# İSLAM PEYĞƏMBƏRİ HƏZRƏTİ MƏHƏMMƏDİN HƏYATI

:Müəllif


## Ibni Hişam



:Çap nəşriyyat

əl–Mustafa (s) Beynəlxalq Tərcümə və Nəşr mərkəzi

:Digital nəşriyyat

İsfəhan Qaimiyyə adına komputer araşdırmalar mərkəzi

# Mündəricat

# İSLAM PEYĞƏMBƏRİ HƏZRƏTİ MƏHƏMMƏDİN HƏYATI

## KİTAB HAQQINDA

Kitabın adı: Ibni Hişamin "Peyğimbərin Tarixi" Əsərinin Tərcüməsi

Müəllif: Ibni Hişam

Tərcümə edən: Ələddin Məlikov

Redaktor: Şahin Yəhyayev

Naşir: Beynəlxalq əl-Mustafa(s) Nəşr və Tərcümə Mərkəzi

ISBN: ۹۷۸-۹۶۴-۱۹۵-۴۶۵-۱

ÇAPXANA: Tövhid, Qum

Çap tarixi: ۲۰۱۱

Çap növbəsi: Birinci

Tiraj: ۱۰۰۰



:SATış MəRKəZI

İran, Qum, Şühəda meydanı, Höccətiyyə prospekti, Beynəlxalq əl-Mustafa(s) Nəşr və Tərcümə Mərkəzi. Telfaks: +۹۸ ۲۵۱ ۷۷۳۰۵۱۷

İran, Qum, Məhəmməd Əmin (s) prospekti, Caməətül-ülumun kənarı, Beynəlxalq əl-Mustafa(s) Nəşr və Tərcümə Mərkəzinin satış şöbəsi

Tel/Faks: +۹۸۲۵۱ ۲۱۳۳۱۰۶ / +۹۸۲۵۱ ۲۱۳۳۱۴۶

www.miup.ir

www.eshop.miup.ir

İSLAM PEYĞƏMBƏRİ

HƏZRƏTİ MƏHƏMMƏDİN

(ALLAHIN SALAMI OLSUN ONA VƏ ÖVLADLARINA)

HƏYATI

İBNİ HİŞAMIN

"PEYĞIMBƏRİN TARİXİ"

ƏSƏRİNİN TƏRCÜMƏSİ

Tərcümə

ƏLƏDDİN MƏLİKOV

NAŞİRDƏN

Hər hansı inkişaf mərhələsini keçən elmi-tədqiqi bir iş ilkin olaraq yazıçının ilham zəmisinə səpdiyi sorğu-suallarla başlayıb, müəyyən zamanda verdiyi səmərə ilə yekunlaşır. Əlbəttə, bu işin sonu yox, yeni-yeni fəaliyyətlər üçün ümid və təşəbbüs deməkdir. Belə ki, əldə olunan hər bir səmərəli qazancın məhsuldarlığı həmişə onun artımı üçün şərait yaradır. Demək, zaman keçdikcə elm, bilik, hünər əhli onun .toxumlarını becərib-yetişdirir, daim elm və mədəniyyətin cərəyanını təmin edir

Fasilə və hüdudları həddən artıq azaldan son müasir zamanımız coşqun tufan kimi, maraqlanan hər şəxsin qarşısına qalaq-qalaq məlumatı sovurub gətirir, mədəniyyətin yeni bir mərhələsinə qapı açır. Hər halda onun normal inkişafında, şübhəsiz, düzgün .təsəvvür və istiqamət həlledici rola malikdir

Beynəlxalq əl-Mustəfa (s) Universiteti ümumdünyəvi rolu, dini hövzələr arasında xüsusi yeri və yetdik kadr imkanına malik olduğunu nəzərə alaraq, artıq, elmi təhqiqat və tədqiqatlar üçün geniş şərait yaratmağı qarşısına qəti məqsəd qoymuşdur. Bununla əlaqədar Beynəlxalq əl-Mustəfa (s) Universitetinin tədqiqat şöbəsi fundamental proqramın təşkili, mövcud avadanlığın düzgün təmini və dini sahələrdə araşdırma aparmaq istəyənlərin cəlb olunmasını özünün ən mühüm vəzifələrindən bilir. Ümid edirik ki, elmi-təhqiqi işlərə qarşı maraq və

dirçəlişlərə zəmin yaratmaq və potensial imkanları inkişaf etdirməklə dünyanın hər bir guşəsində dini mədəniyyətin çiçəklənməsinin şahidi olaq!

(Beynəlxalq əl-Mustafa(s

Nəşr və Tərcümə Mərkəzi

**MÜNDƏRİCAT**

səh:۱۰

## MÜTƏRCİMDƏN GİRİŞ

Əlinizdəki bu kitab İslamın şəni uca peyğəmbəri (s) barəsində yazılan ilk kitab kimi, müxtəlif dövrlərdə mütəmadi olaraq şiə və sünnilərin etimad bəslədikləri kitab ünvanını qoruyub saxlamışdır. Məhəmməd ibn İshaq tərəfindən yazılan bu kitabın əsli (orijinalı) Məhəmməd peyğəmbər (s)ın həyatı haqqında yazılmış və bizim əlimizə gəlib .çatmış kitabların ən qədimi hesab olunur

Məndə olan məlumata görə indiyə qədər bu kitab Fars dilinə tərcümə olunmamışdır. Yalnız fars dilli tarixçilər, öz əsərlərində bu kitabdan sitatlar gətirməklə kifayətlənmiş və nəticə etibarı ilə fars dilli oxucuların, ərəbcə olan bu kitabın istifadəsindən məhrum .qalmasına gətirib çıxarmışdır

Nəhayət kitab işləri ilə məşğul olan yaxın dostum cənab Hacı seyyid İsmayıl bu kitabı tərcümə etməyi mənə təklif etdi. Qarşımda duran bir sıra problemlər və müxtəlif məşğuliyyətlərə görə dostuma konkret və müsbət cavab verə bilmirdim. Lakin bir az sonra əlimə düşən fürsətdən istifadə edərək, kitabı ətraflı mütaliə etdim və nəhayət özüm də bu tip işlərin həvəskarı olduğum üçün onun təklifini qəbul edərək kitabın tərcüməsi ilə məşğul olmağa başladım. Allah təalanın lütf və köməyi ilə səkkiz aydan .bir az vaxt çərçivəsində kitabın hər iki cildini tərcümə edərək çapa hazırladım

İndi isə sizlərə kitabın əhəmiyyəti və müəllifin tərcümeyi halı ilə daha yaxından tanış .olmağınız üçün kitab və müəllif haqqında məlumat verməyə çalışacağıq

səh:۱۵

## Müəllifin tərcümeyi halı və kitab haqqında qısaca məlumat

### İşarə

İbn Hişamın sirəsi adlı ilə tanınan bu kitab (yəni peygəmbər haqqında yazılan tarix kitabı– mütərcim), əslində Mədinəli Məhəmməd ibn İshaqa məxsus olsada, Humeyrli Əbdül Malik ibn Hişam tərəfindən bu günki formaya salınıbdır. Hişamın özünün də kitabın əvvəlində qeyd etdiyi kimi peyğəmbər (s) və onun əcdadları ilə əlaqəsi olmayan bir çox mətləbləri ixtisar etmiş və qalan hissəsini isə qələmə almışdır. Bir çox yerlərdə isə İbn İshaqın sözündən sonra özü izahlar vermiş müəyyən bir fikri isbat və ya rədd .etməyə çalışmışdır

### Məhəmməd ibn İshaq

Məhəmməd ibn İshaq (ləqəbi Əbu Əbdullah) hicrətin səksən beşinci ilində Mədinə şəhərində dünyaya göz açmış və təqribən hicrətin yüz əlli və ya yüz əlli üçüncü ilində .isə Bağdad şəhərində dünyadan köçərək, "Xizran" məqbərəsində dəfn edilmişdir

İbn İshaq uşaqlıq və yeniyetməlik dövrünün bir hissəsini Mədinədə keçirtdikdən sonra yüz on beşinci hicri ilində İskəndəriyyə şəhərinə köçərək orada Ubeydullah ibn Muğeyrə, Yezid ibn Həbib, Ubeydullah ibn Əbi Cəfər, Qasim ibn Qəzman və s… kimi böyük ustad və şəxsiyyətlərdən, hədis elmi, İskəndəriyyə və Misrin tarixi haqqında çoxlu məlumatlar öyrənməyə nail

olmuş, Kufə, Cəzirə, Rey, Hirə və Bağdada səfərlər etmişdi. Bağdadda olduğu zaman dövrün xəlifəsi olan Mənsur Əbbasinin görüşünə getdi. O görüş onun Bağdadda qalmasına və çoxlarının rəylərini əsas tutaraq deyə bilərik ki, bu kitabın yazılmasına .səbəb oldu

Bir çoxlarının yazdığına görə bu görüşdə Mənsur Əbbasi Məhəmməd ibn İshaqın tarix elmi haqqındakı məlumatları qarşısında heyrətə gələrək, yanında oturan oğlu Mehdini Məhəmməd ibn İshaqa göstərib dedi: Bu oğlanı tanıyırsanmı? Məhəmməd ibn İshaq yox deyə cavab verdi: Mənsur dedi: Bu mənim oğlum Mehdidir. Indi isə get onun üçün Adəm ovladlarının yarandığı gündən indiyə qədər bəhs edən bir tarix kitabı yaz. Məhəmməd ibn İshaq Mənsurun əmrini yerinə yetirib müfəssəl bir tarix kitabı yazaraq Mənsurun yanına gətirdi. Mənsur kitabı gördükdən sonra ona dedi: Bu kitab həddən artıq uzun və geniş olduğundan onu müxtəsər formaya salmaq lazımdır. Buna görə də Məhəmməd ibn İshaq kitabı müxtəsər formaya salıb, hər ikisini Mənsurun yanına gətirdi. Mənsur orijinalın xəzinədə saxlanmasını, xülasənin isə oğlu Mehdiyə (verilməsini əmr etdi.(١

Ancaq bu nəzəriyyə ilə yanaşı digər bir qrup isə başqa bir nəzəriyyəni irəli sürərək bildirirlər ki Məhəmməd ibn İshaq bu kitabı Bağdada daxil olmazdan və Əbbasi xəlifələrinin yanında qalmazdan öncə Mədinə şəhərində yazmışdır. Onlar öz fikirlərini bununla əsaslandırırlar ki Məhəmməd ibn İshaqın bu kitabında hədis rəvayət etdiyi ravilərin çoxu Mədinəli, İskəndəriyyəli və ya Misirlidirlər. İraqlı ravilərin heç birinin adı orada qeyd edilmir və bundan əlavə bu kitabı Məhəmməd ibn İshaqdan rəvayət edən şagirdi İbrahim ibn Səidin özüdə Mədinə şəhərindəndir. Əgər bütün bunları bir kənara qoysaq yenədə Bədr döyüşündən bəhs edilərkən elə mətləblərə rast gəlirik ki Əbbasi xəlifələrinin Əbbas ibn Mütəllib (öz atababaları) haqqında dedikləri ilə üstüstə .düşmürdü



---

Bəzilərinin dediyinə görə orijinal nüsxə indi də Astananın Kuberili kitabxanasında . [١] -١ .saxlanılır

Çünki Məhəmməd ibn İshaq bu kitabda Əbbasın qüreyş qoşununda iştirakını və habelə onun müanlar tərəfindən əsir götürülmə cərəyanını və eləcədə Əbbasilərin (işiqlanmasını istəmədikləri bəzi mətləbləri də qeyd etmişdir.(١)

Hər halda kitab tərtib olduğu vaxtdan indiyə qədər bir çox alim və hədis yazarların diqqətini özünə cəlb etmışdir. Əlbətdə kitab istifadəyə verildikdən sonra tərifləyənlərlə yanaşı onu tənqid edənlər də tapıldı. Tənqidçilər müəllifi, şəcərənaməni yanlış yazmaqda, yalançı insanlardan hədis rəvayət etməkdə, saxtakarlıqda və bunun kimi digər hallarda ittiham edirdilər ki həmin kitabın(٢) əvvəllərində bu ittihamlara da geniş formada cavab verilmişdir. Sünni məzhəbinin rical (Ravilərin tərcümeyi halından bəhs edən elmmutərcim) elmi ilə məşğul olan alimlərinin bəziləri Məhəmməd ibn İshaqın hədisləri rəvayət edərkən məzhəbi təəssübkeşlikdən uzaq duraraq neytral mövqe tutmasına görə onu şiəçilkdə ittiham edərək Məhəmməd ibn İshaqın şiə olduğunu söyləmişlər. Sirəyə ön söz yazanın dili ilə desək əgər bu deyilənlər doğru olsa belə, bu .onun hədislərini kənara qoyub inanmamaq anlamına gəlməməlidir

Məhəmməd ibn İshaqdan sonra Əbdülməlik ibn Hişam (bu kitab onun adı ilə İbn .Hişamın “sirəsi” kimi tanınıbdır ) onu indiki formaya salmışdır

**İbn Hişam**

Əbu Məhəmməd Əbdülməlik ibn Hişam Bəsrə şəhərində böyüyüb boyabaşa çatmışdır. Onun doğum tarixini isə taixçilər qeyd etməmişlər. Vəfat tarixinə gəldikdə isə burada müxtəlif nəzərlərlə rastlaşsaqda ancaq deyilənlərdən nəticə çıxardaraq deyə bilərik ki Əbu Məhəmməd Əbdülməlik ibn Hişam hicri tarixi ilə ٢١٣٢١٨ ci illər arasında vəfat .etmişdir

səh:١٩

---

ci il Misirdə çapdan çıxan “sirə”nin ön sözünün ١٥- ١٧- ci səhfəsi ١٣٧٥ . [١] -١

Ancaq Bədr döyüşünün başlanğıcından sonuna qədər baş verən bəzi hadisələr . [٢] -٢ birinci dəstənin fikrini təsdiqləyir. Atikə yuxusu barəsində Əbu Cəhl ilə Əbbasın müzakirəsi, Qüreyşin məğlub olma xəbərinin Məkkəyə çatması, Əbu Rafenin hədisi və .onun Əbu Ləhəblə olan danışığı və s... digər hadisələrdə bizim dediyimizə subutdur

Əbdülməlik ibn Hişam uzun illər Bəsrədə yaşayıb oranın alimlərinin elm mənbəyindən istifadə etdikdən sonra Misirə səfər edərək orada da Şafei və digərləri ilə görüşərək .onlardan çoxlu hədis və şerlər öyrənmişdir

Əbdülməlik ibn Hişamın bu kitabdan başqa "Ticanul Muluk və MərifətuMulukuzzaman" .kimi kitabları da vardır ki onları Misrdə olarkən yazmışdır

**Sirəyə yazılan şərhlər**

Əbdülməlik ibn Hişamdan sonra bu kitabı mütaliə edən bir sıra alimlər bu tarixi kitabın əhəmiyyətini dərk edərək onun hədis və şerlərini şərh etməyə başladılar. Insafən demək olar ki, xeyli əziyyətlər hesabına yazılan şərhləri oxuyarkən şərhçilərin tarix, .lüğət və digər elmləri necədə gözəl və mükəmməl bildiklərinin şahidi oluruq

Bu sahədə adı çəkiləsi insanlardan biri "Suheyli"adı ilə tanınan Əbülqasim .Əbdurrəhman ibn Əbdullahdır ki, bu kitaba geniş məzmunlu bir şərh yazmışdır

Suheyli hicrətin ۵۰۸ ci ilində dünyaya gəlibdir. O, cavan yaşlarında elm öyrənmək üçün İspaniyaya gedərək, orada dövrünün məşhur alimlərindən elm öyrənməyə çalışmış və tədricən özü də məşhur alimlərin cərgəsinə qoşulmuşdur. Az bir zaman çərçivəsində Süheyli elminin əkssədası Mərakeş valisinin də qulağına çatdı. Vali tezliklə onunla görüşmək üçün Əbülqasim Əbdurrəhman ibn Əbdullahı Mərakeşə dəvət edib, orada onu mehribancasına qarşılayaraq, ona qazi rütbəsi verdi. Suheyli Mərakeşdə üç il .qaldıqdan sonra orada vəfat edərək ۵۸۱ ci ildə dünyadan köçdü

Kitaba şərh yazanlardan biridə Əbuzər Xəşni olmuşdur. O, təqribən hicrətin ۵۳۳ cü ilində Əndəlusda (İndiki İspaniyadamütərcim) dünyaya gəlmiş və hicrətin ۶۰۴ cü ilində isə dünyadan köçmüşür. Xəşni adlanmasınn səbəbi isə Əndəlusdaki Xəşn adlı bir .kənddə doğulub boya-başa çatması ilə bağlıdır

Məhəmməd ibn Əhməd Hənəfi də kitaba şərh yazanlardan

biri olmuşdur, o öz şərhini “Kəşful-lisam” adlandırmışdır, lakin onun hətta bir nüsxəsi .belə zəmanəmizə qədər gəlib çatmamışdır

Bir qrup alim isə kitabın bəzi mətləblərini ixtisar edərək onu müxtəsər formaya salmağa üstünlük vermişlər. O cümlədən İbrahim ibn Məhəmməd Şafei o kitabı ١٨ .fəsildə cəmləşdirərək adını “Əzzəxirə fi muxtəsərissirə”adlandırmışdır

İmadəddin Vasiti isə kitabı ixtisar etməyə başlamış və hicrətin ٧١١ ci ilində bu işi .bitirərək kitabı “İbn Hişamın sirəsinin ixtisarı”adı altında yaymağa başlamışdır

Başqa bir qrup isə kitabı nəzmə çəkərək onu şer halına salmışlar. Bunlara misal olaraq Əbdüləziz ibn Məhəmməd Dumeyrini, (ölüm tarixi hicri ۶٠٧ ci il) Fəth ibn Musa Xəzranı (ölüm tarixi hicri ۶۶٣ cü il) və Məhəmməd ibn İbrahim Nablisini (ölüm tarixi hicri ٧٩٣ cü il) .misal göstərmək olar

Kitab və müəllifi tanıtdırmaq üçün topladığımız qısa məzmunlu məlumatlar bundan .ibarət idi ki onu da sizə çatdırmaq üçün fars dilinə tərcümə etdik

**İndi isə mühüm olan bir neçə məqamı diqqətinizə çatdıraq**

Bizim tərcümə etmək üçün istifadə etdiyimiz nüsxə hicri tarixi ilə ١٣٧۵, miladi tarixi ilə (١ isə ١٩۵۵ ci ildə Misirdə Hələb şirkətinin sərmayəsi ilə iki cildlik kitab şəklində nəşr olunmuşdur. Birinci cild Bədr döyüşündə öldürülənləri zikr etməklə başa çatırsa, ikinci cild isə Bədr döyüşündə əsir düşənlərdən söhbət açmaqla başlayır. Biz bu nüsxənin çap olunmuş və ya olunmamış nüsxələr içərisində ən mükəmməl formaya malik olduğunu iddia edə bilməsəkdə hər halda iddia edib deyə bilərik ki, başqa nüsxələrlə müqayisədə bu nüsxənin üzərində daha çox işlənilmiş, bəlkədə digər nüsxələrdən .daha etibarlıdır

Biz tərcümə edərkən sozlərin həddən artıq lakonik olmasına çalışsaqda bir sıra (٢ hallarda cümlələr artırmağa, hansısa cümlənin yerini dəyişirdirməyə məcbur olurduq ki cümlənin axıcı olmasını təmin edə bilək, əlbətdə kitabın mətni dəyişilməsin deyə, .izahları parantez içərisində və ya səhifənin aşağısında qeyd etməyə çalışmışıq

İbn Hişamın sirəsi, tarixi kitab olmaqdan əlavə, təfsir və ədəbi cəhətdən də ( ۳ əhəmiyyət daşıyır, çünki bu kitabda bir çox quran ayələri təfsir edilmiş və peyğəmbərin zamanında və ya ondan öncə baş vermiş bir sıra hadisələr və döyüşlər haqqında çoxlu şerlərdən sitat gətirilərək izahlar verilmişdir. Ancaq bu kitabda qeyd edilən bir sıra ərəb lüğətləri və ya onların tərcümələri və ya təfsir edilən bir sıra hissələr fars dilli oxucular üçün yorucu olduğundan və demək olarki oxucuların bir çoxunun onların üstündən ötüb keçəcəklərini nəzərə alaraq onları tərcümə etmədən ötüb keçdik, (amma mütərcimin tərcüməni burada lazım və ya yaxşı olduğunu bildirdiyi bir sıra hallar istisna olmaqla) bu zaman isə kitabın aşağısında onun yerini .qeyd etməyə üstnlük verib bununla kifayətləndik

Bəzi yerlərdə (necəki qədim tarixçlər arasında geniş yayılmış ənənələrdən biri idi) bir (۴ dastan və rəvayətin iki və ya artıq formada rəvayət edilməsi, ya təkcə hədisi yazmaq kifayət etdiyi halda onların bir sıra əlavlərlə dərc edilməsi və ya hədisin sənədində ravilərin adlarının ata babalarının adları ilə yanaşı olması, hətta bəzən ravilərin ata-babalarının yeddisəkkizinin adının silsiləvari olaraq qeyd edilməsi, bütün bu və ya başqa hallar bizi əlavə hesab etdiklərimiz yerləri ixtisar etməyə məcbur etsədə, lakin eyni zamanda oxucunun yanlış anlamaması üçün ixtisar edilmiş və ya yerləri .dəyişdirilmiş cümlələri kitabın aşağısında qeyd etmək qərarına gəldik

Kitab ərəb dilindən tərcümə olunarkən istifadə edilmiş bir sıra fars və ərəb dilli ( ۵ .kitabların daha çox əhəmiyyət daşıyanlarını kitabın axırında qeyd etdik

Farsca yazılmış kitabların içərisində elə kitablarada rast gəldik ki dəfələrlə çap ( ۶ olmasına baxmayaraq yenədə tərcümə və digər tarixi mətləblər cəhətindən çoxlu səhvlərə malik idilər bununla yanaşı müəlliflərin şiə olmasına baxmayaraq bəzi hallarda onlar sünniləri də ötüb keçdiyindən (məşhur bir cümlənin dili ilə desək “ qatı katolik olmaqda papanı da ötüb keçmişlər”) onların yazılarına etimad etməyərək .tamamilə onların istifadəsindən imtina etdik

Son olaraq Allaha çox şükrlər olsun ki bu kiçik xidməti

tamamlamağı mən kimi aciz quluna lütf elədi. Ümidvaram ki indiyə qədər bu cür xidmətlərdə müvəffəq olduğum kimi bundan sonrada müvəffəq olacağam. Oxuculardan isə xahışım budur ki hər hansı bir səhv ilə rastlaşdıqları vaxt hörmətli redaksiya vasitəsilə bizə bildirsinlər ki, bizdə növbəti çaplarımızda bu səhvləri aradan qaldırmağa çalışaq. Bu arada öncədən həmin insanlara öz dərin təşəkkürümüzü .bildiririk

Vəlhəmdu lillahi əvvələn və axirən

Qəməri tarixi ilə Zihiccə ayının ١٧si ١٣٨٨ ci il

Şəmsi tarixi ilə ١٥/١٢/۴٧ ci il

Miladi tarixi ilə ٠۴/٠٣/١٩۶٨

Şəmiran: Seyyid Haşim Rəsul Məhəllati

səh:٢٣

## İŞARƏ

### İSLAM PEYĞƏMBƏRİNİN ƏBÜLBƏŞƏR (BƏŞƏRİN ATASI) HESAB EDİLƏN ADƏM PEYĞƏMBƏRƏ QƏDƏR OLAN SOYKÖKÜ

İbn Hişam Məhəmməd ibn İshaqdan nəql etdiyi rəvayətdə peygəmbərin soykökünü aşagıdakı kimi qeyd etmişdir: Məhəmməd ibn Əbdullah ibn Əbdül Müttəlib ( tam adı Əbdül Müttəlib Şeybədir ) ibn Haşim ( tam adı Haşim Əmrudur) ibn Əbdul Manaf ( tam adı Əbdul Manaf Mugeyrədir) ibn Qusəyy (adı Qusəy Zeyddir) ibn Kilab ibn Mərrə ibn Kəb ibn Ləvi ibn Galeb ibn Fəhr ibn Malik ibn Nəzr ibn Kənanə ibn Xəzimə ibn Mədrəkə ( tam adı Mədrəkə Amirdir) ibn Ilyas ibn Muzerr ibn Nizar ibn Məəd ibn Ədnan ibn Odd ( bəziləri Oddun yerinə Odəd deyirər ) ibn Məqum ibn Nahur ibn Teyrəh ibn Yərəb ibn Yəşcəb ibn Nabit ibn Ismayıl (ə) ibn İbrahim (ə) (ləqəbi allahın dostudur) ibn Taroh (başqa adla Azər)(۱) ibn Nahur ibn Saruğ ibn



---

۱- [۱] . Bütün şiə alimlərinin əqidəsinə görə Məhəmməd (s) peyğəmbərin atası Əbdullahdan başlayaraq Adəm(ə) peyğəmbərə qədər olan əcdadlarının heç biri kafir olmamış, əksinə onların hamısı imanlı insanlar olmuşdur. Alimlər eyni zamanda isbat etmişlər ki, Azər ya İbrahim(ə) peyğəmbərin əmisi olmuş, ya Ibrahim(ə) peyğəmbər onun himayəsində böyüdüyü üçün ona ata deyə müraciət etmiş və ya da Ibrahim(ə) peyğəmbərin ana tərəfdən babası olmuşdur. Daha geniş izah üçün “Məcməül- bəyan” kitabının ۴- cü cildinin ۳۲۲ səhfəsinə, ”Bəharül- ənvarın” ۱۲ ci cildinin (yeni çap) ۴۸ ci səhifəsinə və ۱۵ ci cildinin ۱۱۷- ۱۲۲ ci səhfələrinə müraciət edə bilərsiniz.

Rau ibn Falex ibn Eybər ibn Şalex ibn Ərfəxşd ibn Sam ibn Nuh (ə) ibn Ləmək ibn Mutəvəşşəlx ibn Əxnux (rəvayətə görə bu həmin İdris peyğəmbərdir ki, qələm ilə yazan ilk peyğəmbər hesab olunur ) ibn Yerd ibn Məhlil ibn Qeynən ibn Yanş ibn Şis ibn Adəm (ə), bu sadaladıgımız şəcərənamə Məhəmməd ibn İshaqdan nəql edilən rəvayət .əsasında idi

Qətadədən nəql olunan rəvayətdə isə (Ismayıl (ə) dan üzü yuxarı) peygəmbərin soykökü bu cür qeyd olunmuşdur: Ismayıl (ə) ibn Ibrahim (ə) (ləqəbi Allahın dostudur) ibn Taroh (başqa adla Azər) ibn Nahur ibn Əsrəg ibn Ərğu ibn Falex ibn Aber ibn Şalex ibn Ərfəxşd ibn Sam ibn Nuh (ə) ibn Ləmək ibn Mutəvşşəlx ibn Əxnux ibn Yərd ibn .(Məhlail ibn Qaen ibn Ənuş ibn Şis ibn Adəm (ə

Biz allahın köməyi ilə bu kitabda Həzrəti İsmayıl (ə) dan başlayaraq onun İslam peygəmbərinə qədər olan övladlarının müxtəsər tərcümeyi halını qeyd edib peygəmbərin özünə və ya atalarının yaşayışına aidiyyəti olmayan artıq mətləb və .hadisələri yazmaqdan imtina edəcəyik

### HƏZRƏTİ İSMAYIL (Ə) IN ÖVLADLARI

Məhəmməd ibn İshaq öz rəvayətində İsmayıl (ə) ın on iki övlad sahibi oldugunu qeyd edirdi. Adları isə belə idi. Hamıdan böyük olan oğlu Sabit sonra Qeyzər, Izbil, Məbşa, ,Məsməa, Maşı, Dema, Azər, Teyma, Yətur, Nəbş, Qeyzəma

Anaları isə Məzaz ibn Əmru Corhəminin qızı Rəhlə idi. Corhəm Qəhtanın övladlarından idi. Qəhtan isə Yəmən tayfalarının ulu əcdadı hesab olunurdu. Qəhtanın Nuh (ə) peygəmbərə qədər olan şəcərəsi isə belə idi. Qəhtan ibn Amir ibn Şalex ibn Ərfəxşd .(ibn Sam ibn Nuh (ə

### HƏZRƏTİ İSMAYIL (Ə) IN ÖMÜR YOLU VƏ DƏFN OLUNDUĞU YER

Yuxarıda nəql etdiyimiz rəvayətə görə Həzrəti İsmayıl (ə) ١٣٠ il bu dünyada ömür sürüb həyatdan köçdükdən sonra onu anası Hacər ilə birlikdə “Həcəre Ismayil” .adlanan yerdə (Kəbə evinin kənarında) dəfn etdilər

O həzrətin anası Misirli idi (ərəb qrammatik qaydalarina görə «ha» hərfini «a» hərfi ilə (əvəzləmək olar bunun üçündə Hacərə Acər də deyildiyini müşahidə edirik.)(١)

Elə buna görədə peygəmbər Misirlilərlə yaxşı rəftar etməyi sifariş edərək buyurmuşdur ki "onlarla yaxşı rəftar edin. Çünki onlar həm həsəb həm də nəsəb cəhətindən bizimlə qohum hesab olunurlar". Peygəmbərin nəsəb cəhtindən qohum olmaga işarə etməsi Hacərin Misirli olmasına, həsəb cəhətindən qohum olması .kənizlərindən birinin yəni Mariyənin Misirli olmasına işarə idi

İbn Ləhiyənin rəvayətinə görə İsmayıl (ə) ın anası Hacərin əsl vətəni Fərma(٢) .şəhərinin yaxınlıgında yerləşən Ümmülərəb rayonudur

Peygəmbərin həyat yoldaşı və oglu Ibrahimin anası Iskəndəriyyə padşahı

Müqəvqəsin hədiyyə olaraq göndərdiyi, Qibti Mariyənin vətəni isə Misrin Həfn .vilayətidir

Başqa bir hədisdə isə ibn İshaq Zöhridən, o da öz növbəsində Əbdürrəhman Sələmidən nəql edir ki peygəmbər buyurmuşdur: "Misri fəth edən zaman oranın əhalisi ilə yaxşı rəftar edin çünki, onların boynumuzda qohumluq haqqları vardır" ibn Ishaq rəvayət edir ki mən Zöhridən peygəmbərin buyurdugu qohumluqdan məqsəd nə idi .deyə soruşduqda o buyurdu: Çünki İsmayıl (ə) ın anası Hacər Misirli idi

## ƏRƏBLƏRİN SOYKÖKÜ

Ərəblərin soykökü həzrəti Ismayıl (ə) və Qəhtandan başlayır. Yəmən əhalisinin bəzilərinin fikrincə Qəhtan özüdə Ismayıl (ə)ın övladı oldugundan deməli nəticə etibarı .ilə ərəblərin soykökü həzrəti Ismayıldan başlayır

Ancaq ibn Ishaqın dediyinə görə Sam ibn Nuh(ə) ın nəslindən olan Laoz oglanları Əmim, Əmlaq və Təsm... Ovs oglu Ad, Aber oglanları Səmud və Cədis ...də daxil .olmaqla hamısı mənşəcə ərəblərdən hesab olunurlar

١- [١] . Necə ki “Heraqul– ma” və “İraqul – ma” da deyirlər.

٢- [٢] . Fərma Misrin şərq istiqamətində yerləşən şəhərlərdən hesab olunur.

Hər halda İsmayıl (ə) ın Nabet adlı oglundan Yəşcəb ondan Yərəb ondan Teyrəh ondan Nahur ondan Müqvəm ondan Odəd, Odəddən isə Ədnan dünyaya gəlibdir. ((bəziləri Odədin yerinə Odd deyiblər

Ismayıl (ə) ın ailəsindən yaranan tayfalar Ədnandan sonra ayrılırlar. Ədnanın isə Məəd .və Okk adlı iki övladı var idi

Okk Əşəri tayfası ilə evlənib onlarla birgə Yəməndə yaşamaga başladı. Əşəri tayfası .Əşər ibn Nəbt vasitəsilə Yərəbin o da Qəhtanın övladı hesab olunurlar

Anaq Ədnanın digər oglu olan Məəd isə Nizar, Qezaə, Qenəs, və Iyad adlı dörd ogul sahibi oldu. Hamıdan böyuk olan Qəzaə, Həmir tayfasına qoşuldu, buna görədə .bəziləri onu Həmirin övladı bilib Qəzaət ibn Həmir deyirlər

Ancaq Qenəs ibn Məədin övladları məhv olub aradan getdilər. Onlardan biridə Heyrə .padşahi Neman ibn Munzər idi

Ibn Ishaq ənsarlı bir kişinin dilindən rəvayət edir ki , Neman ibn Munzərin qılıncını Ömər ibn Xəttabın yanına gətirəndə o Qureyş tayfasının şəcərənaməsini gözəl bilənlərdən biri olan Cubeyr ibn Mutəmi yanına çagırıb qılıncı ona göstərərək ondan soruşdu. Neman ibn Munzər hansı tayfadan olmuşdur. Cubeyr cavab verərək onun .Qenəs ibn Məədin nəslindən oldugunu söylədi

Amma bəzilərinin fikrincə Neman ibn Munzər Ləxm tayfasndandır. Ləxm isə Rəbiət ibn .Nəsrin tayfasından olubdur

.Bəziləri Ləxmin soykökünü isə belə qeyd ediblər: Ləxm ibn Ədi ibn Əmr ibn Səba

Ancaq Ləxmin şəcərənaməsinə gəldikdə isə bu ardıcıllıqladır. Ləxm ibn Ədi ibn Haris ibn Mərrə ibn Ədəd ibn Zeyd ibn Həmisə ibn Əmr ibn Urəyb ibn Yəşcəb ibn Zeyd ibn .Kehlan ibn Səba

Amma Rəbiət ibn Nəsrin şəsərənaməsinin isə belə oldugunu söyləyirlər. Rəbiət ibn Nəsr ibn Əbi Harisə ibn Əmr ibn Amir

.Ibn Rəbiə, Əmr ibn Amirin Yəməni tərk etməsindən sonra oranın hakimi oldu

tərk etmə səbəbi əkinçilik və digər hallarda istifadə üçün nəzərdə tutulan Mərəb səddinin siçanlar fəsiləsindən olan “Cerəz” adlı siçanlar tərəfindən deşilməsini müşahidə etməsi idi. Əmr bu minvalla səddin axıra qədər davam gətirə bilməyəcəyini dərk edib Yəməni tərk etmək qərarına gəlsədə, qəbiləsi onun köçməsinə imkan vermirdilər. O bir az götür qoy etdikdən sonra kiçik ogluna mən sənə qəzəbləndiyim vaxt üzümə sillə vurarsan deyə göstəriş verdi. Oğlu atasının götərişinə əməl etdi. Əmr bundan istifadə edərək elan etdi ki artıq kiçik oglumun üzümə sillə vurdugu bir yerdə yaşaya bilmərəm, bununlada o öz var dövlətini satışa çıxartdı. Yəməndə yaşayan tayfa böyükləri dedilər: Əmr ibn Amirin qəzəblənməsi nəticəsində yaranan fürsətdən istifadə edin (mallarını alın ) beləliklə Əmr ibn Amir var-dövlətini satdıqdan sonra öz .övlad və nəvələrini yıgaraq Yəməni tərk etdi

Əzd qəbiləsi məsələnin bu cür sonluqla bitdiyini görüb biz də Əmr ibn Amirdən ayrılmarıq deyib vardövlətini satdıqdan sonra Əmrin arxasıyca Yəməni tərk etdilər onlar birlikdə hərəkət edərək Okk qəbiləsinin yaşadıgı şəhərə çatdılar (əlbətdə onların orada qalmaq fikri yox idi sadəcə oradan ötürdülər ) Okk qəbiləsi onlarla döyüşə atıldılar və iki qəbilə arasında baş verən bu döyüş bir müddət davam etdi. Gah bu qəbilə gah da digər qəbilə üstnlük əldə edirdi nəhayət onlar bu ölkədən də ötüb digər .şəhərlərə yayıldılar

Ali Cəfənə (Əmr övladlarının bir qolu) Şam şəhərində, Ovs və Xəzrəc Yəsribdə, Xəzaə tayfası isə Mərrada(١) məskunlaşdılar. Əzd övladları Əzd Sirat və Əzd Omman adlanan iki dəstəyə bölündü. Əzd Sirat adlanan dəstə Siratda Əzd Omman adlanan dəstə isə Ommanda məskunlaşdılar. Bu cərəyandan sonra Allahtaala Mərəb səddini dagıtdı ki bu barədə peygəmbərə aşagıdakı ayə nazil olub « Səbə' tayfası üçün yurdlarında bir nişanə var idi. Sagdan və soldan iki bagça var idi. (Səba əhlinə belə buyurulmuşdu:) «Rəbbinizin ruzisindən yeyin və Ona şükr edin! (rəbbinizdə) gözəl diyar bagışlayan bir Rəbbidir». Lakin



---

.Müasir dövrdə isə “Mərauz- zöhran” adlanır . [١]-١

(onlar üz döndərdilər. Biz də üstlərinə "Ərim" (bəndinin) selini göndədik...»(١)

Əbu Ubeydəyə görə "Ərim" sədd deməkdir. Onun sözünə qüvvət kimi Əşi ibn Qeys ibn Soləbənin şerini misal vurmaq olar ki o uzunuzadı olan qəsidəsində belə deyir ki:

وفی ذاک للم ؤتسی اسوه

ومأرب عفی علیها العرم

Və habelə Uməyyə ibn Əbissilətin şerini misal göstərmək olar ki o isə öz qəsidəsində belə yazmışdır

من سبأالحاضرین مأرب اذ

یبنون من دون سیله العرم

Bu şerin Nabigeyi Cədiyə məxsus oldugunu da söyləyənlər olmuşlar:

Qeyd: Ibn Hişam burada adıcıllıqla Əşinin, Uməyyənin və Nabiğənin soykökünü yazıbdir ki maraqlananlar müraciət edə bilərlər. (sirə I cild, səhifə ١۴)

**YƏMƏN PADŞAHI RƏBİƏT İBN NƏSR VƏ...**

YƏMƏN PADŞAHI RƏBİƏT İBN NƏSR VƏ ONUNLA EYNİ DÖVRDƏ YAŞAYAN «SƏTİH» VƏ «ŞEQ» ADLI İKİ KAHİNİN DASTANI

İbn İshaq rəvayət edir: Yəmən padşahlarından biri olan Rəbiət ibn Nəsr qorxulu bir yuxu görmüş, və nəticədə qəmqüssəyə düçar olmuşdu. O, bu yuxunu yozmaq üçün bütün kahin, sehrbaz və münəccimləri öz sarayına çagırtdırıb onlara belə dedi: Gördüyüm qorxulu yuxu məni qəmqüssəyə düçar edibdir sizdən tələbim budur ki o yuxu və yozumunun nədən ibarət oldugunu mənə söyləyəsiniz.

Onlar isə cavabında sən bizə yuxunu söyləki biz də yozumunu sənə söyləyə bilək deyə

.cavab verdilər

Padşah dedi: Əgər mən yuxunu sizə söyləməli olsam o zaman sizin yuxu yozumunuza inanmayacagam, amma kim mənə yuxunun nə oldugunu söyləyə bilsə, onunda yozumunun dogru olduguna inanacagam.

Onlardan biri dedi: Sizin istəyinizi ancaq “Sətih və Şeq” reallaşdıra bilər. Ona görədə o iki nəfəri huzurunuza çagırtdırın. Çünki o iki nəfərdən yaxşı heç kəs bu yuxunu və onun



---

.Səba”surəsi ۱۵- ۱۶ cı ayələr“ . [۱] -۱

yozumunu sizə söyləyə bilməz.(۱) Rəbiə bu sözü eşitcək onların arxasıyca adam göndərdi. Ilk öncə Sətih saraya gəldiyindən padşah ona dedi: Ey Sətih görduyüm yuxu məni pərişan edib əgər sən bu yuxunun nə oldugunu mənə xəbər verə bilsən deməli .sənin yozumuna da inanmaq olar

Sətih dedi: Yuxuda od kürəciyi gördün ki o qaranlıqdan çıxıb Təhamə vilayətinə düşərək ətrafdakı hər bir canlını yandırıb məhv etdi: Padşah dedi: Ey Sətih nə bir kəlmə artıq nə də bir kəlmə əskik dedin (oldugu kimi söylədin) indi isə o yuxunun yozumunun nədən ibarət oldugunu mənə söylə: Sətih dedi: İki Hirrə(۲) arasında yaşayan canlılara and olsun ki, Həbəş əhalisi sizin vilayətinizə hucum edib Əbin(۳) və Cerəş(۴) arasında .yerləşən bütün əraziləri işgal edərlər

Padşah dedi: Ey Sətih de görüm bu hadisə nə vaxt baş verəcək? Mənim hakimiyyətim ?dövründə olacaq, yoxsa məndən sonra

.Sətih dedi: Bu hadisə sizin vaxtınızda deyil təqribən ۶۰۷۰ il sonra baş verəcək

Padşah dedi: Onların hakimiyyəti davam edəcək, yoxsa bir müddət sonra suqut .edəcək

Sətih dedi: Davam etməyəcək təqribən hakimiyyətlərinin ۷۳۷۹ cu illəri arasında onların hakimiyyəti suquta ugrayacaq. O vaxtdan sonra onlar öldürülüb və pərakəndə halına .düşərlər

:Padşah dedi: Onları öldürüb didərgin salan, kimlər olacaq

Sətih dedi: Ədən vilayətindən olan İrəm ibn Zi Yəzəz, onların heç birinin Yəməndə .qalmasına imkan verməyəcək

Padşah dedi: İrəm ibn Zi Yəzəzin hakimiyyəti necə? uzun



---

İbn Hişam burada "Sətih" və "Şeqin" də şəcərənaməsini qeyd edibdir ki . [۱] -۱ .maraqlananlar "sirə"nin ۱۵- ci səhifəsinə müraciət edə bilərlər

Hirrə” ərəb lüğətlərində qara daşların çox olduğu yerlərə deyərlər ki ilk baxışda“ . [۲] -۲ elə nəzərə çarpır ki yerə qara daşlardan xalça döşənibdir. Hicazda bu cür yerlərə çox rast gəlmək olar, misal olaraq Mədinə şəhərinin ətrafı olan “Teybə”ni və digər ərəb ölkələri olan Yəmən, İordaniya və Şamı (indiki Suriyamütərcim) misal gotərmək olar ki buralarda bu tip yerlərə çox rast gəlinir ki hər birinin də özünə məxsus adı olur məsələn: “Harreye Vaqem” “Harreye bəni Hilal” “Hareye Rücəla” və başqaları. Ancaq “Sətih”in burada iki “Harrə”dən məqsədinin nə olduğu məlum deyil. Daha doğrusunu .Allah bilər

.Əbin” Ədən vilyətinin bir hissəsidir“ . [۳] -۳

.Cəreş” isə Yəmənin bir hissəsinə deyərlər“ . [۴] -۴

?ömürlü olacaqmı

.Sətih dedi:Yox o da suqut edəcək

?Padşah dedi: Onun hakimiyyətini kim devirəcək

.Sətih dedi: Böyük Allah tərəfindən vəhy olunan pak və pakizə bir peygəmbər

?Padşah dedi: Dediyin peygəmbər hansı tayfadan olacaq

Sətih cavab verdi: Galib ibn Fəhr ibn Malik ibn Nəzrin övladlarından bir kişi olacaq və .dünyanın sonuna qədər onun davamçıları hakimiyyətdə qalacaqlar

?Padşah dedi: Məgər dünyanın sonudamı vardır

Sətih cavab verdi: Bəli dünyanın sonu o vaxtdır ki ilk yaranmışdan sonuncu yaranmışa qədər bütün insanlar o gün bir yerə toplanacaq və o zaman yaxşı əməl sahibləri .səadətə çatar, pis əməl sahibləri isə bədbəxtçilik və əzaba düçar olarlar

?Padşah dedi:Dediklərin həqiqətənmi olacaq

.Sətih cavab verdi: Bəli! And olsun səhər və axşama ki dediklərim baş verəcəkdir

Bu cərəyandan sonra Şeq, Rəbiət ibn Nəsrin sarayına gəldi. Rəbiə (öz yuxusu haqqında) Sətihə dediyi sözləri ona da söylədi. Ancaq Sətihin dediyi sözləri Şeqə söyləməkdən vaz keçdi. Bununlada padşah bunların hər ikisinin yuxu barəsindəki

.fikirlərinin eyni olubolmadıgını yoxlamaq istəyirdi

Şeq padşahın cavabında dedi: Sən qaranlıqdan çıxan od kürəciyi gördün ki o bag və təpələrə hucum edib hər bir canlını ağuşuna aldı. Sultan bunun sözlərini eşitcək Sətihlə .Şeqin sözlərinin təqribən eyni oldugunu müşahidə etdi

Sonra padşah ona dedi: Ey Şeq yuxunu düz söylədin indi isə bu yuxunu bizim üçün .yozmaga çalış

Şeq dedi: İki Hirrə(١) arasında yaşayan insanlara and olsun ki, qaralar (Həbəşilər) sizin

yurdunuza yürüş edərək davamçılarınıza qalib gəlib, Əbindən Nəcrana(۲) qədər olan .əraziləri işgal edərlər

Sultan dedi: And olsun atanın canına dediyin sözlər bizim



---

.Hirrənin mənası əvvəlki səhifədə qeyd edildi . [۱] -۱

Əbin” in mənasını səkkizinci səhifədə qeyd etdik. “Nəcran” isə Yəməndə bir“ . [۲] -۲ şəhər adıdır. “Nəcran” Yəmən, Şam və Hicaz arasındakı sərhəddin bir hissəsinə də .deyirlər

üçün çox agır və dözülməzdir. Bu hadisənin nə vaxt baş verəcəyini, mənim dövrümdə .və ya sonra olacagını söylə

Şeq dedi: Yox bu zamanda deyil, bəlkə illər sonra baş verəcək. Bu hadisədən sonra güclü və qüvvətli bir kişi davamçılarınızı onların əlindən xilas edərək onları da rüsvayçı .şəkildə məglub edəcək

?Padşah dedi: Dediyin o qüdrətli kişi kim olacaq

Şeq cavab verdi: Heç bir zaman işlərində ruhdan düşməyən Zi Yəzən ailəsinin alicənab .bir cavanı

Şeq dedi: Onun hakimiyyəti din əhli üçün haqq və ədalət ərməgan gətirən bir peygəmbər tərəfindən suquta uğrayacaq və onun tayfası qiyamətə qədər .hakimiyyətdə olacaqlar

?Padşah dedi: Qiyamət günü nə vaxtdır

Şeq dedi: O elə bir gündür ki, rəhbər insanlar həmin gün əməllərinin cəzasını alarlar, diri və ölülərin eşidə biləcəyi tərzdə göydən səslər ucalar və o gün bir an ərzində camaatı bir yerə yığarlar və o gün ancaq pəhrizkar insanlar xoşbəxt olarlar. Padşah ?dedi: Həqiqətənmi dediklərin olacaq

Şeq dedi: And olsun yer ilə göy və onların arasında olan hər bir eniş və yoxuşun .Allahınaki dediklərim doğrudur və heç bir şəkk şübhədə yoxdur

Sətih və Şeqin sözləri (hər ikisi eyni sözü söyləmişdi) Rəbiət ibn Nəsrin ürəyinə qorxu saldı. Məhz buna görədə öz ailəsini toplayıb İraqa tərəf səfər etməyə hazırlaşdı. Onlar münasib bir yerdə məskunlaşmaq üçün Fars padşahı Xerzazın oğlu Şapura məktub .yazdı və o da öz növbəsinə onları Hirə(۱) adlanan yerdə yerləşdirdi

Neman ibn Münzər Rəbiət ibn Nəsrin məşhur övladlarındandır



---

Hirə"Qədim zamanlarda (islamdan öncə) Kufə şəhərinin (cənub tərəfindən) ۵" . [۱] -۱

kilometrliyində yerləşən abad və gözəl şəhərlərdən biri olmuşdur. Burada Ləxm padşahları hakimiyyətdə idilər ki onlardan biridə Neman ibn Munzər idi.Tarixçilərin dediyinə görə bu şəhərin əsası miladi tarixi ilə ۱۹۵ ci ildə qoyulubdur. Ləxm padşahları ۴۰۰ ilə yaxın orada hökmranlıq etdilər. Sasanilər sülaləsi ərəblər tərəfindən suquta uğradıqdan sonra “Hirə”şəhəri miladi tarixi ilə ۶۳۳- cü ildə Xalid ibn Vəlid tərəfindən fəth edildi. Zaman ötdükcə bura torpaq təpələrinə çevrilərək tarixin bir küncündə dəfn olundu. Hər halda ərəb şairlərinin bu şəhərin gözəllikləri haqqında söylədiyi şerlərdən bu nəticəni almaq olur ki, “Hirə” şərqin ən gözəl şəhərlərindən biri olmuşdur. Bu şəhərin “Hirə” adlanmsını isə belə izah edirlər ki növbəti səhifələrdə haqqında danışacağımız Həssan ibn Tə'b Xorasana gedərkən qoşunun yorulan bir hissəsinə . üzünü tutub dedi: ”Hirvabə”yəni burada dayanız

və onun Rəbiəyə qədər olan şəcərənaməsi bu minvalladır. Neman ibn Munzər ibn .Neman ibn Munzər ibn Əmr ibn Ədi ibn Rəbiət ibn Nəsr

.Bəziləri isə Neman ibn Munzər ibn Munzər deyiblər

**Təb adı ilə tanınan «Təban**

...Əsədin» Yəmən vilayətini

Təb adı ilə tanınan «Təban

Əsədin» Yəmən vilayətini istila etməsi və

Yəsrib şəhərinə hücum etməsi haqqında dastan

Rəbiət ibn Nəsr vəfat etdikdən sonra bütünlüklə Yəmən hakimiyyəti Əbu Kərb ləqəbli Təban Əsədin oğlu Həssanın əlinə keçdi. Bu Təban Əsəd həmin sonuncu "Təb"dir. Onun atsaı isə Kəli Kərbdir. Kəli Kərb isə I Təb adlanan Zeydin oğludur.(١) Zeydin şəcərəsi beş vasitə ilə kiçik Səbə, iyirmi iki vasitə ilə böyük Səbə və iyirmi üç vasitə ilə .isə Yərəb ibn Qəhtana gedib çıxır

Təban Əsəd "Həssanın atası" Mədinəyə gəldi və orada yaşayan iki yəhudi əhbarını (din aliminimütərcim) da özü ilə Yəmənə apardı. Məkkədə Kəbə evini təmir edərək üzərinə .pərdə çəkdi. Onun hakimiyyət illəri Rəbiə ibn Nəsrdən əvvəlki illərə təsadüf edir

Təban Əsədin Mədinə camaatına qəzəbi tutmasının səbəbi bu idi ki o Məşriq istiqamətində gedərkən Mədinədə olmuş və oranın əhalisinə toxunmadan ötüb keçmişdir. Oradan ötərkən onların arasında öz övladlarından birini canişin olaraq saxlamışdı. O gedəndən sonra, Mədinə əhalisi pusqu qurub Təbin oğlunu öldürdülər. Təb bu hadisəni eşitdi. O, məşriq səfərindən qayıdarkən Mədinəyə gəlib oranı xarabazara çevirməyi, əhalisini məhv etməyi və xurma ağaclarını kəsməyi qərara aldı. Belə olduqda BəniNəccar tayfasının qardaşı övladları olan bir dəstə insan (onların qəbiləsindən «Mədinə ənsarları» meydana gəldilər) anasının adı Telət, atasının adı isə .Müaviyyə ibn Əmr... olan Əmr ibn Telətin rəhbərliyi altında bir yerə toplaşdılar

Bundan başqa onların Əmr ibn Məbzul (Məbzulun adı

---

Burada İbn Hişam Həssan ibn Təbdən Yərəb ibn Qəhtana qədər olan təqribən . [۱] -۱ iyirmi altı əcdadının adını qeyd edibki maraqlananlar kitabın ۱۹- ۲۰- ci səhifələrinə .müraciət edə bilərlər

Amir, Amir isə Malik ibn Nəccarın övladıdır – Nəccarın adı Timullahdır – Timullah Söləbə ibn Əmr ibn Xəzrəcin... övladıdır) övladlarından olan bir rəhbərləri də var idi. Bunların hamısı Təb ilə döyüşə hazırlaşırdılar. Bu arada (baş verən digər bir hadisə Təbin daha çox qəzəblənməsinə səbəb oldu. O, hadisə isə belə idi) Ədi ibn Nəccar qəbiləsindən «Əhmər» adlı bir kişi Təbin tərəfdarlarından birini qətlə yetirdi. Onu öldürməsinin səbəbi isə belə olmuşdu. Əhmər o kişinin ona məxsus olan xurma ağacının salxımını kəsdiyini görüb, ağac budamaq üçün əlində tutduğu oraqla onu vurub öldürdü və dedi: «Xurma onu böyüdüb qulluğunda durana məxusdur». Bu hadisə Təbin Mədinə camaatına qarşı qəzəbinin daha da artmasına səbəb oldu, hər halda onlar arasında döyüş baş verdi. Ənsarın dediyinə görə bunlar gündüzlər Təblə döyüşə atılar, gecə olan kimi isə (xurma və azuqə göndəməklə) Təb və qoşununa (buna görə ki Təb və ordusu onların qonaqları hesab olunur və qoşunun azuqəsi də tükənmişdi) yardım edərdilər. Onların bu davranışı Təbin təəccübünə səbəb oldu və dedi: And olsun .Allaha ki həqiqətən bunlar alicənab və səxavətli insanlardır

Təb ilə Mədinə camaatı arasında döyüşlər davam edərkən BəniQərizə tayfasından olan iki yəhudi din alimi (bu qərizə də Hədl kimi tanınan Nəzir, Nəccam və Əmr kimi hamısı Xəzrəc ibn Sərihin övladlarıdır ki söy kök etibarı ilə Qahəs ibn Lavi ibn Yəqub (ə) peyğəmbərə gedib çıxır və Yəqub (ə) peyğəmbər isə İshaq (ə) ibn İbrahim Xəlilur–rəhmanın (Allahın dostu – mütərcim) övladıdır. Xülasə bu iki nəfər Yəhudilərin böyük alimlərindən idi. –) Təbin Mədinə şəhərini xarabazara çevirmək və əhalisini məhv etmək fikrində olduğunu eşitdikdə onun yanına gəlib dedilər: Ey padşah bu qərardan vaz keç və bu fikri başından at. Çünki, əgər bu fikri yerinə yetirməyə israr etsən gözəgörünməz qüvvə sənin bu işi yerinə yetirməyinə maneə olacaq və qorxuruq ki, bu .əmələ görə cəzalanarsan

?Təb soruşdu: niyə

Dedilər: Ona görə ki bu şəhər axiruzzəmanda müqəddəs Qüreyş (tayfasından– mütərcim) dən (əzəmətli Məkkədən) olan

!bir peyğəmbərin hicrət edəcəyi bir yerdir və bu şəhər onun evi və mənzili olacaq

Təb onların bu sözlərindən heyrətə gəlib başa düşdü ki, onlar sahib olduqları elm üzündən bu xəbəri verirlər. Buna görə də Mədinəni xarabazara çevirmək fikrindən )daşınıb, o iki yəhudi aliminin sözlərini dinləyərək onların dinini qəbul etdi. (١

Bu döyüş haqda Mədinə ənsarlarından bir şair şerlər yazmış və o şerlərdə həmin şair Xalid ibn Əbdülüzza Əmr ibn Telətin varlığı ilə iftixar etmişdir. (٢) Ənsarın bu qəbiləsinin (Əmr ibn Telətdə həmin tayfadandır) etiqadına görə Təb Mədinə şəhərində olan yəhudilərə qəzəblənmiş və onları məhv etmək fikrinə düşmüşdü və bunlar (yəni ənsar) onu bu işdən daşındıra bildilər. Bu barədə şelər də söylənilib ki o şerlərin birindən bu mətləb istifadə olunur. Ancaq ibn Hişamın dediyinə görə işarə etdiyimiz şer qurama və .saxta şer olduğuna görə, qalanlarını da rəvayət etməkdən imtina etmişdir

...TƏBİN YƏHUDİ DİNİNİ QƏBUL ETMƏSİ, KƏBƏ EVİNƏ

## TƏBİN YƏHUDİ DİNİNİ QƏBUL ETMƏSİ, KƏBƏ EVİNƏ PƏRDƏ HƏDİYYƏ ETMƏSİ VƏ KƏBƏYƏ GÖSTƏRDİYİ EHTİRAM

İbn İshaq deyir: Təb və onun tayfası bütpərəst insanlar idi. O, Mədinə şəhərini xarabazara çevirmək fikrindən daşındıqdan sonra (deyilən ardıcıllıqla) Yəmən istiqamətində irəliləyərək yolunun üstündə yerləşən Məkkə şəhərinə tərəf istiqamət aldı. O, irəliləyəirəliləyə «Əmc» və «Osfan» kəndlərinin arasına



---

Bəzi tarixlərdə qeyd olunur ki, Təb o iki yəhudi alimini dinlədikdən sonra . [١] -١ peyğəmbərə iman gətirib, bu barədə şerlər də söylədi ki o cümlədən bu iki şer də Yəni شهدت على احمد انه رسول من الله بارى النسم فلو مد عمرى الى عمره لكنت وزيرا له و ابن عم .onlardandır Şəhadət verirəm ki, "Əhməd" canlıların yaradıcısı olan Allah tərəfindən göndərilmiş peyğəmbər və elçidir. Əgər mənim ömrüm onun vaxtına qədər uzansa onun vəziri və .(əmisi oğlu olacağam (yəni vəzir və əmioğlu kimi ona kömək edəcəyəm

Adı çəkilən ərəb şerlərinin mətnlərindən agah olmaq üçün ٢٢- ٢٣- cü səhifələrə . [٢] -٢ .müraciət edə bilərsiniz

çatdı.(١) Orada Hüzeyl ibn Mədrəkə ibn İlyasın tayfasından bir neçə nəfər onun yanına gələrək dedilər: Ey padşah səndən öncə yaşayan padşahların belə, xəbərsiz olduğu xəzinə və vardövlət dolu bir ev haqda sənə məlumat verəkmi? Elə evki ora (qiymətli növbənöv cəvahiratlar) qızıl, gümüş, yaqut, dürr, zebərcədlə (xrizolit) doludur.

Təb dedi: Əlbətdə

Dedilər: O ev Məkkə şəhərindədir. Həmin yerdir ki Məkkə camaatı ona pərəstiş edib, ətrafında namaz qılarlar. Əlbətdə Hezli tayfasından olan bu bir neçə nəfər kişinin həmin sözləri deməkdən məqsədi bundan ibarət idi ki Təbi həlak və məhv etsinlər. Çünki onlar bilirdilər ki hər hansı bir padşah Kəbə evini viran etmək istəyibsə özü məhv olub, onlar bununlada Təbi bu fikrə salaraq məhvinə nail olmağa çalışırdılar.

Təb onların sözlərini eşitcək bu işə hazırlaşdı və məsləhət üçün o iki Yəhudi aliminin yanına adam göndərib onların fikirlərini soruşduqda, alimlər dedilər: Bu camaat səni və ordunu məhv etmək fikrindədirlər. Çünki bizim Allahın yer üzərində bu evdən savayı digər bir evi özü üçün ixtiyar etdiyi haqda məlumatımız yoxdur. Əgər bunların dediyini etmək istəsən özün və bütün tərəfdarların məhv olacaq.

Təb dedi: Dediyiniz bu vəziyyətdə mən Məkkəyə daxil olan vaxtı o evə qarşı necə münasibət göstərməliyəm?

Dedilər: Məkkə camaatının yerinə yetirdiyi hərəkəti, yəni onun ətrafına təvaf (dövrə vurmaq– mütərcim) edərsən, təzim və ehtiram üçün lazım olan işləri yerinə yetirərsən, başını qırxdırar, habelə özünü o evin qarşısında kiçildib, təvazö etməli və bu davranışı Məkkə şəhərini tərk edənə qədər etməlisən.

Təb dedi: Bəs siz özünüz nə üçün dediyinizə əməl edib, Məkkə şəhərinə gəlmirsiniz? Dedilər: Xəbərin olsun ki, and olsun Allaha o evi atamız İbrahim inşa edib, (əhəmiyyət və ehtiram baxımından) və sizə dediyimiz kimidir. Amma oranın əhalisi yerinə yetirdikləri rəftar ilə yanaşı bizim o evi ziyarət

Əmc» Mədinə istiqamətində bir kənddir, Osfan isə Məkkədən otuz altı mil aralı» . [١] -١
.bir kənd idi. Bəzilərinin dediyinə görə Osfan kəndi Məkkə ilə Cəhfə arasında yerləşir

etməyimizə mane olurlar. Onlar evin kənarında (Kəbə evi nəzərdə tutulurmütərcim) bütlər qoyub, qurbanlıq adı altında o evin kənarında qan tökmələrinə baxmayaraq, .özləri murdar və müşrik insanlardır

Buna oxşar sözlərdə dedikdən sonra Təb bildi ki onlar doğru söyləyir və xeyirxahlıqdan başqa məqsədləri yoxdur. Belə olduqda Təb əmr verdi ki, bir neçə Hezli (tayfasından) kişini gətirib əlayağını kəssinlər. Sonra özü Məkkə şəhərinə daxil olub, Kəbə evini təvaf edib, qurban kəsib, başını qırxdırdı. Deyilənlərə görə altı gün Məkkə şəhərində qaldı, hər gün qoyun və dəvə kəsdirib, Məkkə əhalisinə yedizdirirdi, habelə .onlara bal da verirdi

Nəhayət yuxuda gördü ki Kəbə evini örtüklə örtübdür. Ayılan kimi göstəriş verdi ki .xurma lifindən Kəbə evini örtsünlər

İkinci dəfə yuxuda gördü ki daha yaxşı bir parça ilə Kəbə evini örtübdür. Bu yuxudan sonra isə göstəriş verdi ki, yenidən onu Muaferi parçası ilə (Yəməndə toxunan parça .növü idi) örtsünlər

Üçüncü dəfə yuxuda gördü ki, əvvəlkilərdən də daha yaxşı bir parça ilə Kəbə evini örtübdür. Bundan sonra göstəriş verdi ki «Məla» və «Vəsail» (hər ikisi o zaman Yəməndə toxunan ən yaxşı parçalardan idi) parçaları ilə evi örtsünlər. Deyilənlərə görə: O, əvvəlinci şəxsdir ki, Kəbə evini örtüklə örtübdür. Hər halda bu işdən sonra o, evin təmizlənməsini Corhəm qəbiləsindən olan öz valilərinə tapşırdı. Habelə tapşırdı ki, qan, murdar, heyz qanına bulaşmış əski və heyzli qadınları o, evə yaxın qoymasınlar. O, ev .üçün qapı və qıfıl düzəltdi

Əbdül Manaf ibn Kəbin(۱)... yanında olan Uhibb ibn Zəbinənin qızı Səbiə öz oğlu Xalidə Kəbə evinin ehtiramı haqqında şer formasında sözlər söyləmişdir ki bu şerlərdə Təb və (onun Kəbə evi qarşısındakı təvazökarlığından söhbət açılır.(۲



---

İbn Hişam Səbiənin şəcərəsini Qeys ibn Eylana qədər və Əbdül Monayın . [۱] -۱ şəcərəsini isə Nəzr ibn Kənanəyə qədər burada qeyd edib ki, maraqlananlar kitabın I

.cildinin ۲۵- ci səhəsinə müraciət edə bilərlər

Şerlərin mətnindən xəbərdar olmaq istəyirsinizsə kitabın ۲۵- ۲۶ cı səhifələrə . [۲] -۲ .müraciət edə bilərsiniz

Təb bu işi yerinə yetirəndən sonra öz qoşunları və iki yəhudi alimi ilə Yəmənə tərəf yola düşdü. O beləcə irəliləyərək Yəmənə daxil oldu. Oraya çatan kimi camaatı özünün qəbul etdiyi Yəhudi dininə dəvət etdi. Onlar qəbul etmədilər. Nəhayət qərara alındı ki Yəməndə adət halını almış "öz haqqını isbat etmək üçün od yandırmaq" vasitəsilə .tərəflərdən hər biri öz məzhəbinin haqq olmasını isbat etsinlər

İbn İshaqın rəvayətinə görə: Təb Yəmənə daxil olanda Humeyr tayfası onun Yəmənə daxil olmasına maneə olub dedilər: Bizim dinimizi tərk etdiyinə görə bura daxil ola bilməzsən. Təb isə onlara, onun qəbul etdiyi dini qəbul etmələrini təklif etdi. Onlara bu din sizin dindən yaxşıdır deyə müraciət etdi. Camaat dedilər: Hansı dinin daha yaxşı .olmasını isbat etmək üçün odun yanına mühakiməyə gedək! Təb bu təklifi qəbul etdi

Yəmən əhalisinin dediyinə görə «od cərəyanı» bundan ibarət idi ki, hər vaxt oranın camaatı hər hansı bir mətləb haqqında ixtilaf etdikdə o oda pənah aparardılar. Və qeyd etdiyimiz od zülm və haqsızlıq edən şəxsi ağuşuna alar məzlum və haqqı .tapdanana isə heç bir ziyan yetirməzdi

Məsələnin belə olduğunu görən Yəmən camaatı öz bütlərini və nəzərlərində müqəddəs bildikləri şeyləri özləri ilə götürüb od yerinə getdilər. O, iki Yəhudi alimi isə öz səmavi kitabını boynuna asaraq oraya gəldilər. Onlar odun çıxdığı yerdə əyləşdilər. Od öz yerindən çıxıb Yəmən əhalisinə tərəf hərəkət etdi. Onlar odu öz qarşılarında görcək fəryad edib, qorxdular. Ancaq orada olan digər camaat onlara ürəkdirək verib səbrli olmağa səslədilər. Onlar da odun qarşısında müqavimət göstərdilər. O vaxta qədər ki od onları və özləri ilə gətirdikləri bütün bütlər və şeyləri qərq edib yandırdı. Boyunlarından səmavi kitab asan o iki Yəhudi alimi isə tər tökə-tökə oranı tərk etdilər. Bu hadisə Humeyr tayfasının Təbin dinini qəbul etməsinə səbəb oldu. Yəhudilər Yəməndə beləcə kök atdılar. İbn İshaq deyir: Digər bir rəvayətdə isə bu cür deyiblər: O, iki

Yəhudi kişi Humeyr qəbiləsinin insanları ilə qərar qoydular ki, oda tərəf gedib, onu geri qaytarsınlar və dedilər: Hər kim odu öz yerinə qaytara bilsə onun sözü haqdır. Bu zaman Hümeyr tayfasının bir qrupu özləri ilə gətirdiyi bütlərlə oda yaxınlaşıb onu geri qaytarmaq istədilər. Onlar odun şöləléndiyini görüb onları qərq etmək istədiyini başa düşüb geri çəkilib onu çıxdığı yerə qaytara bilmədiyini başa düşdülər. O iki, alim kişi isə oda yaxınlaşıb Tövratı oxumağa başladılar. Bu zaman od geri çəkildi. Həmin iki alim də irəli getdilər. O vaxta qədər ki od öz çıxdığı yerə qayıtdı. Humeyr tayfası vəziyyəti belə «gördükdə Təbin dinini qəbul etdilər. «Daha doğrusunu Allah bilər

## RİAM EVİ VƏ ONUN VİRAN EDİLMƏ HADİSƏSİ

İbn İshaq deyir: Yəməndə Riam adlı bir ev vardı ki camaat bütpərəst olan vaxtı oraya ehtiram qoyub, təzim edər və orada qurbanlıq kəsərdilər. Oradan bir səs yüksələr və camaatla danışardı. O iki Yəhudi alimi Təbə dedilər: Şübhəsiz ki, bu səs şeytanın səsidir. Və odur ki camaatı bu yol ilə zəlalətə sürükləyir. Bu evə münasibətdə öz bildiyimiz kimi rəftar etmək üçün bizə icazə ver. Təb dedi: özünüz bilərsiniz, istədiyinizi edə bilərsiniz. Yəmən camaatının dediyinə görə o iki nəfər həmin evin arasından qara bir iti çıxarıb öldürdülər. Sonra oranı viran etdilər. Deyilənlərə görə qurbanlıq qanın .izləri görünən evin qalıqları indi də mövcuddur

## ...YƏMƏNDƏ TƏB OĞLU HƏSSAN HAKİMİYYƏTİ VƏ

YƏMƏNDƏ TƏB OĞLU HƏSSAN HAKİMİYYƏTİ VƏ ONUN QARDAŞI ƏMR TƏRƏFİNDƏN ÖLDÜRÜLMƏSİ

Təbdən sonra övladı Həssan hakimiyyətə gəldi. O, Yəmən əhalisini özü ilə götürüb, Hicaz və İrana tərəf hərəkət etdi. O, hərəkət edəedə İraqa və ya bəzilərinin dediyinə görə Bəhreynə çatdı. Orada Humeyr və digər tayfalar yol getməkdən yorulub öz yurdlarına qayıtmağı istədilər. Bu barədə Həssanın qoşununda olan Əmr adlı qardaşı ilə müzakirəyə başlayıb ona təklif etdilər ki qardaşın Həssanı öldür ki bizdə sənin haklimiyyətini qəbul edib, fərmanına əməl edək və qarşılığında sən də bizi öz .şəhərlərimizə qaytarasan

Əmr bu təklifi qəbul etdi və onlarla bu barədə əlbir olub, həmin planı həyata keçirdilər. Təkcə Zureyn Humeyri adlı bir kişi bu işə qarşı çıxıb Əmrunu bu işdən çəkindirməyə çalışsada o qəbul etmədi. Zureyn məsələni belə görcək özünün əks mövqedə durması ilə Allah dərgahında olan üzrü haqqında iki şer dedi.(١) Və onu bir məktuba yazıb möhürlədi və Əmrin yanına gəlib ondan xahiş etdi ki, onu əmanət kimi yanında saxlasın. Əmr qəbul etdi. Sonra o, Həssanı öldürüb adı çəkilən tayfaları da götürüb .Yəmənə qayıtdı

## ...ƏMRİN QARDAŞI HƏSSANI ÖLDÜRMƏSİNDƏN PEŞMAN

ƏMRİN QARDAŞI HƏSSANI ÖLDÜRMƏSİNDƏN PEŞMAN OLMASI VƏ ONUN HƏLAK OLAMASI

İbn İshaq deyir: Əmr Yəmən vilayətinə qayıdan kimi yuxusuzluq xəstəliyinə düçar oldu. Bu xəstəlik onu təngə gətirib taqətdən saldı. Bu xəstəliyin səbəbini həkim, münəccim və kahinlərdən soruşdu. Onlardan biri cavab olaraq dedi: And olsun Allaha ki hər kim sənin kimi qardaşı və ya qohumlarından birini öldürsə gözlərinə yuxu getməz və yuxusuzluq xəstəliyinə düçar olar. Əmr bu sözü eşitcək onu Həssanı öldürməyə vadar edən tayfa başçılarını öldürməyə başladı. Növbə Züreynə çatanda Züreyn dedi: Mən bəraət istəmişəm və bu işə razı deyildim. Həmin sənəd səndədir. Əmr dedi: O, hansı sənəddir? Züreyn dedi: Sənə verdiyim məktub idi. O məktubu gətirdikdə oradakı iki şeri görüb Züreyni azad etdi. Əmr başa düşdi ki həmin şəxs o vaxtlar öz nəsihətini etsədə amma o qəbul etməyibdir. Hər halda Əmr bu hadisədən sonra həlak oldu. Ondan sonra Humeyr tayfasının birliyi dağıldı və onlar pərakəndə .halda yaşamağa başladılar

## YƏMƏN VİLAYƏTİNDƏ ZUŞENATR ADI İLƏ TANINAN «LƏXNİƏNİN» HAKİMİYYƏTİ

Humeyr tayfasından Ləxniyə adlı bir kişi (baxmayaraq ki o, məmləkətin əhalisindən deyildi) onlara qalib gələrək rəhbərlərini



.Onun mətnindən agah olmaq üçün ٢٨- ci səhfəyə müraciət edə bilərsiniz . [١] -١

öldürdü və Yəmən əhalisini incitməyə başladı. Humeyr tayfasından bir kişi onu məzəmmət etmək üçün şerlər qoşdu.(۱) (Ancaq buna baxmayaraq o öz zülmünə davam edirdi). Zuşenatrın zülm və ədavətini bir kənara qoysaqda o, həm də çox bədəməl və pisəxlaq bir kişi olmaqla Lut peyğəmbərin tayfasının əməllərini (Pənah aparırıq Allaha homoseksual idimütərcim) təkrar edirdi. Məxsusəndə şahzadələrin arxasıyca adam göndərərdi ki onlar yüksəldikdə hakimiyyətə çatmasınlar. O, bu iş üçün ayrılmış otaqda bu pis işlə məşğul olurdu. Bu işi görüb qurtardıqdan sonra, otağın kəndarından qışqırar və ağzına bir misvak (diş fırçasımütərcim) qoyar və bununlada öz mühafizləri və qoşununa işin (pis əməlin) sona çatmasını bildirərdi.

Bir gün bu məqsədlə Təbin oğlu və Həssanın qardaşı Zunnəvasın ardıyca adam göndərdi. Zunnəvas qardaşı Həssan öldürülən vaxtı hələ balaca bir uşaq idi. O yavaşyavaş böyümüş xoşsima və ağıllı bir cavan olmuşdu. Ləxniyənin elçisi onun yanına gələndə Zunnəvas onu nə üçün çağırdığını başa düşdü. Buna görə də iti bir bıçaq götürüb ayaqqabısında gizlədərək Ləxniyənin yanına gəldi. O, pis əməl üçün Zünnəvasla tək qaldıqda, Zunnəvas ona hücum edərək başını kəsdi. Ləxniyənin kandarda fəryad çəkdiyi yerdə onun başını qoyub, misvakı da ağzına qoyaraq ordan enib çölə çıxdı.

Camaat onu gördükdə kinayə ilə hadisəni ondan soruşdular. O da cavabında kinayə ilə dedi: Bu barədə kəsik başdan soruşun.(۲) Onlar otağın kəndarına baxdıqda Ləxniyənin kəsik başını gördülər. Onlar Zunnəvasın ardıyca gələrək ona çatıb dedilər: Doğurdanda bizim canımızı bu alçaq insandan xilas edə bildiyin üçün təkcə sən hakimiyyətə layiqsən.



---

۱- [۱] . Sirənin ۳۰- cu səhifəsinə müraciət edə bilərsiniz.

۲- [۲] . Sirə kitabı və Təbərinin tarix əsərinin bu barədə istifadə etdiyi ifadə və cümlələr, qısa və anlaşılmaz olduğundan burada Əğaninin rəvayət etiyi ibarəti gətirik. ibarət belədir. فلما خرج ذو نواس و رکب ناقه له يقال لها السراب، قالوا : أرطب ام يباس؟ فقال : ستعلم الاحراس، است ذی نواس، است رطبان ام يباس

## YƏMƏNDƏ ZUNƏVAS HÖKMRANLIĞI

Bu minvalla Yəmən əhalisi Zunəvası (adı Yusif idi) özlərinə padşah seçdilər. Bütün Yəmən və Humeyr tayfaları onun hakimiyyətinə tabe oldular. O, Humeyrin axırıncı padşahı idi. Zunəvas habelə «Uxdud» əhvalatının sahibi olmaqla yanaşı Yəməndə uzun (müddət hakimiyyətdə olubdur. (Uxdud dastanını Allah quranda da bəyan edibdir

## NƏCRAN ŞƏHƏRİNDƏ XRİSTİAN DİNİ

(NƏCRAN ŞƏHƏRİNDƏ XRİSTİAN DİNİ(١)

Nəcranda Həzrəti Məsihin dinini qəbul edən və xalis niyyətlə bu dinə xidmət göstərib, "İncil" kitabına əməl edən insanlar var idi. Onların başçısı Əbdullah ibn Samir idi. Nəcran sakinləri olan bu insanların xristian dinini qəbul etməsinin səbəbi (halbuki oranın camaatı da digər ərəblər kimi bütpərəst idilər) Feyemyon adlı bir xristian kişinin oraya gəlib onları xristian dininə dəvət etməsi və onun təbliğatı nəticəsində onların bu .dini qəbul etmələri idi

Feyemyon və Salehin işinin başlanması, Xristian dininin Nəcranda yayılması və Vəhəb ibn Mənbənin rəvayətinə əsasən

## UXDUD SAHİBLƏRİNİN» DASTANI»

İbn İshaq Vəhəb ibn Mənbəyə istinadən rəvayət edir ki Nəcran şəhərində xristianlığın yayılmasının səbəbkarı Feyemyon adlı saleh, pəhrizkar, duası qəbul olunan bir kişi idi. O, şəhərlərə səyahət etməklə gününü keçirərdi. Bir yerdə tanınandan sonra oradan tanınmayan bir yerə köç edərdi. Peşəcə bənna və gül əkməklə məşğul bu şəxs adəti üzrə yalnız öz gündəlik güzəranını təmin edəcək qədər pul qəbul edərdi. Bazar günü .olanda işləməz çöllü– biyabana gedər namaz və ibadətlə məşğul olardı

Şam (indiki Suriya– mütərcim) kəndlərindən birində bu minvalla beləcə gizli (tanınmadan– mütərcim) ömr sürərdi. Həmin kəndin sakinlərindən Saleh adlı bir kişi bu barədə eşitdikdən sonra onda abidə qarşı rəğbət yarandı. Feyemyon

NƏCRAN � SƏNA (YƏMƏNİN INDIKI PAYTAXTI) ŞƏHƏRININ ON MƏNZIL . [١] -١ ARALIĞINDA YƏMƏNIN ŞİMAL DAĞLIQ ƏRAZILƏRINDƏ YERLƏŞƏN BIR ŞƏHƏRİN .ADI İDİ

.hara getsəydi Saleh o, duyuq düşməsin deyə gizlincə onun arxasıyca gedərdi

Adəti üzrə bazar günü Feyemyon ibadət etmək üçün kənddən çıxanda Salehdə gizlincə arxasıyca düşdü. Feyemyon namaz və ibadətə məşğul olan kimi Saleh bir küncdə gizlincə ona tamaşa etməyə başladı. Bu arada yeddi başlı böyük bir ilan Feyemyona tərəf hücum etdi. Feyemyon ilandan özünü qorumaq üçün Allahtaalanın .dərgahına dua etdi və ilan yerindəcə öldü

Saleh ilanı görmüş lakin ilanın Feyemyonun duası ilə öldüyünü bilmədiyindən, digər tərəfdən Feyemyona olan rəğbətinə görə öz gizləndiyi yerdən çıxıb qışqırmağa başladı: Feyemyon ilan! ilan! Feyemyon onun səsinə əhəmiyyət verməyərək namazını bitirdi. O, vaxt üzünü ona çevirib, bildi ki Saleh onun halından xəbərdardır. Saleh ona dedi: And olsun Allaha ki, mən dünyada heç bir şeyi sənin qədər sevmirəm və qərara almışam ki səndən ayrılmayam hara getsən məndə sənin arxanca gedəcəyəm. Feyemyon dedi: Bu iş bu asanlıqla başa gəlmir, yaxşı fikirləş əgər (çətinliklər qarşısında) müqavimət göstərməyə gücün çatacaqsa arxamca gəl. Saleh qəbul etdi o .kəndin əhalisi az- çox onun işindən xəbərdar idilər

Feyemyon adəti üzrə onun yanına gələn xəstələrə dua edər və onlar şəfa tapardı. .Amma əgər onu xəstənin yanına aparmaq istəsəydilər getməzdi

Bir gün kənd əhalisindən bir kişinin oğlu xəstə və kor olduğu üçün Feyemyonun yanına gələrək, oğluna şəfa vermək üçün onu xəstənin yanına aparsın. Ona dedilər: Feyemyon camaatın dəvəti ilə harasa gedən şəxslərdən deyil. Əksinə o elə bir şəxsdir ki, öz maaş və qazancını bənnalıq yolu ilə ödəyir. Qeyd etdiyimiz kişi vəziyyəti belə görüb öz evinə gəldi. Oğlunu otaqda yerləşdirərək onun üzərinə parça atdı. Sonra isə Feyemyonun yanına getdi və ondan xahiş etdi ki otaq düzəltmək üçün onunla birgə evinə gəlsin və otağı yaxından görsün. Feyemyon o kişinin arxasıyca yola düşdü, elə ki otağa daxil oldu ev sahibindən soruşdu: bu otağın tikilməsi üçün nə etmək istəyirsən? dedi: beləbelə! sonra otaqda yatan oğlunun

üzərindən parçanı çəkib dedi: Ey Feyemyon bu balaca oğlan Allahın bəndələrindən biridir. Gördüyün kimi xəstə və arıq (ya da kor) olubdur. Onun sağalması üçün Allah .Təalanın dərgahına dua et ki şəfa tapsın

Feyemyon dua etdi. Balaca oğlan yaxşılaşdı. Bu əhvalatdan sonra Feyemyon anladı ki camaat onun işindən agah olublar. Buna görə də o kənddən çıxdı. Saleh də onunla birgə kənddən çıxdı. Onlar beləcə Şam vilayətində gəzirdilər ki, nəzərlərini qədim və !böyük bir ağac cəlb etdi ki ağacın arasından bir kişi Feyemyon deyə qışqırdı

.Femyon ona cavab verərək dayandı

Kişi dedi: Uzun zamandır ki, mənim gözüm yoldadır. Hər gün özözümə deyirəm görəsən nə vaxt gələcəkdir? Nəhayət ki sənin səsin qulağıma çatdı və bildim ki sənsən. İndi isə səndən xahişim budur ki burada gözlə mənim işim qurtardıqdan sonra isə (mən dünyadan köçdükdən sonramütərcim) istədiyin yerə gedə bilərsən. Çünki mən indicə öləcəyəm! Bunu deyib dünyadan köçdü. Feyemyon orada dayanıb onu torpağa basdırdı. Sonra isə Saleh ilə bərabər ərəb vilayətlərinə tərəf yola düşdü. Ərəblər onları təqib etdilər. Nəhayət bir ərəb karvanı bu iki nəfəri tutub Nəcran şəhərinə gətirdi. Orada onların hər ikisini qul kimi satdılar. O vaxtı Nəcran əhalisi digər ərəblərin dininə sitayiş edirdilər. Onların arasında bir xurma ağacı var idi ki ona pərəstiş edərdilər. Hər il keçirilən bayram günündə o xurma ağacının yanına gələr öz arvadlarının zərzibalı, .qiymətli parçalarını o ağacdan asar və o günü axşama qədər orada qalardılar

Feyemyonu Nəcranın əyanəşrəflərindən biri aldı. Saleh də digər bir evdə qul kimi məskunlaşdı. Feyemyon qaldığı otaqda hər gecə ibadət etmək üçün qalxar və o otaq sübhə qədər çıraqsız işıqlanardı. Feyemyonun sahibi bu hadisəni gördükdə heyrətə gəlib Feyemyonun məzhəbi haqda soruşdu. Feyemyon məzhəbini söylədikdən sonra ona dedi: Siz (bu xurma ağacına sitayiş edirsiniz) batil yoldasınız, çünki bu ağac sizə nə bir ziyan nə də ki bir xeyir verə bilər. Əgər mən sitayiş etdiyim Allahdan istəsəm o ağacı məhv edər. Mənim Allahım şərik və bənzəri olmayan bir Allahdır. Qeyd etdiyimiz kişi (bu sözü

eşitcək) ondan bu işi yerinə yetirməsini istədi və ona dedi: Əgər bu işi edə bilsən mən .öz dinimdən əl çəkəcək və sənin dinini qəbul edəcəyəm

Feyemyon qalxıb dəstəmaz alaraq iki rükət namaz qıldıqdan sonra o ağac haqqında nifrin etdi. Allah küləyə əmr etdi. Külək o ağacı kökündən çıxarəb yerə atdı. Nəcran camatı vəziyyəti belə gördükdə Həzrəti İsa (ə) ın şəriət və dinini qəbul etdilər. Bunun arxasıyca digər şəhərlərdə Məsih dini üçün baş verən hadisələr burada da təkrarlandı. İbn İshaqın Vəhəb ibn Mənbədən ərəb qəbilələrinə xristian dininin nüfuz etməsi haqda .söylədiyi rəvayət bu idi

**... ƏSHABE UXDUD» VƏ ƏBDULLAH İBN SAMİRİN DİGƏR»**

ƏSHABE UXDUD» VƏ ƏBDULLAH İBN SAMİRİN DİGƏR RƏVAYƏTLƏR ƏSASINDA» SƏRGÜZƏŞTİ

İbn İshaq, Məhəmməd ibn Kəb Qərzi və digər Nəcran əhalisindən nəql etdiyi digər bir rəvayətdə isə Nəcran şəhərinə Məsihin dininin nüfuz etməsi hadisəsini bu cür şərh edir ki, Feyemyon Nəcran şəhərinə gəlməzdən öncə, Nəcran camaatı şirk və bütpərəstliklə günlərini keçirirdilər. Nəcran kəndlərinin birində (Nəcran o kəndə nisbət mərkəz sayılırdı) bir sehrbaz Nəcran əhlinin uşaqlarına sehrbazlığı öyrədirdi. Bu zaman Feyemyon tanınmaz formada o şəhərə gəldi və (məsələdən xəbərdar olmuşdu) Nəcran ilə bu kənd arasındaki yolda pərdə salıb ibadətə məşğul oldu. O, kəndə sehrbazlığı öyrənməyə oğlunu göndərənlərdən birinin adı Samir, göndərdiyi oğlunun adı isə Əbdullah idi. Əbdullahda digər Nəcranlı uşaqlar kimi hər gün kəndə gedərdi. O, Feyemyonun çadırına çatdıqda bir az dayanar və onun namaz və ibadətinə tamaşa edərdi. Bu zaman ona rəğbəti artdı və günlərcə onun yanında əyləşər və onun sözlərinə qulaq asardı, getgedə Məsihin dinini qəbul etdi və yeganə olan Allaha ibadət etməyə başladı. Tədricən Məsihin şəriət hökmlərini Feyemyondan öyrənərək dini .məsələlərdə alim və bilici oldu

Bir gün ondan xahiş etdi ki «esmi əzəmi» ona öyrətsin Feyemyon o adı ona öyrətməkdən imtina edərək dedi: Sən ona

dözməyə tab gətirməzsən, qorxuram ki, onu qorumaqda səhlənkarlıq edəsən. Əbdullahın atası yəni Samir gizlində olan bu hadisələrdən xəbərsiz idi. O, güman edirdi .ki, oğlu da digər uşaqlar kimi hər gün sehrbazın yanına gedib sehrbazlıq öyrənir

Əbdullah Feyemyonun «ismi əzəmi» ona öyrətməsindən imtina etdiyini və şagirdinin o, adı saxlamaqda süstlük edəcəyindən qorxduğunu görüb daha təkid etmədi və ayrı bir fikrə düşdü. O, ox çubuqları hazırlayaraq Feyemyonun ona öyrətdiyi Allah adlarının hər birini onlardan birinə yazdı. Sonra od yandırıb, oxları birbir oda atırdı. Eləki oxlardan birini atdı. Oxu oda ataratmaz, ox oddan çölə sıçradı və od şölələri ona təsir etmədi: Əbdullah bildi ki bu həmən «esme əzəmdir» buna görədə o adı qeyd edərək .Feyemyonun yanına gəlib ona dedi: Məndən gizlətdiyin «esme əzəmi» öyrənmişəm

?Femyon dedi: Hansıdır

.Ədullah həmin adı söylədi

?Femyon soruşdu: Bu adı necə öyrəndin

Əbdullah oxlar və od əhvalatını onun üçün izah etdi. Feyemyon dedi: Ey övlad bu adı .bildin, onu qorumağa çalış, özünü saxla, və güman etmirəm ki bu işə dözəsən

## ƏBDULLAH İBN SAMİRİN NƏCRAN ƏHALİSİNİ MƏSİH DİNİNƏ DƏVƏT ETMƏSİ

Bu hadisədən sonra Əbdullah ibn Samir nə vaxt ki Nəcran şəhərinə daxil olardı xəstə və dərdli insanların yanına gedər və onlara deyərdi. Əgər mən dua etsəm və sən bu xəstəlikdən şəfa tapsan mənim dinimi qəbul edərsənmi? Xəstə qəbul edərdi. O, da dua edərdi. Xəstə sağalan kimi Məsih dinini qəbul edərdi. Beləliklə Nəcranda olan xəstələr Əbdullahın yanına gələr onun duası ilə sağaldıqdan sonra Xristian dinini qəbul edərdi. Bu əhvalat Nəcran padşahının qulağına çatdıqda Əbdullahı yanına çağırıb ona dedi: Bu nə xoşagəlməz işdir ki özünə peşə seçmisən? Bizim şəhərin camaatını fəsada çəkib bizim və öz atalarının dini ilə mübarizəyə qalxmısan? Xəbərin olsun ki bu işin cəzası :olaraq səni tikətikə doğrayacağam. Əbdullah dedi

sənin bu işə gücün çatmaz və dediyin kimi edə bilməzsən. Nəcran padaşahı göstəriş verdi. Onu bir dağın yuxarısına aparıb, oradan aşağı atdılar. Əbdullah dağın aşağısına .düşdükdən sonra heç bir zədə almadan yerdən qalxıb öz yoluna düzəldi

Şahın göstərişinə görə onu insanı qərq edən dəniz sularına atdılar. Ancaq Əbdullah sağsalamat sudan çölə çıxıb, yenə də Məsih dininin təbliğinə məşğul oldu. Nəhayət Əbdullah Sultana dedi: And olsun Allaha ki, sən heç bir vasitə ilə məni öldürə bilməyəcəksən. Yox əgər sən mənim dinimə gəlib böyük Allahın birliyinə ibadət etsən o vaxt mənə qalib olacaqsan və bu zaman məni öldürə bilərsən! Padşah bu sözü eşitcək Allaha iman gətirib, Allah Təalanın təkliyinə şəhadət verdi. Sonra isə əlində ki əsa ilə Əbdullahın başına vurdu. Əsa Əbdullahın başını yardı. Əbdullahın yarası o qədər ağır olmasada Əbdullah o yara ilə dünyasını dəyişdi. Əbdullah dünyadan köçdükdən sonra .elə o saat padşah da dünyasını dəyişdi

Nəcran camaatı məsələni belə gördükdə hamısı Əbdullah ibn Samirin dinini qəbul etdilər. Həzrəti İsa (ə) peyğəmbərin şəriət və İncilini qəbul etdilər. Beləliklə Nəcran .şəhərinin əhalisi Xristian dinini qəbul etdilər

İbn İshaq deyir: Bu Qərzli Muhəmməd ibn Kəb və digər Nəcran əhalisinin bəzilərinin Məsih dininin Nəcran şəhərinə nüfuz etmə cərəyanı haqqındakı dastan idi. Daha .doğrusunu Allah yaxşı bilər

Zunəvasın Nəcran şəhərinə gəlməsi və Məsih dininin ardıcılları üçün od xəndəkləri qazdırması

Bu hadisədən sonra Zunəvas çoxlu qoşun ilə birlikdə Nəcran şəhərinə gəlib onları Yəhudi dininə dəvət edərək, əhalini Nəsrani dinindən çəkinməyə dəvət etdi. Zunəvas onlara xəbərdarlıq edərək bildirdi ki, ya Yəhudi dinini qəbul etməli, ya da ölümə hazır .olmalısınız. Nəcran camaatı ölümü qəbul etdilər, amma Yəhudi dinini qəbul etmədilər

Zunnəvasın göstərişinə əsasən onlar üçün arx formasında uzun xəndəklər qazaraq içərisində od yandırdılar. Camaatı onun kənarına gətirdilər. Bir hissəni odda yandırıb, bir hissəsini

qılıncdan keçirib və ya onların əl, ayaq və burunlarını kəsərək öldürdülər. Üstüstə .iyirmi min nəfəri öldürdülər

Zunəvas və qoşunu haqqında Allah Təala bu ayələri əziz İslam peyğəmbərinə (s) nazil etdi: « xəndək sahibləri qətl edildilər, o, xəndəklər ki çırpı ilə alovlandırılmışdı o, zaman onlar (xəndəklərin ) kənarında oturub, (öz əsgərlərinin) möminlərin başlarına gətirdiklərinə (müsibətlərə) tamaşa edirdilər. Onlardan (möminlərdən) yalnız yenilməz qüvvət sahibi, (hər cür) şükrə layiq olan Allaha

(iman gətirdiklərinə görə intiqam alırdılar.(١)

.Bəzilərinin rəvayətinə görə Əbdullah ibn Samir də Zunəvasın əli ilə öldürülübdür

## ÖMƏRİN XİLAFƏTİ DÖVRÜNDƏ ƏBDULLAH İBN SAMİRİN CƏSƏDİNİN AŞKAR EDİLMƏSİ

İbn İshaq rəvayət edir ki, Ömər ibn Xəttabın xilafəti dövründə Nəcran əhlindən bir kişi o, şəhərin xarabalıqlarında yer qazarkən təsadüfən Əbdullah ibn Samirin cənazəsi ilə qarşılaşdı. O, əyləşmiş və əlini yaranın üstünə qoymuş vəziyyətdə dünyadan köçmüş idi. Əlini yaranın üstündən çəkdikdə qan axmağa başlayar, əli sərbəst buraxdıqda isə yenədə həmin yaranın üstünə qayıdar və qan dayanardı. Barmağındakı üzüyün :qaşında yazılmışdı

«Rəbbiyəllah ربی الله »

yəni mənim pərvərdigarım bir olan Allahdır) Bu barədə Ömər ibn Xəttaba bir məktub) yazdılar. O da cavabında yazdı. Onu olduğu kimi saxlayın və həmən yerdə dəfn edib, .bədəninin üstünü örtün

## ... YƏMƏN MƏMLƏKƏTİNİN HƏBƏŞ (İNDİKİ EFİOPİYAMÜTƏRCİM) QOŞUNU

YƏMƏN MƏMLƏKƏTİNİN HƏBƏŞ (İNDİKİ EFİOPİYAMÜTƏRCİM) QOŞUNU TƏRƏFİNDƏN İSTİLA EDİLMƏSİ VƏ ZUNƏVASIN ÖLDÜRÜLMƏSİ

Qeyd etdiyimiz kimi Zunəvas Nəcran əhalisini Allaha pərəstiş etdiyinə görə odda yandırıb və qılıncdan keçirtməklə öldürdü. Onlardan «Sə'ba» qəbiləsindən «Dus Zu Sələban» adlı

Nəcran xristianı ata minərək qaçmağa müvəffəq oldu. Zunəvasın qoşunu onu təqib etdikdə, o, yolunu qumluq və səhralıqdan saldı. Qoşun onu təqib etməkdən aciz və .yorğun olduqlarından «Dus Zu Sələban» dan əl çəkərək geri döndülər

Zu Sələban, Zunnəvas və qoşunun qəzəbindən canını qurtardıqdan sonra Romaya tərəf yola düşdü. O, gəlib Roma padşahı Qeysərin sarayına çatdı. Zunəvas və qoşunundan Qeysərə şikayət etdi. Nəcranda öldürülənlərin intiqamını almaq üçün .Qeysərdən yardım istədi

Qeysər dedi: Sizin vilayət məndən uzaqda olduğu üçün mən birbaşa sizə kömək edə bilməyəcəm. Amma Həbəş padşahına bir məktub yazaram. O, həm xristian, həmdə .sizə yaxın və qonşu olduğundan onu sizə kömək etməyə səsləyərəm

Bu minvalla Həbəş padşahına bir məktub yazıb, onu Nəcran xristianlarına köməyə .səsləyib, Zunəvasdan onların qanının intiqamını almağı tapşırdı

Dus» Qeysərin məktubunu alıb, Həbəşə yola düşdü. Həbəş padşahı Nəcaşinin» sarayına çatıb, Qeysərin məktubunu ona verərək, Zunnəvasın zülmlərindən ona danışdı. Nəcaşi «Oryat» adlı bir sərkərdənin başçılığa ilə Əbrəhə də onların içərisində olmaqla yetmiş min nəfəri Yəmənə tərəf yola saldı. Oryat Nəcaşinin göstərişi əsasında Dus ilə birlikdə Həbəş qoşununu götürüb, dəniz yolu ilə hərəkət etdilər. Onlar gəmilərdən düşərək Yəmən sahillərinə çıxdılar. Digər tərəfdən Zunnəvas rəhbərliyi altında olan Humeyr və digər Yəmən tayfalarından təşkil olunmuş qoşunla Oryatla döyüşə gəldi. Döyüş başladıqdan sonra Zunnəvas və qoşunları Həbəş qoşunu qarşısında müqavimət edə bilməyərək qaçmağa başladılar. Zunnəvas özü və qoşununun bu məğlubiyyətini görməyə dözməyib, atla özünü dənizə vurdu. O, dənizin .coşğun dalğalarında qərq oldu. Bu minvalla Oryat Yəmən vilayətinə sahib oldu

Bu barədə Yəmən şairləri və eləcədə Zucədn, ibn Zebə və Əmr ibn Moed Yəkrəb kimi (digər vilayətin şairləridə şerlər qoşublar.(١



---

Şerin mətnindən xəbərdar olmaq üçün ۳۸- ۴۰- cı səhifələrə müraciət edə. [١] -١

İbn İshaq rəvayət edir: Bu hadisə ilə kahin « Sətih» və «Şeq»in Həbəş əhalisinin Yəmən (məmləkətinə gəlmələri haqda söylədikləri xəbərin doğru olması təsdiq olur.(١)

## ORYATIN ƏBRƏHƏ TƏRƏFİNDƏN ÖLDÜRÜLMƏSİ VƏ YƏMƏNDƏ ƏBRƏHƏ HAKİMİYYƏTİ

Qeyd etdiyimiz kimi «Oryat» Yəmən vilayətini istila etdi: Illərlə orada hakimiyyət etdikdən sonra onun qoşununda olan Həbəş əhalisindən Əbrəhə adlı birisi onunla mübarizəyə qalxıb, hakimiyyəti ondan almağa cəhd etdi. Yəməndə olan Həbəş əhalisi iki dəstəyə bölünərək bir dəstəsi Əbrəhəyə havadar çıxıb, digər dəstə isə Oryatı müdafiə etməyə başladılar. Əbrəhə tərəfdarları ilə birlikdə Oryatla döyüşə gəldi. Oryat da Əbrəhəni məğlub etmək üçün öz tərəfdarlarını götürüb döyüş meydanına getdi. İki qoşun bir-birinin qarşısında düzüldükdən sonra Əbrəhə Oryatın yanına bir nəfər göndərib ona belə bir təklif etdi ki, sən iki nəfər arasındakı döyüşə görə Yəmən əhalisinin birbirinin canına qıymasına və nəticə etibarı ilə məhv olmasına razı olmamalısan. Daha yaxşı olar ki, mən və sən hər ikimiz meydana gəlib döyüşə atılaq, .hansımız qalib gəlsək, Yəmən hakimi olub, qoşunun hamısı da ona tabe olsun

Oryat dedi: Bu ədalətli təklifdir. Hər ikisi meydana gəldilər. Əbrəhə kök və gödək boylu .olduğu halda, Oryat isə uzun və xoşsima bir insan idi

Əbrəhənin «Otudə» adlı bir qulu var idi. Əbrəhəni arxadan qorumaq üçün onuda özü ilə döyüşə apardı

Oryat Əbrəhə ilə qarşıqarşıya durduqdan sonra əlindəki yarağı Əbrəhənin başına tərəf endirdi. Ancaq həmin yaraq Əbrəhənin sifətinə dəyərək, onun qaş, burun və dodağını kəsdi. Buna görə də ona «Əşrəm» (yəni kəsilmiş) ləqəbi vermişdilər. «Otudə» Əbrəhənin arxa tərəfindən Oryata hücum edib onu öldürdü. Bu minvalla Əbrəhə .qoşunu özünə tabe edib Yəmən hakimi oldu

:Bu xəbər Nəcaşinin qulağına çatdıqda qəzəblənərək dedi



---

.Onların sözləri ٧- ٩ və ١٠- cu səhifələrdə qeyd edilmişdir . [١]-١

Əbrəhə mənim icazəm və göstərişim olmadan qoşun başçısına qiyam edərək onu öldürübdür. Nəcaşi and içdi ki Yəmənə gedib, Əbrəhəni tutaraq başının tükünü (yonacaq (onu bu cür tənbeh edəcək

Əbrəhə məsələdən agah olan kimi başının tükünü qırxdırıb, bir çantanı Yəmən torpağı .ilə dolduraraq Nəcaşi üçün göndərdi və ona belə yazdı

Ey padşah! Oryat sənin qullarından biri olduğu kimi məndə sənin qullarından biriyəm.» Bizim hər ikimiz sultanın göstərişlər və fərmanlarını icra etmək tərzində fikir ayrılığına düşdük. Əslində bizim heç birimizin saray fərmanları ilə mübarizəyə qalxmaq niyyətimiz yox idi. Digər tərəfdən mən Həbəş ordusunu idarə etmək işlərində ondan qüvvətli və siyasətcil olduğum üçün onu aradan götürərək işlərin idarəçiliyini ələ aldım. Padşahın Yəmən torpağını tapdalaması və mənim başımı qırxacağına and içdiyini eşitcək mən özüm başımı bütünlüklə qırxıb və Yəmən torpağını huzuruna göndərdim ki, mübarək ayaqların altında tapdalayasınız və beləliklə də padşah andına əməl etmiş .olur

Məktub və torpaqla dolu çanta Nəcaşinin əlinə çatdıqda Əbrəhənin intiqamından vaz keçib, ondan xoşu gələrək Yəmən padşahlığını ona tapşırdı. Nəcaşi Əbrəhəyə mənim .növbəti əmrim gələnə qədər orada ol deyə yazdı. Beləliklə Əbrəhə Yəməndə qaldı

## ƏSHABE FİL DASTANI VƏ KƏNANLI KİŞİNİN SƏRGÜZƏŞTİ

Əbrəhə Yəməndə hakimi mütləq olduqdan sonra, Səna şəhərində o zaman dünyada tayı-bərabəri olmayan bir məbəd (kilsəni) tikməyə başladı. Məbədin adını «Qəlis» qoyub, Nəcaşiyə yazdı: Ey Padşah! Mən burada sizin üçün bir məbəd düzəltmişəm ki məndən öncə heç bir padşah ona bənzər bir şey tikdirməmişdir. Mənim bu məbədi tikdirməkdən məqsədim budur ki onu elə əzəmətli edəm ki ərəblər öz həcc .mərasimlərində buraya gəlsinlər və beləliklə onları Məkkədən uzaqlaşdıram

Ərəblər bu məktubdan xəbərdar olduqda (Əbrəhənin kininə

əvəz olaraq) Kənanə qəbiləsindən, Nəsili(۱) bir kişi qəzəblənərək öz ölkəsindən Sənaya tərəf yola düşdü. O, birbaşa Qəlis məbədinə gələrək məbədi başdanayağa murdarladı. .Sonra isə oradan çıxıb öz məmləkətinə tərəf qaçdı

Cərəyanı Əbrəhəyə bildirdikdə soruşdu: bu işi eləyən kimdir? dedilər: Hər il ərəblərin həcc əməli yerinə yetirdikləri Məkkədə yerləşən məbədin tərəfdarlarından olan bir kişidir. O, sənin dediyin «mən istəyirəm ərəblərin həccini Səna məbədinə intiqal edəm» !sözünü eşidərək qəzəblənmiş və Səna məbədində bu işi görmüşdür

Əbrəhə hadisədən xəbərdar olduqdan sonra bərk heyrətə gələcək and içdi ki Məkkəyə gedib, Kəbə evini viran edəcək. Bu məqsədlə Həbəş qoşununu götürüb bir neçə fil ilə Məkkəyə doğru hərəkət etdi. Ərəblər bu xəbəri eşitdikdə, onlara Əbrəhənin Allahın evini (Kəbəni) dağıtmaq istəməsi fikri ağır gəlib onunla döyüşü vacib bildilər. Buna görə «Zu nəfər» adlı Yəmən böyüklərindən biri ayağa qalxıb öz qəbilə və tayfasını Əbrəhə ilə döyüşə çağırdı. O, digər qəbilələr və ərəbləri də təhrik edib, onları Allahın evinin müdafiəsi və o evi viran etmək istəyən biri ilə mübarizə etməyə səsləyərək, bir .dəstəni özü ilə birgə Əbrəhə ilə döyüşə apardı

Ancaq Əbrəhənin saysızhesabsız qoşunu qarşısında müqavimət göstərə bilməyərək məğlub olub, özüdə Əbrəhə döyüşçülərinə



---

۱- [۱] . İbn Hişam burada Nəsi ləqəbi ilə bağlı bir açıqlama versədə Əbrəhənin dastanına aidiyyəti olmadığı və ümumi oxucular üçün yorucu olduğunu nəzərə alıb onu rəvayət etməkdən vaz keçdik. Ancaq özümüzün qısaldaraq sizə təqdim etdiyimiz budur ki, Nəsi: O, şəxslər idilər ki cahiliyyət dövründə aylarını öz nəzərlərinə uyğun olaraq təxirə salar üç ardıcıl ay olan haram ayların haramlığını digər aylara atardılar və bu ayda onlara haram olan şeyləri halal bilər, onun yerinə halal aylardan birini yerləşdirərdilər. Məsələn: haram aylardan olan Məhərrəm ayının haramlığını halal aylardan biri olan Səfər ayına salardılar. Bu minvalla Məhərrəm ayında istədikləri əməlləri yerinə yetirərdilər. Mubarək bəraət surəsinin ۳۷ci ayəsi də bu məqsədlə əziz İslam peyğəmbərinə (s) nazil olmuşdur. (Həqiqətən, (haram ayələri) gecikdirmək

(məsələn, rəcəbi şəbana və ya zülqədə, zilhiccə və məhərrəmi gecikdirib səfərə, (yaxud başqa bir aya saxlamaq) küfrü artırmaqdırmütərcim " انما النسئ ز ی اه ف ی الکفر ".

əsir düşdü. Onu Əbrəhənin yanına gətirdikdə Əbrəhə Zu Nəfəri öldürməyə göstəriş verdi. Ancaq onu öldürmək istədikdə Zu nəfər dedi: Ey padşah məni öldürmə, bəlkə gələcəkdə sənə xeyrim dəyəki məni öldürməyindən daha faydalı ola. Əbrəhə mülayim .insan olduğundan onu öldürməkdən vaz keçib, həbs edilməsi barəsində göstəriş verdi

### NUFEYL VƏ ƏBRƏHƏ

Əbrəhə Zu Nəfəri məğlub edib onu əsir götürdükdən sonra Məkkə istiqamətində irəliləyərək Xəsəm yurduna çatdı. Orada Nufeyl ibn Həbib Xəsəmi, Xəsəm qəbilələri olan «Şəhran» və «Nahes» qəbilələri və onlarla birlikdə olan digər qəbilələrin sərkərdəsi kimi Əbrəhə ilə döyüşə atılsada, ancaq Əbrəhə onu da məğlub etdi. Nufeyl və qoşununu əsir edib, Əbrəhənin yanına gətirdilər. Onu öldürmək istədikdə dedi: Ey padşah məni öldürməsən ərəb yurdlarında sənə bələdçi olaram. Digər tərəfdən mən iki Xəsəm qəbiləsi olan «Şəhran» və «Nahesin» rəhbəriyəm. Əgər mən sənə itaət etsəm, .onlar da sənə itaət edəcəklər! Əbrəhə onu da öldürməkdən vaz keçdi

### İBN MOTƏB VƏ ƏBRƏHƏ

Əbrəhə Nufeylin bələdçiliyi ilə Məkkə istiqamətində irəliləyərək Taifə çatdı. Orada Səqif tayfasının ağsaqqalları ilə birlikdə Məsud ibn Mötəb (Səqif tayfasının kökü Moed ibn Ədnana çatırdı)(١) Əbrəhəni yolda qarşılayıb ona dedilər: Ey padşah! Biz hamımız əmrə itaət edən insanlarıq. Bizim şəhərimizdə olan məbəd sənin dağıtmaq məqsədilə ilə gəldiyin məbəd deyildir. Onların Kəbə evi qədər müqəddəs bilib ehtiram etdikləri məbəd Taif şəhərində inşa etdikləri «Lat» məbədi idi. Biz sənə o evə (Kəbə evini nəzərdə tuturdular – mütərcim) qədər bələdçilik edərik. Əbrəhə onların yanından ötüb yoluna düzəldi. Onlar da Əbu Roğal adlı bir kişini Məkkə şəhərinə qədər bələdçilik etmək üçün Əbrəhə ilə yola saldılar. Əbu Roğal



---

.Məğməs» Məkkənin dörd kilometrliyində bir yerin adıdır» . [١] -١

Əbrəhəni müşayiət edərək «Məğməs» adlı vilayətə çatdı. Oraya çatdıqdan sonra Əbu Roğal dünyasını dəyişdi. Onu orada dəfn etdilər. İndi camaat ora çatanda Əbu Roğalın .qəbrinə daş atırlar

## ƏSVƏD İBN MAQSUD TƏRƏFİNDƏN MƏKKƏ ƏHALİSİNİN MALLARININ QARƏT OLUNMASI

Əbrəhə Məğməsə çatdıqda Həbəş sərkərdələrindən biri olan Əsvəd ibn Məqsuda, Məkkəyə gedib Təhamə(١) yurdunda Qureyş və digərlərinin vardövlət və malqaralarını talan edərək onun yanına gətirməsini əmr etdi. Əsvəd ibn Məqsud Əbrəhənin əmri ilə Təhaməyə gəlib Qüreyşin mallarını o cümlədən Əbdülmüttəlib ibn Haşimin iki yüz dəvəsini Əbrəhənin yanına apardı. O, vaxt Əbdül Mütəllib Qüreyşin böyük və önəmli insanlarından hesab edilirdi. Buna görə Qüreyş, Kənanə, Hezyil, və Məkkədə olan digər tayfalar Əbrəhə ilə döyüşmək fikrinə düşdülər. Lakin onun qoşunun sayının çox .olduğunu bildikdə bu fikrdən daşındılar

## HƏNATƏ VƏ ƏBDÜLMÜTƏLLİB

Əbrəhə Hənatə Həmiri adlı bir şəxsi Məkkəyə göndərib ona belə bir göstəriş verdi. Məkkə əhalisinin rəhbərini axtarıb tapdıqdan sonra ona de: Mən sizinlə bura döyüşə deyil, yalnız Kəbə evini viran etməyə gəlmişəm. Əgər siz mənim niyyətimə qarşı çıxmasanız mən sizin qanınızı axıtmayacağam və əgər görsən ki mənimlə döyüşmək .fikri yoxdur onu mənim yanıma gətirərsən

Hənatə Məkkəyə gəlib soruşdu: Məkkənin rəhbəri kimdir? Dedilər: Əbdülmüttəlib ibn Haşim. Bundan sonra Əbdülmüttəlibin yanına gələrək Əbrəhənin dediklərini ona çatdırdı. Əbdülmüttəlib cavabında dedi: And olsun Allaha. Bizim Əbrəhə ilə döyüşmək fikrimiz yoxdur, bundan əlavə ona müqavimət etməyə qüvvəmiz də çatışmır. Bura Beytullahul-həram və İbrahim XəlilürRəhmanın (Allahın dostu – mütərcim) evidir. Bəs əgər AllahTəala öz evi və hərəmini Əbrəhənin viranından qorumaq



---

Təhamə Ərəbistanın elə bir hissəsidir ki, Məkkə və bəzi digər kənd və . [١] -١

qəsəbələrdə ora daxildir. Oranın Təhamə adlanmasının səbəbi havasının çox isti və hərəkətsiz olmasıdır. Çünki Təhamə lüğətdə təhm sözündən götürülüb, havanın istiliyi .və havanın hərəkətsiz olması mənasını daşıyır

istəsə, qoruyacaq və əgər qorumasa, and olsun Allahaki biz Əbrəhəni dəf etməyə .qadir deyilik

Hənatə dedi: Elə isə qalx onun yanına gedək, çünki mənə səni onun yanına aparmağı .əmr edibdir

Əbdülmüttəlib bəzi övladları ilə yola düşüb Əbrəhənin ordugahına çatdı. Əbdülmüttəlib Zu Nəfərlə qədimdən dost olduğu üçün onu axtarıb tapdı. Əsir olaraq zindana salınan Zu Nəfərlə görüşüb ona dedi: Ey Zu Nəfər bizə nazil olmuş bu bəlanı dəf etməkdə kömək edə bilərsənmi? Zu nəfər dedi: Əbrəhə kimi qüdrətli bir hökmdarın əlində əsir olan və hər gecəgündüz öz öldürülməsinin intizarında olan mənim kimi bir şəxs sənə necə kömək edə bilər. Təkcə sənə köməyim bu ola bilər ki mən Əbrəhənin filinə baxan «Əmis» ilə dost olduğum üçün onun yanına bir şəxs göndərib sənin yüksək məqam və şəxsiyyətini ona çatdırar və ondan xahiş edərəm ki sənin yüksək məqama sahib olduğunu Əbrəhəyə çatdırsın, və mümkün qədər Əbrəhənin yanında məqsədinə çatmağın üçün sənə kömək etsin. Əbdülmüttəlib buyurdu: Elə bu qədər kifayətdir. Bəs Zu Nəfər bir şəxsi Ənisin yanına göndərərək bildirdi ki, Əbdülmüttəlib bu vilayətin böyüyü və Qüreyşin başçısıdır. O, elə bir şəxsdir ki, bu tərəflərin insanlarına evlərində, çöl vəhşilərinə isə dağlarda yemək verir. İndi isə onun iki yüz dəvəsini qarət ediblər. Sən Əbrəhədən onunla görüşmək üçün icazə al və bacardığın qədər onu daha yaxşı .təqdim edərək arzusuna çatdır

Ənis xəbər gətirənə hər cürə münasib vəd verdikdən sonra Əbrəhənin yanına gedib dedi: Sənin yanına gələn bu kişi Qureyşin rəhbəri və bu vilayətin böyüklərindəndir. O, elə bir kəsdir ki bu tərəflərin camaatını evində və çöl vəhşilərini isə dağlarda yedizdirir. İndi isə görüş üçün icazə istəyir. Səndən xahişim budur ki onu muradına çatdırıb, .hörmətini saxlayasan. Əbrəhə icazə verdi və Əbdülmüttəlib daxil oldu

## ƏBDÜLMÜTƏLLİB VƏ ƏBRƏHƏ

### İŞARƏ

Əbdülmüttəlib xoşsima, gözəlüzlü və vüqarlı bir insan idi. Əbrəhə onun simasını, vüqar və heybətini görcək ona ehtiram etdi. Əbrəhə onu taxtının alt tərəfində otuzdurmağa rəva bilmədiyi və digər tərəfdən də Həbəş qoşunun yanında ona taxtının yanında yer vermək istəmədiyi üçün özü taxdan düşərək Əbdülmüttəlibin yanında yer üzərində əyləşdi. Sonra Mütərcimə dedi: ondan soruşki istəyi nədir? Mütərcim soruşub Əbrəhəyə dedi: Deyir ki mənim istəyim budur ki məndən qarət etdikləri iki yüz dəvənin .qaytarılması barəsində əmr verməyinizdir

Əbrəhə Tərcüməçiyə dedi: Ona de: İlk görüşdə sənin yaxşı siman, heybət və vüqarın məni özünə cəzb etdi. Ancaq etdiyin bu kiçik xahiş sənin heybətini azaltdı. Belə təhlükəli və həssas bir vaxtda mənimlə dəvələrin haqda söhbət edirsən, ancaq sənin ?və əcdadlarının məhv olmaqla üzbəüz olan ibadətgah evi haqqında danışmırsan

Əbdülmüttəlib cavabında dedi: Mən bu dəvələrin sahibiyəm, Kəbənin də öz sahibi .vardır və Kəbənin sahibi onu qoruyacaqdır

!Əbrəhə dedi: Bu gün heç bir qüvvə mənim Kəbəni viran etməyimin qarşısını ala bilməz

!Əbdülmüttəlib dedi: İndi bu sən, bu da Kəbə

Bəzilərinin rəvayət etdiyinə görə Əbdülmüttəliblə birgə ərəb tayfa başçılarından iki nəfər Bəni Bəxr tayfasının böyüyü Yəmər

ibn Nəfasə və Hüzeyl tayfasının başçısı Xuveyld ibn Vasilə də Əbrəhənin yanına getmişdilər. Bunların ikisidə Əbrəhəyə təklif etdilər ki Təhamə vilayətinin bütün vardövlətinin üçdə birini götürərək Kəbəni dağıtmaqdan vaz keçib Yəmənə qayıtsın. .Ancaq Əbrəhə qəbul etmədi: Daha doğrusunu Allah bilər

Hər halda Əbrəhə Əbdülmüttəlibin dəvələrinin ona qaytarılmasını əmr etdi. Əbdülmüttəlib qalxıb Qüreyşin yanına gələrək hadisəni Qüreyşə danışdı və onlara göstəriş verdi ki, hamınız Məkkədən xaric olub dağdərəyə pənah aparınız ki canınız .Həbəş qoşununun təhlükəsindən amanda qalsın

Sonra Əbdülmüttəlib bir neçə Qüreyşli ilə birlikdə Kəbəyə tərəf gəlib Kəbə qapısının halqasından tutub, yanındakılarla birgə dua və yalvarışa başladı. Onlar sızlar qəlb və ağlar göz ilə Allahdan istədilər ki Əbrəhə və qoşununu məğlub etsin.(١) Sonra başqaları kimi dağa tərəf yola düşdülər. Orada Məkkə əhli ilə Əbrəhənin Məkkə və Kəbə evinə .nə edəcəyini intizarla gözləyirdilər

## ƏBRƏHƏNİN MƏKKƏYƏ DAXİL OLMASI, ƏBRƏHƏ, FİL VƏ QOŞUNUNUN TALEYİ

Növbəti gün Əbrəhə Məkkəyə daxil olmağa hazırlaşdı. Fikirləşirdi ki, Kəbəni viran etdikdən sonra Yəmənə qayıtsın. «Məhmud» adlı filini hərəkət üçün, qoşunun isə hücum üçün hazırlanması barəsində göstəriş verdi. Fili Məkkəyə tərəf hərəkət etdirdilər. Nufeyl ibn Həbib Xəsəni (Əbrəhənin qoşununda idi ki bundan öncə əhvalatını qeyd etdik) filin yanına gələrək qulağını əlinə tutub, ona Ey Məhmud dizə çök (irəli getmə) ya da gəldiyin yerə sağsalamat qayıt ki bura Allahın evidir deyib filin qulağını buraxdı. .Birdən– birə fil dizə çöküb oturdu

Digər tərəfdən Nufeyl ibn Həbib özünü dağın başına yetirdi. Əbrəhənin qoşunu yatmış fili qalxmaq üçün vursalarda, ancaq fil qalxmadı. Təbərzini gətirib başına vursalar da yenə də yerindən qalxmadı. İti uclu əsalarla qarnının altına vursalarda yenə də



---

Burada ibn Hişam, Əsvəd ibn Maqsud barəsində Əbdülmüttəlib və Əkrəmə ibn . [١] –١ Amir ibn Haşim ibn Əbdülmanafdan şerlər rəvayət edir ki maraqlananlar sirənin ٥١– ci

yerindən tərpənmədi. Onu Yəmən tərəfə döndərdikdə qalxıb qaçmağa başladı. Məğrib tərəfə döndərdikdə qaçmağa başladı. Məşriq tərəfə döndərdikdə yenə də qaçırdı. .Ancaq elə ki Məkkə tərəfə döndərirdilər yerə çöküb, getməkdən imtina edirdi

Bu vaxt AllahTəala dəniz tərəfindən onların üzərinə qaranquşa oxşar quşlar göndərdi. Onların hər biri noxud və mərci boyda üç daş tutmuşdular. Biri dimdiklərində digər ikisi .isə ayaqlarında idi

Quşlar daş qırıntılarını qoşunun başlarına atırdılar. Bu daşların dəydiyi hər bir kəs ölürdü. Əbrəhənin qoşunu belə gördükdə gəldikləri tərəfə qaçmağa başladılar. Yolu tanımadıqları üçün Nüfeyli axtarırdılar ki Yəmən istiqamətini onlara göstərsin. Nüfeyl Allahın onlara endirdiyi əzabı gördükdə onların məzəmməti və Allahın etdiyi köməyliyə təşəkkür etmək üçün şer söyləyib,(۱) bələdçilikdən imtina etdi. Onlar da sərgərdan olub, hər biri bir tərəfə qaçır və ya bir çuxurda həlak olurdu. Əbrəhədə ilahi əzab və qəzəbdən amanda qalmadı, kiçik bir daşda ona dəydi. Əbrəhəni götürüb Yəmən tərəfə yola düşdülər. Ancaq dəyən o balaca daşın nəticəsində yavaşyavaş bədəninin əti tökülür, yerindən çirk və qan axırdı. Onu bu halda Sənaya çatdırdılar. Əbrəhəni oraya çatdırdıqda zəiflik və arıqlıqdan toyuq cücəsinə dönmüşdü. Nəql edilən rəvayətə görə .bu halda ürəyi partlayaraq dünyadan köçdü

İbn İshaqın rəvayətinə görə bu vaxta qədər qərb vilayətində çiçək və qızılca xəstəliklərinə, habelə “üzərik”, “qarpız” və “cəhl atası” kimi acı ağaclara rast .gəlinməmişdi. Həmin il ilk dəfə olaraq onların hamısına rast gəlindi

Allah – Təala əziz İslam peyğəmbərinə (Allahın salamı olsun ona və övladlarına) peyğəmbərlik verdikdən sonra Quranda Qüreyşin yaşayış və vəziyyətinin davam etməsi üçün Həbəş qoşununu pərakəndə etməsini Qüreyşə bəxş etdiyi nemətlərdən hesab edirdi. Bu haqda Fil surəsi nazil oldu. (Digəri isə Məkkə şəhərinin quraqlıq olduğuna görə məhsul vermədiyi üçün



---

Nufeylin şerinin mətnindən agah olmaq üçün Sirənin ۵۳ cü səhifəsinə müraciət . [۱] -۱ .etsinlər

məcbur idilər ki ildə iki dəfə yaşayışlarını təmin etmək üçün Yəmən və Şama səfər etsinlər ticarət vasitəsilə bu iki məmləkətdən faydalanaraq öz yaşayışlarını təmin etsinlər. Yəmənin havası isti olduğundan qışda Yəmənə yayda isə Şama səfər edərdilər). Məkkənin daxili vəziyyəti və yaşayışlarını təmin etmək üçün bu cür yaşamağa məcbur idilər. Ancaq Əbrəhə Məkkə şəhərinə hücum etdikdə bu əmniyyət təhlükə altına düşdü. Allah onları dəf etmək vasitəsilə bu təhlükəsizliyi onlar üçün bərpa etdi ki vəziyyətləri pisləşməsin. Bu mətləbi xatırlamaq üçün «Lilaf» surəsini nazil etdi.(١)

Ayişə rəvayət edərək deyir ki mən Məkkə şəhərində Həbəş ordusunun filini idarə edən iki kor olmuş şəxsi gördüm ki, yolçuluq ilə güzəranlarını keçirirdilər.

## BU HADİSƏDƏN SONRA QÜREYŞİN ƏRƏBLƏR YANINDA ARTAN ƏZƏMƏTİ

AllahTəala Əbrəhənin qoşununu əzab və bəlaya düçar edərək məhv etdikdən sonra, Qüreyşin ərəblərin yanında hörmətizzəti artdı. Ərəblər Qüreyşi Əhlullah (yəni Allahın əhalisi, Allaha məxsus olan camaat, Allahın sevimli camaatı– mütərcim) adlandırdılar. Çünki Allah onları müdafiə edərək, düşmənlərini məhv etmişdi. Ərəblər bu barədə bir çox şerlər qoşdular:

Misal olaraq ibn Zəbəri deyirdi:

تنكلوا عن بطن مكه انها

كانت قديما لايرام حريمها

Şerin sonuna qədər(٢)

İbn Əslət isə bu haqda deyir:

ومن صنعه يوم فيل الجيو

ش اذ كلما بعثوه رزم

:Şerin sonuna qədər

Bəziləri işarə etdiyimiz bu şerin Üməyyə ibn Əbissilət

səh:۶۰

---

İbn Hişam burada qeyd etdiyimiz mətləbi söylədikdən sonra iki mübarək surənin . [۱] -۱ lüğətləri üçün şərh və təfsirə başlayır. İbn Hişam bəzi halarda bir sıra ərəb şairlərindən .sitatlar gətirir ki, bizim mövzumuza aidyyəti olmadığı üçün onlardan imtina edirik

Qeyd etdiyimiz bütün şerlər və şairlərin soykökü haqqında sirənin ۵۷- ۶۱ ci . [۲] -۲ .səhfələrinə müraciət edə bilərsiniz

.tərəfindən yazıldığını qeyd ediblər

:Habelə İbn Əslət deyir

فقو موا فصلوا ربكم و تمسحوا

باركان هذالبيت بين الاخاشب

Şerin sonuna qədər

.Talib ibn Talib isə deyibdir

الم تعلموا ما كان الله فى حرب داحس

ش اذ كلما بعثوه رزم

Şerin sonuna qədər

:Əbussilət deyir

ان آيات ربنا ثاقبات

لايمارى فيهن الاالكفور

Şerin sonuna qədər

Şair Fərəzdəq, Həccac ibn Yusifi məzəmmət edərək şerlər qoşmuş və onlardan biridə

فلما طغى الحجاج حين طغى به

غنى قال انى مرتق فى السلا لم

Nəhayət gəlib bu hissəyə çataraq deyir

رمى الله فى جثمانه مثل مارمى

عن القبله البيضاء ذات المحارم

جنودا تسوق الفيل حتى اعادهم

هباءا و كانو مطر خمى الطراخم

.Şerin sonuna qədər

.İbn Rüqəyyat isə bu haqda deyir

كاده الشرم الذى حباء بافيل

كاده الشرم الذى حباء بافيل

Şerin sonuna qədər

## YƏMƏNDƏ YEKSUM VƏ MƏSRUQ HAKİMİYYƏTİ, SEYF İBN ZİYƏZƏNİN QİYAMI VƏ «VEHREZİN» GƏLİŞİ

Əbrəhə həlak olduqdan sonra övladı Yeksum hakimiyyətə gəldi. Ondan sonra isə .qardaşı Məsruq ibn Əbrəhə Yəmən padişahı oldu

Yəmən əhalisi bu illər ərzində Həbəş qoşunlarının qüdrəti altında çətinliklə yaşayırdılar. Onların hakimiyyətinin uzun olduğuna görə Həmir tayfasından Əbu Mərrə ləqəbli Seyf ibn Ziyəzən, Yəməndən Romaya gələrək padşah Qeysərin sarayına yollandı. Yəmən camaatının dözülməz vəziyyəti və Həbəş hökmranlarının etdiyi zülmlər haqqında Qeysərə danışdı. Qeysərdən Yəmənə qoşun göndərməsini Həbəşiləri oradan qovmağı və hakimiyyəti istədiyi adama həvalə etməsini xahiş

etdi. Qeysər onun sözünə əhəmiyyət vermədi. Seyf ibn Ziyəzən incimiş halda oranı .tərk etdi

### ...SEYF IBN ZIYƏZƏNİN NEMAN IBN MÜNZƏRDƏN YARDIM İSTƏMƏSİ VƏ

SEYF IBN ZIYƏZƏNİN NEMAN IBN MÜNZƏRDƏN YARDIM İSTƏMƏSİ VƏ... NEMANIN İRAN PADŞAHI NUŞİRƏVANIN YANINDA ONA VASİTƏÇİLİK ETMƏSİ

Seyf ibn Ziyəzən, Qeysərin yanından çıxıb birbaşa İran padşahı Ənuşirəvanın tərəfindən Cirə yurdunda hakimlik edən Neman ibn Münzərin yanına getdi. O, Həbəşilərin zülmündən Nemana şikayət etdi. Neman dedi: Mən ildə bir dəfə İran padşahının yanına gedirəm, sən mənim yanımda qal ki, onun sarayına getdikdə səni də özümlə aparım və ondan sənə kömək etməsini xahiş edim. Seyf bu təklifi qəbul .etdi

Nemanın yola düşmək vaxtı çatdıqda Seyfidə özü ilə götürərək İran padşahının sarayına apardı. İran padşahının adətinə görə camaatı görmək üçün öz sarayının eyvanında əyləşər və müxtəlif cəvahiratla bəzədilmiş bir tacı başına qoyardı. Tac o .qədər ağır idi ki padşahın boynu onun ağırlığına tab gətirməzdi

Buna görə də onun əyləşdiyi taxtın tavanından üzərində qızıl zəncirlə qeyd etdiyimiz tacı asmışdılar. Tacın üzərinə parça salmışdılar. Ənuşirəvan gəlib taxta əyləşər və başını tacın içərisinə keçirərdi. Bu vaxt parçalar kənara çəkilər və saraya daxil olan hər bir kəsin ürəyini qorxu bürüyərək ixtiyarsız halda torpağa düşərdi (səcdə .edərdimütərcim). Seyf ibn Ziyəzəndə saraya daxil olan kimi onu görcək torpağa düşdü

### SEYF IBN ZİYƏZƏN NUŞİRƏVANIN HÜZURUNDA

Əbu Ubeydə rəvayət edir ki, Seyf sarayın qapısından girib başını əydi. Ənuşirəvan dedi: Bu axmaq kişi kimdir ki bu cür hündür qapıdan daxil olub səbəbsiz yerə başını əydi? Seyf dedi: Mənim əyilməyim məndə olan qəmqüssəyə görədir və bu qəmqüssə o .həddədir ki hər bir şeyi nəzərimdə kiçildibdir

Seyf dedi: Padşah sağ olsun! Qara qarğalar bizi məğlub edərək, yurdumuzu işğal .etmişlər

Dedi: Həbəş camaatı. İndi sənin hüzuruna gəlmişəm ki mənə köməklik göstərəsən. Biz Yəmən vilayətini onlardan geri alaq və sonra isə oranın hakimiyyəti sənə məxsus .olsun

Ənuşirəvan dedi: Sənin yaşadığın yer uzaq olmaqla yanaşı faydalı və gəlirli yer deyil. Mən sənə görə Fars qoşununu Ərəb vilayətinə göndərərək həlak edə bilmərəm. Mənim o vilayətlərə ehtiyacım yoxdur. Bu vaxt şahın göstərişinə görə, ona min dirhəm .verib, yaxşı paltar geyindirərək oranı tərk etməsinə icazə verdilər

Seyf pulları alıb saraydan çıxdı. Bütün pulları camaata paylayaraq onların ətəyinə tökdü. Bu xəbər Ənuşirəvanın qulağına çatarçatmaz, özözlüyündə dedi bu işin bir .rəmzi vardır

Bu an Seyfin yanına bir adam göndərərək onu hüzuruna çağırdı və dedi: Padşahın bəxşişini pis hesab edərəkmi pulu camaata paylayıb insanların qucağına atdın? Seyf cavab verdi: Mən dağları qızıl-gümüş və zərsimlə dolu olan bir vilayətdən gəlmişəm, !mənim bu dirhəmlərlə nə ehtiyacım var

Ənuşirəvan onun bu sözünü eşitcək məmləkətin vəzir və baş bilənlərini yanına .çağırtdıraraq Seyfin təklifi haqqında onlarla müzakirəyə başladı

Onlardan biri padşaha ərz etdi ki, ey padşah sənin zindanlarında ölüm və edama məhkum olunmuş dustaqlar vardır. Yaxşı olardı ki o insanları bu kişi ilə Yəmənə göndərəsən. Bəs əgər həlak olsalar padşah məqsədinə çatmış olar və əgər qalib olub .Yəməni işğal etsələr məmləkətin tabeçiliyinə daha bir yurd əlavə olunmuş olar

Ənuşirəvan bu təklifi qəbul edərək və edama məhkum edilmiş ۸۰۰ nəfəri zindandan .azad edib Seyf ilə birgə Yəmənə yola saldı

Məhkumlar arasında digərləri ilə müqayisədə daha sağlam və daha nəcib ailədən olan Vehrez adlı bir məhkum var idi. Ənuşirəvan onu məhkumların rəhbəri təyin etdi. Onlar səkkiz gəmidə dəniz yolu ilə Yəmənə tərəf hərəkət etdilər. Onların iki gəmisi yolda .batdı. Altı gəmi isə sağsalamat Ədən sahilinə yan aldı

Seyf ibn Ziyəzən bacardığı qədər öz tayfasının döyüşgən insanlarını «Vehrezə» kömək

dedi: Mən hər yerdə addım-baaddım səninlə olacağam ki ya qalib olacaq, ya da birlikdə məğlub olacağıq! Vehrez dedi: doğrusu insafli danışdın. Digər tərəfdən (Yəmən padşahı) Məsruq öz qoşununu yığıb onlarla döyüşə gəldi. Vehrez öz övladını onlarla döyüşə göndərdi ki, onların döyüşgənliyini yoxlasın. Təsadüfən onun övladı qoşun tərəfindən öldürüldü. Bu Vehrezin qəzəbinin cuşa gəlməsinə səbəb oldu. İki qoşun bir-:birinin qarşısında cərgəyə düzüldükdə Vehrez dedi

Onların padişahı olan Məsruğu mənə göstəriniz. Ona dedilər. Filə minmiş başında tacı !olan və iki gözü arasında qırmızı yaqut olan odur

Vehrez Məsruğu gördükdə dedi: Onunla işiniz olmasın bir az keçdikdən sonra ikinci dəfə soruşdu: İndi hansı vəziyyətdə və nəyə səvar olmuşdur (minmişdirmütərcim)? dedilər: öz miniyini atla əvəz edibdir! Dedi: onunla işiniz olmasın. Bir az ötdükdən sonra üçüncü dəfə soruşdu: İndi nəyə səvar olubdur: dedilər: Qatıra minmişdir! Vehrez dedi: !Qatır eşşəyin qızıdır Məsruq rüsvay oldu və səltənəti əlindən çıxdı

Bu vaxt dedi: Mən ona tərəf bir ox atacağam, əgər görsəniz ki, qoşun öz əvvəlki vəziyyətindədir və hərəkət etmir, siz də yerinizdən tərpənməyiniz ki mən sizə yeni göstəriş verəcəyəm. Çünki məlum olur ki, ox ona dəyməyib. Yox əgər görsəniz ki qoşun onun ətrafına yığılıb dövrəyə aldılar, biliniz ki ox ona dəymiş və siz onlara hücum .ediniz

Bunu deyib özündən başqa kimsənin çəkə bilmədiyi yayı dartıb oxu buraxdı. Ox həmin yaquta dəyərək onu sındırıb Məsruqun başına sancıldı. Məsruq həmin oxla minikdən torpağa düşdü. Həbəş qoşunu onu dövrəyə aldılar. Fars qoşunu hücuma keçib onları pərənpərən saldı. Onlardan bir hissəsi öldürülüb digər bir hissəsi isə ətrafa səpələnib dağılışdılar. Vehrez Sənaya tərəf hərəkət etdi. Səna darvazasına çatdıqda dedi: Mən heç vaxt öz bayrağımı şəhərə daxil olmaq üçün əyməyəcəyəm darvazanı uçurun, .Vehrez darvazanı uçurtdurduqdan sonra şəhərə daxil oldu

Seyf ibn Yəzən bu haqda şerlər qoşdu və habelə Üməyyə

(ibn Əbissilət və Ədi ibn Zeyd də bu dastana şerlər qoşdular.(١)

Bu münəccim Setih ilə Şeqin verdiyi xəbər idi ki; onların sözünün xülasəsi bu idi ki Əbi Yəzən ailəsindən olan bir kişi Ədən tərəfindən gəlib onları məhv edəcəkdir.

## İRANLILARIN YƏMƏNİ İSTİLA ETMƏSİ, VEHREZ VƏ ÖVLADLARININ HAKİMİYYƏTİ

İbn İshaq deyir: Bu hadisədən sonra Vehrez və İranlılar Yəməndə qaldılar. İndidə Yəməndə o farsların nəslindən olan fəzi insanlara rast gəlinir.

Oryatın oraya daxil olduğu gündən Məsruqun öldürüldüyü vaxta qədər ٧٢ il ötmüşdü ki Həbəş əhalisinin hakimiyyət müddəti olan bu vaxtda ardıcıllıqla Yəməndə Orayat, Əbrəhə, Yeksum ibn Əbrəhə və Məsruq ibn Əbrəhə padşahlıq etdilər. İbn Hişam deyir. Vehrez dünyadan köçdükdən sonra İran padşahı onun oğlu Mərzbanı Yəmən padşahı təyin etdi. Mərzbanın ölümündən sonra Tincan, Tincanın ölümündən sonra isə oğlunu yerinə təyin etdi. Sonra isə onu hakimiyyətdən uzaqlaşdıraraq, Bazan adlı bir şəxsi Yəmən hakimi təyin etdi. Nəhayət Bazanın hakimiyyəti dövründə Allah taala əziz peyğəmbərə peyğəbərlik verdi.

## İRAN PADŞAHININ İSLAM PEYĞƏMBƏRİ HAQQINDA BAZANA YAZDIĞI MƏKTUB

Zöhridən rəvayət olmuşdur ki , İran padşahı Bazana aşağıdakı məzmunlu bir məktub yazdı: “ Eşitmişəm ki Məkkədə Qureyşli bir kişi peyğəmbərlik iddiası edib, bu məktub sənə çatadan sonra onun yanına get və ona tövbə elətdir. Əgər tövbə etsə onunla işin olmasın və əgər tövbə etməsə başını mənə göndər.”

Bazan məktubu Allahın rəsuluna göndərdi. Həzrət cavabında Bazana yazdı: Mənim Allahım mənə xəbər verib ki, İran padşahı filan ay və filan gündə öldürüləcək!

Allahın rəsulunun məktubu Bazana çatan kimi onun həzrətə



---

١- [١] . Şerlərin mətnindən və şairlərin soy- kökündən xəbərdar olmaq üçün sirənin I cildinin ٦٥- ٦٧- ci səhifələrinə müraciət edə bilərsiniz.

xəbər verdi ay və günə baxan kimi dedi: Əgər bu kişi doğurdanda peyğəmbərdirsə, dediyi olacaq. O gün olan kimi İran padşahı oğlu Şiruyə tərəfindən öldürüldü.(۱)

## BAZANIN İSLAMI QƏBUL ETMƏSİ

İran padşahının öldürülmə xəbəri Bazana çatan kimi İslamı qəbul etdi. Eyni zamanda Yəməndə olan İranlılar da Islamı qəbul etdilər, sonra özü və Yəmən sakinləri olan İranlıların müan olma xəbərini bir neçə nəfər vaistəsi ilə əziz peyğəmbərə göndərdi. Elçilər o həzrətin yanına gəlib, xidmətinə ərz etdilər: Ey Allahın elçisi biz İranlıların taleyi kimin əlində olacaq?

Həzrət buyurdu: Siz bizdənsiniz və taleyiniz bizim ailəyə tərəf olacaq!

Zöhri deyir. Elə buna görə də Allah rəsulu buyurdu: «Salman bizim ailədəndi (əhlibeytdəndi-mütərcim)»

Beləliklə münəccim Sətih və Şeqin digər dediyi sözlərdən biri yəni ilahi peyğəmbərin gəlməsi xəbəri də reallığa çevrildi.

Və Əşi də verdiyi bu xəbərin reallığa çevrilməsi haqqında aşağıdakı şeri qoşdu.

ما نظرت ذات اشفار كنظرتها     حقا كما صدق الذئبى اذ سجعا(۲)

## HIZIR PADŞAHININ ƏHVALATI

Fərat sahilində «Hızır» adlı bir şəhər var idi ki bu şəhər möhkəm bürclərə malik idi. Orada «Satrun» adında bir şəxs hökümdarlıq edirdi ki, Hirə sultanı Neman ibn Münzər də onun övladlarından idi.

«Hızır» Ədi ibn Zeyd və Əbu Davud Əyyadın vəsfində şer və qəsidələr söylədiyi yerdir.(۳)



---

۱- [۱] . Ərəb şairlərindən biri olan Xalid ibn Həqq Şeybani, İran padşahının öldürüldüyü barəsində iki şer demişdir ki onların mətnindən xəbərdar olmaq üçün sirənin I cildinin ۶۹cu səhifəsinə müraciət edə bilərsiniz.

Zati- Əşfar çox iti görən bir ərəb qadını olubdur. Deyilənlərə görə: Səhrada üç . [۲] -۲ günlük yol məsafəsindən insanları tanıyardı. O, "Zərqaye Yəmamə" adı ilə məşhurdur. Zebidən məqsəd isə kahin Setih olmuşdur. Çünki onun dördüncü babası "Zeb" adlı bir .kişi olmuşdur

Daha çox məlumat əldə etmək istəyirinizsə sirənin I cildinin ۷۱ ci səhifəsinə . [۳] -۳ .müraciət edə bilərsiniz

## ZULƏKTAF ŞAPURUN ƏLİ İLƏ SATRUNUN ÖLDÜRÜLMƏSİ

İran padşahı Zuləktaf Şapur, Satrun ilə muharibə etmək üçün Hızır qalasının kənarına gəldi və iki il oranı mühasirədə saxladı (amma fəth edə bilmədi). Nəhayət bir gün Satrunun qızı qala divarlarının yuxarısından baxdıqda gözü əyninə ipək paltar geyinmiş və başına müxtəlif cəvahirat ilə bəzədilmiş tac qoyan və eyni zamanda gözəl simaya malik olan Şapura sataşdı və ona vuruldu. O, Şapur üçün xəbər göndərərək dedi: Əgər məni özünə həyat yaldaşı etsən mən Hızır qalasının qapsını üzünə açaram! Şapur qəbul etdi: Axşam olan kimi Satrun adəti üzrə şərab içib məst olaraq yuxuya getdi: Qızı gəlib qalanın açarlarını başının altından götürərək öz qullarından birinin vaistəsi ilə Şapur üçün göndərdi. Şapur bu yol ilə Hızıra daxil olub Satrunu öldürüb orada olan hər .bir şeyi qarət edərək, şəhəri viran etdi

Gecələrin birində Şapur gördü ki, Satrunun qızı sağ və sol tərəfə fırlansada, amma .gözlərinə yuxu getmir

Məsələnin nə olduğunu bilmək üçün bir çıraq gətirməsinə əmr verdi: Çıraq gətiriləndən sonra Şapur o qadının yatağını axtaranda orada bir gül yarpağı müşahidə etdi. Ona ?dedi: Bu gül yarpağımı sənin yuxunun ərşə çəkilməsinə səbəb olmuşdur

.Cavab verdi: Bəli bu gül yarpağı bədənimi incidir məni yatmağa qoymur

Şapur soruşdu: Atan Satrun səni necə böyüdüb ki? Cavab verdi: Mənim döşəkçəmi ipəkdən düzəltmişdi, əynimə ipək paltar geydirərdi, mənə qoyun beyni yedizdirərdi, .içkim isə şərab idi

Şapur dedi: Səni elə böyüdən atan ilə bu cür rəftar etdinsə, bəs mənim ilə necə rəftar ?edərsən

Sonra onun saçlarını ata bağlatdırıb, atı da səhraya qovdurdu və nəhayət o qadın həlak oldu. Bu barədə Əşi və Ədi ibn Zeydin qoşduqları şerləri İbn Hişam öz tarix .kitabında qeyd etmişdir

## NEZAR İBN MOEDİN ÖVLADLARI

Öncədən işarə etdik ki: Moed ibn Ədnanın, Qəzaə, Qinəs, Əyad və Nezar adlı dörd .övladı var idi

Qəzaə, Qinəs, Əyad və övladları haqqında qısacada olsa

işarə etdik, amma İbn İshaqın dediyinə görə Nezar ibn Moedin Mozer, Rəbiə və Ənmar adlı üç oğlu var idi: Lakin İbn Hişama görə isə onun Əyad adlı digər bir övladı ola olmuşdur ki Haris ibn Dus Əyadi və ya adı Cariyə ibn Həccac olan Əbi Davud Əyadi, .Əyadın övladları haqqında deyir

و فتوّ حسن أوجبهم

من أياد بن نزار بن معد

Mozer və Əyadın anası "Əkk ibn Ədnanın qızı Sudət", Rəbiət və Ənmarın anası isə Əkk :ibn Ədnanın qızı Şəqiqə və ya Cümə idi

## ƏNMARIN ÖVLADLARI

İbn İshaq rəvayət edir: Xəs'əm və Bəcilə tayfalarının şəcərnaməsi Ənmara gedib çxır. Bəcilə tayfasının rəhbəri Cureyr ibn Abdullah Bəcəli öz şerində bu mənaya işarə :etmişdir.(١) Bu Cureyr həmin şəxsdir ki, onun barəsində deyiblər

لولا جرير هلكت بجيله

نعم الفتى و بئست القبله

.Bəcilə qəbiləsi özlərini Yəmən qəbilələrinə mənsub etdikləri üçün Yəmənli adlanırdılar

## MOZER İBN NEZARIN ÖVLADLARI

Mozer ibn Nezarın İlyas və Eylan adlı iki oğlu var idi. Anaları Cerhəm qəbiləsindən olan :bir qadın idi

:İlyas övladları

İlyas ibn Nezarın üç övladı var idi: Mədrəkət ibn İlyas, Tabixət ibn İlyas və Qomət ibn İlyas. Anaları "Xəndəf"(٢) adlı Yəmənli bir qadın idi. Xəndəfin atası İmran ibn İlhaf ibn

.Qəzaə idi

Mədrəkənin adı Amir, Tabixənin adı Əmr idi. Rəvayətə görə bir gün o iki nəfər öz dəvələrini otlağa aparmış idilər. Otlaqda olarkən bir ov əldə etdilər. Ovu bişirmək üçün bir kənarda əyləşdilər. Bu vaxt bir yol kəsən onların dəvələrini oğurlamaq məqsədi ilə ?onlara hücum etdi. Amİr Əmrə dedi: Sən dəvələri qaytarırsan yoxsa yemək bişirirsən



---

.Sirənin I cildinin ۷۴- ۷۵- ci səhifəsinə müraciət edə bilərsiniz . [۱] -۱

Yəzid ibn Müaviyə, Həzrəti Seyyidüş- şühədanın müqəddəs başını müşahidə . [۲] -۲ edən vaxtı dedi: həmin qadındır ki, deyir: لست من خندف ان لم انتقم من بن ی احمد ما کان فع

Əmr dedi: Mən yemək bişirirəm. Amir isə dəvələrə çatıb onları qaytardı. Atalarının yanına qayıtdıqda başlarına gələn əhvalatı ona danışdılar. Atası Amirə dedi: Sən "Mədrəkə"(۱). Əmruya isə sən "Tabixəsən" dedi. Dəvələrin qaçırılma xəbəri anasına çatan kimi qaçaqaça onların yanına gəldi. Əri ona dedi: Qaçırsan? Oda Xəndəf adlandı. Mozerr qəbiləsinin şəcərənamə alimlərinin fikrinə görə Xəzaə (Xəzaə qəbiləsinin .rəhbəri), Əmru ibn Ləhi ibn Qəmət ibn İlyasın övladlarından hesab olunur

## QƏMƏT İBN İLYASIN OĞLU ƏMR İBN LƏHİNİN DASTANI

İbn İshaq Allahın rəsulundan belə bir hədis söyləmişdir ki, o həzrət buyurub: Əmr ibn Ləhini cəhənnəmdə gördüm ki, öz bağırsağını odun içərisində dartırdı. Ondan mənim ilə onun arasında olan insanlar haqqında soruşdum? Dedi: hamı həlak oldular (xoşbəxtlik və səadət üzü görmədilər) və yenə digər sənədə görə Əbu Hüreyrədən – adı Əbdullah ibn Amir və ya ƏbdürRəhman ibn Səxrdir – hədis rəvayət edir ki, dedi: Peyğəmbər, Əksəm ibn Cun Xəzaiyə buyurarkən eşitdim. Mən cəhənnəmdə Əmru ibn Ləhi ibn Qəmə ibn Xəndəfi gördüm ki odda öz bağırsaqlarını dartırdı. Səndən daha çox ona oxşayanı və ondan daha çox sənə oxşayan bir kəsi görmədim. Əksəm ərz etdi: Görəsən mənim ona çox oxşamağım mənə ziyan verə bilrə? Buyurdu: Yox çünki sən .mömin amma o isə kafir idi

O, həzrəti İsmailin dinini dəyişən əvvəlinci şəxs idi. O camaatı bütpərəstliyə vadar etdi. (Bəhirə, Saibə, Vəsilə və Hamini yaratdı.(۲

Əmr ibn Ləhinin Hübəl bütünü Şamdan Məkkəyə gətirməsi və Məkkə camaatını bütpərəstliyə vadar etməsi

Bəzi tarixçilərin rəvayətinə görə: Günlərin bir günü Əmr ibn Ləhi bir işi həyata keçirtmək üçün Məkkədən Şama (indiki Suriyamütərcim) səfər etdi. O, Bəlqa yurduna "və "Məab



---

Mədrəkə yəni dəvələri dərk edən, Tabixə yəni yemək bişirən, Xəndəf isə sürətlə . [۱] -۱ .yol getmək mənasındadır

٢- [٢] . Bəhirə, Saibə, Vəsilə və Haminin mənası ərəb məbədləri və bütlər mövzusunun sonunda deyiləcək.

şəhərinə çatanda Əmaliqə və ya Əmlaq Əmliq – ibn Laoz ibn Sam ibn Nuhun övladları hesab olunan o yerin əhalisinin bütə sitayiş etdiyini görüb soruşdu: Sizin bu pərəstiş etdikləriniz nədir? Dedilər: Bunlar elə bütlərdir ki, biz yağış istədikdə onlara deyir və onlarda da bizim üçün yağış yağdırırlar. Hər vaxt kömək istəsək, onları yardıma səsləyir və onlar da bizə kömək edirlər. Əmr ibn Ləhi dedi: Mümkünsə bunlardan birini mənə veriniz və mən də onu ərəb yurduna aparımki ərəblər də sizin kimi ona pərəstiş .edə bilsinlər

Əmaliqə Hübəl bütünü ona verdilər, Əmr onu Məkkəyə gətirərək camaatı ona pərəstiş .etməyə vadar etdi

İsmailin övladları daşlara pərəstiş edən ilk insanlar oldular

İbn İshaq rəvayət edir ki: Daşlara pərəstiş, İsmail övladları arasında yarandı. Belə ki, yaşayış çətinləşdikdə su və çörək ardınca Məkkəni tərk edib başqa ölkələrə getdikdə, özləri ilə hərəmin daşlarından götürər və bununlada hərəmin hörmətini saxlayardılar. Adətələri üzrə harada dayanardılarsa Kəbə ətrafına təvaf etdikləri kimi o daşın ətrafına fırlanardılar. Bu iş tədricən hərəm daşlarının pərəstiş edilməsinə gətirib çıxartdı. Sonrakı nəsillər atalarının rəftarından xəbərsiz olaraq daşlardan bütlər yonub, onlara pərəstiş etməyə başladılar. Həzrəti İbrahim və İsmailin dinində olmayanları artırmağa başladılar və beləliklə əvvəlki ümmətlər kimi yollarını azdılar. Həzrəti İbrahimin müəyyənləşdirdiyi, Kəbə evinə hörmət, həcc və ümrənin təvafı, Ərəfat və Müzdəlifədə dayanmaq, qurban kəsmək, həcc və ümrə əməllərini yerinə yetirmək kimi əməllərin bəzilərini həyata keçirməyə və onun dinində olmayan bəzi şeyləri isə .artırmağa başladılar

Bu məsələ o həddə çatdı ki, Kənanə və Qüreyş qəbilələri öz ləbbeyklərini bu formada " :deyirdilər

لبيک اللهم لبيک، لبيک لا شريک لک

الا شريک هو لک، تملکه و ما ملک

Şüarın qısaca mənası belədir ki, ilk öncə ləbbeyklə Allahın tək olmasına şəhadət verir və deyirdilər: Heç bir şərikin yoxdur, amma onun arxasıyca deyirdilər: Sənə şərik olan və mülkiyyəti sənin əlin ilə olan bütlərdən başqa. Buna görə də AllahTəala .QuraniKərimdə deyir: “Onların əksəriyyəti ancaq şərik qoşaraq Allaha inanarlar

Allaha təklikdə deyil, Ona qoşduqları şəriklərbütlər və tanrılarla birlikdə ibadət) edərlər)"(١) yəni o cür mənim tək olmağıma şəhadət verməsinlər, halbuki mənim .yaratdığımdan mənə şərik qoşurlar

## NUH QÖVMÜ VƏ ƏRƏB QƏBİLƏLƏRİNİN BÜTLƏRİ

Nuh qövmünün pərəstiş etdiyi bir sıra bütlər var idi ki, AllahTəala bu barədə öz peyğəmbərinə xəbər vermiş və buyurmuşdu: "Və (öz tabeçiliyində olanlara) dedilər: öz tanrılarınızı tərk etməyin, (xüsusilə) Vəddi, Suvaı, Yəğusu, Yəuqu və Nəsri atmayın. (Onlar çoxlarını yoldan çıxartdılar.".(٢

O cümlədən İsmail övladları olan ərəb qəbilələri qeyd etdiyimiz bütlər ilə eyni adlı bütlər düzəldib pərəstiş edərdilər. Onlar İsmailin dinindən üz döndərdilər. Bunlardan biri Huzeyl ibn Mədrəkə ibn İlyas idi ki, Səvanı "Rəbat"(٣) şəhərində yerləşdirmiş və ona pərəstiş edərdilər. Digər tayfa isə Qəzaə tayfasından olan Kəlb ibn Vebrə ailəsi idi ki, "Vədd" bütünü "DuməlCəndəldə"(۴) qoyub ona pərəstiş edərdilər. Kəlb ibn Vebrənin soykökü isə belədir: "Kəlb ibn Vebrə ibn Təğəllab ibn Həlvan ibn İmran ibn İlhaf ibn ."Qəzaə

Soykökü Teyə gedib çıxan Ənəm qəbiləsi və Məzhəc qəbiləsindən olan Cəreş əhli,(۵) (Cəreşdə olan "Yəğus" bütünə sitayiş edirdilər.(۶

Həmədan qəbiləsinin bir qolu olan Xiyvan(٧) camaatı da Həmədan yurdunda olan ."Yəuq" bütünə sitayiş edirdilər

Hümeyrdən olan Zulkəla qəbiləsi də Humeyr yurdunda olan "Nəsr" bütünə sitayiş .edirdilər



---

.Yusif surəsi ١٠۶- cı ayə . [١] -١

.Nuh surəsi ٢٣- ٢۴ cü ayə . [٢] -٢

.Yənbə yurdunda yer adıdır . [٣] -٣

.Mədinə ətrafında bir yerin adıdır . [۴] -۴

.Cəreş Yəmən yurdunda bir yer adıdır . [۵] -۵

۶- [۶] . Burada ibn Hişam Ənəm, Tey və Həmədanın söykökünü qeyd etmişdir ki, maraqlananlar sirənin I cildinin ۷۹- ۸۰ ci səhifələrinə müraciət edə bilərlər.

۷- [۷] . Xiyvan da Yəmən şəhərlərindən olmuşdur.

## OMYANUS BÜTÜ VƏ ONUN ARDICILLARI

Xolan yurdunda Xolan(١) qəbiləsinin arasında “Omyanus” adlı bir büt var idi. Onlar öz əkinləri, dəvə, qoyun və inəklərindən bir pay Omyanus bütü üçün və bir pay da Allah üçün ayırardı. Nə vaxtsa Allahın payından Omyanusun payına nə isə qatışsaydı ona əl vurmaz, lakin Omyanusun payından Allahın payına qatışsaydı isə onu ayırıb Omyanusun payına qaytarardılar (onlar bu işi bununla əsaslandırırdılar ki, Allah .(ehtiyacsızdır

Həmin bütün pərəstişkarları Xolan qəbiləsinin bir qolu olan “Ədim” idi. Onların :barəsində Allahtaala bu ayəni nazil etdi

Allahın yaratdığı əkin və dörd ayaqlılardan onun üçün qərar verdilər və dedilər: Bu“ Allah üçündür və bu da bizim şəriklər üçün (öz gümanlarına əsasən), Bəs şəriklərin payından Allaha çatmaz və Allahın payından şəriklərə çatar. Onların verdiyi hökmlər (necə də pisdir ”(٢

## SƏD BÜTÜ VƏ ONUN ARDICILLARI

İbn İshaq deyir: Bəni MəlkanMəlkan, Kənanə ibn Xəzimə ibn Mədrəkə ibn İlyasın övladı idiqəbiləsində Səd adlı bir büt vardı. O, səhrada olan uzun bir daş idi. Bir gün həmin qəbilədən bir kişi öz dəvələrini bərəkətli olması məqsədi ilə o bütün yanına gətirdi. Amma həmişə səhrada otlayan dəvələr həmin bütün yanında kəsilmiş çoxlu qurbanlığın qanını gördükdə hürküb hər biri səhranın bir tərəfinə qaçdı. Məlkani kişi bu hadisədən narahat olub qəzəbləndi. Yerdən bir daş götürüb Səd bütünün başına çırparaq dedi: Allahın sənə xeyr verməsin ki, mənim dəvələrimi pərakəndə halına .saldın. Sonra dəvələrinin arxasıyca gedib çox çətinliklə onları bir yerə topladı

Sonra isə aşağıdakı bu iki şeri oxudu

أتينا إلى سعد ليجمع شملنا

فشتتنا سعد فلا نحن من سعد

---

Xolanın söykökündən xəbərdar olmaq istəyirsinizsə sirənin ۸۱- ci səhifəsinə . [۱] -۱
.müraciət edə bilərsiniz

.Ənam surəsi ۱۳۶- cı ayə . [۲] -۲

و ه‍ـل سعد الاصخره بتنوقه            من الارض لا تدعو لغی و لا رشد(۱)

:Dus bütü

Dus(۲) qəbiləsinin içərisində Əmr ibn Həmamə Dusiyə məxsus bir büt var idi ki, biz yeri gəldikdə onun dastanını da qeyd edəcəyik.

:Hübəl bütü

Qüreyşin Hübəl adlı bir bütü də var idi ki, onu Kəbə evinin içərisində bir quyuda qoymuşdu. Onun izahını da qeyd edəcəyik.

## ASAF VƏ NAİLƏ

İbn İshaq rəvayət edir: Digər iki büt Asəf və Nailə bütləri idi ki, Qüreyş onları Zəmzəm quyusunun kənarında qoymuş və onların qarşısında qurban kəsərdilər. Bu Asaəf və Nailə Corhəm qəbiləsindən olan bir kişi və bir qadın idilər ki– Asəf ibn Bəği və Dik qızı NailəAsəf Kəbə evində Nailə ilə zina etdiyinə görə allah o ikisini iki daş parçasına çevirmişdi.

Ayişədən rəvayət olunubdur ki, biz həmişə camaatdan eşidərdik ki, Asaf və Nailə Kəbə evində birbiri ilə zina edən iki şəxs idi. Allah o, qadın və kişini daş parçasına çevirdi. Daha doğrusunu Allah bilər.

(Əbu Talibdə öz şerlərindən birində Asəf və Nailənin adını çəkmişdir.(۳

Ərəblərin bütlərə olan münasibəti

:İbn İshaq rəvayət edir

Qüreyş hər bir evdə büt saxlayır və ona pərəstiş edirdi. Hər vaxt bir kişi səfərə getmək istədikdə onun axırıncı gördüyü iş bu olurdu



---

۱- [۱] . Həmin iki şerin qısaca mənası budur ki, biz Səd bütünün yanına gəldik ki, bizi pərakəndəlikdən xilas etsin, amma əksinə onun bizi pərakəndə halına saldığını gördük.

Bu səd quru səhrada düşən daş parçasından başqa bir şey deyil. Onun heç bir fayda .və ziyanı yoxdur və kimsəyə ziyan vurub və ya xeyir verə bilməz

Dusun söykökündən xəbərdar olmaq istəyirsinizsə sirənin I cildinin ٨٢ ci . [٢] -٢ .səhifəsinə müraciət edə bilərsiniz

Qeyd etdiyimiz şerdən xəbərdar olmaq üçün Sirənin I cildinin ٨٣- cü səhifəsinə . [٣] -٣ .müraciət edə bilərsiniz

ki, evdəki bütün üzərinə əl çəkər sonra getmək istədiyi yerə tərəf yola düşərdi. Səfərdən qayıdandan sonra gördüyü ilk iş isə bundan ibarət olurdu ki, bütün yanına gələn ona əl sürtər, sonra isə öz ailəuşağının yanına gedərdi. Allahın elçisi peyğəmbərliyə yetişəndən sonra camaatı tək Allahpərəstliyə dəvət edəndə Qüreyş dedilər: Aya bütün Allahları bir Allah qərar verib? Doğurdan da belə bir şey !təəccüblüdür

Qüreyş bütpərəstləri Kəbənin qarşısında, ibadətgahlar düzəldib Kəbə evi kimi onlara .da hörmət və ehtiram göstərərdilər

Belə ibadət evlərinin qulluqçusu və mühafizəçiləri var idi. Kəbə evində olduğu kimi buraya da hədiyyə və nəzirlər gətirirdilər. Kəbə evinə təvaf etdikləri kimi bu evlərin də ətrafında təvaf edərdilər. Bu evlər üçün qurban kəsərdilər. Əlbəttə Kəbə evini bunlardan üstün hesab edər və onun üstünlüklərini inkar etməzdilər. Çünki oranın .Həzrəti İbrahim Xəlilin bina etdirdiyini və onun ibadətgahı olduğunu bilirdilər

## ÜZZA VƏ ONUN MÜHAFİZƏÇİLƏRİ

Qüreyş və Bəni Kənanənin ibadətgah yeri Nəxlə(١) məkanında yerləşən Üzza bütü idi. Onun qulluqçu və mühafizəçiləri İbn İshaqın dediyinə görə Bəni Haşim qəbiləsinin həmpeymanları olan Səlim qəbiləsindən olan Şeyban övladları idilər. Ancaq İbn Hişamın əqidəsinə görə onlar bütün Haşim övladları ilə deyil təkcə Əbu Talib övladları ilə həmpeyman idilər. İbn Hişama görə ərəb şairi olan Əbu Xəraş Həzli iki şer söyləmiş (və bu şerlərdə Üzza və onun üçün edilən qurbana işarə etmişdir.(٢

## LAT BÜTÜ VƏ ONUN MÜHAFİZƏÇİLƏRİ

Lat Səqif tayfasına məxsus olan və Taifdə yerləşən bir büt idi. Bu bütün qulluqçu və mühafizəkarları da Səqifdən olan Bənu Motəb qəbiləsi idi. İnşaallah yeri gəldikdə izah .edəcəyik

:Mənat və onun mühafizəçiləri

Qırmızı dənizin sahilləri olan "Məşləle Qədid" bölgəsinin

---

.Nəxlə Məkkə ətrafında olan bir vadinin adıdır . [۱] -۱

.Sirənin I cildinin ۸۴- cü səhifəsinə müraciət edə bilərsiniz . [۲] -۲

Mədinə şəhərində yaşayan Ovs və Xəzrəc tayfası və onlara tabe olanlar, Mənat .bütünə sitayiş edirdilər. Kumeyt ibn Zeyd öz şerində bunu qeyd etmişdir

İbn Hişam rəvayət edir: Peyğəmbər Əbü Süfyanı və bəzilərinə görə Əli ibn Əbu .Talibi(١) göndərərək onu viran etdi

### ZULXİLSƏ VƏ ONUN MÜHAFİZƏÇİLƏRİ

Zulxilsə də DuS, Xəsəm, Bəcilə və digər ərəb qəbilələrinə məxsus idi və onu “Təbalə”(٢) də qoymuşdular. Rəvayətə görə: Atası öldürülmüş ərəb bir kişi Zulxilsənin yanına gəldi və orada olan oxlar ilə atasını öldürənlərdən intiqam almaq üçün püşk atdı. Püşkdə :onu bu işdən çəkindirirdilər. Belə olduğunu görən ərəb kişi aşağıdakı beytləri oxudu

لو كنت يا ذا الخالص الموتورا

مثلی و كان شيخك المقبور

لم تنه عن قتل العداه زورا

Yəni ey Zulxilsə əgər sənin də atanı mənim kimi öldürsəydilər, intiqam almamış onu basdırsaydılar, onda sən boş yerə mənim atamın qatillərinin öldürülməsini nəhy .etməzdin

Bəziləri yuxarıdakı dastan və beytləri ƏmrülQeysə nisbət veriblər. Hər halda .Peyğəmbərimiz Cureyr ibn Abdullah Bəclini göndərərək Zülxilsəni viran etdirdi

### FƏLS VƏ ONUN MÜHAFİZƏÇİLƏRİ

”Fəls”, Teyy və onların qonşuları olan “a” və “Əcə“



---

Bu ikinci nəzəri Kəlbi, Əsnam kitabında qeyd edib ki, düz olduğu nəzərə çarpır. . [١] -١
Necə ki, bildiyiniz kimi Əbu Süfyan ta bu vaxta qədər yəni Məkkənin fəth edilməsi ilinə qədər müsəlman olmamış və müşriklərdən hesab olunurdu. Həm də Mənat Mədinə

yolu üstündəki Qədiddə idi. Həmuy MöcəmulBəldan da yazır: Hicrətin səkkizinci ili Allahın rəsulu Mədinədən xaric olduqda Əli ibn Əbu Talibi göndərdi ki, Mənatı viran edib oradakılarını götürüb peyğəmbərin yanına gətirsin. O cümlədən Haris ibn Əbi Şimr Ğəsaninin Mənat üçün hədiyyə apardığı iki qılınc da var idi. Birinin adı Məxzəm digərinin adı isə Rusub olan bu qılıncı peyğəmbər Əli (ə)- a bağışladı… ta dastanın sonuna qədər. Amma bəzilərinin nəzərinə görə peyğəmbərin Əli (ə)- a bağışladığı qılıncları Əli ibn Əbu Talib "Fəls" məbədindən o həzrətin yanına gətirmişdi. Necə ki, ibn .Hişam da bəzilərindən rəvayət edir

.Təbalə Məkkədən yeddi düşərgəlik məsafədə bir yerin adıdır . [٢] -٢

qəbilələrinə məxsus olan bir məbədin adı idi. Necəki bəzilərinin dediyinə görə: Allahın rəsulu Əli ibn Əbu Talibi göndərərək onu məhv etdirdi. Orada Rusub və Məxzəm adlı iki .qılınc tapıb peyğəmbərin yanına gətirdi. O, həzrətdə hər ikisini ona bağışladı

Riam

Humeyr qəbilələri və Yəmən camaatının da “Səna” şəhərində yerləşən “Rəsam” adlı (bir məbədləri var idi ki, onun izahını vermişdik.(١

### RİZA VƏ ONUN QULLUQÇULARI

Bəni Rəbiə qəbiləsi də Reza adlı bir yeri özlərinə ibadətgah ayırmışdılar. İslamın .zuhrundan sonra onu viran etdikdə Məstuğər ibn Rəbiə bu haqda şer söylədi

و لقد شدت على رضاء شده

فتر كتها فقرا بقاع اسحما

Bu Məstuğər uzun ömürlü insanlardan biri olmuşdur. O, üç yüz otuz il bu dünyada ömür sürdü. Mozer tayfasında ondan uzun ömürlü heç kim olmayıb. O öz şerində belə :deyir

ولقد سئمت من الحياه و طولها

و عمرت من عدد السنين مئينا

مأه حدتها بعد ها مأتان لى

و ازددت من عدد الشهورسنينا

هل ما بقى الا كما قد فاتنا

يوم يمر و ليله تحدونا(٢)

Bəziləri yuxarıdakı şerlərin Züheyr ibn Cənab Həlbiyə aid olduğunu (o da uzun ömürlü insanlardan olub) qeyd ediblər.

ZulKəbat, onun qulluqçuları və mühafizəçiləri:

İbn İshaqın rəvayətinə görə: Bəkr və Təğəllob tayfalarına

səh:۷۶

---

۱- [۱] . Əvvəlki səhifələrə müraciət edə bilərsiniz.

۲- [۲] . Yəni doğurdanda mən həyat və yaşayışdan yoruldum. Yüz illərdir ki, ömür sürürəm. Birinci yüz il keçdi. İki yüz ildə ona əlavə olundu. Ondan sonra da illərdir ki, ömür sürürəm. Görəsən mənim qalan ömrüm keçəndən (ömrümdən – mütərcim) başqadır. Gecəgündüz bir –birinin arxasıyca gəlir və bizi ölümə tərəf sürükləyir. Deyilənlərə görə Məstuğəri Okaz bazarında gördülər ki, öz nəvəsi olan qoca bir kişinin əlindən tutub gedir. Onu tanımayan bir kişi ona yaxınlaşıb dedi: Bu qoca kişi ilə yaxşı rəftar et. Çünki səninlə çox əziyyət çəkib. Məstuğər dedi: Səncə bu qoca kişi kimdir? Dedi: Ya sənin atan və ya babandır. Məstuğər dedi: O, mənim nəvəmdir! Kişi dedi: Doğurdanda bu vaxta qədər belə bir təəccüblü şeylə rastlaşmamışdış. Heç Məstuğər də sənin kimi deyil. Məstuğər dedi: Mən də həmin Məstuğərəm.

məxsus olan Zulkəbat adlı bir bütdə Sindad[1] adlı yerdə qoyulmuş idi. Bunlar Vail və İyad övladlarından idi. Bu barədə şair Əşi deyir:

بين الخورنق و اسدير و بارق

و البيت ذى الكعبات من سنداد

Amma ibn Hişamın nəzərinə görə bu şeri Əsvəd ibn Yəfər Nəheşli bir qəsidə əsnasında söyləyibdir.[2]

Bəhirə, Saibə, Vəsilə, Hami və onların mənası.

Keçən bəhslərdə qeyd etmişdik ki, bu mövzunun sonunda Bəhirə, Saibə, Vəsilə, Hami (və onların mənasını qeyd edəcəyik. İndidə onları deyirik). İbn İshaq rəvayət edir: Bəhirə, Saibənin dişi balasıdır. Saibə on dəfə ardıcıl olaraq dişi bala verən dəvəyə deyirlər. On dəfə ardıcıl olaraq dişi doğan dəvəyə süvar olmaq olmaz, onun kürk və yununu istifadə etməzdilər. Südündən isə yalnız qonaqlar üçün sağardılar. Əgər yenə dişi dəvə doğsaydı onu Bəhirə adlandırırdılar. Təzə doğulan dəvənin qulağını sındırar, anasının arxasıyca buraxardılar. Anası ilə necə rəftar edirdilərsə, balası ilə də elə rəftar edərdilər. Yəni nə ona suvar olar nə yunundan istifadə edər və nə də südünü sağardılar.

Vəsilə beş ardıcıl qarına on dişi doğan qoyuna deyərdilər. Yəni hər dəfə əkiz dişi quzu doğmalı idi. Bu qoyuna Vəsilə deyərdilər. Əgər ondan sonra yenə quzu doğsaydı onun ətindən yalnız kişilər istifadə edər və qadınların ondan istifadə haqları yox idi. Ancaq bu arada əvvəlki on dişi quzudan biri ölsəydi hamı onun ətindən istifadə edə bilərdilər.

İbn Hişam rəvayət edir: Bəziləri burada rəvayət edirlər ki, Bundan sonra nə doğsaydı oğlanlara məxsus idi və bundan qızlara heç bir şey verilməzdi.

Hami: Birbirinin ardıyca on dişi dəvəsi olan erkək dəvəyə deyərdilər. Ona süvar olmağı özlərinə haram bilər və onun kürkündən istifadə etməzdilər. Onu dəvələrin içərisinə buraxardılar ki, lazım olan halda dişi dəvələr ilə yaxınlıq etsin. O, heyvandan başqa heç

cürə faydalanmırdılar. Bu İbn İshaqın Bəhirə və



---

.Sindad Kufə ətrafında bir yer adıdır . [١] -١

Daha çox izah əldə etmək üçün Sirənin I cildinin ٨٨- ٨٩-cu səhifələrinə eləcə də . [٢] -٢
. onun aşağı hissəsində qeyd edilən haşiyəsinə müraciət edə bilərsiniz

.digərləri üçün verdiyi izah idi

Amma ibn Hişamın rəvayətinə görə: İbn İshaqın bu lüğətlərin mənası haqqında dedikləri Hamidan başqa digərləri üçün doğru deyil. Bu mənalar ərəblərin nəzərləri ilə uyğun deyil. Çünki Bəhirə öz Allahlarına aid edilmiş dəvəyə deyərdilər. Buna görə qulağını sındırar, ona minməz və onun kürkündən istifadə etməzdilər. Südünü yalnız .qonaq üçün sağardılar. Əgər sağsaydılar sədəqə verər və özləri onu yeməzdilər

Saibə o dəvəyə deyərdilər ki, insanlar nəzr edərdilər. Necəki xəstəlikdən sağalardılar, .ya əgər istəkləri hasil olsaydı onu buraxar və ondan heç bir fayda götürməzdilər

Vəsilə o malqaraya deyərdilər ki, anası bir qarına iki erkək və dişi bala verərdi. Bu halda onların hər ikisini özlərinə haram bilərdilər və heç birindən faydalanmazdılar. Çünki adətə görə əgər dişi olsaydı onu Allahlar üçün nəzərdə tutar və əgər erkək olsaydı özü üçün saxlayardılar. Bir qarında əkiz dişi və erkək olduğu üçün deyərdilər. Bu dişi erkəyə birləşib, ona görə də dişi kimi ondan da əl çəkmək lazımdır. Buna görə .də o erkəkdən də istifadə etməzdilər

.Bu ibn Hişamın Yunis ibn Həbib Nəhvi və digərlərindən nəql etdiyi rəvayət idi

AllahTəala əziz bəndəsi Məhəmmədə peyğəmbərlik verdikdən sonra ona aşağıdakı :ayələri nazil etdi

١. ما جعل الله من بحيره ولا سائبه ولا وصله ولا حام، ولكن الذين كفروا يفترون على الله الكذب و اكثرهم لا يعقلون.(١)

٢. و قالوا ما فی بطون هذه النعام خالصه لذكورنا و محرم على ازواجنا وان يكن ميته فهم فيه شركاءسيجريهم و صفهم انه حكيم عليم.(٢)



---

١- [١] . "Bəhirə nə Saibə, Vəsilə və Haminin heç birisini Allah (sizin üçün müəyyən edib) qanuni buyurmamışdır. Lakin kafirlər Allaha qarşı yalan uydururlar, onların (kafirlərə uyan camaatın) əksəriyyəti isə (bu cür iddiaların Allaha qarşı böhyan, iftira olduğunu) .(dərk etmirlər (Maidə surəsi ١٠٣- cü ayə

٢- [٢] . (Müşriklər) həmçinin: "Bu heyvanların qarnındakı balalar yalnız kişilərə

məxsusdur (halaldır), onlar qadınlarımıza haram edilmişdir",dedilər. Əgər (bala) ölü doğularsa, (kişilər və qadınlar) ona (onu yeməyə) ortaqdırlar. (Allah) onlara (bu yalan) vəsflərinin cəzasını verəcəkdir. Şübhəsiz ki, O, hikmət, elm sahibidir (Ənam surəsi ١٣٩-cu ayə).

۳. قل أرأيتم ما انزلله لكم من رزق فجعلتم منه حراما و حلالا قل آلله اذن لكم ام على الله تفترون.(۱)

۴. ثمانيه ازواج من اضأن اثنين و من المعز اثنين قل آاذكرين حرم ام الانثيين اما اشتملت عليه ارحام الا نثيين نبئو بعلم ان كنتم صادقين و من الابل اثنين و من البقراثنين قل آلذكرين حرم ام الا نثيين اما اشتملت عليه ارحام انثيين ام كنتم شهداء اذ و صا كم الله بهذا قمن اظلم ممن افترى على الله كذبا ليضل الناس بغير علم ان الله لا يهدى القوم الظالمين.(۲)

İbn Hişam burada bir iki ərəb şairindən Bəhirə və Vəsilə haqqında şer stat gətirərək deyir: Bəhirənin cəmi Bəhair və bəhr, Vəsilənin cəmi Vəsail və vəsl, Saibənin cəmi .Səvaib və Seyb, Hamın cəmi isə Humdur

## XƏZAƏNİN ŞƏCƏRƏNAMƏSİ MÖVZUSUNUN DAVAMI

Biz Qomət ibn İlyas övladlarından danışarkən Əmr ibn Ləhinin adını da çəkmişdik.. Əmr ibn Ləhi ərəb yarmadasında bütpərəstliyi yaydığı üçün biz də bütpərəstlərin .məbəd və bütlərindən danışdıq. İndi isə yenə də əvvəlki mövzuya qayıdırıq

İbn İshaq rəvayət edir: Xəzaə qəbiləsinin etiqadına görə onlar Əmr ibn Amirin övladlarıdır və Yəmən əhalisi hesab olunurlar. İbn Hişam onlardan rəvayət edir ki: Biz Əmr ibn Rəbiə ibn Harisə ibn Əmr ibn Amir və ya Harisə ibn Əmr ibn Amir övladlarıyıq. Onlara Xəzaə deyilməsinin səbəbi bundan ibarət idi ki, onlar Əmr ibn Amirin digər övladları ilə birlikdə Yəməndən Şama tərəf köç edirilər. Mərəzzöhrana (Məkkədən bir mənzil aralı) çatdıqda onlardan ayrılaraq orada məskən salmışdılar. Xəzaə ərəb (lüğətində bir şeydən kəsilmiş hissəyə deyirlər.(۳



---

۱- [۱] . De: “Allahın sizə ruzi olaraq (göydən) nə endirdiyini gördünüzmü ki, onun bir qismini haram, bir qismini isə halal etdiniz?” De: (Bunu deməyə) Allah özü sizə izn verdi, .(yoxsa Allaha iftira yaxırsınız? (Yunis surəsi ۵۹- cu ayə

۲- [۲] . Yeddi cüt (Həmçinin erkək və dişi olmaqla) bir cüt qoyun və bir cüt çəpiş. De: (Allah) iki erkəyi, yoxsa iki dişini, yaxud da iki (müxtəlif cinsli) dişinin qarınlarındakı balaları haram buyurdu? Yoxsa Allah bunu (iddia etdiyiniz) sizə tövsiyə etdiyi zaman (orada) şahid idiniz? Heç bir biliyi olmadan insanları (haqq yoldan) azdırmaq üçün Allaha qarşı yalan uyduran şəxsdən daha zalim kim ola bilər? Həqiqətən Allah zalım

.(tayfanı doğru yola salmaz! (Ənam surəsi ۱۴۴- cü ayə

Burada ibn Hişam On ibn Əyyub və İsmail ibn Rafedən şerlər stat gətirib ki, . [۳] -۳
.istəyənlər I cildin ۹۲- ci səhifəsinə müraciət edə bilər

## MƏDRƏKƏ İBN İLYAS ÖVLADLARI

Mədrəkə ibn İlyasın iki oğlu var idi: Xəzimət ibn Mədrəkə və Huzeyl ibn Mədrəkə. .Anaları isə Qəzaə tayfasından olan bir qadın idi

Xəzimət ibn Mədrəkənin dörd övladı var idi. Kənanə ibn Xəzimə, Əsəd ibn Xəzimə, .Əsdət ibn Xəzimə və Hun ibn Xəzimə. Anaları Kənanə tayfasından Səd qızı Əvanə idi

## KƏNANƏ İBN XƏZİMƏ İBN MƏDRƏKƏ ÖVLADLARI

Kənanə ibn Xəzimənin dörd oğlu var idi: Nəzr ibn Kənanə, Malik ibn Kənanə, Əbdü .Mənat ibn Kənanə və Məlkan ibn Kənanə

İbn İshaq rəvayət edir: Nəzrin anası Mərr ibnƏdd ibn Tabixə ibn İlyasın qızı Bərrə idi. Kənanənin qalan övladları isə digər qadınlardan idilər. Amma ibn Hişama görə Bərrə, (Nəzr və Malikin anaları idi.(١

.Qərşi o şəxsdir ki şəcərəsi Nəzr ibn Kənanəyə gedib çıxır

İbn Hişam rəvayət edir: Nəzr həmin Qüreyşdir ki, hər kim onun övladlarındandırsa Qərşidir. Bir kəsin şəcərəsi ona gedib çatmasa o Qərşi deyil. Bəziləri isə deyiblər: (Qüreyş, Fəhr ibn Malikin ləqəbidir və Qərşi o şəxsdir ki, şəcərəsi ona gedib çata.(٢

.Qüreyş lüğətdə təqərrəş sözündən olub qazanc və ticarət mənasını verir

İbn İshaq deyir: Qüreyş təqərreş sözündən olub cəm etmək mənasındadır. Ona görə Nəzrə Qüreyş deyirlər ki, onların qəbiləsi arasında yaranan ayrılıq və təfriqdən sonra .onları bir yerə toplaya bildi



---

١- [١] . Burada da Əbdü Monatın anasının nəsəbini ki Əzd Şəmutdan idi. Şəmutun .şəcərəsi və onun mənasını isə ٩٣- cü səhifədə qeyd edir

٢- [٢] . Fəhr ibn Malikin tərcüməsi bundan sonra gəlir. Bu arada ibn Hişam Cüreyrin Hişam ibn Əbdül Məlikin mədhində dediyi şeri və yenə quruşu ticarət mənasında .işlədən Robət ibn Həccacın şerini və Əbu Cəldənin şerini stat gətirib

## NƏZR İBN KƏNANƏ ÖVLADLARI

Nəzr ibn Kənanənin Malik ibn Nəzr və Yəxlud ibn Nəzr adlı iki oğlu var idi. Malikin anası .olan Ədvan ibn Əmrunun qızı Atikənin həm də Yəxludun anası olması ehtimal edilir

Və ibn Hişamın Əbu Əmr Mədənidən rəvayətinə görə Nəzrin Silət adlı digər bir övladı da olmuşdur. Onun dediyinə görə bu üç oğlanın anası Səd ibn Zərb Ədvaninin qızı olmuşdur. Sonra isə öz sözünə qüvvət üçün Xəzaə qəbiləsindən olan Kəsir İzzət kimi (tanınan Kəsir ibn Əbdürrəhmanın şerini qeyd edir.(١)

## MALİK İBN NƏZR ÖVLADLARI

Malik ibn Nəzrin də Fəhr ibn Malik adlı bir oğlu var idi. Fəhrin anası Haris ibn Məzazın .qızı Cəndələ idi

## FƏHR İBN MALİK ÖVLADLARI

Fəhr ibn Malikin dörd oğlu var idi. Ğaleb, Məhareb, Haris və Əsəd. Bu dörd oğlanın .anası Səd ibn Muzeyl ibn Mədrəkənin qızı Leyli idi

İbn Hişamın rəvayətinə görə: Fəhrin həmin qadından Cəndələ adlı bir qızı da var idi. .Sonra isə onun adını qeyd edən Cureyrin şerini xatırlayır

## ĞALEB İBN FƏHR ÖVLADLARI

Ğaleb ibn Fəhrin iki oğlu var idi. Ləvi ibn Ğaleb, Tim ibn Ğaleb. O, iki uşağın anası Əmru Xəzainin qızı a idi. Tim ibn Ğaleb isə həmin şəxsdir ki, onun övladlarına Bənu Ədrəm deyərdilər. İbn Hişam o qadından yəni Əmru Xəzainin qızı olan adan Qeys ibn Ğaleb .adlı bir oğlunun da olmasını yazıbdır

LəVI IBN ĎALEB öVLADLARı

Ləvi ibn Ğalebin Həb, Amir, Samə və Of adlı dörd oğlu var idi. Kəbə, Amir və Samənin .anası Qəza qəbiləsindən olan Kəb ibn Qeynin qızı Maviyə adlı bir qadın idi

İbn Hişam,Ləvi ibn Ğalebin Haris, Səd və Xəzimə adlı digər üç oğlunun da olduğunu qeyd edir. Eyni zamanda onların qəbilələri haqqında da söhbət açır.(١) Sonda deyir: Amirdən başqa Ləvinin bütün övladlarının anası Kəb ibn Qeynin qızı Maviyə idi. Amir ibn Ləvinin anası isə Şeyban ibn Məhareb ibn Fəhrin qızı Məxşiyəvə ya Leyli– .olmuşdur

## SAMƏT İBN LƏVİDƏN BİR DASTAN

İbn İshaq rəvayət edir: Amma Samət ibn Ləvi Hicazdan Omana tərəf yola düşdü. Bəziləri deyirlər: Qardaşı Amir ibn Ləvi onu Omana köçməyə məcbur etdi. Səbəbi isə ikisinin arasında baş verən mübahisə və nəhayət Samənin Amirin gözünü çıxartması idi. Amir onu öldürməsi ilə hədələdikdə Samə çarəsiz qalıb Omana tərəf yola düşdü. Hər halda rəvayətə görə: Samə öz dəvəsinin üstündə yol gedirdi. Birdə dəvə boynunu yerə uzadıb otu qoparmaq istədi. Bu zaman orada olan ilan onun sifətindən çaldı. İlanın zəhəri güclü olduğundan dəvəni taqətdən salıb böyrü üstə yıxdı. İlan Saməni də çaldı. Samə də ilanın çalmasından öldü. Deyilənə görə öləcəyini hiss edən Samə bir neçə şer dedi ki onlardan biri də

رب كأس هرقت يا بن لوى　　　　حذرالموت لم تكن مهراقه.(٢)

İbn Hişamın rəvayətinə görə: Samət ibn Ləvinin övladlarının bəzisi peyğəmbərin hüzuruna gəlib Saməyə qədər olan şəcərələrini söylədi. Həzrət buyurdu: Şair Saməni "رب كـأس" deyirsiniz? Səhabələrin bəziləri ərz etdilər: Deyəsən sizin qəsdiniz onun .şeridir. Buyurdu: Bəli

:Ovf ibn Ləvinin sərgüzəşti və onun Bəni Zebyana nisbət verilməsinin səbəbi

Rəvayətə görə: Of ibn Ləvi bir dəstə Qüreyş ilə Məkkəni tərk etdilər. Ğətfan yurduna çatanda dəvə getməkdən boyun qaçırdığına görə yoldaşlarından geri qaldı. Onlar da onu gözləməyib getdilər. Bu vaxt Söləbə ibn Səd ibn Zebyan onun yanına gəlib, Ofu yanlarına apardı. Bir müddət sonra öz



---

.Sirə I cild, səhifə ٩۶– ٩٧ . [١]–١

.Deyəsən o zaman Sölәbә Bənu Zebyan qəbiləsinin rəhbəri olmuşdur .[۲] -۲

tayfasından ona bir qız alıb Ofu özünə qardaş elan etdi. Sonra isə onu öz qəbiləsinə yola saldı. Onun Bəni Zebyan qəbiləsində şəcərəsi belə yayıldı. “Of ibn Səd ibn :Zebyan…” Bu şeirdə Şöləbəyə nisbət verirlər ki bu haqda Of dedi

أحبس على ابن لوى جملك

تركك القوم ولا منزل لك

Beləliklə Ofun övladı Mərrə onun şəcərəsini Bəni Zebyanda olduğunu qeyd edir. Təkcə Haris ibn Zalemdən başqa Mərrə övladları bu şəcərəni inkar etmirdilər. Mərrə ibn Of tayfasından olan Haris ibn Zalim Neman ibn Münzərin yanından qaçdığından sonra söylədiyi şerlərdə özünün Qüreyşdən olmasını qeyd edərək Bəni Zebyanla olan .nisbətini həm özü həm də qəbiləsinə qarşı inkar edir

Mərrənin övladlarından olan Həsin ibn Həmmam ona cavab verərək özü və qəbiləsinin Ləvi ibn Ğalebə mənsub olmasını inkar etmişdir. Amma sonradan peşiman olaraq (əvvəl dediyi sözlərə görə şer oxudu.(١

İbn İshaqın bəzilərindən söylədiyi rəvayətə görə: Ömər ibn Xəttab üzünü bir dəstəyə Bəni Mərəliyə tutaraq dedi: Əgər istəsəniz öz əsil şəcərənizə (yəni Qüreyşə) qayıda .bilərsiniz

Yenə rəvayət edirlər ki: Of övladları, Ğəffan qəbiləsinin nəcib və rəhbər insanları idilər. O cümlədən onların sırasında Hərm ibn Sənan, Xaricə ibn Sənan, Haris ibn Of, Həsin (ibn Həmmam və Haşim ibn Hərmələni qeyd etmək olar.(٢

Bu qeyd etdiyimiz şəxslər Ğətfan və Qeys qəbiləsində məşhur olan insanlar idilər. .“Bəsl” hadisəsi də onların arasında baş vermişdir

Bəsl” deyilənlərə görə: Ərəblərin özləri üçün müəyyən etdiyi səkkiz haram ay idi.“ Bütün ərəblər də bunu bilirdilər. Onlar bu səkkiz ay ərzində istədikləri yerə gedər və (kimsədə onlardan qorxub çəkinməzdi.(٣

١- [١] . ١٠٠ -٩٩ Haris və Həsinin şerlərinin mətnini görmək istəyirsinizsə Sirənin I cildinin .cü səhifələrinə müraciət edə bilərsiniz

٢- [٢] . Burada ibn Hişam ərəb şairlərindən olan Haşim ibn Hərmələnin mədhində bir şer söyləmiş, sonra isə Haşim ibn Hərmələ barəsində bir dastan söyləyib ki, .maraqlananlar ١٠١- ci səhifəyə müraciət edə bilərlər

٣- [٣] . İbn Hişam Bəslə məna verərkən Züheyr ibn Səlma və Əşi ibn Qeysin şerindən faydalanıb, eyni zamanda Züheyrin şəcərəsində qeyd edilibdir ki, sirənin I cildinin ١٠٢- .١٠٣- cü müraciət edə bilərsiniz

:Kəb ibn Ləvi övladları

Kəb ibn Ləvinin Mərrə ibn Kəb, Ədi ibn Kəb və Həsis ibn Kəb adlı üç oğlu var idi. Bu üç :oğlanın anası Şeyban ibn Məhareb ibn Fəhr ibn Malikin qızı Vəhşiyyə idi

:Mərrə ibn Kəb övladları

Mərrə ibn Kəbin, Kəlab, Qəyyim və Yəqzə adlı üç oğlu var idi: Kəlabın anası Sərir ibn Söləbinin qızı Hind idi. Yəqzinin anası Bariq tayfasından Barüqəyyə adlı bir qadın idi.(١) Təyyim haqqında isə tarixçilər konkret rəyə gələ bilmirlər ki, onun anası Kelabın, yoxsa .Yəqzənin anası olubdur

:Kelab ibn Mərrə övladları

Kelab ibn Mərrənin iki oğlu var idi. Qəsi ibn Kelab və Zöhrə ibn Kelab. Onların anası Yəmənin Əzd tayfasından olan Bəni Cədrə və ya Bəni Cəsəmdən(٢) olan Səd ibn Seylin .qızı Fatimə olmuşdur

İbn Hişamın rəvayətinə görə: Kelabın Nəm adlı bir qızı da var idi ki, anası Səd ibn Seylin .qızı Fatimə idi

:Qəsi ibn Kelab övladları

Qəsi ibn Kelabın altı övladı Əbdü Manaf, Əbdüddar, Əbdüluzza, Əbdü Qəsi adlı dörd oğlu, Təxmər və Vebrə adlı iki qızı vardı. Onların anası isə Həlil ibn Həbəşiyyənin qızı .Həbbi idi

:ƏbdüManaf ibn Qəsi övladları

İbn İshaq rəvayət edir: Əbdü Manafın– adı Muğeyrə idi. Haşim, Əbdu Şəms, Mətləb və Nofəl adlı dörd oğlu var idi. İlk üç uşağın anası Mərrə ibn Hilalın qızı Atikə və Nofəlin .anasının adı isə Əmru Mazəniyənin qızı Vaqidə idi

İbn Hişam Əbdü Manafın digər övladlarının da olmasını qeyd edir ki, onların adları aşağıdakı kimidir. Əbu Əmr, Təmazer, Qulabə, Həyyə, Ritə, Umm Əxsəm, Umm Süfyan. Təkcə Ritənin anası Səqif tayfasından idi. Qalanlarının anası isə

Bariqin şəcərəsi və adlanma səbəbini bilmək istəsəniz sirə kitabının ۱۰۴- cü . [۱] -۱
.səhifəsinə müraciət edə bilərsiniz

Cəsəmənin şəcərəsi və "Cədrə" adının qoyulmasının səbəbini ibn Hişam öz sirə . [۲] -۲
.kitabının ۱۰۵- ci səhifəsində qeyd edib ki, istəyənlər müraciət edə bilərlər

Atikə idi. Atikənin anası Hozət ibn Əmrunun qızı Səfiyyə, onun anası isə Aizullah ibn .Səduləşirətin qızı idi

### HAŞİM İBN ƏBDMANAF ÖVLADLARI

Haşim ibn Əbdü Manafın doqquz övladı vardı. Əbdül Mütəllib, Əsəd, Əbu Seyfi, Nəzlə adlı dörd oğlu, Şəfa, Xalidə, Zəifə, Rüqəyyə və Həyyə adlı beş qızı var idi. Əbdül Mütəllib və Rüqəyyənin anası Əmru ibn Zeydin qızı a, Əsədin anası Amir ibn Malik Xəzainin qızı Qilə, Əbu Seyfi və Həyyənin anası Əmru ibn Süləbənin qızı Hind, Nəzlə və Şəfanın anası Qəzaə tayfasından bir qadın, Xalidə və Zəifənin anası isə ƏbiƏdi .Mazəninin qızı Vaqidə idi

### ƏBDÜLMÜTƏLLİB İBN HAŞİM ÖVLADLARI

Əbdül Mütəllib ibn Haşimin Əbdullah, Həmzə, Əbbas Əbu Talib– adı Əbdü Manaf idi– Zübeyr, Haris, Həcl– çoxlu var– dövlətli və səxavətli olduğu üçün Ğeydaq(١) deyirdilər. Məqum, Zerar, Əbu Ləhəb– adı Əbdül Uzza idi– adlı on oğlu Səfiyyə, Ümm Həkim, Atikə, Əminə, Əroy və Heyrə adlı altı qızı var idi. Əbbas və Zerarın anası Kuleyb ibn .Cənabın qızı Nətilə idi

Həmzə, Məqum, Həcl və Səfiyyənin anası Vəhib ibn Əbdu Mənatın qızı Halə, Əbdullah, Əbu Talib, Zübeyr və digər qızlarının anası şəcərənaməsi Malik ibn Nəzrə gedib çatan Əmru ibn Aiz ibn Omran ibn Məxzunun qızı Fatimə idi. Fatimənin anası Əbd ibn Omran ibn Məxzunun qızı Səxrə onun anası isə Əbd Qəsi ibn Kəlab ibn Mərrənin qızı olan .Təxmər idi

Ancaq Haris ibn Əbdül Mütəllibin anası Cündəb ibn Xəcir ibn Reabın qızı Səmra, Əbu .Ləhəbin anası isə Hacir ibn ƏbdManaf ibn Zaterin qızı Ləbəni idi

### PEYĞƏMBƏRİN ATASI ƏBDULLAH

Əbdullahın da bir övladı var idi ki, bu həmin Allahın peyğəmbəri və Adəm övladının` ağası olan Məhəmməd ibn Əbdullah– Allahın salavat, salam və rəhməti ona və .övladlarına olsun– idi

١- [١] . Ğeydaq lüğətdə alicənab deməkdir. Habelə ərəb xeyir və bərəkət dolu hər bir şeyə də ğeydaq deyərmiş.

Peyğəmbərin anası Vəhəb ibn ƏbdManaf ibn Zöhrə ibn Kəlab ibn Mərrə ibn Kəb ibn .Ləvinin qızı Aminə idi

Aminənin anası: Əbdül Üzza ibn Osman ibn Əbdüddar ibn Qəsi ibn Kəlab ibn Mərrənin .qızı Bərrə idi

.Bərrənin anası: Əsəd ibn Əbdülüzza ibn Qəsi bin Kəlabın qızı Ümm Həbib idi

.Ümm Həbibin anası: Of ibn Übeyd ibn Əvic ibnƏdi ibn Kəb ibn Ləvinin qızı Bərrə idi

İbn Hişamın rəvayətinə görə: İndiyə qədər söylənilənlərə əsasən demək olar ki, Allahın rəsulu Adəm (ə) övladlarının ən şərafətlisi idi. İstər ata istərsə də ana tərəfdən .insanların ən üstünü hesab olunur

.Allahın salamı olsun ona və övladlarına

## ZƏMZƏM QUYUSU VƏ ONUN ƏBDÜL MÜTƏLLİBİN ƏLİ İLƏ QAZILMASI

Günlərin bir günü Əbdül Mütəllib "Həcəre İsmail"də yuxuya getmişdi. Yuxuda ona Corhəm qəbiləsinin Asəf ilə Nailənin(١) arasında doldurduqları quyunu qazması barədə göstəriş verdilər. (Bu dastan daha çox izaha bağlı olduğu üçün ilk oncə Zəmzəm quyusu, onun Corhəm tayfası tərəfindən doldurulması və habelə lazım olan digər mətləblərin qısa tarixçəsini sıra ilə qeyd edib, yenidən Əbdül Mütəllibin yuxu görməsi (dastanına qayıdacağıq

## ZƏMZƏMİN YARANMA TARİXİ

.Zəmzəm AllahTəalanın İsmaili sirab etdiyi həmin quyudur

İsmail balaca bir uşaq olarkən, susuzluq quru səhrada ona qalib gəlmiş idi. Anası su üçün o tərəf bu tərəfə getsədə o səhrada su gözə dəymirdi. O qadın su tapmaq üçün Səfaya qalxıb orada Allah-Təalanın dərgahına dua edərək İsmail üçün kömək istədi. Oradan Mərvəyə gedib həmin hərəkəti təkrarladı. Tainki AllahTəala Cəbraili göndərib İsmailin ayaq pəncəsini yerə vurdu və oradan Zəmzəm suyu axmağa başladı (anası onu

---

Asəf və Nailə Kəbə evində olan iki daşın adı idi. Müşriklər onların yanında qurban . [۱] -۱ .kəsərdilər. ۵۶- cı səhifədə onların dastanını söyləmişdik ki, istəyən müraciət edə bilər

.(dərənin ortasında qoymuş idi

Birdən birə su axtarışında olan ananın qulağına yırtıcıların səsi gəldiyi üçün İsmailin canı üçün qorxub ona doğru qaçdı. Onun yanına gəldikdə İsmailin öz xırda əlləri ilə qumları çeşmədən təmizləyib su içdiyini gördü. Sonra Hacər onu (yəni Zəmzəm .quyusunumütərcim) çuxur formasına saldı

## CORHƏM QƏBİLƏSİNİN ZƏMZƏM QUYUSUNU DOLDURMASI

Ancaq Corhəm qəbiləsinin Məkkəyə gəlməsi, Nabət ibn İsmail və ondan sonra Məzaz ibn Əmru Corhəminin Məkkəyə rəhbərlik etməsi, Corhəm qəbiləsinin Zəmzəm quyusunu doldurması, onların Məkkə şəhərindən köç etmələri və onlardan sonra .Məkkə şəhərində hakimiyyətə yiyələnən şəxslərin tarixçəsi isə belə olmuşdu

.Zəmzəm suyu aşkar olduqdan sonra İsmail və anası orada yaşamağa başladılar

Yəmən məmləkətində Corhəm və Qətura adlı iki tayfa var idi. Bu tayfalar birbiri ilə əmioğlu idilər. Corhəm qəbiləsinin başçısı Məzar ibn Əmru, Qətura qəbiləsinin başçısı Səmidə adlı bir şəxs idi. Bu iki qəbilə öz başçıları ilə Yəməndən xaric olub səhralardan keçərək Məkkə yurduna çatdılar. Oradakı su və ağacı gördükdə burada yaşamaq fikrinə düşdülər. (Naçar qalıb orada qalmaq üçün İsmailin anasından icazə alıb (yaşamağa başladılar

Məzaz, İsmailin övladları və Nabətin də aralarında olduğu tayfası ilə birlikdə Məkkənin yuxarı tərəfində, Səmidə isə Qətura tayfası ilə birlikdə, şəhərin cənub hissəsində məskunlaşmağa başladılar. (İsmail yetkinlik yaşına çatdıqdan sonra Məzaz ibn (Əmrunun qızı ilə evləndi. Ondan bir neçə övladı oldu ki, birinin də adı Nabət idi)(١



---

١- [١] . Biz ibn Hişamın tarix kitabının bu hissəsində ifadələr bir az anlaşılmaz və müxtəsər olduğu üçün onların yerlərini dəyişməyə və izahlar artırmağa məcbur olduq. Dastanın zəncirvari məzmununun qırılmaması və ifadələr arasında əlaqələrin itməməsi üçün biz naçar qalıb Təbəri və Yəqubinin tarixindən də istifadə etmək məcburiyyətində qaldıq. Buna görə də xatırladırıq ki, parantez arasında yerləşmiş

hissələri ibn Hişam sirəsində mövcud olmayan hissələrdir ki, bunları Təbəri və .digərlərinin tarixindən istifadə etmişik

İsmail dünyadan köçdükdən sonra Nabət atsının yerinə keçib Məkkə əhalisinin rəhbərliyini öhdəsinə aldı. Nabətdən sonra onun ana babası olan Məzaz, Kəbə evi, .Ismail və Nabət övladları və Corhəm tayfasının rəhbərliyini öhdəsinə götürdü

Məkkənin yuxarı hissəsinə Corhəm tayfası ilə birlikdə yiyələnən Məzaz bu hissədən Məkkəyə daxil olanlardan mallarının əşriyyəsini (ondan bir hissəsi) alardılar. Eyni ilə cənub hissədə məskunlaşan Qətura tayfasının başçısı Səmidədə cənub .istiqamətindən daxil olanlara qarşı həmin işi həyata keçirərdi

Bu iki qəbilə elə bu minvalla yaşayar və heç biri digərinə qarşı etiraz etməzdi. Nəhayət bir gün Məkkə şəhərinə tam eəhbərlik etmək üstündə aralarında mübahisə və ixtilaf .yarandı

O vaxt Kəbə evinin qəyyumu olan Məzaz, İsmail, Sabit övladları və Corhəm tayfasından ona tabe olan insanlarla döyüşə hazırlaşıb Qeyqean(۱) dağı istiqamətində hərəkətə başladılar. Onların nizə, qılınc və qalxanlarının səsi hər tərəfə əkssəda verirdi. Deyilənlərə görə o gündən etibarən o dağ Qeyqean adlanmağa başladı. Çünki .Qeyqean silah səslərinin birbirinə qatışması mənasındadır

Səmidə də Əcyad(۲) istiqamətindən bərk çapan atlara minib Qətura tayfası ilə birlikdə Məzazla döyüşə gəldi. Deyilənlərə görə həmin yer o gündən etibarən Əcyad .adlanmağa başladı. Çünki, Cəyyad bərk çapan atlar deməkdir

İki qoşun Fazehdə(۳) birbirinə çatdıqdan sonra şiddətli döyüş baş verdi. Nəhayət Səmidə öldürüldü və Qətura qəbiləsi məğlub oldu. Rəvayət edirlər ki, o yer buna görə də Fazeh adlandı. Çünki, Fazeh rüsvayçılıq deməkdir. Bu hadisədən sonra sülh təklif edildi və tərəflər qəbul etdilər. Bu məqsədlə hər iki qəbilə Mətabexə Məkkənin yuxarısında bir dərənin adıdır– tərəf yola düşdülər. Orada sülh sazişi bağlandı və hamı .Məzazın tabeçiliyinə keçdilər

Bu hadisədən sonra oranın bütün əhalisini tabeçiliyinə keçirən Məzaz, dəvələr kəsdirib ətini bişirtdirərək hamıya

١- [١] . Məkkənin şimalında bir dağın adıdır. Əgər bir kəs orada dayansa və Məkkə binaları maneçilik yaratmasa İraqı görə bilər.

٢- [٢] . Əcyad – Səfa istiqamətində bir dağın adıdır.

٣- [٣] . Fazeh – Əbu Qübeys dağı yaxınlığında bir yerin adıdır.

yedizdirdi. Deyilənlərə görə elə bu münasibətlə oranın adını Mətabex qoydular. Çünki Mətabex mətbəxin cəmidir. Bəzi rəvayətlərə görə oranın Mətabex adlanmasının .səbəbi bu olubdur ki, Təb Məkkəyə gələn kimi orada mənzil saldı

Təbin göstərişi ilə dəvələr kəsilib oranın əhalisinə yedizdirildi. Hər halda rəvayətlərə görə: Məkkədə baş verən ilk döyüş və tökülən ilk qan Məzaz ilə Səmidə arasında baş .verən döyüşdə olubdur

Sonra Allah birbirinə dayı uşağı hesab olunan İsmail və Məzaz övladlarını Məkkədə hakim etdi. Onların nəsli artmağa başladı. Heç kim Məkkəyə hakim olmaq üçün onlarla mübarizəyə qalxmırdı. Qohumluq və dayı övladları olmaq onların əlaqələrini möhkəmləndirmişdi. Digər tərəfdən də onlar qan tökülməsinə, döyüşə imkan .verməyərək Allah evinin hörmətini saxlayırdılar

Onların nəsli artıqdca Məkkə şəhəri onlara darısqallıq edirdi. Onlar bir çox ölkələrə köçməyə başladılar. Hara çatırdılarsa orada yayılıb və sonra da oranın hakimiyyətini .ələ keçirirdilər

Xəzaə və Kənanə qəbiləsinin Məkkə şəhərini istila etməsi və

Corhəm qəbiləsini o şəhərdən qovması

Corhəm qəbiləsi getgedə Məkkə şəhərində zülmkarlıqla məşqul olur, onlar üçün haram olanları halal bilir və o müqəddəs yerə gələnləri incidir, Kəbə evi üçün gətirilən hədiyyələri mənimsəyirdilər. Bu hərəkətlər onların qüdrət və heybətinin azalmasına səbəb oldu. (Məkkəyə hakimiyyət arzusu ilə yaşayan digər ərəb tayfalarının onlara hücum etməsinə səbəb oldu). Elə buna görə də Xəzaə tayfasından olan Ğəbşan və Bənu Bəkr ibn Kənanə adlı iki ərəb tayfası onlara hücum etdilər. Bu döyüş nəticəsində .onlara qalib gələrək Corhəm tayfasını Məkkə şəhərindən qovdular

Qədim dövrlərdə Məkkə şəhərində heç kəs zülm edə bilməz və etməzdi də. Zülm edən şəxs oradan qovulardı. Buna görə də Məkkəni “Nasət”(١) adlandırırdılar. Heç bir padşah Məkkəyə hörmətsizlik etməz, buna cəhd etdikdə isə həlak olardı. Məhz buna ”görə də Məkkəni “Bəkkə” adlandırardılar. “Bəkkə

---

[۱] -۱ Nasə” nəs kəlməsindən götürlmüş qovmaq və istiqamətləndirmək. mənsaındadır. Məqsəd budur ki, Məkkə orada zülm edəni rədd edərdi (özündən uzaqlaşdırardı).

.sınmaq mənasındadır

Məkkə elə bir yer idi ki, oranı viran etmək istəyən və ya oraya hörmətsiz lik etmək istəyən zülmkar şəxslərə Allah möhlət vermir və onları məhv edirdi. (Bu ibn İshaqın .(sözü idi

İbn Hişam Əbu Übeydədən rəvayət edir ki, "Bəkkə" həmin Kəbə evi və məscidinin yerləşdiyi Məkkə çökəkliyinin adı idi. Ora ona görə Bəkkə deyirdilər ki, camaat orada izdiham yaradardılar. Sonra Amir ibn Kəbin öz sözünü isbat etmək üçün gətirdiyi .aşağıdakı şeri qeyd edib

اذ الشريب اخذته أكه

فخله حتى يبك بكه

Yəni o vaxt ki, şiddətli istilər sizin dəvələr ilə su içən əhalinin dəvələrini haqladıqda) onların qarşısını kəsməyin, onları suyun ətrafına toplaşmaqda sərbəst buraxın ki, (izdiham yaratsınlar

İbn İshaq öz sözünün arxasıyca deyir: Corhəm qəbiləsi Kənanə və Xəzaə tayfasının) qələbəsini gördükdən sonra) Əmru ibn Haris ibn Məzaz Corhəmi Kəbənin iki qızıl ceyranını götürüb və qara daşıda yerindən qoparıb hamısını Zəmzəm quyusunda basdırdı. Sonra Corhəm qəbiləsi ilə Yəmənə köçdülər. Məkkə şəhəri və oradakı hakimiyyətdən əlləri üzüldüyünə görə möhkəm incidilər. Əmru ibn Haris bu barədə (şerlər söylədi. (onun brinci şeri budur

و قـائـلـه و الـدمع سـكـب مبادر و قد شرقت بالدمع منا المحاجر(۱)

Yenə də Məkkə şəhərində Ğəbşan və Bəni Bəkrin hakimiyyəti haqqında aşağıdakı .şerləri söyləmişdir

يا ايها الناس سيروا ان قصركم

ان تصبحوا ذات يوم لا تسرونا

حثوا المطى و أرخوا من أرمتها

قبل الممات و قضوا ما تقضونا

كنا اناسأ كنتم فغيروها

دهر قأنتم كما كنا تكونونا

Bəziləri rəvayət edirlər: Yuxarıdakı şerlər ərəbcə deyilən ilk şerdir. Onu söyləyən də .məlum deyil. Yəməndə tapılan daş parçasına həkk olmuşdu

## XƏZAƏ TAYFASININ MƏKKƏ ŞƏHƏRİNDƏ HAKİMİYYƏTİ

Xəzaə qəbiləsindən olan Ğəbsan tayfası Curhəmdən sonra Məkkə şəhərində hakimiyyəti ələ alıb, Kəbə evinin idarəçiliyinə



---

Bütün şerlərdən xəbərdar olmaq istəyirsinizsə tarix kitabının ۱۱۵- ۱۱۶- cı . [۱] -۱ .səhifəsinə müraciət edə bilərsiniz

sahib oldular. Rəhbərləri Əmr ibn Haris Ğəbşani adında bir kişi idi. Qüreyş tayfası da pərakəndə halda Məkkənin müxtəlif məhəllələrində yaşayırdılar. Xəzaə tayfası da bu minvalla orada hakimiyyət sürürdülər. Onların sonuncu rəhbərləri Həlil ibn Həbşiyyə... .idi

### QƏSİ İBN KELABIN, HƏLİL İBN HƏBƏŞİYYƏNİN QIZI İLƏ EVLƏNMƏSİ

Həlil ibn Həbşiyyə Məkkədə hakim olan zaman Qəsi ibn Kəlab onun qızı “Həbi” üçün elçiliyə getdi. Həlil bu qohumluğu bəyənib “Həbi”ni ona ərə verdi. Qəsi ibn Kəlabın (necəki əvvəldə də demişdik) o qadından dörd övladı dünyaya gəldi. Onların adları: Əbdüddar, ƏbdManaf, Əbdülüzza və Əbd idi. Get- gedə Qəsi ibn Kəlabın Məkkədə işləri yaxşı gedirdi. Onun var- dövləti artmış, övladları isə çoxalmışdı. Belə bir vaxtda .Həlil ibn Həbşiyyə dünyadan köçdü

Qəsi ibn Kəlab özünü Məkkə hakimliyi və Kəbə evinin işlərinin idarəsi baxımından Xəzaə və Bəni Bəkr tayfasından üstün görürdü. Qüreyşi (özü də onlardan biri idi) İsmail peyğəmbərin ən üstün övladlarından hesab edirdi. Buna görə də Məkkə şəhərinin hakimliyi üçün öz fikrini Qüreyş və Bəni Kənanə tayfasına bildirdi. Habelə onlardan ona kömək etmələrini və Bəni Bəkr ilə Xəzaə tayfasını Məkkədən qovmalarını istədi. Onlarda Qəsi ibn Kəlabın sözünü qəbul edib ona kömək etməyə .qalxdılar

Digər tərəfdən Qəsi ana tərəfdən qardaşı olan (anadan bir atadan ayrı idilər – mütərcim) Rizah ibn Rəbiəni yazdığı məktub vasitəsilə ona kömək etməyə çağırdı. Rəbiənin (Rizahın atası) Fatimə (Qəsinin anası) ilə evlənmə əhvalatı belə olub. Kəlab (Qəsinin atası) vəfat etdikdən sonra Ozrət ibn Səd qəbiləsindən olan Rəbiə Məkkəyə gəldi. O, əri (Kəlab) ölmüş Fatimə ilə evləndi. Rəbiə Fatiməni öz yaşadığı yerə apardı. Qəsi o zaman balaca uşaq idi. Ancaq Zöhrə ibn Kəlab (Qəsinin qardaşı) böyümüşdü.Buna görə də Zöhrəni Məkkədə qoyub Qəsini anası ilə birlikdə öz qəbiləsinə apardı. Fatimə Rəbiə ilə evləndikdən sonra Rizahı dünyaya gətirdi. Qəsi .böyüyüb həddi buluğa çatdıqdan sonra Məkkəyə gələrək orada yaşadı

dediyimiz kimi Həlilin qızı ilə evləndi. Bu vaxt Rizah ibn Rəbiəni də öz köməyinə çağırdı))
Rizah onun dəvətini qəbul edib Rəbiənin Fatimədən başqa digər həyat yoldaşlarından dünyaya gələn Hənn ibn Rəbiə, Mahmud ibn Rəbiə, Həlhəmə ibn Rəbiə adlı qardaşları .(ögey), Fəzaə qəbiləsindən bir qrup insan və ərəb hacıları ilə birgə Məkkəyə gəldi

Xəzaə tayfasının etiqadına görə Həlil Kəbə evinin idarə etməsini Qəsiyə sifariş edərək !ona demişdi: Sən bu işə digərlərindən daha layiqsən

Ancaq bizim etdiyimiz kimi Qəsinin özünün Məkkəni Xəzaə tayfasından geri almaq fikrinə düşməsi və ya Xəzaə tayfasının dediyi kimi ki, Həlil ona belə bir sifariş vermişdi fikrinin hansının doğru olması haqda əlimizdə heç bir sübut yoxdur. Daha doğrusunu .Allah bilər

Ğos ibn Mərr və onun Həcc əməllərinin

yerinə yetirilməsi üçün icazə verməsi dastanı

Qəsi ibn Kelabın Məkkəni istila etməsi əhvalatında, öyrənilesi lazım olan şeylərdən) biridə Sofə tayfası və Ğos ibn Mərrin övladlarının dastanıdır. Hadisə belə olmuşdu ki) Sofə adı ilə tanınan Ğos və övladları Məkkədə çox qüvvətlənmişdilər. Hacıların Ərəfatdan Minaya doğru hərəkət etməsi və habelə daş atmaq mərasimi onların icazəsi ilə həyata keçirilirdi. Onların işinin başlanğıcı belə olmuşdu ki, Curhəm qəbiləsindən olan Ğos ibn Mərrin anasının övladı olmurdu. O, nəzr etmişdi ki, əgər oğlan uşağı dünyaya gətirsə onu Kəbə evinə hədiyyə edəcək ki, o oğlan öz həyatı boyu Kəbə evinin xidmətçisi olsun. Nəzrdən sonra Ğos dünyaya gəldi. İlk öncə Curhəm qəbiləsindən olan dayıları ilə birgə Kəbədə xidmət etməyə başladı. Kəbə evinə münasibətdə olan xüsusiyyətlərinə görə hacıların gediş- gəliş işini və Ərəfədən hərəkət etmə işlərini öhdəçiliyinə götürdü. Ondan sonra övladları bu istiqamətdə (davam etdilər. Mərr ibn Odd və Ğos ibn Mərrin hər biri bu haqda şerlər deyiblər.(١

Bu iş beləcə davam edirdi ki, “Sofə” camaatı Ərəfatdan Məşərə və Minaya aparardılar. Minadan köçmək istədikdə isə köçmək üçün onların icazəsini almaq lazım idi. Onların icazəsi

olmadan o yeri tərk edə bilməzdilər. Elə buna görə də Minada dayanmağın son günü yetişdikdə və camaat oranı tərk etmək istədikdə daş atmaq üçün daşın yanına gələrdilər. Amma orada gözləməli “Sofə” camaatından biri gəlməli, daş atmalı və sonra digərləri də daş atmağa başlamalıydılar. Bunun üçündə Minadan çıxmaqda tələsən və kənarda işi-peşəsi olan şəxslər Sofənin yanına gələr və deyərdilər. Qalxın və daş atma mərasimini bərpa edin ki, bizdə sizinlə birlikdə daş ataq. Onlar cavabında deyirdilər. Günorta olmayınca biz bunu etməyəcəyik. Tələsən insanlar onların ətrafında toplaşar, onlar da öz növbəsində vaxtı gözləyər, günorta olandan sonra ilk öncə onlar, sonra isə .camaat daş atardılar

Daş atma mərasimindən sonra camaat Əqəbə dərəsindən keçib Məkkəyə gəlmək istədikdə “Sofə” tayfasının kişiləri irəli gəlib “Əqəbə” dərəsinin hər iki tərəfini kəsib deyərdilər. “Sofə” tayfasından olan insanlar bütünlüklə Minadan xaric olmayınca kimsənin buradan keçməsinə haqqı yoxdur. “Sofə” tayfasının insanları keçdikdən .sonra onlar camaatın yolunun qarşısından çəkilərdilər

Bu hərəkət onlar məhv olana qədər “Sofə”də davam edirdi. Onlardan sonra bu mənsəb Bəni Səd ibn Zeyd Mənatın yaxınlarına çatdı. O cümlədən həmin bəni Səd Səfvan(١) da bu mənsəbə yiyələndi. Ondan sonra isə oğlanları birbirinin arxasıyca bu mənsəbə yiyələnirdilər. Onun övladlarından olan Kərb ibn Səfvanın vaxtında isə İslam :dini zühur etdi və bu mənsəbi aradan apardı. Ovs ibn Təmim bu haqda deyir

لا يبرح االناس ما حجوا معر فهم

حتى يقال أجيزوا آل صفوانا

Amma Zuləsbə Ədvani– adı Hərsan idi– Ədvanın qəbiləsinin mədhində belə bir şer :deyir

عذيرو الحى من عدو

ان کانوا حیه الارض

بغی بعضهم ظلما فلم

یرع علی بعض

یرع علی بعض

و الموفون با لقرض

و منهم من یجیز الناس

بالسنه و الفرض



---

۱- [۱] . Səfvanın şəcərənaməsini bilmək üçün ۱۲۰- ci səhifəyə müraciət edə bilərsiniz.

و م ـن ـه ـم ح ـك ـم ی ـق ـضی          ف ـلا ی ـنق ـض م ـا ی ـق ـضی.(١)

Bu vəzifə Əbu Səyyarəyə qədər onun övladlarında idi. Onun dövründə İslam dini .Məkkəni fəth etdikdən sonra bu vəzifə də əhəmiyyətini itirərək aradan getdi

Qəsi ibn Kəlabın Məkkə şəhərini istila etməsi və Qüreyşi toplaması

Qəsi ibn Kəlab qoşun hazırlamaq, Məkkə və Qüreyşə rəhbərlik etmək fikrində olduğu il, Sofə tayfası hər il olduğu kimi bu ildə Mina, Məşər və Ərəfatda hacılara cilovdar idilər. Hacılar Əqəbədən keçmək istədikdə Sofə öz adətləri üzrə onların qarşısını kəsib dedilər: Bütün Sofə camaatı keçməyincə kimsənin keçməyə ixtiyarı yoxdur. Bu arada Qəsi ibn Kəlab, Qüreyş, Kənanə və Qəzaə tayfası ilə birlikdə irəli gəlib Sofə camaatına dedilər: Biz bu işi yerinə yetirmək üçün daha layiqik (hamıdan öndə getməyə). Nəticə etibarı ilə Sofə tayfası ilə Qəsi ibn Kəlab arasında şiddətli döyüş başladı. Çox vuruşmadan sonra Sofə



---

١- [١] . Tərcümənin xülasəsi budur ki, Ədvan qəbiləsi yer üzünün səxavətli və alicənab şəxsləri idilər. Onlar həm camaata yaxşı mükafat verər, həm həcc əməllərini icra etmək üçün icazə verər, həm camaat arasında hakim olub, hökm verər və həm də onlar kimsə tərəfindən hökmü rədd edilməyən tayfa idi. Sonuncu şerdən məqsəd: Məşhur ərəb qazi və hakimi olan Amir ibn Zərb Ədvani idi. Məhəmməd ibn İshaqın rəvayətinə görə: onun zamanında ərəblər arasında baş vermiş hər bir ixtilaf və mübahisəyə görə onun yanına hökm verməyə gələr və onun verdiyi hər bir hökm hamı tərəfindən qəbul edilərdi. Tainki onun yanına bir xonsa (xonsa – hermafrodit, qadın və ya kişi olması bilinməyənmütərcim) gətirib dedilər: Onu kişilərin yoxsa qadınların cərgəsinə daxil edək? Bu vaxta qədər belə bir problemlə rastlaşmayan Amir möhlət istədi. Axşam evə gedəndən sonra bu hökmə görə yata bilmədi. Beləcə fikirlərə qərq olmuşdu. Amirin narahat olduğunu görən Səxilə adlı kənizi onun səbəbini soruşdu. Amma Amir ilk öncə səbəbini söyləməsədə, kənizin israrları qarşısında nəhayət səbəbini söyləməyə məcbur oldu. Kəniz fikirləşmədən dedi: Sidik ifraz etməsi ilə onu qadın və ya kişi olmasını bilmək olar. Əgər sidik onun kişi cinsiyyət üzvündən gəlsə kişi,

əgər qadın cinsiyyət üzvündən gələrsə onu qadınların cərgəsinə qatarsan. Amir şad olub ona dedi. Ey Səxilə and olsun Allaha ki, mənim problemimi həll etdin. Səhər olan kimi kənizinin dediyi kimi o şəxs haqqında hökm etdi. (Bu ibn Hişamın Zuləsbənin şerinin arxasınca ibn İshaqdan rəvayət etdiyi mətləbin xülasəsi idi. Biz ifadələrin ardıcıllığı pozulmasın deyə onun tərcüməsini ixtisarlaşdırılıb aşağıda qeyd etdik.)

.tayfası məğlub oldular. Bu vəzifə Qəsi ibn Kəlabın əlinə keçdi



## QƏSİ İBN KELABIN XƏZAƏ VƏ BƏNİ BƏKR TAYFALARI İLƏ DÖYÜŞÜ VƏ YƏMƏR İBN OFUN QƏZAVƏTİ

Yuxarıdakı hadisə Xəzaə və Bəni Bəkrin Qəsidən ayrılmasına səbəb oldu. Onlar bilirdilər ki, Qəsi o vəzifəni Sofədən aldıqdan bir az sonra Kəbə və Məkkənin digər vəzifələrini və "açara sahib olma" vəzifəsini də onlardan alacaq. Qəsi onların ayrıldığını görüb bu tayfalarla döyüşmək fikrinə düşdü. Qardaşı Zərah ibn Rəbiə də Qəza tayfası ilə onun köməyinə gələrək Xəzaə və Bəni Bəkr tayfası ilə döyüşə atıldılar. Onlar arasında Əbtəhdə(١) şiddətli döyüş baş verdi. Hər iki tərəfdən çoxlu insan öldü. Vəziyyət belə olduqda onlar sülh bağlayıb, qərara gəldilər ki, ərəblərdən bir kişi onlar .arasında qəzavət etsin və onun etdiyi qəzavət hamı tərəfindən qəbul edilsin

Tərəflər qəzavət üçün Yəmər ibn Ofu (Kənanlı) seçdilər. Yəmər ibn Of Kəbə və Məkkə işlərində Qəsi ibn Kəlabın Xəzaədən daha layiq olduğunu bildirərək qeyd etdiyi ki, bu döyüşdə Qəsi ibn Kəlabın Bəni Bəkr və Xəzaə tayfalarından öldürdükləri insanların qanı hədər, Xəza və Bəni Bəkr tayfalarının öldürdükləri insanların qanbahası ödənilməlidir. Bundan sonra Məkkəyə rəhbərlik və Kəbə evinin işlərinin öhdəçiliyi Qəsi ibn Kəlaba tapşırılır. O vaxtdan etibarən Yəmər ibn Of, Şedax adlanmağa başladı ki, bu .da qanı hədər eləyən mənasındadır

### Qəsinin Məkkəyə rəhbərliyi və Qüreyşin onu "Mucəmme" adlandırması

Bu minvalla Qəsi Məkkə şəhərinin rəhbəri və Kəbə evinin işlərinin öhdədarı oldu. Qüreyş tayfasının pərakəndə camaatını birləşdirə bildi. Buna görə də ona Mucəmme deyirdilər. Bütün Qüreyş və Məkkə əhli onun rəhbərliyinə tabe oldular. O, Səfvan, Ədvan, Nəsət və Mərrət ibn Of tayfalarının sahib olduğu mənsəbi onlara həvalə etdi. Çünki onları dəyişilməsi icazə verilməyən bir ayin təsəvvür etdi. Nəhayət İslam dini



---

.Əbtəh Məkkə dərələrinin yarğanının adıdır . [١] -١

.gəlib bütün o mənsəbləri ləğv etdi

Kəb ibn Ləvi övladları arasında Qüreyşi özünə tabe edən ilk şəxs Qəsi olmuşdur. Məkkənin mühüm mənsəb və vəzifələri olan: Kəbə evinin açarına sahib olma, hacıları zəmzəm suyu ilə təmin etmək, onları yedizdirmək, Darunnədvəyə (məşvərət evi) .rəhbərlik və bayraqdar olmaq kimi mənsəblər onun əlinə keçdi

Qəsi ibn Kəlab Məkkənin işlərini dörd hissəyə bölüb və hər bir hissəsini onların bir qrupuna tapşırdı. Rəvayətə görə: Qüreyş o vaxta qədər öz evlərində ağac kəsməkdən qorxardılar. Amma Qəsi öz köməkçiləri ilə bu işi öhdəsinə aldılar və onların bu işə qarşı .olan xofunu aradan qaldırdılar

O cümlədən Qəsinin Qüreyşdə olan rolu artmağa başladı. Ərə getmək istəyən hər bir qadın, evlənmək istəyən hər bir kişi, Qüreyşin məsləhətləşmək istədiyi hər bir iş, hamısı Qəsinin evində həyata keçirilirdi. Hər vaxt bir döyüş üçün bayraq qaldırmaq .istədikdə Qəsinin evində onun oğlanlarının birinin əli ilə qaldırılardı

Müəyyən yaşlarda öz məxsus paltarını geymək istəyən hər bir qız onun evində geyinər və öz evinə gedərdi. Onun verdiyi əmrlər istər yaşadığı dövrdə istərsə də ölümündən .sonra Qüreyş üçün dinc hökmlər kimi lazım və vacib idi

Qəsi öz verdiyi məsləhətlər üçün bir ev tikib onun qapısını Məscidulhərama tərəf açdı. .Qüreyş öz işlərində məsləhətləşmək üçün orada toplaşardılar

:Bu şeri də şair onun vəsfinə ithaf edib

قصی لعمری کان یدعی مجمعا

به جمع الله القبائل من فهر

Rizahın öz yurduna qayıtması

Xəzaə və Bəni Bəkr ilə olan döyüş başa çatdıqdan və Qəsi Məkkənin rəhbəri olduqdan .sonra Qəsiyə köməyə gəlmiş Rizah öz dəstəsi ilə vətənlərinə qayıtdılar

(Rizah bu haqda şerlər də qoşmuşdur: (onun birinci şeri budur

لما اتی فی قصی رسول

فقال الرسول أجيبوالخليل

(sona qədər)

.Qəzai tayfasından olan Şöləbə Qəsiyə etdiyi köməklik barəsində belə deyir

جلبنا انخیل مضمره تعالی

من العراف اعراف الجناب

(sona qədər)

:Qəsi ibn Kəlab Rizahın cavabında deyir

انا ابن العاصمین بنی لوی

بمکه منزلی و بهار بیت

(sona qədər)

Rizah öz diyarına qayıdandan sonra Allah- Təala onun və qardaşı Həsən ibn Rəbiənin övladlarını artırdı. O iki nəfər bu gün Ozrət tayfaları adı ilə tanınırlar (Ozrət ibn Rəfidət (və Ozrət ibn Səd

Rizahın zamanında baş verən hadisələrdən biridə bu idi ki, Rizah ilə Qəzaə tayfalarından olan Nəhd ibn Zeyd və Hotkət ibn Əsləm tayfası arasında ixtilaf və küdurət yarandı. Bunun ardıyca Rizah onları təhdid etdi. Onlar da Rizahın qorxusundan Yəmənə qaçaraq Qəzaə yurdundan ayrıldılar. İndi də Yəməndə yaşayırlar. Qəsi ibn Kəlab Qəzaə tayfasında böyümüş və onlarla Rizah vasitəsi ilə yaxın əlaqəsi vardı. Məkkənin istilası zamanı ona kömək etdiklərinə görə Qəsi Rizahın o iki tayfaya :etdiklərindən razı qalmayıb şerlər vasitəsi ilə onun bu hərəkətini tənqid edib demişdi

الامن مبلغ عنی رزاحا

فانی قد لحیتک فی اثنین

لحیتک فی بنی نهد بن زید

كما فرقت بينهم و بينی

و حوتكه بن اسلم ان قوما

عنوهم بالمسا ئه قد عنونی(١)

İbn Hişamın dediyinə görə: Bəziləri yuxarıdakı beytləri Züheyr ibn Cənab Kəlbiyə .nisbət veriblər

Qəsi ibn Kelabın öz vəzifələrini oğlu Əbdüddara həvalə etməsi

Öncədən qeyd etmişdik ki, Qəsi ibn Kəlabın dörd oğlu var idi: Əbdüddar, Əbdülüzza, .Əbdü- Manaf, Əbd

Əbd Manaf, Əbdülüzza və Əbdin hər biri məqam sahibi olan şəxsiyyətlər idilər. .Əbdüddar onların hamısından böyük olsada onlarla ayaqlaşa bilmirdi

Qəsi ibn Kəlab yaşlaşdıqdan sonra Əbdüddara dedi: Ey oğlum baxmayaraq ki, qardaşların şəxsiyyət və uca məqam



---

١- [١] . Məndən Rizaha deyin: Mən iki şeyə görə səni danlayıram: Biri mənim ilə Nəhd ibn Zeyd övladları arasında saldığın ayrılığa görə digəri isə Hotkət ibn Əsləm barəsində .ki hər kəs onun incitmək istəsə məni də incidibdir

sahibi olma baxımından səndən irəlidədirlər, ancaq mən sənə elə bir məqam və vəzifə verəcəyəm ki, heç bir Qüreyş səndən icazəsiz Kəbəyə daxil olmayacaq. Sənin əlinlə Qüreyş üçün döyüş bayrağı yüksələcək, hacıların su ilə təmin edilməsi sənin vasitən ilə olacaq, sənin yemək vermədiyin halda həcc günlərində kimsə təam yeyə bilməyəcək, sənin evindən başqa bir yerdə Qüreyş işləri barəsində qərar verməsinlər. Beləliklə Darunnədvədə və habelə açara sahibi olma (Kəbə evinin qapılarının açarı – mütərcim), bayraqdarlıq, su ilə təmin etmə, hacıların qonaqlığı və bütün vəzifələri Əbdüddara .həvalə etdi

Hacıları qəbul etmək və onları yedizdirmək cərəyanı belə idi ki, Qüreyş hər il həcc mövsümündə mal və azuqə toplayıb Qəsi ibn Kəlabın yanına gətirərdilər. O da onlardan var- dövləti olmayan hacılara yemək hazırlayıb onalra yedizdirərdilər. Qəsi ibn Kəlab bu işi Qüreyşə vacib və lazım etmişdi. Onlara bu haqda verdiyi göstərişdə :belə deyirdi

Ey Qüreyş tayfası siz Allahın qonşuları və onun evinin sakinlərisiniz. Buraya gələnlər Allahın qonaqları və onun evinin ziyarətçiləri idilər. Ən layiqli qonaqlar hörmətli və izzətli olanlardır. Elə isə gəlin həcc günlərində onlar üçün su və yemək hazırlayaq. Nə .qədər ki, onlar buradadırlar onlara yaxşı qulluq ediniz

Bu göstərişdən sonra Qüreyş il boyunca öz mal-dövlətinin bir miqdarını kənara qoyub .Qəsiyə verdilər. O da Minada yemək hazırlayar və hacılara qulluq edərdi

Bu adətənənə ondan sonra da Qüreyş arasında qalmaqda idi. Nəhayət İslam dini zühur etdi. İslam dinin zühurundan sonra indiyə qədər padşahların adətinə görə hər il Minada təam hazırlanar və həcc bitənə qədər orada hacılara qulluq edirlər (indiyə (qədər dedikdə müəllif burada kitabın yazılması vaxtını qeyd etmişdirmütərcim

Bu vəzifələr üstündə Əbdüddar və ƏbdManaf övladları arasında yaranan ixtilaf və mübarizə

Qəsi ibn Kəlab dünyadan köçdü. Qüreyş və onun övladları onun göstərişləri əsasında ömür sürdülər. Onun bölgüsünə uyğun olaraq Məkkə şəhəri dörd hissəyə bölünmüşdü. Hər bir hissəsi Qüreyş və onların həmpeymanları vasitəsi ilə idarə

olunurdu. Onlar öz aralarında hissələri bir- birindən alqı- satqı edir və digər təsərüffatları ümumişlək edirdilər. Elə ki, ƏbdManaf ibn Qəsi övladları olan Əbd Şəms, Haşim və Mətləb və Nofəlin dövrü çatdı. Onlar özlərini Əbdüddar övladlarından üstün hesab edirdilər. Qüreyş arasında özlərini daha şərafətli görüb qərara aldılar ki, Kəbə evinin açarına sahib olma, bayraqdarlıq, hacıların yemək və içməklə təmin olma vəzifələrini Əbdüddar övladlarından alsınlar. Bu vaxt Qüreyş arasında ixtilaf və düşmənçilik yarandı. Bir qrup ƏbdManaf, digər bir qrup isə Əbdüddar övladlarının .köməyinə qalxdılar

Birinci dəstə deyirdilər: ƏbdManaf övladları sahib olduqları şərafət və alicənablığa .görə bu vəzifəyə layiqdirlər

İkinci dəstə deyirdilər: Qəsinin Əbdüddar övladlarına həvalə etdiyi vəzifə onlardan .alınmamalıdır

:Hər iki dəstənin tərəfdarları

ƏbdManaf övladlarının hakimiyyəti Əbd Şəmsin öhdəsində idi. Çünki o digərlərindən daha sağlam və daha böyük idi. Əbdüddar övladlarının hakimiyyəti Amir ibn Haşim ibn ƏbdManaf ibn Əbdüddarın öhdəsində idi. Deməli (Məkkə və ətrafında olan tayfalar üç dəstəyə bölündülər) Əsəd ibn Əbdülüzza, Zöhrət ibn Kəlab, Təyyom ibn Mərrət və Haris ibn Fəhr övladları ƏbdManaf övladlarının Məxzum, Səhm ibn Əmru, Cəməx ibn Əmru, Ədi ibn Kəb övladları isə Əbdüddar övladlarının müdafiəsinə qalxdılar. Amir ibn Ləvi və Məhareb ibn Fəhr övladları isə özlərini bitərəf elan edib döyüşdən kənar .durdular

Hər iki dəstə bir- birinin qarşısında səf çəkərək son nəfəsə qədər bir- birinə kömək .etməkdən əl çəkməyəcəkləri haqda möhkəm and içdilər

### ... TAYFALARIN AND İÇMƏSİ HƏLƏFUL MÜTƏYYİBİN

TAYFALARIN AND İÇMƏSİ HƏLƏFUL MÜTƏYYİBİN ...HƏLƏFUL ƏHLAF� VƏ �HƏLƏFUL FUZUL� CƏRƏYANI HƏLƏFUL MÜTƏYYİBİN

Əbdül Manaf övladları bir qabı ətir ilə doldurub– bəzi rəvayətlərə görə: onların bəzi

qadınları o qabı gətirdilər– Kəbə evinin kənarına qoydular. Onlarla həmpeyman olan bütün tayfalar əllərini ona batırıb sonra Kəbə divarına sürtdülər. Bu tərz ilə ƏbdManaf övladlarına sadiq olmalarını nümayiş

etdirdilər. Onlara tərəfdar olmalarını özlərinə lazım bilib onları Mütəyyibin(١) .adlandırdılar

**HƏLƏFUL ƏHLAF**

Əbdüddar övladları da Kəbə evinin kənarında toplaşıb vəfadarlıq üçün möhkəm and içdilər və onları “Əhlaf” adlandırdılar. Hər iki tayfa birbirinin qarşısında düzüldülər. ƏbdManaf övladları Bəni Səhm qəbiləsi ilə döyüşü öhdəsinə götürdülər. Bəni Əsəd Əbdüddar övladlarının, Zöhrə Bəni Cəməh, Tim övladları Məxzum övladları və Haris ibn Fəhr övladları isə Ədi ibn Kəb övladları qarşısında dayandılar. Hər bir tayfanın .qarşısındakı tayfanı məğlub etməsi müəyyən edildi

Döyüş üçün cərgələr düzülərkən bir dəstə vasitəçi olaraq sülh təklif etdilər. Belə ki, yedizdirib-içizdirmək vəzifəsi ƏbdManaf övladlarına həvalə edilməli, digər vəzifələr yəni açara sahib olma, bayraqdarlıq və Darunnədvə isə Əbdüddar övladlarında qalmalı idi. Bu təklifi tərəflər qəbul etdilər və onunla razılaşdılar. Beləliklə şölələnməkdə olan alov söndürüldü və qeyd etdiyiniz tayfalar döyüşdən əl çəkdilər. Bu minvalla İslam dini zühur etdi. O vaxt Allahın peyğəmbəri buyurdu: “Cahiliyyətdə içilən ”hər bir andı İslam daha da möhkəmləndirir

**HƏLƏFUL FUZUL**

Amma Hələful Fuzul cərəyanı isə belə olmuşdu: Bəni Haşim, Bəni Mütəllib, Əsəd ibn Əbdülüzza, Zöhrət ibn Kəlab və Tim ibn Mərrət tayfaları Abdulla ibn Cədanın– digərlərindən daha sağlam və şərafətli insan idi– evində toplaşıb and içdilər ki, istər Məkkə şəhəri əhalisindən və istərsə də digər bir şəhərdən olan hər hansı bir şəxsə Məkkə şəhərində zülm olunarsa onun müdafiəsinə qalxaraq, zülmkardan onun haqqını



---

Bəzi rəvayətlərə görə: bu hədis peyğəmbərin buyurduğu “la hələfə filislam” yəni . [١] -١ İslamda ləğv edilmiş and yoxdur digər bir hədisə görə isə Məkkənin fəthindən öncə deyilib. Amma Məkkə fəth edildikdən və İslam qüvvətləndikdən sonra cahiliyyət

(alaraq ona qaytarmalıdırlar. Bu andı Qüreyş “Hələful Fuzul” adlandırdılar.(١)

**...HƏLƏFUL– FUZUL BARƏSİNDƏ PEYĞƏMBƏRDƏN BİR HƏDİS VƏ**

HƏLƏFUL– FUZUL BARƏSİNDƏ PEYĞƏMBƏRDƏN BİR HƏDİS

VƏ... ƏBA ƏBDİLLAH HÜSEYN (Ə) DAN BİR DASTAN

Məhəmməd ibn İshaqın, Təlhə ibn Abdulladan rəvayət edir ki, Allahın elçisi buyurdu: Mənim yanımda qırmızı tüklü dəvə karvanından daha sevimli olan bu and bağlanarkən mən də Abdulla ibn Codanın evində idim. Əgər İslamda da mənə belə and dəvət olunarsa onu qəbul edərəm. Və yenə ibn İshaq, Məhəmməd ibn İbrahimdən rəvayət edir ki, həzrəi Əba Əbdillah Hüseyn (ə) ilə Mədinəyə əmisi Müaviyə tərəfindən təyin edilən Vəlid ibn Ütbə arasında həzrətin Zi Mərrədə olan malmlükü barəsində mübahisə baş verdi. Vəlid ibn Ütbə öz qüdrətindən istifadə edərək onun haqqını tapdalamaq istədi. Hüseyn (ə) buyurdu: Mənim haqqımı mənə qaytarmasan qılıncı ələ alıb .peyğəmbər məscidində ayağa qalxıb camaatı HələfulFuzula dəvət edəcəyəm

Vəlidin məclisində iştirak edən ƏbdullaH ibn Zübeyr dedi: And olsun Allaha, əgər o belə bir dəvət etsə, mən də qılıncımı əlimə alıb onu müdafiə edəcəyəm ki, onun haqqını səndən geri



---

Onun Hələful– Fuzul adlanmasının səbəbi kimi qeyd edirlər ki, belə bir andın . [١] –١ oxşarı Corhəmilərin vaxtında bağlanmış idi. O zaman bu andı içənlərin hamısının adı Fəzl olduğu üçün – Nəzl Ibn Fəzalə (ya Qəzaə), Fəzl ibn Vidaə, Fəzl ibn Haris (ya Şəraə) – Qüreyş onu Hələful Fuzul (yəni Fəzllərin andı) adlandırdılar. Qureyşin belə bir addım atmasının səbəbini bu cür izah edirlər: Zübeyd tayfasından bir kişi Məkkəyə gəldi. Özü ilə satmağa gətirdiyi şeyi As ibn Vailə satdı. Qüdrətli və nüfuzlu bir şəxs olan As ibn Vail kişiyə pul verməkdən imtina etdi. Zübeyddən olan kişi kömək üçün “Əhlafın” yanına getdi. Ancaq onlar onun haqqını almaqdan boyun qaçıraraq onu yanından qovdular. Zübeyd tayfasından olan o kişi Əbu Qubeys dağının zirvəsinə qalxıb bir neçə şer ilə ona qarşı olan zülmü Məkkəlilərin qulağına çatdıraraq onlardan yardım istədi. Bu vaxt

Zübeyr ibn Əbdül Mütəllib ayağa qalxıb qeyd etdiyimiz tayfaları ƏbdullaH ibn Codanın evində toplayaraq onlarla qeyd etdiyimiz andı bağladı. Bu hadisə besətdən (Həzrət Məhəmmədin (s) peyğəmbərliyə yetişdiyi gün – mütərcim) iyirmi il əvvəl baş vermişdi.

.alım və ya bu yolda canımı verim

.Bu xəbər Məsur ibn Məxzəmənin qulağına çatdı. O da eyni sözləri dedi

Əbdür- Rəhman ibn Osman Timi də hadisədən xəbərdar olduqda onların sözlərinə :oxşar sözlər dedi

(Vəlid ibn Ütbə işi belə gördükdə o həzrətin haqqını ona qaytardı.(١)

Hacıların yeməkiçmək ilə təmin edilməsi vəzifəsinin

Haşim ibn Əbd Manafa həvalə edilməsi və onun

haqqında qısaca məlumat

Qeyd etdiyimiz kimi hacıların yemək- içmək ilə təmin edilmə vəzifəsi Haşim ibn Əbdü Manafa tapşırıldı. Əbd Şəms Haşimdən daha böyük və daha sağlam olsada bu vəzifə ona verilmədi. Çünki Əbd Şəms çox səfər etdiyi üçün öz ölkəsində yəni Məkkədə az qalardı.. Bundan əlavə ailəli və kasıb idi. Haşim ibn ƏbdManaf isə imkanlı və varlı bir kişi :idi. Həcc vaxtı olanda Qüreyş arasında ayağa qalxıb aşağıdakı xütbəni oxuyardı

Ey Qüreyş! Siz Allahın qonşuları və onun evinin sakinlərisiniz. Bu elə bir mövsümün“ vaxtıdır ki, Allah ziyarətçiləri və evinin qonaqları olan hacılar sizə tərəf gələrlər. Ən layiqli qonaqlar, o qonaqları qəbul edən və hörmətli qonaqlardır. Elə isə onlar üçün bir şeylər yığın ki, onun vasitəsi ilə bu şəhərdə qadlıqları müddətdə onlar üçün yemək hazırlayaq. And olsun Allaha ki, əgər mənim kifayət qədər imkanım olsaydı sizə təklif .”etməzdim

Onun sözlərini eşidən Qüreyşin hər biri imkanı çatdığı qədər mal və ərzağı onun yanına .aparırdılar. Haşim o mallar vasitəsi ilə yemək hazırlayıb hacıları yedizdirərdi

Rəvayətə görə: Haşim ibn Əbdü Manaf Qüreyş üçün iki səfəri yəni şeta və seyf(٢) (yay (və qız ticarət səfəri

İbn Hişam bu barədə Əbdül Məlik ibn Mərvan və Məhəmməd ibn Cübeyrdən . [١] -١
kiçik bir dastan rəvayət edir ki, ixtisara riayət olunması və bizim məqsədimizə aidiyyatı
.olmadığı üçün yazmaqdan vaz keçdik. ١٥٥- ci səhifəyə müraciət edə bilərsiniz

Fil sahibləri dastanın aşağısında bunun üçün izah verilib ki, istəyənlər oraya . [٢] -٢
.müraciət edə bilər

səfərini təşkil edən ilk şəxs idi. Onun adı Əmr idi. Haşim adlanmasının səbəi Məkkədə öz tayfasını yeməklə təmin etmək üçün böyük kasalara çörək doğrayardı. Buna görə də onu Haşim adlandırdılar. (Çünki Haşim, həşm sözündəndir doğrayan mənasındadır. Yəni çörək doğrayan) Bu münasibətlə Qüreyş və ya ərəb şairlərindən biri deyir:

عمرو الذی هشم الثرید لقومه

قوم بمکه مستنین عجاف

سنت الیه الرحلتان کلاهما

سفر الشتاء و رحله الاصیاف

Haşimin vəfatı və onun vəzifəsinin Mütəllib ibn ƏbdManafa çatması

Haşim ibn ƏbdManaf ticarət üçün Şama etdiyi səfərlərdən birində Ğəzza kəndində dünyadan köçdü. Ondan sonra hacıların yeməkiçmək ilə təmin edilməsi vəzifəsi ƏbdŞəms və Haşimdən kiçik olan qardaşı Mütəllibə keçdi. O, hörmtəli alicənab və səxavətli bir insan idi. Səxavətli insan olduğuna görə Qüreyş ona “Feyz” ləqəbi vermişdi.

Əbdül Mütəllibin dünyaya göz açması və ona bu adın verilmə səbəbi

Haşim ibn Əbdü Manaf Mədinəyə getdiyi səfərlərdən birində Bəni Nəccar tayfasından olan Əmru qızı a ilə ailə həyatı qurdu. Bu qadın ilk öncə Əhihə ibn Cəlahla evlənmiş və ondan Əmru ibn Əhihə adlı bir oğlu olmuş idi. Ərindən ayrıldıqdan sonra Haşimin həyat yoldaşı oldu. İlk öncə bu qadın öz tayfası arasında olan nüfuz və hörmətinə görə evlənmirdi. Nəhayət onunla şərt kəsdilər ki, onun boşanma məsələsi öz ixtiyarında olacaq və əgər bir şəxs ilə yaşamaq istəməsə ondan ayrıla bilər. Hər halda Haşim ibn ƏbdManaf ilə ailə həyatı qurub ondan Şeybə adlı oğlu oldu. Haşim ibn ƏbdManaf onu böyüməsi üçün anasının yanında saxladı. Şeybə böyüyəndən sonra (Haşim vəfat etmişdi). Əmisi Mütəllib Mədinəyə getdi ki, onu anasından alıb öz tayfasına gətirsin. a övladını Mütəllibə verməyə razı olmadı Mütəllib də dedi: Mən Şeybəni özüm ilə

Məkkəyə aparmayana qədər buradan getmiyəcəyəm. Çünki mənim qardaşım oğlu burada biganə və qəribədir. Amma Məkkədə bizim tayfa hörmətli tayfadır. Onların bir çoxu işləri bizim idarəçiliyimiz altında

həyata keçirilir. Onun Məkkə kimi şəhərdə öz tayfa və qohumları içərisində yaşaması .yadlar içərisində yaşamaqdan daha yaxşıdır və bu kimi sözlər dedi

Digər tərəfdən Şeybə də əmisinə dedi: Anam a icazə verməyincə mən ondan ayrılmayacağam. Nəhayət anın razılığı alındı və Şeybə Mütəlliblə Məkkəyə yola salındı. Mütəllib onu götürüb dəvəyə mindirib Məkkə şəhərinə yola düşdü. Məsələdən xəbərdar olmayan Qüreyş onu Mütəlibin qulu zənn edib dedilər: Mütəllib onu alıb özü ilə Məkkəyə gətirib ona görə də onu “Əbdül Mütəllib” adlandırdılar. Mütəllib dedi: Yersiz sözlər danışmayın, bu mənim qardaşım Haşimin oğludur. Onu mən Mədinədən bu .şəhərə gətirmişəm

## MÜTƏLLİBİN ÖLÜMÜ VƏ ONUN VƏZİFƏLƏRİNİN ƏBDÜL MÜTƏLLİBƏ KEÇMƏSİ

Mütəllib Yəmən vilayətində “Rəzman” adlı bir yerdə dünyadan köçdü. Mətrud ibn Kəb və digərləri onun müsibətinə şerlər qoşdular.(۱) Ondan sonra Əbdül Mütəllib hacıların yemək- içməklə təmin edilməsi vəzifəsini öhdəsinə aldı. Atalarının gördüyü işi bu da .görürdü. Get- gedə camaat arasında böyük hörmət sahibi olurdu

İndi yenə də Əbdül Mütəllibin yuxusu və Zəmzəm quyusunun qazılma dastanının davamına qayıdırıq

Qüreyş Kəbə evinin yaxınlığında bir quyunun olmasından və onun Corhəmilər) tərəfindən doldurulmasından xəbərdar idilər. Amma onun yerini bilmirdilər. Həmişə bu quyudan bir əsər əlamət tapmaq intizarında idilər. Amma heç bir əsərəlamət tapmaq intizarında idilər. Amma heç bir əsərəlamət tapa bilmirdilər. Suya olan tələbatı ödəmək üçün Məkkədə quyular qazdılar ki, sonra onların adlarını qeyd edəcəyik. İş beləcə davam edirdi tainki) Əvvəldə qeyd etmişdik ki, Əbdül Mütəllib Həcər İsmail adlanan yerdə yatmış idi ki, bir kəs onun yuxusuna girib Zəmzəm quyusunu qazmaq barəsində .göstəriş verdi



---

Şerlərin mətnlərindən xəbərdar olmaq üçün ۱۳۸- ۱۴۲ səhifələrə müraciət edə . [۱] -۱ .bilərsiz

.Beləcə yerini də ona göstərdilər

İbn İshaq Əli ibn Əbu Talibdən bir hədis rəvayət edib ki, qeyd etdiyiniz yuxu Əbdül Mütəllibin öz dili ilə belə olmuşdur: Həcərdə yatdığım vaxt bir kəs yanıma gəlib dedi: ("Teyyibəni" qaz! Mən dedim: Teyyibə haradır? Deyən getdi (və mən onu görmədim

Səhəri gün yenə həmin yerə gedib yatdım. Yuxuda gördüm həmin şəxs gəlib dedi. ."Bərrəni" qaz! Dedim: Bərrə nədir? Deyən gözdən itdi

Üçüncü gün olduqda mən yenə də oraya getdim. Yuxuya gedən kimi həmin söyləyən .gəlib dedi: "Məznunəni" qaz! Dedim: Məznunə nədir? Deyən gözdən itdi

Dördüncü gün həmin formada gəlib dedi: Zəmzəmi qaz, dedim: Zəmzəm nədir? Dedi: Odur ki, nə suyu quruyar və nə azalar. Hacıları sirab edər, yeri qan və peyin ilə doludur. Orada ağ və qara qarğalar dimdik vurar, ora qarışqaların yuvasıdır. Əbdül Mütəllib bu əlamətlərlə ona göstərişi verilən quyunun yerini bildi və onun yuxusunun doğru düzgün yuxulardan olduğunu başa düşdü. Səhərisi gün külüngünü əlinə alıb həmin vaxt yeganə övladı olan Haris ibn Əbdül Mütəlliblə işə başlayıb, quyunu qazmağa başladı. Bir az qazdıqdan sonra quyuda daş görünməyə başladı və təkbir dedi: Qüreyş onun təkbir səsindən bildilər ki, o öz məqsədinə nail olub. Bu vaxt hamı qalxıb onun yanına gələrək dedilər: Ey Əbdül Mütəllib bu quyu bizim atamız həzrəti İsmailindir. Bizidə özün ilə birgə bu quyuda şərik elə! Əbdül mütəllib dedi: Bu elə bir quyudur ki, onu qazmaq üçün təkcə mən məmur olmuşam, ona görə də sizi onda şərik etməyəcəyəm. Qüreyş dedilər: Biz bu söz ilə razılaşmırıq. Əgər güclü bir dəlilsübut .gətirməsən biz əl çəkməyəcəyik

Əbdül Mütəllib dedi: Bizim aramızda bir şəxsi qazi təyin edin, o nəyə hökmə etsə biz də o cür hərəkət edəcəyik. Dedilər: Biz Səd Həzim qəbiləsinin kahin qadınının qəzavətini qəbul edirik. Əbdül Mütəllib də qəbul etdi və Şam dağlıqlarında yaşayan o qadına tərəf yola düşməyə hazırlaşdılar. Səhərisi gün hər tayfadan bir nəfər yola düşdü. Yol əsnasında Əbdül mütəllib

və onu müşayət edənlərin suyu qurtardı. Elə susamışdılar ki, artıq məhv olacaqlarını yəqin etmişdilər. Onlarla olan digər qüreyş nümayəndələrindən su istəsələrdə onlar su verməkdən imtina etdilər və dedilər: Bizim özümüzün də suya ehtiyacımız var .qorxuruq ki, bu quru və susuz səhrada sizin taleyinizi təkrarlayaq

Vəziyyəti belə görən Əbdül mütəllib üzünü yoldaşlarına tutub dedi: İndi nə etmək lazımdır? Dedilər: Sən nə desən onu! Dedi: Mənim fikrimə görə nə qədər ki, canımız da qüvvət var hər birimiz öz əli ilə qəbrini qazıb yanında əyləşsin. Nə qədər ki, onun digər dostları sağdırlar onu qəbirdə dəfn etsinlər. Axıra qalan şəxsin bədəni çöldə qalacaq. Ona görə də bu biyabanda hamının bədəni məhv olmasındansa bir nəfərin bədəninin .məhv olması daha yaxşıdır

Bu sözü qəbul etdilər və hər biri qalxıb özü üçün bir çuxur qazdılar. Sonra onun yanında əyləşib onlara hakim olmuş susuzluğa görə ölümün gəlişini gözləyirdilər. Digər Qüreyş nümayəndələri isə bütün bu hallarda onların necə davranacaqlarına tamaşa edirdilər. Bu vaxt Əbdül Mütəllib üzünü yoldaşlarına tutub dedi: And olsun Allaha bizim su axtarmağımız tamamən acizlik və gücsüzlükdür. Əlimizi əlinizin üstünə qoyub ölümü gözləməkdənsə qalxın bir tərəfə gedək bəlkə Allah dünyanın bu nöqtəsində ruzi olaraq bizə su qismət etdi. Bütün karvan əhlinin onların necə hərəkət etməsinə tamaşa edə-edə hamı ayağa qalxdılar. Əbdül Mütəllib öz dəvəsinə minib qışqırdı ki, dəvə yerdən .qalxsın. Qalxan kimi o dəvənin ayağı altından saf və şirin su axmağa başladı

Saf suya gözü sataşan Əbdül Mütəllib qışqıraraq təkbir dedi: yoldaşları da təkbir dedilər. Bu vaxt dəvədən aşağı düşüb su içib susuzluğunu yatızdırdı. Sonra hamısı o sudan içib dedilər. Ey Əbdül Mütəllib Allah sənin barəndə yaxşı qəzavət etdi. Biz bundan sonra Zəmzəm quyusuna görə səninlə dalaşmayacağıq. Səni bu susuz səhrada sirab edən şəxs Zəmzəm suyunu sənə bağışladı. Arxayınlıqla öz sirab etmə .işinə qayıt

Beləliklə Əbdül Mütəllib Qüreyş karvanı ilə Məkkəyə tərəf

.qayıtdılar və Bəni Səd kahinəsinin yanına getmək fikrindən daşındılar

İbn İshaqın Əli ibn Əbu Talibdən rəvayət etdiyi hədis bu idi. Digər hədisdə Zəmzəm :quyusunun qazılma dastanını belə rəvayət edir ki, Əbdül Mütəllib deyir

:Quyunun qazılması mənə göstəriş verildikdən sonra mənə deyildi

ثم ادع بلماء الروى غير الكدر

يسقى حجيج الله فى كل مبر

ليس يخاف منه شىء ما عمر(۱)

Əbdül Mütəllib bu sözləri eşitcək Qreyşin yanına gedib dedi: Xəbəriniz olsun ki, Zəmzəm quyusunu qazmağa məmur edlimişəm (yuxuda) Qüreyş dedilər: Onun yerini sənə göstəriblərmi? Dedi: yox; dedilər: Elə isə bu yuxunu gördüyün yerə qayıt və yat. Əgər bu göstəriş Allah- Təala tərəfindən gəlibsə onda onun yerini də sənə göstərəcəklər. Əgər bu yuxu şeytan tərəfindən olubsa yanına heç kim gəlməyəcək. Əbdül Mütəllib oraya qayıdıb yatdı. İkinci dəfə onun yanına gəlib dedilər: "Zəmzəmi qazsan peşiman olmayacaqsan, O sənin babanın mirasıdır. Onun suyu heç vaxt qurumaz və azalmaz. Hacıları sirab edərsən...(۲) Orada nemət verən Allah üçün nəzr etsinlər. Miras qalan bir quyu və möhkəm bir müqavilədir. Sənin bildiyin kimi deyil. ."Onun yeri qan və peyin arasındadır

Rəvayətə görə: Əbdül Mütəllib soruşdu: Onun yeri hardadır? Ona dedilər: Qarışqa .yuvası olan yerdə, o yerdə ki, sübh qarğa dimdiyini yerə vurur

Bəs Əbdül Mütəllib yeganə övladı Haris ilə birlikdə oraya gəldi. Asəf və Nailə(۳) arasında Qüreyşin qurban kəsdiyi yerdə qarışqa yuvasını tapdılar. Habelə orada əyləşən və dimdiyini yerə vuran qarğanı müşahidə etdilər. Külüngü əlinə alıb qazmağa .başladı

Bunu görən Qüreyş yaxın gəlib dedilər: Biz icazə verməriк

---

Yəni (Zəmzəm quyusunu qazmaqla) elə bir su istəki həm çox saf həm zülallıdır. . [۱] -۱
.Həcc mərasimi vaxtı hacıları sirab etsin. O mövcud olana qədər kimsəni inctiməsin

.Sirənin cümləsini başa düşmədik . [۲] -۲

.Asaf və nailənin mənası ۵۶- cı səhifədə qeyd edildi . [۳] -۳

ki, biz qurban kəsdiyimiz iki büt arasında quyu qazasan! Əbdül Mütəllib övladı Harisə dedi: Sən onları buradan uzaqlaşdır ki, mən işimi davam etdirim. Çünki and olsun Allaha mən bu işdən əl çəkməyəcəyəm. Qüreyş Əbdül Mütəllibin bu iş barəsində ki, .qərarını görüb, onu orda qoyub öz işlərinin dalısıyca getdilər

Quyunu bir az qazmışdı ki, quyuda bir daşa rast gəldi. Əbdül mütəllib daşı görüb təkbir .dedi. Camaat başa düşdülər ki, Zəmzəm barəsində ona deyilənlər düz olubdur

Quyunun qazılma işi bitdikdən sonra oradan qızıl ceyran– Corhəm qəbiləsi basdırmışdı(۱)bir neçə Qala(۲) qılıncı və eləcədə bir neçə zireh də tapıldı. Qüreyş dedilər: Bu tapılan xəzinədə biz də sənin ilə şərikik? Əbdül Mütəllib dedi: Mən sizi bu əşyalara şərik edə bilmərəm. Amma bir iş görə bilərəm ki, Kəbə də püşk atma üçün .saxlanılan oxlar vasitəsi ilə bu tapıntıların sahibini müəyyənləşdirə bilərik

?Qüreyş dedilər: Necə

Əbdül Mütəllib dedi: İki ox Kəbə üçün, iki ox mənim üçün və iki oxda sizin üçün ayıraq. .Oxlar kimin bəxtinə çıxsa xəzinə də onun olsun

Qüreyş qəbul etdi: Kəbə üçün iki sarı ox, Əbdül Mütəllib üçün iki qara ox və Qüreyş üçün iki ağ ox müəyyənləşdirdilər. Sonra oxları Hübəlin yanına aparan püşk atana verdilər– Hübəl Kəbə evinin ortasında qoyulan böyük büt idi. Ühüd döyüşündə Əbu .yəni ey Hübəl öz dinini aşkar elə "اعل هبل" :Süfyan onu özü ilə gətirşmiş və ona demişdi

Əbdül Mütəllib əllərini Allahın dərgahına qaldırıb dua etdi. Püşkatan oxlarla püşkünü atdı. Nəticədə iki qızıl ceyran Kəbənin, qılınc və zirehlər isə Əbdül Mütəllibin bəxtinə .düşdü. Ağ oxlar– Qüreyşin adına idi– heç nə qazana bilmədi

Əbdül Mütəllib onun bəxtinə çıxan qılıncları Kəbəyə bağışladı. Onlardan Kəbə üçün .qapı düzəltdilər. İki qızıl ceyranın qızılından qapının dəstəyində istifadə etdilər



---

.Bunun izahı ۷۶– cı səhifədə qeyd edildi . [۱] –۱

Qala Şamda (indiki Suriya – mütərcim) bir dağ adı və ya Hindistanda bir qaladır . [۲] –۲

.Deyilənlərə görə: birinci dəfə idi ki, Kəbənin bəzədilməsində qızıldan istifadə edilirdi

.Əbdül Mütəllib beləcə hacıların sirab edilməsi işi ilə məşqul idi

Qüreyş tayfalarının Məkkədə qazdığı quyular

Əbdül Mütəllib Zəmzəm quyusunu qazmazdan öncə Qüreyş Məkkənin müxtəlif .məhəllələrində bir çox quyular qazmışdılar ki, onların bəziləri aşağıdakı kimidir

Təvi quyusu" ƏbdŞəms ibn Manaf Məkkənin yuxarı tərəfində Məhəmməd ibn Yusifin" .evinin yaxınlığındakı Bəyzada (ağ yerdə) qazmışdı

Bəzr quyusu" Haşim ibn ƏbdManaf, Əbu Talib dərəsinin girəcəyində "Xəndəmənin" " .qarşısındakı Müstənzərdə qazmış və onun suyunu hamı üçün vəqf etmişdi

Sucilə quyusu" Onu Haşim ibn ƏbdManaf qazdı. Bu gün Motəm ibn Ədi ibn Nofəl" tayfasının quyusudur ki, ondan istifadə edirlər. Nofəl övladlarına görə bu quyunu Motəm Əsəd ibn Haşimdən alıbdır. Amma Haşim övladları deyirlər: Zəmzəm quyusu tapılandan sonra bu quyuya ehtiyac qalmadığına görə Əsəd ibn Haşim onu Motəm ibn .Ədiyə bağışladı

.Həfr quyusu" Uməyyə ibn Əbd- Şəms öz şəxsi istifadəsi üçün qazmışdı"

Səqiyyə quyusu" Əsəd ibn Əbdül- Ğürra övladları qazmışdılar. Bu quyu Əsəd övladları" .quyusu kimi məşhur idi

.Um Ehrad quyusu" Əbdüddar övladları qazmışdılar"

Sünbülə quyusu" Cəməh övladları qazmışdılar. Onu Xələf ibn Vəhəb quyusuda" .adlandırırdılar

.Ğəmər quyusu"ya da Səhm övladları quyusu– Səhm övladları tayfası qazmışdı"

Məkkənin ətrafında digər quyularda rast gəlmək mümkün idi ki, mənə ibn Kəb və Kəlab ibn Mərrə tərəfindən qədim dövrlərdə qazdırılmışdı. Məsələn: "Rəm quyusu" Mərrə ibn Kəb övladları "Xəm quyusu" və "Həfr" quyusu isə Bəni Kəlab ibn Mərrə

.tayfası tərəfindən qazılmış və Qüreyş rəhbərlərinin istifadəsinə verilmiş idi

Zəmzəm quyusu qazıldıqdan sonra hacıların sirab edilməsi üçün istifadə edilən digər quyulardan imtina edilib hamı bu

quyuya tərəf axışdılar. Çünki bu quyunun digər quyular ilə müqayisədə bir sıra üstünlükləri var idi. Məsələn: onun Məscidul-həramda olması, digər quyular ilə müqayisədə suyunun daha yaxşı olması, Allahın dostu olan həzrəti İbrahimin övladı .həzrəti İsmail tərəfindən meydana çıxması və s

Bu cəhətlər ƏbdManaf övladlarına digər ərəb və Qüreyş tayfaları ilə müqayisədə əlavə iftixar və başıucalıq gətirirdi. Bu barədə Müsafir ibn Əbi Əmr ibn Üməyyə və Həzifət ibn Ğanəm bir sıra şerlər söyləmişlər ki, bu şerlərdə Haşim övladlarının Zəmzəm suyu ilə sirab etmələri və digər cəhətlərə görə iftixara malik olmaları qeyd .olunur

## ƏBDÜLMÜTƏLLİBİN ÖZ ÖVLADINI KƏSMƏSİ ÜÇÜN ETDİYİ NƏZR

Rəvayətə görə Əbdül Mütəllibin "Zəmzəm" quyusunu qazdığı zaman qüreyşin ona qarşı etdiyi etirazları və yersiz söhbətlərini eşitmiş və öz- özünə nəzr etmişdi ki, əgər Allah zəruri olan hallarda özünü qoruması üçün ona on oğlan övladı əta edərsə onların birini Kəbə evinin ətrafında qurban kəsəcəkdir. Elə ki, övladları ١٠ nəfər oldu, nəzri yadına düşdü, övladlarını toplayıb etdiyi nəzri onlara deyərək onlardan nəzrinə vəfa .etməsində ona yardımçı olmalarını istədi

Övladlar hazır olduqlarını bildirib dedilər: Bu barədə dediyin hər bir şeyi yerinə yetirəcəyik. Dedi: Hər biriniz əlinizə bir ox alıb adınızı onun üzərinə yazaraq mənim yanıma gətiriniz. Əbdül Mütəllibin oğlanları onun göstərişini yerinə yetirərək hər biri öz adını yazdığı oxu Əbdül Mütəllibin yanına gətirdi. Əbdül Mütəllib onları götürərək Hübəl bütünün qoyulduğu Kəbə evinin içərisinə daxil oldu. Hübəl Kəbə hədiyyələrinin .töküldüyü və Kəbə evində yerləşən bir quyunun yuxarı tərəfində qoyulmuşdu

Ərəbin püşk atma mərasimi belə idi ki, Hübəlin yanına gələrdilər orada hər birinin üzəri yazılmış yeddi ox vardı. Birinə yazılmıdır ki, "Diyə" (qanbahası) hər vaxt biri öldürülmüşün qanbahasına görə fikir ayrılığı olduqda Kəbə evinin içərisinə gələr və hər kəsin adına "Diyə" yazılmış ox çıxsaydı öldürülmüşün qan pulunu ondan tələb .edərdilər

Oxlardan birinə yazmışdılar: "Bəli", digərinə isə "yox" yazmışdılar. Hər vaxt bir iş görmək istədikdə onu bir- birinə qatışdırar, sonra isə birini çıxarardılar. Əgər "Bəli" yazılmış ox çıxsaydı onu yerinə yetirər, yox əgər "yox" yazılmış ox çıxsaydı ondan .imtina edərdilər

Digər üç oxda isə ardıcıllıqla "Sizdəndir", "Başqalarındandır", "Yapışıbdır" sözləri yazılmışdı. Əgər bir şəxsin şəcərəsində şəkk etsəydilər qeyd etdiyimiz oxları qatışdırar sonra isə onlardan birini çıxarardılar. Əgər birinci ox çıxsaydı şəxsiz onu özlərindən hesab edər, əgər ikinci ox çıxsaydı onu biganə və yad hesab edər və əgər üçüncü .çıxsaydı deməli onlarla heç bir bağlılıq və nisbət yox idi

Onlardan birinə "Sular" sözü yazılmış idi. Əgər bir quyu qazmaq istədikdə oxları qatışdırardılar. Əgər o ox çıxsaydı quyunu qazardılar. Onların adətinə görə evlənmək, övlad sünnət etdirmək, ölüləri hansısa yerdə dəfn etmək və ya kimsənin şəcərəsində şübhə etdikdə və ya başqa hallarda oxlar vasitəsi ilə püşk atmaq istədikdə nəzərdə tutulmuş insanı bir dəvə və yüz dirhəm pul ilə Hübəlin yanına göndərərdilər. O, dəvə və pulu püşk atana verərdilər. Sonra püşk atılacaq insanı irəli çəkib deyərdilər. İlahi bu filankəs oğlu filankəsdir ki, biz onun barəsində filan işi yerinə yetirməyi niyyət etmişik. İndi nəyi məsləhət və haqq bilirsənsə onu da müəyyən elə. Bu sözü deyir sonra püşkü .atana deyərdilər: İndi püşkü at

.O, da qeyd etdiyimiz formada püşk atar və hər nə çıxsaydı ona da əməl edərdilər

O, cümlədən Əbdül Mütəllib püşk atana öz nəzri barəsində məlumat verib ona dedi: İndi püşk at! Əbdül Mütəllib ovladlarının hər biri öz oxunu o kişiyə verdilər. Bu arada Zübeyr və Əbü Talib ilə eyni anadan olan Əbdül Mütəllibin kiçik oğlu Əbdullah da öz oxunu o kişiyə verdi– anaları Əmr ibn Aizin qızı Fatimə idi– Deyilənlərə görə: Əbdül Mütəllib onu digər övladlarından daha çox istəyirdi. Onun Allahın elçisinin atası .olacağını bildiyi üçün püşkün ona düşəcəyini güman etmirdi

Püşkün Əbdullahın adına çıxması və Qüreyşin onun öldürülməsinə mane olması

Püşk atan şəxs onları qarışdırdı. Əbdül Mütəllib də Allahtəalanın dərgahına əllərini qaldırıb dua edərək püşkün nəticəsini gözləyirdi ki, qəflətən bir kişi irəli gələrək Əbdullahın adını dedi. Əbdül - mütəllib dərhal yerindən qalxaraq bir əli ilə Əbdullahı, digər əli ilə isə xəncəri tutub birbaş Asaf və Nailəyə(۱) tərəf gəldiki Əbdullahın orada başını kəssin. Belə olduqda Qüreyş hər tərəfdən Əbdülmütəllibə doğru hücum edib ona dedilər: Nə etmək istəyirsən? Dedi: Əbdullahı kəsmək istəyirəm. Dedilər: And olsun Allaha nə qədər ki, bu işdə üzr yeri var, onu öldürməməlisən. Çünki, əgər sən bu gün bu işi yerinə yetirsən bundan sonra camaat öz övladlarını buraya gətirərək başını kəsəcəkdir. Bununla da kimsə salamat qalmayacaqdır.

Əbdullahın anası Fatimə ilə eyni tayfadan olan və Əbdullahın dayısı hesab olunan Müğeyrə ibn Abdulla Məxzumi irəli gəlib dedi: Ey Əbdül -mütəllib nə qədər ki, bu işdə çıxış yolu var sən Əbdullahın başını kəsməməlisən. Əgər qurban istəsə biz bütün var dövlətimizi Əbdullaha qurban verə bilərik. Əbdül mütəllibin digər övladları və Qüreyş deyirdilər. Onu Hicazda yaşayan kahinin yanına apar və o nə desə onu da yerinə yetir.

Bu təklif qəbul edildi. Həmin qadını tapmaq üçün Mədinəyə gəldilər. Soraqlaşdıqdan sonra ona dedilər ki, dediyiniz qadın Xeybərdədir. Onlar Xeybərə tərəf yola düşərək oraya çatdılar. Onlar qadının yanına gedib məsələni ona danışdılar. Qadın dedi: Bu gün mənə möhlət veriniz ki, mənim tabeçiliyimdə olan cin gəlsin və mən bu işi ondan soruşum. Onlar o qadının yanından durub getdilər. Əbdül- Mütəllib o günü Allah - təalanın dərgahına dua etməklə keçirtdi. Səhəri o qadının yanına gəldilər. Qadın dedi: Öz yurdunuza qayıdıb püşkün bir tərəfinə Əbdullahın adını digər tərəfdə isə on dəvə yazaraq püşk atın. Yenə də püşk Əbdullahın adına çıxdı. On dəvə artırıb yenə də püşk atdılar, püşk Əbdullahın adına çıxdı. On dəvə artırıb sayını otuza çatdırdılar. Sonra yenə də püşk atdıqda Əbdullahın adı çıxdı. Dəvələri artırdılar sayı qırx oldu, püşk atdıqda yenə də Əbdullahın qismətinə çıxdı. Dəvələrin sayı ۵۰- yə yüksəldi amma püşkdə yenə Əbdullahın adı çıxdı.



---

۱- [۱]. Mənası ۵۶- cı səhifədə söylənildi.

Beləcə hər dəfə on dəvə artırırdılar. Nəhayət onların sayı ۱۰۰ olduqda püşkdə dəvələrin .adı çıxdı. Bütün bu müddətdə hər dəfə püşk atanda Əbdülmütəllib dua edirdi

Püşk dəvələrin adına çıxdıqda orada olan Qüreyş və digər şəxslər ayağa qalxıb dedilər: Ey Əbdül mütəllib Allah səndən razı oldu. Amma Əbdül Mütəllib qəbul etməyib dedi: Yox and olsun Allaha üç dəfə də püşk atmasam rahat olmayacağam. Yenə üç dəfə püşk atdıqda, püşk dəvələrin adına çıxdı. Elə buradaca dəvələri kəsib ətlərini yer .üzərinə qoydular ki, istəyən apara bilsin. Beləliklə Əbdullah öldürülməkdən xilas oldu

Özünü Əbdullaha təqdim edən və onunla ailə həyatı qurmaq istəyən qadının dastanı

Əbdül Mütəllib dəvələri kəsdikdən sonra Əbdullahın əlini tutub evə tərəf yola düşdü. Deyilənlərə görə: Vərəqət ibn Nofəlin bacısı Bəni Əsəd ibn Əbdülüzza tayfasından olan bir qadın Kəbə kənarında Əbdullahın parlaq simasını görüb ona dedi: Ey Əbdullah hara gedirsən? Dedi: Atamın arxasınca gedirəm. Qadın dedi: Mən sənin üçün qurbanlıq kəsilən dəvənin sayı qədər dəvə bağışlayaram ki, mənimlə bir yatağa girəsən? Əbdullah dedi: Mən atamın izni olmadan heç bir iş görməyəcək və ondan da .ayrılmayacağam

Əbdullahın Vəhəb qızı Aminə ilə ailə həyatı qurması

Əbdülmütəllib bu hadisədən sonra Əbdullahı Bəni Zöhrə qəbiləsinin rəhbəri olan Vəhəb ibn ƏbdManaf ibn Zöhrənin yanına aparıb öz dövründə Qüreyş qadınlarının ən nəcib xanımı olan qızı Aminəyə elçi düşərək onu Əbdullah üçün aldı. Aminə xanım Əbdullahın həyat yoldaşı oldu.(۱) Həmin evdə Aminə onunla bir yastığa baş qoyur. O, qadın Allahın elçisinə hamilə qalır. Əbudllah Aminənin yanından xaric olduqda yolda özünü Əbdullaha təqdim edən qadınla rastlaşır. Amma təəccüblə müşahidə etdi ki, .artıq qadın ona meyl göstərmir

?Əbdullah soruşdu: Dünənki xahişini təkrarlamamağının səbəbi nədir

Dedi: Dünən sənin simanda müşahidə etdiyim nur artıq

۱- [۱] . Aminənin ana tərəfdən şəcərəsi ۷۰- ci səhifədə deyilib, istəyənlər müraciət edə bilərlər.

səndə yoxdur. Buna görə də mənim sənə ehtiyacım yoxdur. O, qadın səmavi kitablar oxuyan xristian dinində olan qardaşı Vərəqət ibn Nofəldən eşitmişdi ki, tezliklə ərəb .ümməti arasında bir peyğəmbər zühur edəcək

Digər bir hədisdə rəvayət edilibdir ki, Vəhəb qızı Aminə Əbdullahla birgə onun digər bir arvadının evinə getdilər. O, qadının əlləri palçığa bulaşmışdı. Əbdullahdan onun ilə bir yastığa baş qoymasını xahiş etsədə, Əbdullah onun əllərini palçığa bulaşdığını görüb üzünü turşudub onun xahişini rədd etdi. Belə olduqda qadın ayağa qalxıb əl- üzünü təmizləyib öz olduğu yerə qayıtdı. Əbdullahda Aminənin yanına getmək üçün ayağa qalxdıqda gözü o qadına sataşdı. Qadın yenə də öz xahişini dilə gətirsədə amma Əbdullah onun sözlərinə fikir verməyərək Aminənin yanına gedib onunla bir yastığa .baş qoydu. Aminə bu yaxınlıq nəticəsində Allahın elçisinə hamilə qaldı

Əbdullah Aminənin yanından qayıdıb digər qadının yanına gedib ona dedi: İndi hazırsan? Dedi: yox, çünki mənim yanıma gələndə gözlərinin arasında aşkar nur parlayırdı. Mən o nuru oğulmaq istəyirdim. Amma sən mənim xahişimi qəbul etməyib, .Aminənin yanına getdin və o nur ona qismət oldu

Aminənin o həzrətə hamilə qaldığı dövrün hədisi

Peyğəmbərin anası Vəhəb qızı Aminə deyir: Mən peyğəmbərə hamilə olan vaxt bir şəxs mənim yanıma gəlib dedi: Xəbərin olsun ki, sən bu ümmətin ağası və rəhbərinə hamilə qalmısan. Onu doğduqdan sonra deyərsən: “Mən bu övladı hər bir həsəd aparanın şərrindən yeganə Allaha tapşırıram” Sonra onun adını Məhəmməd qoyarsan. (Aminənin dilindənmütərcim) Rəvayət edirlər ki: Mən ona hamilə olduğum vaxt məndən bir nur ayrıldı ki, o nurun arasında Şamdakı (Suriyamütərcim) Bəsra şəhərinin .qəsrlərini gördüm

:Əbdullahın vəfatı

Aminə peyğəmbərə hamilə olan vaxtı yəni peyğəmbər dünyaya gəlməmiş Əbdullah (vəfat etdi.(١)

Əbdullahın peyğəmbərin dünyaya gəlməsindən əvvəl və ya sonra vəfat etməsi . [١] -١
ixtilaflı məsələdir. Bir çoxlarına görə Əbdullah vəfat etdikdə peyğəmbər beşikdə idi. İki
.ay və ya bir az çox olardı ki, peyğəmbər dünyaya gəlmişdi

## İSLAM PEYĞƏMBƏRİNİN DÜNYAYA GƏLMƏSİ

### İŞARƏ

İbn İshaqın rəvayətinə görə Məhəmməd peyğəmbər Fil ilinin rəbiul- əvvəl ayının on ikisi bazar ertəsi(۱) dünyaya gəlmişdir. (Fil ili Əbrəhənin Allah evini dağıtmaq üçün .(gəldiyi ilə deyilir ki, biz bu dastanı sizlər üçün qeyd etdik

Həssan ibn Sabit rəvayət edir ki, mən yeddi və ya səkkiz yaşında eşitdiyim hər bir şeyi yaxşı başa düşən bir uşaq idim. Bir gün gördüm ki, Mədinə şəhərində yəhudi bir kişi !qalanın yuxarısında uca səslə qışqırır: Ey yəhudilər

Elə ki, qalanın yanına toplaşdılar dedilər: Nə deyirsən? Dedi: Xəbərininz olsun ki, o .ulduz ki onun görsənməsi ilə Əhməd dunyaya gələcəkdi dünən gecə göründü

Allahın elçisi dünyaya gələndən sonra anası Aminə peyğəmbərin babası Əbdül Mütəllibin yanına adam göndərdi ki, AllahTaala sənə bir oğlan əta edib. Bu müjdəni eşidən Əbdül Mütəllib onun evinə gəldi. Aminə hamiləlik dövründə onun barəsində .eşitdiklərini və doğuş vaxtı gözləri ilə gördüklərini ƏbdülMütəllibə danışdı

ƏbdülMütəllib onu qucağına götürərək Kəbənin içərisinə gətirib və Allahın ona belə bir uşaq qismət etməsinə görə şükr mərasimi yerinə yetirdi. Sonra onu anası Aminənin .yanına qaytararaq ona süd verməsi üçün dayə axtarmağa başladı

səh:۱۱۷

---

Şiə alimlərinin (Allah onlara cənnət qismət eləsin) məşhur nəzərlərinə görə . [۱] -۱ .peyğəmbər rəbiul- əvvəl ayının on yeddinci günündə dünyaya gəlmişdir

Səd qəbiləsindən olan Həlimə, onun söykökü və həyat yoldaşı

Nəhayət Bəni Səd ibn Bəkr qəbiləsindən Əbi Züeybin qızı Həliməni onun üçün dayə tutdular. (Əbu Züeyb, Əbdullah ibn Haris ibn şəcənətin künyəsidir ki, onun da şəcərəsi Qeys ibn Eylana gedib çıxır). Həlimənin həyat yoldaşı Haris ibn Rəfaə idi (soykökü Bəkr ibn Həvzana gedib çatırdı).(١) O, həzrətin süd qardaşının adı Əbdullah, bacılarının adları isə Ənisə və Şima adı ilə tanınan Həzafət idi. Bunarın üçü də Səd qəbiləsindən olan .Həlimənin övladları idi

Deyilənlərə görə: Peyğəmbər bəni Səd qəbiləsinin arasında olduğu müddətdə Sima, o .həzrəti saxlamaqda anası Həliməyə kömək edərdi

## HƏLİMƏNİN O HƏZRƏT HAQQINDA SÖYLƏDİYİ DASTAN

Əbdullah ibn Cəfər, Səd qəbiləsindən olan Həlimədən rəvayət edərək deyir: Biz quraqlığa düçar olduğumuz vaxt həyat yoldaşım, yanımda olan südəmər uşaq və Bəni Səd qadınları ilə birgə Məkkə şəhərinə getdik ki, hərəmiz Qüreyşdən bir uşaq (götürərək ona süd verib böyütmək üçün öz qəbiləmizə gətirək.(٢



---

.Sirənin ١۶٠- ١۶١- ci səhifələrinə müraciət edə bilərsiniz . [١]-١

Ərəbin əyan- əşrəflərinin və Qüreyşin öz yenicə doğulan uşaqlarını süd vermək . [٢]-٢ və böyütmək üçün köçəri qəbilələrin qadınlarına tapşırmasının bir neçə səbəbi var idi ki, o cümlədən a) Səhranın səs- küysüz mühiti və azad havası uşağın ruh və cisminin sağlam tərbiyə olması, inkişafı və sümüklərinin möhkəmlənməsinə səbəb olurdu. O, azad havada tərbiyə alan şəxslərin ruhları da səhranın azad havası kimi inkişaf edirdi . b) Öz uşaqlarını köçəri qadınlara tapşıran qadınların öz ərlərinin diqqətini cəlb etmələri üçün daha yaxşı və daha çox fürsətləri olurdu. Onların ailə mühiti və daxili yaşayışında həyat yoldaşının diqqətini cəlb etməsi çox faydalı idi. v) Çölçü ərəb ictimai yaşayışında qəbilə qayda qanunlarına tabe idi. O şəxsi həyatında elə adətlər ilə yaşayırdı ki, aclıq və susuzluğaonların fərdi yaşayış xüsusiyyətlərindən biri idiadət edərdilər. Bəzən aclıq hiss etməmək üçün qarınlarına daş bağlayardılar. Onların arasında belə bir məsəl yayılırdı ki, çölçü ərəbin toxluqdan ölməsi mümkündür. Amma aclıqdan ölməsi isə əsla.

Əksinə isə şəhərdə yaşayan Ərəblər naz- nemət içərisində yaşayardılar. Aclıq və yoxsulluq eləcə də kiçicik bir xoşagəlməz hadisə baş verdikdə quru və yandırıcı səhrada taqətsiz düşüb qalardılar. Buna görə də səhra mühitində böyümək, aclıq və susuzluq və digər xoşagəlməz hadisələrə adət etmək, onların gələcək həyatları üçün çox faydalı idi . q) Səhrada yaşayan ərəblər şəhərdə yaşayan ərəblər ilə müqayisədə səlis danışardılar. Bunun səbəbi ya şəhərə çoxlu karvan qafilələrinin gəlməsi bunun nəticəsində müxtəlif insanlar ilə münasibətdə olmayan çölçü ərəbin dilinin fəsahətli qalması idi və ya səhranın təmiz havasının bu işdə böyük təsiri var idi və ya da ki digər . səbəblər ola bilərdi ki, ləhcənin səlis qalmasına gətirib çıxarardı

Biz boz rəngdə olan bir uzunqulağa minmişdik. Yanımızda qoca bir dəvə olsada Allaha and olsun ki, bir damcı belə südü yox idi. Məkkə yolunda olduğumuz gecə bizim uşağımız aclıqdan o qədər ağladı ki, yata bilmədik. Nə mənim nədə ki, dəvənin döşündə onu doyuzdura biləcək qədər süd yox idi. Yeganə ümidim bizi Məkkəyə doğru aparan gələcək idi. Bizim arıq uzunqulağımız o qədər arıqlamış və əldən düşmüş idi ki .onun ləng getməsi Bəni Səd qafiləsini yormuşdu

Hər halda özümüzü Məkkə şəhərinə yetirərək, südəmər uşaqları soraqlamağa başladıq. Allahın elçisini, Səd tayfasından olan qadınların hansına tapşırırdılarsa yetim olduğunu bilən kimi onu saxlamaqdan imtina edərək deyirdilər: Bu uşağın atası ölmüş, anası və babasının himayəsində yaşayır. Görəsən anası və babası onun üçün nə edə bilərlər ki? Səd qəbiləsindən olan qadınların hər biri süd vermək üçün uşaq tapdılar. Təkcə mən heç kəsi tapa bilməmiş və peyğəmbərdən də yetim olduğuna görə imtina etmişdim. Amma nəhayət Bəni Səd qadınlarının yola düşmək istədiklərini gördükdə həyat yoldaşıma dedim: Bütün bu qadınların içərisində təkcə mənim uşaqsız qayıtmağım xoşuma gəlmir. And olsun Allaha indi gedəcəm, həmin yetim uşağı qucağıma alıb gətirəcəyəm. Həyat yoldaşım da mənim təklifimi qəbul edərək dedi: .Ümid edirik ki, Allah bu uşaqla bizim üçün bərəkət qərar versin

Həlimə deyir: Nəhayət mən Əbdülmütəllibin yanına gedib o həzrəti götürdüm. Məni buna vadar edən yeganə səbəb başqa uşaq tapa bilməməyim idi. Onu süd vermək üçün qucağıma alan kimi iki döşümdə süd ilə də doldu həm peyğəmbər və həm də aclıqdan yatmayan uşağım yedi. Hər ikisi doyub yuxuya getdilər. Digər tərəfdən həyat yoldaşım da ayağa qalxıb dəvəyə tərəf getdikdə onun hər iki döşünün süd ilə dolduğunu müşahidə etdi. Sonra mən və onu doyuzduracaq həddə süd sağdı və biz də .yedik. O gecəni tom arxayınlıqla başa vurduq

Səhər olan kimi həyat yoldaşım dedi: Ey Həlimə and olsun Allaha ki, sənə bərəkətli bir uşaq qismət olub: Dedim: Bəli mən də belə düşünürəm. Sonra mən öz eşşəyimə minib o həzrəti də özümlə götürdüm. And olsun Allaha çətinliklə yol gedən uzunqulaq

elə sürətlə gedirdi ki, Bəni Səd qəbiləsinin qadınlarının uzunqulaqlarının heç biri onun kimi sürətlə gedə bilmirdi. Qeyd etdiyimiz qadınlar dedilər: Ey Əbi Züeybin qızı bir az yavaş sür! Məgər bu gələndə mindiyin taqətdən düşmüş həmin uzunqulaq deyil! Deyirdim niyə elə özüdür ki var. Qadınlar təəccüblə dedilər! And olsun Allaha ona nə .isə olubdur

Bəni Səd yurduna qayıdandan sonra o gündən etibarən bizim qoyunlar otlaqdan qayıdanda qarınları tox, döşləri isə süd ilə dolu olurdu, ancaq o vaxta qədər bizim yurd kimi otsuz və susuz bir yer tanımırdım. Bəni Səd qəbiləsinin üzvləri qoyunlarından bir damcı belə süd sağa bilmədiyi halda, biz həmişə qoyunlarımızın çoxlu südündən istifadə edərdik. (bu hadisə bizim qəbilənin təəccübünə səbəb olmuş idi) onlar öz çobanlarına deyirdilər: Siz də qoyunlarınızı Həlimənin qoyunlarının otlağına aparınız. Bununla belə yenə də onların qoyunları ac və quru döşlərlə səhradan qayıdardılar. .Amma bizim qoyunlar isə doymuş və döşləri südlə dolu halda qayıdardılar

Bu minval ilə hər gün bizim evdə xeyir- bərəkət artmağa başlayırdı. Nəhayət o həzrət iki yaşına çatdıqda onu süddən ayırdım. O uşaq digərləri ilə müqayisədə fərqli inkişaf edirdi. Belə ki, iki yaşı olduqda yekə və güclü bədən quruluşuna sahib idi. İki yaşı tamam olandan sonra onu anası Aminənin yanına qaytardım. Amma onun mənim yanımda qaldığı müddət ərzində mənə qismət olan xeyir-bərəkətə görə istəyirdim ki, onu anasından alıb öz qəbiləmin yanına qaytarım. Buna görə də Aminəyə dedim: Yaxşı olar ki, o bizim yanımızda qalsın, çünki mən Məkkənin vəbasından onun üçün qorxuram (bu şəhərin münasib olmayan havası). Bu barədə çox təkid etdikdən sonra .nəhayət Aminə razı olub onu bizim ilə yola saldı

## O, HƏZRƏTİN SİNƏSİNİ YARAN İKİ MƏLƏYİN DASTANI

Həlimə rəvayət edir: O, həzrəti öz qəbiləmə qaytardıqdan sonra hələ bir neçə ay keçməmişdi ki, günlərin bir günü adəti üzrə o həzrət bizim evin arxasında övladlarımdan biri ilə çəpişləri otarmağa getmişdi. Birdən övladım qaça- qaça yanıma gələrək dedi: Bizim süd qardaşımızı qurtarın ki, iki ağ geyinmiş

kişi onu tutub yerə yatırdaraq sinəsini yardılar! Həlimə deyir: Mən və həyat yoldaşım onun yanına qaçdıqda gördük ki, rəngi qaçmış formada ayaq üstə durmuşdur. Onu ağuşa alaraq dedim: Oğlum nə olub? Dedi: İki ağ geyinmiş kişi mənim yanıma gələrək məni yerə yatırdıb, sinəmi yararaq mənim bilmədiyim bir şeyi oradan çıxartdılar. Sonra .isə getdilər. Həlimə deyir: Sonra biz o həzrəti götürüb öz çadırlarımıza qayıtdıq

Həlimənin o həzrəti anası Aminənin yanına gətirməsi

Həlimə rəvayət edir: Bu hadisədən sonra həyat yoldaşım mənə dedi: Ey Həlimə! Mən qorxuram ki, bu uşağa bir ziyan toxunsun, nə qədər ki, xoşagəlməz bir hadisə baş !verməyib onu qohumlarının yanına qaytar

Mən onu götürüb anası Aminənin yanına apardım. Aminə dedi: Ey qadın sən ki, onu saxlamaq üçün bu qədər israr edirdin, indi nə olub ki, onu geri gətirmisən? Dedim: Artıq uşaq böyüyüb və mən onu saxlamaq üçün öhdəmə götürdüyüm vəzifəni yerinə yetirmişəm. Bundan sonra isə onun başına gələn xoşagəlməz hadisələrə görə qorxuram. Buna görə də onu sənin yanına gətirdim. Aminə dedi: Bunlar səbəb deyil, !həqiqəti söylə

Həlimə deyir: O qədər təkid etdi ki, nəhayət mən iki ağ geyinmiş kişinin dastanını ona söylədim. Aminə dedi: Aya şeytana görə ondan qorxursan? Dedim: Bəli, Aminə dedi: Yox and olsun Allaha ki, şeytan ona yol tapa bilməz. Amma mənim uşağımın əhvalatı !başqa cürdür. İstəyirsənsə onun sərgüzəştini sənin üçün danışım? Dedim: Əlbəttə

Aminə dedi: Mən bu övlada hamilə olarkən məndən nur ucaldı ki, o nurda Şam Bəsrəsinin saraylarını gördüm. Bütün hamiləlik müddətimdə ona hamilə qaldığım kimi bu sadəlikdə və asanlıqda bir uşaq daşımamışdım (hamilə olmamış idim). Dünyaya gələndən sonra əllərini yerə qoyaraq başını asimanə tərəf qaldırdı. Hər halda onu (burada qoy və sağsalamat öz yurduna qayıt.(١)

## BU BARƏDƏ O HƏZRƏTİN ÖZÜNDƏN BİR HƏDİS

İbn İshaq sənədi ilə rəvayət edir ki, səhabələrin bəzisi o

۱- [۱] . Həlimənin peyğəmbəri anasının yanına qaytarması barəsində başqa bir səbəbdə söyləyiblər ki gələcək səhifələrdə onu da qeyd edəcəyik.

həzrətə dedilər: Ya Rəsulallah! Öz uşaqlıq tarixçəni bizə danış. Həzrət buyuru: Bəli mən atam İbrahimin duası və qardaşım İsanın müjdəsiyəm.(١) Anam mənə boylu olarkən ondan bir nur yüksəldi ki, o nurda Şam qəsrlərinin görə bildi. Süd əmmək dövrünü Bəni Səd qəbiləsində keçirdim. Ondan sonra bir gün öz süd qardaşlarımdan biri ilə evin arxasında çəpiş otarırdım ki, qəflətən iki ağ geyimli kişi yanıma gəldi. Əllərində qar ilə dolu qızıl bir teşt var idi. Sonra məni tutub sinəmi yardılar, ürəyimi çıxardıb onu da yardılar, ürəkdə olan qara laxtanı çıxarıb atdıqdan sonra, ürəyimi yuyb təmizlədilər. Sonra onlardan biri digərinə dedi: Onu ümmətindən on nəfər ilə müqayisə et, eləki müqayisə etdilər mən üstün oldum. Dedi: Ümmətindən yüz nəfər ilə müqayisə et, yenə də müqayisə etdikdə mən üstün oldum. Dedi: Onunla işin olmasın and olsun Allaha ki, .əgər bütün ümməti ilə müqayisə etsən yenə də onlardan üstün olacaq

## İLAHİ PEYĞƏMBƏRLƏRİN QOYUN OTARMASI

Yenə də İbn İshaqın rəvayətinə görə peyğəmbər buyurdu: Hər bir peyğəmbər əvvəlcə .qoyun otarmışdır. O həzrətə dedilər: Siz necə? Buyurdu: Bəli mən də

Peyğəmbərin Bəni Səd qəbiləsində böyüməsi ilə fəxr etməsi

Yenə də İbn İshaq rəvayət edir ki, peyğəmbər buyurdu: “Mən sizin içərinizdə ən fəsahətli insanam. Çünki mən şəcərəcə Qüreyşliyəm, öz uşaqlıq və südəmmə (dövrümü isə Bəni Səd ibn Bəkr tayfasında keçirtmişəm.(٢



---

١- [١] . İbn Əsir və digərləri bu hədisin mənası haqqında deyiblər: İbrahim (Allahın salamı olsun ona) peyğəmbərin duasından məqsəd quranda qeyd olunan duadır. Dedi: “(Onlar yenə dedilər) “Ey rəbbimiz! Onların (nəslimizin) ” içərisindən özlərinə elə bir peyğəmbər göndər ki, Sənin ayələrini (hökmlərini) onlara oxusun...” (Bəqərə surəsi ayə ١٢٩). İsanın (Allahın salamı olsun ona) müjdəsindən məqsəd budur ki, digər yerdə o həzrətdən hekayə edir ki, İsrail övladlarına buyurdu: Ey İsrail oğulları ! Həqiqətən, mən özümdən əvvəl nazil olmuş Tövratı təsdiq edən və məndən sonra gələcək Əhməd adlı .(bir peyğəmbərlə (sizə) müjdə verən Allahın elçisiyəm!...” (Səf surəsi ۶- cı ayə

٢- [٢] . Şəhərdə yaşayan qəbilələr arasında Qüreyş və köçəri ərəblər arasında isə Bəni

.Səd qəbiləsi şücaət və fəsahət baxımından tanınmış şəxslər idilər

## PEYĞƏMBƏRİN İTMƏSİ DASTANI

Rəvayət edirlər: Səd qəbiləsindən olan Həlimə peyğəmbəri Məkkəyə gətirən zaman Məkkə şəhərində camaatın arasında o həzrəti itirdi. Nə qədər o tərəf bu tərəfi axtarsada onu tapa bilmədi. Əbdülmütəllibin yanına gələrək cərəyanı ona danışdı. Əbdülmütəllib yerindən qalxıb Kəbə evinin kənarına gələrək peyğəmbərin tapılması üçün Allah dərgahına dua etməyə başladı. Bu vaxt Vərəqət ibn Nofəl və Qüreyşli digər bir kişi o həzrəti taparaq Əbdülmütəllibin yanına gətirib dedilər: Biz Məkkə şəhərinin yuxarı hissəsində yolu azmış övladını sənin yanına gətirdik. Əbdülmütəllib onu çiynina mindirərək Kəbə evinin ətrafına fırlatdı. Allahdan onun qorumasını istəyərək haqqında .dua etdi

.Sonra onu anası Aminənin yanına gətirdi

Bəziləri rəvayət edirlər ki: Səd qəbiləsindən olan Həlimənin peyğəmbərin anası Aminənin yanına qaytarmasının səbəbi bu idi ki, Aminəyə dedi: Mən onu ikinci dəfə öz qəbiləmə aparanda yolda Həbəşəli (Efiopiyalı) bir neçə xristian onu gördükdə onun barəsində suallar etdilər və sonra yaxınlaşaraq onun bədəninə baxaraq mənə dedilər: Biz onu səndən oğurlayaraq öz ölkəmizə aparacağıq. Çünki bizim bildiyimizə görə bu uşağın mühüm gələcəyi vardır. Bu sözləri eşidən gündən Həlimə o həzrəti gözdən .qoymur və onu Efiopiyalılardan gizlin saxlayırdı

## AMİNƏNİN VƏFATI

Səd qəbiləsindən olan Həlimə peyğəmbəri anası Aminənin yanına gətirib ona tapşıraraq öz qəbiləsinə qayıtdı. O gündən etibarən Məhəmməd (Allahın salamı olsun ona və övladlarına) öz babası və anasının yanında yaşayırdı. Peyğəmbərin altı yaşı olanda anası Aminə onu Mədinədə Bəni Nəccar(١) qəbiləsində



---

Əvvəllərdə qeyd etdiyimiz kimi Əbdülmütəllibin anası Əmr qızı Səlma idi ki, . [١] -١ Haşim ibn Əbdülmanaf Mədinəyə səfər edərkən onunla ailə həyatı qurmuşdu. Səlmanın atası Əmr, Bəni Nəccar qəbiləsindən idi. Buna görə də peyğəmbərin (Allahın

yaşayan dayılarının yanına apardı. Aminə Məkkəyə qayıdanda Əbva (۱) adlı yerdə .xəstələnərək dünyadan köçdü

Ondan sonra Allahın elçisi babası Əbdül- Mütəllibin himayəsi altında yaşamağa başladı. Adətə görə gündüzlər Kəbənin kənarında Əbdül- Mütəllib üçün xalça sərərdilər. Övladları gəlib o xalçanın kənarında yerin üzərində əyləşər və gözləyərdilər ki, Əbdül- Mütəllib gəlib xalçanın üstündə əyləşsin. Onların heç biri hörmət əlaməti olaraq istər o gəlməmişdən öncə, istərsə də o gələndən sonra xalçaya ayaq basıb oturmazdılar. Amma balaca uşaq olan peyğəmbər keçib xalçanın üstündə oturardı. Bəzən həzrətin əmiləri onu tutub xalçanın üstündən uzaqlaşdırardılar. Amma Əbdül Mütəllib onlara mane olaraq deyərdi: Uşağımı rahat buraxın ki, and olsun Allaha o, yüksək məqam sahibi olacaq. Sonra onu tutub öz yanında xalça üstündə otuzdurar və əlini onun kürəyinə çəkərdi. O, uşağın davranışı Əbdül Mütəllibin şad olmasına səbəb .olardı

## ƏBDÜLMÜTƏLLİBİN VƏFATI

Peyğəmbər səkkiz yaşına çatanda Əbdül Mütəllib dünyadan köçdü. İbn İshaq, Səid ibn Müseyibdən rəvayət edir. Eləki Əbdül Mütəllibin vəfat vaxtı çatdı, öləcəyini hiss edib, Səfiyyə, Bərrə, Atikə, Ümm Həkim Bəyza, Əmimə və Ərvi adlı altı qızını yanına çağırıb onlara dedi: Mən ölməmiş mənə ağlayıb mərsiyə deyin, mən öləndən sonra .deyəcəyinizi mən ölməmiş eşitmək istəyirəm

Bəs hər biri atası haqqında mərsiyə deyib ağladılar.(۲) Hüzeyfə ibn Ğanem və Mətrud .ibn Kəb Xəzainin hər biri Əbdül Mütəllibin müsibətində bir şer söylədilər

Hər halda Əbdül Mütəllib dünyadan köçdükdən sonra Zəmzəm quyusunun rəhbərliyi və hacıların sirab edilməsi vəzifəsi Əbdül Mütəllibin ən kiçik oğlu olan Əbbasa tapşırıldı. İslam dini zühur edənə qədər bu vəzifə onun əlində idi. Əziz peyğəmbərimizdə



---

Əbva, Cəhfə və Mədinə arasında bir yerin adıdır. Deyilənlərə görə: oradan . [۱] -۱ .Mədinəyə ۳۰- mil Cəhfəyə qədər isə ۲۳ mil məsafə vardır

Əbdülmütəllibin qızları Huzeyfə və Mətrudun şerlərinin mətnlərindən xəbərdar . [۲] -۲ .olmaq istəyirsinizsə sirənin I cildinin ۱۶۹- ۱۷۸- ci səhifələrinə müraciət edə bilərsiniz

habelə onu vəzifəsində saxladı. İndiyə qədər də Əbbas övladlarının əlindədir. (indiyə .(qədər dedikdə yazıçı burada kitabı yazdığı vaxta işarə edirmütərcim

## ƏBU TALİBİN PEYĞƏMBƏRİ HİMAYƏSİNƏ GÖTÜRMƏSİ

ƏbdülMütəllib dünyadan köçdükdən sonra peyğəmbəri əmisi Əbu Talib himayəyə götürdü. Rəvayətə görə bu barədə Əbdül Mütəllib Əbu Talibə vəsiyyət etmiş idi. Çünki Əbu Talib peyğəmbərin atası ilə atabir və anabir qardaş idilər. Onların hər ikisinin .anası Əmr ibn Aiz Məxzuminin qızı Fatimə idi

İbn İshaqın rəvayətinə görə: İzdəşnəvət tayfasından fizionomist (insanların simasına baxaraq onların haqqında məlumat verən şəxsmütərcim) bir kişi insanların qiyafəsinə baxaraq onların gələcəyi haqqında məlumat verərdi. Məkkəyə gələndə Qüreyş öz uşaqlarını onların yanına gətirərdilər. Kişi onlara baxaraq, gələcəkləri haqqında xəbər verərdi. Məkkəyə etdiyi növbəti səfərlərdən birində Əbu Talib peyğəmbəri onun yanına apardı. Kişi peyğəmbəri görcək bir işlə məşğul oldu. Sonra isə yenidən Əbu Talibə tərəf baxıb dedi: O, uşaq necə oldu? Onu mənim yanıma gətirin! Əbu Talib onun israrla peyğəmbəri görmək istədiyini müşahidə etdikdə peyğəmbəri o kişinin gözündən gizlətdi. Fizionomist bir neçə dəfə təkrar etdi. O, uşaq necə oldu! Mənim gördüyüm o uşağı yanıma gətirin ki, and olsun Allaha onun dastanı vardır. Belə .oldugunu görən Əbu Talib o kişinin yanından qalxıb getdi

## RAHİB BOHEYRANIN ƏHVALATI

Qüreyş tayfası hər il Şama ticarət səfərinə gedərdilər. O, zaman Bəsrə şəhəri Şamın böyük şəhərlərindən və mühüm ticarət mərkəzlərindən hesab olunurdu. Bu şəhərin yaxınlığında bir kilsə var idi. Bu kilsədə Buheyra adlı guşəneşin və xristian bir kişi yaşayırdı. Xristianların əqidəsinə görə onların keçmiş alimlərinin kitab və elmləri .əldənələ, sinədənsinəyə gəzərək nəhayət Boheyraya gəlib çatmışdır

Qüreyş karvanı hər il Boheyranın kilsənin kənarından keçər və ara- sıra orada dayanardılar. Boheyra heç bir zaman onlar ilə söhbət etməmişdi. Amma bu dəfə Qüreyş karvanı onun kilsəsinin yaxınlığında dayandıqda onlar üçün çoxlu yemək hazırlayaraq onlara qonaqlıq verdi: Boheyranın belə bir addım atmasının səbəbi onun öz kilsəsində oturaraq Qüreyşin karvanı və onların arasında peyğəmbəri görməsi idi. O, səhrada peyğəmbərin başı üstündə bir bulud parçasının hərəkət edərək, karvanın düşərgə saldığı ağacın üstündə dayanmasını gördü. Vəziyyəti belə görən Boheyra kilsəsindən aşağı enib, karvanın yanına adam göndərərək dedi: Mən sizin üçün yemək hazırlamışam. Bu gün sizin karvanınızda olan kiçik, böyük, qul və azad bir sözlə bütün insanları süfrəmə dəvət edirəm. Karvandakılardan biri dedi: Ey Boheyra and olsun Allaha ki, bu gün nə isə gözlənilməz hadisə baş verib, çünki indiyə qədər neçə dəfə biz buradan keçsək də sən indiki kimi heç vaxt bizi qonaq etməmisəm. Boheyra dedi: Doğrudur. Lakin bi sizin qonaq olduğumuza görə deyil, mən bu gün istəyirəm ki, sizə qulluq edəm. Buna görə də xörək hazırlamışam. İstəyirəm ki, sizin hamınız ondan .dadasınız

Qüreyş rahibin ibadətgahına tərəf yola düşdülər. Təkcə peyğəmbəri hamıdan kiçik olduğuna görə həmin ağacın altında öz əşyalarının yanında saxladılar. Karvan əhli bir- birinin arxasıyca rahibin ibadətgahına gəldilər. Boheyra bir- bir onların çöhrəsinə baxdıqda kitablarda peyğəmbər haqqında oxuduğu əlamətləri onlarda müşahidə etmədikdə onlardan soruşdu. Sizdən kimsə karvanda qalmayıb ki? Dedilər: Ey Boheyra sənin süfrəndə oturmağa ləyaqəti olan bütün şəxslər gəliblər. Təkcə yaş cəhətindən karvandakılardan ən kiçiyi olan bir uşaq gəlməyib. Boheyra dedi: Belə etməyin, o uşağı da gətirin. Qüreyşli bir kişi dedi: Lat və Üzzaya and olsun ki, Əbdullah ibn Əbdül Mütəllibin oğlunun burada olması bizim üçün əskiklik deyil. Bunu dedikdən sonra ayağa qalxaraq, gedib o həzrəti özü ilə gətirib yanında əyləşdirdi. Boheyra diqqətlə o həzrətin üzünə baxdı. Kitablarda peyğəmbərin bədən üzvlərinin əlamətləri barəsində oxuduqlarını ona

baxaraq bir- bir nəzərdən keçirdi. Rahibin qonaqları olan karvan əhli yemək yedikdən və süfrə yığışdırdıqdan sonra, dəstə- dəstə oranı tərk etdilər. Bütün bu müddətdə Məhəmməd (Allahın salamı olsun ona və övladlarına) və onun davranışına fikir verən Boheyra onun yanına gələrək dedi: Ey oğlan! Səni and verirəm Lat və Üzzaya ki mənim suallarıma cavab verəsən. Boheyranın Lat və Üzzaya and verməsinin səbəbi, Qüreyşin onlara and içməsini gördüyü üçün idi. Lakin peyğəmbər Lat və Uzza adını eşitdikdə buyurdu: Məni Lat və Üzzaya and vermə, çünki heç bir şey onlar qədər mənim !yanımda nifrətli deyil

Boheyra dedi: Elə isə səni and verirəm Allaha, suallarıma cavab ver! Həzrət buyurdu: Nə istəyirsənsə soruş! Boheyra onun şəxsi həyatı, yuxu, ayıqlıq və şəxsi işləri haqında bir sıra suallar soruşdu. Peyğəmbər suallara bir- bir cavab verirdi. Rahib peyğəmbərə aid kitablarda oxuduğu xüsusiyyətlərin buna uyğun gəldiyini görürdü. Sonra onun kürəyinə baxdıqda necə ki, eşitmişdi peyğəmbərlik möhrünü onun iki çiyni arasında .müşahidə etdi

Suallarına cavab aldıqdan sonra üzünü Əbu Talibə tutaraq dedi: Bu oğlan sənin nəyindir? Əbu Talib dedi: Oğlumdur. Boheyra dedi: O, sənin oğlun deyil və atası da dünyadan köçmüş olmalıdır. Əbu Talib dedi: Qardaşım oğludur. Boheyra dedi: Atası necə oldu? Əbu Talib dedi: Anası ona hamilə olarkən atası vəfat etdi. Boheyra dedi: Doğru deyirsən indi isə bu qardaşın oğlunu öz şəhərinizə qaytar və onu yəhudilərdən qoru. And olsun Allaha ki, mənim bu uşaq haqqında bildiklərimi onlar da bilsələr ona zərər vuracaqlar. Xəbərin olsun ki, bu qardaşın oğlu böyük işlər görəcək! Nə qədər .tezdir onu öz yurdunuza qaytar

Əbu Talib Boheyradan eşitdiyi sözə görə öz ticarətini yarıda qoyub peyğəmbəri .götürərək sürətlə oradan uzaqlaşdı

### ZUREYR, TƏMMAM VƏ DƏRRİSİN DASTANI

Rəvayətə görə Zureyr, Təmmam və Dərris adlı bir neçə kitab əhli(١) peyğəmbərin əmisi Əbu Taliblə Şama etdiyi səfər

١- [١] . Bəzi tarixi kitablarında onların yəhudi olması vurğulanmışdır.

çərçivəsində Boheyra kimi peyğəmbərdə peyğəmbərlik xüsusiyyətlərini müşahidə etdikdə ona zərər vurmaq fikrinə düşdülər. Bunu eşidən Boheyra onlara mane olaraq bildirdi ki, heç kəs ona bir şey edə bilməz. O qədər bu barədə danışandan sonra onları .fikrindən döndərərək geri qaytardı

O cümlədən bu hadisədən sonra peyğəmbər Məkkə şəhərində yaşayırdı. AllahTəala bütün hallarda onu cahiliyyət dövrünün pis adətənənələrindən qorudu. Nəhayət o həzrət böyüdükdən sonra, xoş xasiyyətlik, səbr, düzdanışma, əmanəti qorumaqda, mürüvvət, dostluq, söyüşdən uzaq durmaqda Qüreyş arasında misilsiz bir şəxsiyyətə .çevrildi. Məkkə əhalisi o həzrəti Əmin Məhəmməd deyə səsləyirdilər

Peyğəmbər rəvayət etdiyi bir hədisdə Allahın onu pis adət- ənənələrdən qoruması haqqında buyurur: Mən Qüreyş uşaqları ilə birlikdə oynadığımız oyun üçün, ətraf yerlərdən daş yığardıq. Uşaqlar daş daşımaq üçün paltarlarını soyunub, boyunlarına bağlamış və daşları onun üstünə qoyurdular. Mən də onlara kömək etmək məqsədi ilə paltarlarımı çıxarmaq istəyirdim ki, qəflətən bir şəxs mənə yaxınlaşaraq möhkəm bir şillə vuraraq dedi: Paltarını gey. Mən dərhal paltarımı geyib, paltar ilə daş daşımağa .başladım. Amma digər uşaqların hamısı lüt və çılpaq idi

O cümlədən həzrətin uşaqlıq xatirələrindən biri də Füccar döyüşü əhvalatı olmuşdur

Bu döyüş Qüreyş və onların Kənani tayfasından olan həmpeymanları ilə Eylan arasında baş verdi. Döyüşün baş vermə səbəbi isə Ürvə ibn Ütbə Heyrə padşahı Neman ibn Münzərə məxsus ticarət mallarını daşıyan bir neçə dəvəni Okaz bazarına aparması idi.(١) Kənanə qəbiləsindən olan Bəraz ibn Qeys, Ürvəyə etiraz etdi ki, sənin gördüyün bu iş Kənanə qəbiləsinin ziyanınadır. Ürvə dedi: Əgər bütün insanlara ziyanı !olsa belə mən onu yerinə yetirəcəyəm



---

١- [١] . Heyrə padşahının adətinə görə hər il ticarət malları ilə birgə dəvələri Oxaza göndərirdi ki, onları sataraq əvəzində onun üçün Taif dəri və gön alaraq Heyrəyə göndərsinlər. Əlbəttə bu işi ərəb və Qüreyş rəhbərlərindən biri öhdəsinə götürərdi ki, .digərləri ona maneə olmasınlar. On il Ürvət ibn Ütbə bu işi öhdəsinə almışdı

Ürvə dəvələri deyilən yerə sürməyə başladı. Bəraz da Ürvəni öldürmək fikrinə düşdü. Onun yolu üstə gizləndi. Ürvə Nəcdin yuxarı hissəsində yerləşən "Timın Zi Təlal"a çatdıqda haram ay olmasına və bu ayda qan tökülməsi qadağan olmasına baxmayaraq onu öldürərək, hətta bu barədə şerlər də söylədi. Vəlid ibn Rəbiə də bu barədə şerlər söylədi.(١) Bu hadisə haram ayda baş verdiyinə görə onu "Füccar" (adlandırdılar (çünki Füccar, fəcr və fucur sözündən götürülüb, günah deməkdir

Qüreyş bu xəbəri eşidəndə Ukazda idilər. Onlar Həvzanın bu ölüm xəbərini eşitməsindən öncə Okazdan Məkkəyə tərəf yola düşdülər. Həvzan bu xəbəri eşitdikdə, Ürvənin intiqamını almaq üçün, onların arxasıyca hərəkət etdilər. Qüreyş Hərəmə daxil olmamış, Həvzan onları haqladı (Hərəmdə döyüşməyə icazə verilmirdi). Hər iki dəstə arasında başlanan döyüş gecəyə qədər davam etdi. Gecə olandan sonra Qüreyş hərəmə daxil oldu. Bunu görən Həvzan daha döyüş və onların təqibini dayandırdı. Ondan sonra da Qüreyş ilə Həvzan arasında bir neçə döyüş var verdi ki, bunların bəzisində hələ o zaman on dörd və ya on beş yaşı olan peyğəmbər iştirak edərdi. Peyğəmbərin əmiləri onu döyüşə aparardılar. O həzrətin özündən nəql edilən rəvayətə görə peyğəmbər buyurdu: Mən o döyüşdə əmilərim üçün ox gətirərdim. Yəni düşmənin onlara atdığı və hədəfə dəymədiyi oxları (və ya onların düşmənə atdıqları oxları) mən döyüş meydanından toplayar (yenidən istifadə etmək üçün) və onları .əmilərim üçün gətirərdim

Füccar döyüşündə Qüreyşin rəhbəri Hərb ibn Üməyyə ibn Əbdüşşəms idi. O gün ilk öncə Həvzan qəbiləsi və Qeys ibn Eylan, Kənanə qəbiləsinə üstün gəlirdilər. Amma .günorta sonra Kənanə Qeysə qalib gəldi

İbn Hişam rəvayət edir: Füccar döyüşünün dastanı bundan daha uzundur, amma biz .bu qədər söyləməklə kifayətlənirik

## İSLAM PEYĞƏMBƏRİNİN XƏDİCƏ İLƏ AİLƏ HƏYATI QURMASI

.Peyğəmbərin mübarək ömründən iyirmi beş il keçdi

Şerlərdən xəbərdar olmaq istəyirsinizsə Sirənin ۱۸۵- ci səhifəsinə müraciət edə . [۱] -۱
.bilərsiniz

Xuveyld qızı Xədicə varlı və hörmətli bir qadın idi. Ticarətlə məşqul olardı. Ticarət etmək üçün kişiləri muzdla tutar, onlarla ticarət işlərini yerinə yetirmək üçün .müqavilələr bağlayıb və onları ticarət səfərlərinə göndərərdi

Qeyd etdiyimiz kimi Qüreyş də öz dövranını ticarət ilə başa vurardı (hər il iki dəfə Şam (və Yəmənə ticarət səfərinə yollanardılar

Peyğəmbərin dillər əzbəri olan doğru danışmağı, əmanətdarlığını, xoş xasiyyətcil olmasını Xədicə də eşitmişdi. Elə buna görə də Xədicə onun yanına adam göndərərək, peyğəmbərə Şama ticarət səfərinə getməyi təklif etdi. Bunun müqabilində peyğəmbərə digərlərinə ödədiyindən artıq muzd verəcəyini və Meysərə adlı qulu özü ilə bərabər aparacağını qeyd etdi. Peyğəmbər onun təklifini qəbul edib, Xədicənin ticarət mallarını götürərək Meysərə ilə Şama yollandı. Dayanacaqların birində Məhəmməd (s) bir rahibin(١) monastrının yaxınlığındakı ağacın kölgəsində düşərgə :saldı. O həzrəti görən rahib Meysərəyə tərəf dönərək soruşdu

?O ağacın altında istirahət edən kişi kimdir

.Meysərə dedi: Məkkə əhlindən qüreyşli bir kişidir

.Rahib dedi: Bu ağacın altında peyğəmbərdən başqa kimsə düşərgə salmaz

Hər halda peyğəmbər (s) Şama gətirdiyi Xədicənin mallarını satdı və əvəzində istədiklərini alaraq Qüreyş karvanı ilə Məkkəyə tərəf yola düşdü. Yol əsnasında Meysərə müşahidə edirdi ki, günorta vaxtı günün qızmar vaxtı dəvəyə minmiş peyğəmbərin başı üzərində iki mələk peyda olar və günəşin o həzrətə ziyan .verməməsi üçün ona kölgə salardılar

Peyğəmbər Məkkəyə qayıtdıqdan sonra Xədicə həzrətin aldığı malları iki qatına və ya daha çox baha qiymətə satıb çoxlu qazanc götürdü. Meysərə də Rahibin sözlərini və .mələklərin kölgə salmasını Xədicəyə danışdı

Xədicə hörmətli, bilikli və şərafətli bir qadın idi. Digər

[1] -١ . Rəvayətə görə bu rahibin adı “Nəstura” olub. Bu qeyd etdiyimiz Boheyra deyil, başqa birisidir.

tərəfdən də Allah iradə etmişdi ki, o iffətli xanımın əzəmət və şəxsiyyətini artıraraq ucaltsın. Meysərənin danışdığı sözlər də bu prosesi sürətləndirdi (xülasə Xədicənin ürəyində meyl yarandı və Əmin kimi tanınan Məhəmmədin həyat yoldaşı olmaq həvəsi baş qaldırdı) və buna görə də peyğəmbərin yanına adam göndərdi. Xədicə çox var-dövlətli, iffətli, namuslu, şərafətli, ailə və qohumluq şəxsiyyətinə və digər müsbət cəhətlərə malik olduğuna görə bütün Qüreyş kişilərinin onunla ailə həyatı qurmaq arzusunda olmasına baxmayaraq, o peyğəmbərə özünü təqdim edib dedi: Mənim əziz əmim oğlu,(١) sən Qüreyş arasında şərafətli, xoş xasiyyət, doğrudürüst və əmanətcil olduğuna görə, mən də sənə qarşı meyl yaranıb və istəyirəm ki, sənin həyat yoldaşın olum. Beləliklə o həzrət ilə ailə həyatı qurmaq istədiyini peyğəmbərin mübarək qulağına çatdırdı. Peyğəmbər bu barədə öz əmilərinə xəbər verdi: Həmzə ibn Əbdül Mütəllib (Allah ondan razı olsun) Xüveylənin yanına gələrək Xədicəyə elçilik edib, onu peyğəmbərlə evləndirdi. Xədicənin Mehriyyəsi ٢٠ dəvə idi. Xədicə peyğəmbərin ailə həyatı qurduğu ilk qadın idi. Nə qədər ki, Xədicə həyatda idi peyğəmbər digər qadınla .ailə həyatı qurmadı

:Peyğəmbərin Xədicədən olan övladları

Anası Misrin Həfn xilafətindən olan Qibtili Mariyə ilə peyğəmbərin İbrahim adlı övladından başqa bütün övladları Xədicədən dünyaya gəlmiş idi.– Mariyəni İskəndəriyyə padşahı Moqoqos peyğəmbərə hədiyyə göndərmişdi. Peyğəmbərin .Xədicədən olan övladları yaş etibarı ilə bu ardıcıllıqdadır

Qasim– Ona görə də Həzrətinn künyəsi Əbül Qasim idi– Teyyib, Tahir, Rüqəyyə, (zeynəb, Ümmü Külsüm və Fatimə (Allahın salamı olsun ona



---

İbn Hişam və digərlərinin rəvayətlərinə görə Xədicənin şəcərənaməsi belədir: . [١] -١ Xədicə, Xuveyld ibn Əbdüləzi ibn Qəsi ibn Kəlabın qızıdır ... Anası, Zaid ibn Ələsəmin qzı Fatimədir. Fatimənin anası Əbdü Manaf ibn Əbdül Harisin qızı Halədir. Halənin anası Səid ibn Səd ibn Səhmin qızı Qulabədir. Xuveyld ata tərəfdən peyğəmbər ilə əmioğludur. Hər ikisinin şəcərəsi üç vasitədən sonra Qəsi ibn Kəlaba gedib çıxır. İbn

Hişam Xədicənin şəcərəsini ١٨٧ və ١٨٩- cu səhifələrdə təfsilatı ilə yazıbdır. Biz burada .onu qısa formada qeyd etdik. Maraqlananlar həmin səhifələrə müraciət edə bilərlər

Peyğəmbərin oğlanları yəni Qasim, Teyyib və Tahir o həzrət peyğəmbərliyə yetişməzdən öncə dünyadan köçdülər. Amma qızlarının hamısı peyğəmbərliyə yetişənə qədər həyatda idilər. İslam dinini qəbul edib, o həzrət ilə Mədinəyə hicrət .etdilər

## XƏDİCƏ VƏ VƏRƏQƏT İBN NOFƏLİN DASTANI

Xədicənin əmisi oğlu Vərəqət ibn Nofəl çoxlu kitablar oxumuş idi. O, xristian dininə qulluq edirdi. Xədicə onun yanına gedərək Şam yolunda rahibin Meysərəyə dediyi sözü ona danışdı. Habelə Meysərənin öz gözləri ilə gördüyü mələklərin kölgə salma əhvalatını da ona danışdı. Vərəqə dedi: Əgər Meysərənin dedikləri doğrudursa onda Məhəmməd bu ümmətin peyğəmbəri olacaq. Mən kitablarda oxumuşam ki, bu ümmətə bir peyğəmbər göndəriləcək ki, indi onun gəlmək vaxtı çatıb. Sonra isə o zaman üçün çəkdiyi intizara görə öz- özünə deyir və təkrar edirdi ki: Kim nə vaxta (qədər? O vaxt bu haqda şerlər oxudu.(١

## KƏBƏNİN İNŞA EDİLMƏSİ VƏ PEYĞƏMBƏRİN QƏZAVƏT ETMƏSİ

Əziz İslam peyğəmbəri ömrünün ٣٥ ci ilini yaşayırdı ki, Qüreyş Kəbə evini yenidən tikmək və üstünü örtmək fikrinə düşdü. Onların bu fikrə düşməsinin səbəbi Kəbə evinin o vaxta qədər örtüyünün olmaması idi.(٢) Hündürlüyü isə təqribən bir insan boyu hündürlüyündə idi. Elə buna görə də Kəbə evində oğurluq baş verdi və Kəbənin içərisindəki quyudan mallar və cəvahiratlar oğurladılar. Məkkədə bu oğurluq xəbəri yayıldıqdan sonra Qüreyş oğrunu axtarmağa başladı. Axtarışdan sonra oğurlanmış əşyaları Bəni Məlih ibn Əmr tayfasından olan "Dəvik" adlı bir qulun evində tapdılar. Xəbər yayıldı ki, oğrular qeyd etdiyimiz əşyaları "Dərik"in evinə daşıyıblar. Hər halda ."Dəvik"in əllərini kəsdilər



---

Vərəqənin şerlərinin mətnindən xəbərdar olmaq istəyirsinizsə Sirənin I cildinin . [١] -١ .١٩١- ١٩٢- ci səhifələrinə müraciət edə bilərsiniz

Bəzi rəvayətlərə görə isə Qüreyşin Kəbəni yenidən inşa etməsinin səbəbi Məkkə . [٢] -٢ .şəhərini sel basması və nəticədə Kəbə evinin də bir hissəsinin dağılması idi

Bu qərarı həyata keçirtməyə kömək edən məsələ isə bu oldu ki, Roma ticarət gəmilərindən biri Ciddədə daşa çarpıb parçalandı. Sahibi gəmidən imtina etdi. Qüreyş də Kəbənin damı üçün o taxtaları Məkkə şəhərinə gətirdi. Məkkə şəhərində olan Qibtli dülgər lazım olan bəzi materialları hazırladı. Bu işlər Qüreyşin qərarı icra etməsinə kömək etdi. Lakin onlar işə başlamaq üçün köhnə tikilini viran etmək istədikdə qorxuya düşdülər. Bu qorxunu artıran şeylərdən biri də Kəbənin içərisindən qara bir ilanın– hədiyyələrin qoyulduğu yerdən– çölə çıxaraq Kəbə evinin divarı üzərində qıvrılması idi. Kəbəyə yaxınlaşmaq istəyən hər kəsə qarşı ilan ağzını açar və hücum edərdi. Bu zaman onun dərisindən səs eşidilərdi. Elə buna görə də Kəbəyə kimsə yaxınlaşa .bilməzdi

Bu hadisə bir neçə gün davam etdi. Hər gün bu işi həyata keçirtmək istədikdə canlarında olan qorxu və qara ilan Kəbə evini sökməyə maneə olurdu. Nəhayət bir gün Allah Təala bir quş göndərdi. Quş Kəbə divarındakı ilanı dimdiyinə alıb göydə görünməz oldu. Bunu görən Qüreyş dedi. Belə çıxır ki, Allah bizdən razı qalıb və gördüyümüz işi də bəyənir. Taxtamız və peşəkar dülgərimizin olduğuna eləcə də Allah .bu qara ilanın şərrini bizdən uzaqlaşdırdıqına görə daha yubanmaq düzgün deyil

Peyğəmbərin atası Əbdullahın(١) dayısı Əbu Vəhəb ibn Əmr ibn Aiz Məxzumi adında bir kişi hamıdan öncə külüng vuraraq Kəbə divarından bir daş qopardı. Lakin birdən- birə daş əlindən çıxıb öz yerinə qayıtdı. Əbu Vəhəb qışqırdı: Ey Qüreyş bu tikintidə xərcləmək istədiyiniz pul halal olmalıdır. Zinakar qadının qazandığı pul və mehriyyə, sələmdən əldə edilən pul və eləcə də camaatdan zülm və sitəmlə yığdığınız əşyalardan (bu evin tikintisində istifadə etməyin.(٢

.Bəzilərinə görə bu sözlər Vəlid ibn Müğeyrəyə məxsusdur

Qüreyşin öz aralarında Kəbənin sökülüb və yenidən tikilməsi işini bölüşdürməsi



---

Əbdül Mütəllib və Əbdullah haqqında danışarkən qeyd etmişdik ki, Əbdullahın . [١] -١ .anası Fatimə Əmru ibn Aiz Məxzuminin qızıdır

Ərəb şairlərindən biri Əbu Vəhəb haqqında şer qoşub ki, ibn Hişam Sirənin I . [٢] -٢

Qüreyş öz aralarında Kəbənin sökülməsi və yenidən tikilməsi işini bölüşdürdü. Qapının qoyulduğu tərəf Əbd Manaf və Bəni Zöhrə övladlarına, qara daş ilə Yəmani sütunu arasındakı hissəni Bəni Məxzum və onlara birləşdirilmiş digər tayfalara, Kəbənin arxa divarını Bəni Cəməh və Bəni Səhm ibn Əmruya qara daşın qoyulduğu və Hətim adlanan yer Əbdüddar, Bəni Əsəd ibn Əbdülüzza və Bəni Ədi ibn Kəb övladlarına .həvalə edildi

Yenə də Kəbənin divarına külüng vurmaq istədikdə canlarına qorxu düşdü. Vəlid ibn Müğeyrə irəli gəlib dedi. İlk öncə mən bu işə başlayacağam. Sonra külüngü əlinə götürüb dedi: İlahi sənə məlumdur ki, biz sənin dinindən kənara çıxmamışıq və yaxşı iş görməkdən savayı heç bir məqsədimiz yoxdur. Bu vaxt külüngünü aşağı endirib ətraf hissədən bir az qopartdı. O gün camaat əl saxlayıb dedilər: Biz bu gecə səbr edəcəyik, əgər Vəlid üçün bəla gəlməsə deməli məlum olacaq ki, Allah bizim işimizdən razıdır. Əgər Vəlidə bir bəla üz versə, ona əl vurmayacaq və Vəlidin xarab etdiyi yeri də .düzəldəcəyik

Növbəti gün olan kimi Vəlid oraya gəlib uçurtmağa başladı. İşi belə görən camaat onunla uçurtmağa başladılar və həzrəti İbrahimin əli ilə tikilmiş evin bünövrəsinə qədər qazdılar. Orada bel sümüyü kimi bir- birinə keçmiş və möhkəmlənmiş yaşıl rəngli bir daş gördülər. Qreyşdən bir kişi əlində tutduğu dəmir deyləmi o daşı yerindən oynatmaq üçün daşlardan birinin arasına vurdu. Elə ki, o daşı yerindən tərpətdi bütün Məkkə şəhəri titrədi. Bu zaman uçurtmaq işini dayandırıb elə oradan Kəbə evini .tikməyə başladılar

Rəvayətə görə Qüreyş sütunun altında Seryani dilində yazılmış kəlmələr gördülər. Onlar bu kəlmələri oxuya bilmədilər. Yəhudi bir kişi o kəlmələri aşağıdakı formada tərcümə etdi. “Mən Məkkənin sahibi olan Allaham, göylər və yeri yaratdığım, ay və günəşi bu formaya saldığım gündən, oranı xəlq etdim. Padşahlardan yeddisinin vasitəsi ilə…,(۱) Nəruddan iki “Əxşəban”(۲) dağına qədər qazılsın, su və süddə oranın .”əhalisi üçün bərəkət vardır

.Sirənin burada yazdığı ifadəni başa düşə bilmədik . [۱] -۱

.Məkkədəki iki dağın adıdır . [۲] -۲

İbrahim məqamında bir lövhə tapdılar ki, yazılmış idi: “Məkkə Allah evidir ki, onun ruzisi (üç yoldan yetişər. Onun əhalisinin bəzisi o şəhərin hörmətini sındırar”.(١)

Yenə də rəvayətə əsasən Peyğəmbərin besətindən (peyğəmbərliyə yetişməsi) qırx il öncə Kəbə evində bir daş tapdılar ki, orada yazılmış idi: Hər kim dünyada yaxşı iş görsə, axirətdə qibtə edilər, hər kim pislik toxumu səpsə peşimançılıq görər. Pis və çirkin əməllər edib yaxşı mükafat istəyirsiniz?! Bəli, heç vaxt tikan ağacından üzüm .yığmazsınız

## Qara daşı yerinə qoymaq barəsində Qüreyşin mübahisəsi

Qüreyş Kəbə evi üçün daş gətirərdi və hər bir dəstə o daşları öz tərəfinə aparardı. Kəbənin divarı dörd tərəfdən ucaldı və nəhayət qara daşı yerinə qoymaq lazım gəldi. Bu zaman tayfa başçıları arasında mübahisə yarandı. Çünki hər bir tayfa istəyirdi ki, daşı yerinə qoymaq şərəfinə nail olsun. Qəbilələrin dəstələrə bölünməsi başlandı. Qüreyş qəbilələrinin hər biri ayrıca silahlanaraq döyüşə hazırlaşdılar. Əbdüddar övladları bir teşti qan ilə doldurub, əllərini qana batıraraq, əhd bağladılar ki, nə qədər ki, sağdırlar başqalarının o daşı yerinə qoymasına imkan verməyəcəklər. Ədi övladları .da onlar ilə and içdi

Tikinti işi dayandırıldı. Üçdörd gün beləcə ötdü. Nəhayət dördbeşinci gün MəscidulHərama toplaşaraq çıxış yolu axtarmağa başladılar. Nəhayət Qüreyşin ən yaşlısı olan Əba Ümməyə ibn Müğeyrənin fikrini qəbul etdilər. O, belə bir fikir söylədi: Məscidin qapısından(٢) daxil olan ilk şəxs bu barədə hökm versin və onun verdiyi hökm hamı tərəfindən qəbul edilsin. Qüreyş razılaşıb gözlərini məscidin qapısına dikdilər. Qəflətən peyğəmbər qapıdan içəri girdi. Hamı qışqırdı. Bu gələn Əmindir, bu Muhəmməddir. Biz hamımız onun verəcəyi hökmə razıyıq. O həzrət yaxın gəldikdən sonra məsələni ona danışdılar. Peyğəmbər buyurdu: Bir parça gətirin, parça



---

Deyilənlərə görə Əbdullah ibn Zübeyr, hacılar və başqalarının döyüş dastanına . [١] -١ .işarə edilibdir

Burada məqsəd Bəni Şeybə qapısıdır ki, (İbrahim) məqamının arxa tərəfində . [٢] -٢

yerləşirdi ki, son dövrlərdə onu uçurublar. Bəzi rəvayətlərə görə, məqsəd Səfaya tərəf .açılan qapı olmuşdur

gətiriləndən sonra həzrət onu yerə sərib, qara daşı onun üstünə qoydu. Sonra buyurdu: Sizin hər biriniz onun bir küncündən tutub qaldırın. Beləliklə hamılıqla o daşı qaldırıb, əsil yeri ilə üzbəüz saxladılar. Peyğəmbər özü irəli gələrək onu parçanın üstündən götürüb yerinə qoydu və Kəbə divarları onun üstündən ucalmağa başladı. İş bitdikdən sonra Zubeyr ibn Əbdullah həmin qara ilan və Kəbə evi barəsində şerlər (qoşdu.(١

## KƏBƏNİ IPƏK PARÇA İLƏ ÖRTƏN İLK ŞƏXS

Peyğəmbərin vaxtında Kəbənin hündürlüyü ١٨ metr oldu. Hər il onu "Qəbati" adlı ağ Misir parçaları ilə örtərdilər. Sonra isə onu Yəmən kətan parçası ilə örtməyə başladılar. .Onu ipək parça ilə örtən ilk şəxs isə Həccac ibn Yusuf olmuşdur

Həms" cərəyanı və Qüreyşin yaratdığı bidətlər"

Fil dastanından əvvəl və ya da sonra idi ki, qüreyş həcc əməllərində bidət yaradaraq özləri üçün imtiyaz yaratmağa nail oldular. Hadisə belə olmuş idi ki, dedilər: Biz İbrahim övladları, Allah hərəminin və Məkkə şəhərinin sakinləriyik və özlərini "Həmss" .(adlandırdılar (hərəm əhli deməkdir

Dedilər: Bizim əldə etdiyimiz mqam və vəzifə digərlərində olmadığına görə təkcə biz hərəmin hörmətini saxlamalı və hərəmdən kənarda yaşayanların hörməti isə bizə lazım deyil. Çünki əgər biz də digərləri kimi hərəmdən xaricə hörmət göstərsək, ərəblər bizə hörmət etməyəcək. Bu məntiq əsasında Ərəfatda dayanmağı (hərəmdən xaricdə olduğuna görə) tərk etdilər. Onlar oranı müqəddəs yerin tərkib hissəsi və orada dayanmağa həzrəti İbrahimin göstərişi və həcc əməllərinin bir hissəsi bildikləri halda oraya getməz və deyərdilər: Biz hərəm əhli olduğumuza görə bizə hərəmdən xaric olmaq olmaz. Hərəmdən kənara hörmət etmək biz hərəm əhlinə lazım deyil. Ona görə də Ərəfatda dayanmaq əvəzinə Muzdələfdə dayanardılar. Oradan Minaya gedərdilər. Getdikcə bu hökm hətta Qüreyşdən olmayan və hərəmdə dünyaya gələn insanlara

١- [١] . İbn Hişamın Sirə kitabının I cildinin ٢٩٨- ci səhifəsinə müraciət edə bilərsiniz.

da şamil edilirdi. Kənanə qəbiləsi də onların yolu ilə gedib özünü “Həms” əhli hesab (edirdi.(١

Qüreyş bir az da irəli gedərək digər bidətlər yaratdılar. O cümlədən deyirdilər: Həms əhli ehram halında ayrandan qurut düzəldə və kərədən yağ tuta bilməz. Tükdən düzəldilən çadırın altına gedə bilməz. Əgər kölgəliyə getmək istəyirlərsə piydən .hazırlanmış çadırdan savayı digər bir çadırın altına yığışa bilməzlər

Başqa bir bidət isə bu idi ki, dedilər: Hərəmin xaricindən daxil olan Ümrə və ya həcc niyyətində olan insanlar özləri ilə hərəmə gətirdikləri yeməkdən yeyə bilməzlər. Məkkəyə daxil olduqda həyata keçirtməli olduqları ilk təvafi “Həms” əhalisinin paltarında yerinə yetirməlidir. Onlar özləri ilə gətirdikləri paltar ilə təvaf edə bilməzlər. Əgər “Həms” əhalisindən bir paltar əldə edə bilməsələr çılpaq təvaf etməlidirlər. Əgər çılpaq təvaf etmək istməsələr, naçar qalıb özləri ilə Hərəmdən kənarından gətirdikləri paltar ilə təvaf edə bilərlər. Təvafdan sonra gərək o paltarı əynindən çıxardalar, ondan .sonra isə o paltardan kimsənin istifadə etmə haqqı yoxdur

O cümlədən bu və digər qanunları Qüreyş özü və digərləri üçün müəyyənləşdirmişdilər. Onlar ərəbləri bu qanunlara tabe olmağa məcbur edirdilər. Buna görə də ərəblər (Həmsdən başqa) Ərəfatda dayanırdılar. Kişilər təvaf vaxtı paltar tapmadıqda soyunardılar. Qadınlar üst paltarı çıxarıb, alt paltarda qalardılar ki, bəzən arxa və ya qabaq tərəfdən yırtığı olardı. Belə halda təvaf edən ərəb :qadınlarından biri bu şeri dedi

اليوم يبدو بعضه اوكله

ومابدامنه فلا احله

Habelə öz paltarında təvaf edən ərəb kişilərindən biri “Həms” qanunlarına görə çox :sevdiyi paltarlarından birini atmaq məcburiyyətində qaldığından bu barədə dedi

كفى حرنا كرى عليها كانها

لفی بین ایدی الطائفین حریم

İslam dininin meydana gəlməsi, Qüreyş və Həms bidətlərinin

səh:۱۳۷

---

۱- [۱] . Burada İbn Hişam “Cəble” və “Zinəcəb” günləri dastanından söz salmış və Əmru ibn Moed Yəkreb, Ləqit ibn Zürarə, Cərir və Fərəzdəqdən şerlər söyləmiş amma bizim tərcüməmizə aidiyyəti olmadığına görə onları ixtisar edərək qeyd etmədik. Sirə I cild səhifə ۲۰۰– ۲۰۱.

aradan qaldırılması.

Qüreyş bu minvalla pis adətləri ərəblərə təhkim etmişdilər ki, nəhayət əziz Islam peyğəmbəri peyğəmbərliyə yetişdi. Allah-Təala "Həms" bidətləri haqqında aşağıdakı ayələri nazil etdi. "Sonra camaatın döndüyü yerdən siz də dönün! Allahdan bağışlanmaq diləyin, şübhəsiz ki, Allah bağışlayandır, rəhm edəndir!".(1)

Bu ayədə Qüreyşə əmr edir ki, camaatın yəni ərəblərin köç etdiyi yerə siz də köç ediniz. Ərəfat, Məşər və Minaya digərləri kimi köç ediniz.

Habelə Həll (Hərəmdən xaricdə yaşayan) əhlinin yeməyi və paltarı haqqında bu ayələr nazil oldu.

"Ey adəm oğulları! Hər ibadət vaxtı (namaz qılarkən, məscidə gedərkən və ya təvaf edərkən) gözəl libaslarınızı geyin, yeyiniçin, lakin israf etməyin, çünki (Allah) israf edənləri sevməz! (Ya peyğəmbərim) De: "Allahın öz bəndələri üçün yaratdığı zinəti və təmiz (halal) ruziləri kim haram buyurmuşdur?" De: "Bunlar dünyada iman gətirənlər üçündür (lakin kafirlər də onlardan istifadə edə bilərlər), qiyamət günündə (axirətdə) isə yalnız möminlərə məxsusdur", Biz ayələrimizi anlayıb bilən bir tayfaya belə ətraflı izah edirik.(2)

Beləliklə Allah Qüreyşin Həll əhalisinin yemək və paltarı barəsindəki bidətlərini puç etdi.

Cubeyr ibn Mutəmdən rəvayət olunan hədisdə deyilir: Peyğəmbərə vəhy nazil olmazdan öncə mən o həzrəti Ərəfatda dəvəyə minmiş halda müşahidə etdim ki, "Həms" əhli ola-ola digər insanlar ilə birgə həcc fəzilətini dərk etmək üçün Ərəfatda dayanmışdı. Digərləri köç etdikdə əziz İslam peyğəmbəri də onlar ilə hərəkət etdi.

**...ƏRƏB KAHİNLƏRİ, YƏHUDİ ALİMLƏRİ, NƏSRANİ RAHİBLƏRİNİN**

## ƏRƏB KAHİNLƏRİ, YƏHUDİ ALİMLƏRİ, NƏSRANİ RAHİBLƏRİNİN PEYĞƏMBƏRIN GƏLMƏSİ HAQQINDA VERDİYİ XƏBƏRLƏR

Günlər ötdükcə İslam peyğəmbərinin zühuru yaxınlaşırdı. Yəhudi alimləri, xristian

.peyğəmbərin zühur edəcəyini insanlara çatdırırdılar

Xristian və yəhudi din xadimləri ixtiyarlarında olan kitablar ilə peyğəmbərin əlamətləri .və onun zühur edəcəyi vaxtı bilirdilər

Ancaq ərəb kahinlərinə gəldikdə isə onlar göylərdə mələklərdən xəbər eşidən və o vaxta qədər meteor (fəzada sürətlə hərəkət edən kosmik mənşəli qızmar cisim-mütərcim) ulduzların yuxarıya qalxmalarına maneə olmadığı cinlərdən öyrənirdilər. Uzun illər qadın və kişi kahinlər o həzrətin gəlməsi haqqında xəbər versələrdə, ərəblər bu xəbərlərə əhəmiyyət verməzdilər. Lakin peyğəmbər zühur etdikdən sonra onlar .kahinlərin məqsədinin o həzrət olduğunu bildilər

Həzrətə peyğəmbərlik verilməsi vaxtı çatdıqda meteor ulduzlar tərəfindən şeytanların göylərə qalxıb, xəbərləri dinləməsinin qarşısı alındıqda cinlər Allah tərəfindən yer .üzündə hansısa bir hadisənin baş verdiyini anladılar

Cin və şeytanların göylərə tərəf qalxmasının qadağan olunması haqda AllahTəala :peyğəmbərə aşağıdakı ayələri nazil etdi

Ey Peyğəmbər) De: Mənə vəhy olundu ki, bir dəstə cin (Məkkə və Taif arasında sübh )“ namazı vaxtı Quranı diləyib öz həmcinslərinin yanına qayıtdıqları zaman) dedilər: “Biz çox qəribə (təsəvvür edilməz dərəcədə gözəl olan) bir Quran eşitdik. O, (xalqa) haqq yolunu göstərir. Biz ona iman gətirdik və biz bir daha heç kəsi Rəbbinizə şərik qoşmayacağıq. Həqiqətən Rəbbimizin cəlalı çox ucadır. O, özünə nə bir zövcə götürmüş nə də bir uşaq. Doğrusu bizim səfehimiz (İblis) Allah barəsində tamamilə yalan (haqdan uzaq) söyləyirmiş. Biz elə güman edirdik ki, nə insan nə də cin tayfası Allah barəsində yalan danışmaz. Həqiqətən (cahiliyyət dövründə) bəzi insanlar bir para cinlərə pənah aparır, bununla da onların təkəbbürünü (azğınlığını) artırırdılar (cinlər özləri haqqında çox böyük fikirlərə düşürdülər) . Onlar (o insanlar) da siz (cinlər, yaxud o cinlər də siz insanlar təkin elə güman edirdilər ki, Allah heç kəsi (öləndən sonra) diriltməyəcəkdir. Biz (cinləryuxarı aləm əhlinin söhbətinə oğrunoğrun qulaq asmaq üçün) göyə qalxmaq istədik (səmanı yoxladıq) amma onun (mələklərdən ibarət) güclü gözətçilər və yandırıb- yaxan

axan) ulduzlarla dolu olduğunu gördük. Biz (rəsulum əleyhissəlamın peyğəmbər) göndərilməsindən əvvəl mələklərin söhbətinə) qulaq asmaq üçün (göyün) bəzi yerlərində otururduq. Lakin indi kim (onların söhbətinə) qulaq asmış olsa, yandırıb-yaxan bir ulduzun onu gözlədiyini görər. Biz bilmirik ki, (göyün gözətçi mələklərlə, axan ulduzlarla doldurulması və mələklərin söhbətinə qulaq asmağın bizə qadağan edilməsi ilə) yerdə olanlara bir pislik etmək istənilmişdir, yoxsa Rəbbi onlara bir xeyir (diləmişdir.(١)

Cinlər Quranı eşitdikdən sonra başa düşdülər ki, onlara səmavi xəbərləri eşitməyə mane olunmasının səbəbi vəhyin digər səmavi xəbərlərə oxşamaması idi. Yer əhlinə höccət tamamlandığına görə onlar iman gətirib, təsdiq etdilər. Ondan sonra öz tayfasına tərəf qayıdaraq onları qorxudaraq dedilər: Ey bizim tayfamız biz Musadan sonra nazil olan bir kitabı eşitmişik ki, Tövratı da təsdiq edərək, haqq yola doğru hidayət edir. Belə ki, Allah- Təala buyurur: (Cin surəsinin ۶cı ayəsində) "Həqiqətən bəzi insanlar bir para cinlərə pənah aparır, bununla da onların təkəbbürünü (azğınlıqlarını) artırırdılar" səbəbi bu idi ki, hər vaxt ərəblər– Qüreyş və ya qeyri Qüreyş– səfər etdikdə əgər gecəni bir dərədə qalmaq istədikdə öz- özünə deyərdilər. Mən bu gecə ...dərədə olan pisliklərə görə cinlərin böyüyünə pənah aparıram

Səqif tayfasının meteor oxlarını görməsindən yaranan nigarançılıq

Meteor oxlarını görərək qorxuya düşən ilk insanlar Səqif qəbiləsindən bir tayfa idi. Onlar meteor oxlarını göydə müşahidə etdikdən sonra həmin tayfada yaşayan və dövrünün ən zirək insanı hesab olunan Əmr ibn Üməyyə adlı şəxsin yanına gedib dedilər: Nə baş verib ki, bu ulduzlar o tərəf bu tərəfə qaçırlar? Əmr dedi: Diqqət ediniz əgər onlar insanların quru və dənizdə yolun istiqamətini müəyyənləşdirdikləri və ya onların çıxıb- batması ilə qış və yayda yağış və küləyin gəldiyi ulduzlardırsa onda and olsun Allaha ki, dünyanın sonu



---

.Cin surəsi ۱- ۱۰- cu ayələr . [۱]-۱

yaxınlaşıb və yer üzərində yaşayan insanların həlak olmasının başlanğıcıdır. Yox əgər digər ulduzlardırsa belə məlum olur ki, Allah- Təala yer kürəsinin əhalisinə nə isə .etmək fikrindədir ki, onun nə olduğunu gözləmək lazımdır

Meteor oxları barəsində peyğəmbərin hədisi

İbn İshaq rəvayət edir ki, ənsardan bir qrup peyğəmbərin xidmətinə gəlmiş idilər. Peyğəmbər onlara buyurdu: Siz bu meteor oxları haqqında nə deyirsiniz? Dedilər: Ey Allahın elçisi biz nə zaman onlardan birini görsək deyərik. Hansısa bir padşah ölüb ya ...!kimsə hakimiyyətə yiyələnib, ya kimsə dünyaya gəlib və ya kim isə ölübdür

Həzrət buyurdu: Yox belə deyil, bəlkə hər vaxt Allah- Təala yer üzərində məxluqata qarşı nə isə etmək istədikdə ərş daşıyıcıları onu eşidib təsbeh deyərlər. Sonra onlardan aşağıdakılar eşidib təsbeh deyərlər. Bu ardıcıllıqla səs dünya səmasına gəlib çıxar və oradakılar təsbeh deyərlər. Sonra onların bəzisi digərinə deyər. Niyə təsbeh dediniz? Deyərlər: Bizdən yuxarıdakılar təsbeh dediklərinə görə biz də təsbeh dedik! Onlardan niyə təsbeh dediklərinizi soruşmadınız? Sonra onlardan soruşar və onlar da həmin cavabı verərlər və beləliklə növbə ərşi daşıyanlara çatar. Onlar deyərlər: Çünki Allah yerdə filan işi görməyi və belə bir hərəkət etməyi planlaşdırır. Bu xəbər habelə gələr və dünya səmasına çatar. Orada şeytanlar onu qatışıq və ixtilaflı şəkildə eşidib kahinlərə xəbər verər, onlar da eşitdiklərini camaata deyərlər. Bəzən bu xəbər doğru .bəzən isə yanlış çıxar

Beləcə davam edirdi ki, nəhayət AllahTəala bu ulduzlar vasitəsi ilə onların göyə qalxmasının qarşısını aldı. Ondan sonra kahinlik (gələcəkdən xəbər vermə) elmi (dayandı və artıq müasir dövrdə bu elm aradan getmişdir.(١)



---

Bu gün bəzilərinin cin və şeytanlar vasitəsi ilə xəbər verməsini müşahidə edirik. . [١] -١ Onlar elə bir şeylərdir ki, elə yaşadığımız yer üzərində onlar müşahidə edilir. Məsələn oğurlanmış mal hardadır. Filan dəfinə harada gizlədilib. Amma gələcəkdən verilən xəbərlər adətən səhv olurlar. Səhv çıxmayan xəbərləri isə mələklər onlara öyrədir (ibn .(Hişamın Sirədə yazdığı haşiyədən xülasə edilibdir

## KAHİN QADIN ĞEYTƏLƏNİN DASTANI

Bəni Səhm tayfasında peyğəmbərdən öncə Geytələ adlı məşhur bir kahin qadın var idi. Onun övladlarına Gəyatel deyərdilər ki, Əbu Talibdə öz şerlərindən birində onları Gəyatel adlandırmışdır. Bir gecə onun cinlər arasında olan və ona xəbərləri çatdıran .dostu yanına gəlib diz çökərək dedi

Bilirəm özüdə nələr bilirəm. Tikətikə olmaq və baş kəsilmə günüdür! Bu xəbəri eşidən ?Qüreyş dedilər: Bu sözlərlə nə demək istəyirsən

Növbəti gecə yenə onun yanına gələrək diz çöküb dedi: Dərələr və nə dərələr ki, Kəb ((övladları) orada torpağa düşdülər!(۱)

Bu xəbəri eşidən Qüreyş dedi: Hansısa hadisə baş verməlidir! Gözləyək görək nə olacaq. Bədr və Ühüd döyüşündən sonra hər iki döyüş dərədə baş vermiş idi – bu .sözlərin mənasını anladılar

## PEYĞƏMBƏR HAQQINDA CUNƏB KAHİNİN DEDİKLƏRİ

Yəmən vilayətində “Cunəb” adlı bir qəbilə yaşayırdı. Bu qəbilədə yaşayan bir kahin qeybdən xəbərlər verirdi. O həzrət peyğəmbərliyə yetişəndən və onun peyğəmbərlik sorağı ərəb qəbilələri arasında yayılmağa başladıqdan sonra Cunəb qəbiləsi kahinin yaşadığı dağın ətəyinə yığışaraq ondan peyğəmbərin bu iddiası haqqında soruşdular. Kahin günəş doğarkən dağdan aşağı enərək onların yanına gəlib, əlindəki kamana söykəndi. Bu vaxt başını göyə qaldıraraq bir müddət gözlərini göyə zillədi. Sonra özünü tərpədərək dedi: Ey insanlar, Allah- Təala Məhəmmədi əzizlədi və onu seçdi. Onun ürəyini tər- təmiz etdi. Xəbəriniz olsun ki, sizin aranızda az yaşayacaq. Kahin bu sözləri .dedikdən sonra gəldiyi yol ilə yenə də dağa qalxdı

## KAHİN SƏVAD IBN QAREBİN ÖMƏR IBN XƏTTABA DEDİKLƏRİ

Rəvayətə görə bir gün Ömər ibn Xəttab Mədinə məscidində əyləşmiş idi. Bir ərəb(۲) məscidə gələrək Ömərі soruşdu. Onu görən Ömər dedi: Bu kişi İslamdan qabaq kahin .olmuş və hələ də bütpərəst və müşrik kimi yaşamağa davam edir

.Burada məqsəd Kəb ibn Ləvinin övladlarıdır . [١] -١

.Deyilənlərə görə bu kişi Səvad ibn Qareb olmuşdur . [٢] -٢

O kişi irəli gəlib salam verərək əyləşdi. Ömər dedi: Müanlığı qəbul etmisən? Dedi: Bəli. Soruşdu: Sən İslamdan öncə kahinlik etmirdin? Dedi: Sübhənallah! Ey Ömər mənə qarşı bədgümanlıq etdin. Mənə elə bir şeyi aid etdin ki, xəlifə olduqdan bu günə kimi heç kəsə bu sözü deməmişdin. Ömər dedi: Üzr istəyirəm. Mən və sən islamdan öncə kahinlikdən də pis bir şey olan bütpərəstlikdə idik və bütlərin ətəyindən yapışmışdıq ki, nəhayət Allah-Təala peyğəmbər vasitəsi ilə bizi əzizlədi. Kişi dedi: Bəli ey Ömər and olsun Allaha ki, mən İslamdan öncə kahin idim. Ömər dedi: De görüm sənin həmyaşıd cinin sənə hansı xəbərləri söyləyib. Dedi: İslamdan təqribən bir ay öncə mənim yanıma gələrək dedi: Sən cinlərə onların ümüdsüzlüyü və acınacaqlı vəziyyətinə və eləcə də ?dəvələrin bellərinə pənah apardıqlarına fikir vermirsən

Ömər dedi: Bəli mən də o vaxt bir neçə Qüreyşli ilə bütün yanında idik. Bir ərəb bütün yanına qurbanlıq alaraq buzov gətirdi. Bizdə səbirsizlik ilə gözləyirdik ki, buzovun qurbanlıq mərasimi başa çatsın və pay verərəkən bir az da bizə çatsın. Qəflətən buzovun sinəsindən bir səs eşitdim ki, hələ o vaxta qədər elə qorxulu səs :eşitməmişdim. Səs deyirdi

Ey Zureyh! Yaxşı bir iş baş verib bir kişi fəryad edib deyir. Bir olan Allahdan başqa Allah .yoxdur

.Bunlar kahinlərin verdikləri xəbərlər haqqında qısaca məlumatlar idi

İslam peyğəmbərinin gəlməsi haqqında yəhudilərin söylədikləri

Ömər ibn Qətadə öz qəbiləsinin dilindən rəvayət edir: Onlar deyirdilər ki, ilahi inayəti nəzərə almasaq bizim müan olmağımızın səbəbi bu idi ki, biz bütpərəst və müşrik olan vaxtlar kitab əhli və bizim sahib olmadığımız bir sıra elmlərə yiyələnmiş yəhudilərlə müharibə edib onlara qalib gəldikdə, onlar bizə deyərdilər: Sonuncu gələcək peyğəmbərin zamanına az qalıb. Biz onun başçılığı ilə sizi Ad və İrəm kimi öldürəcəyik. .Bu sözü biz bir çox yəhudilərdən eşitmişdik

Allahın elçisi peyğəmbər olduqdan sonra biz başa düşdük ki, yəhudilərin bizi təhdid etdiyi peyğəmbər budur. Buna görə də biz qabağa düşüb o həzrətə iman gətirdik. :Amma yəhudilər küfr edib iman gətirmədilər. Bu barədə aşağıdakı ayələr nazil oldu

Onlara Allah tərəfindən əllərindəkini (Tövratı) təsdiq edən bir kitab (Quran)" göndərildiyi zaman (onu qəbul etmədilər). Halbuki əvvəlcə (rəsulumdan qabaq) kafirlərə (ərəb müşriklərinə) qələbə çalmaq üçün ("Tövratda adı çəkilən axiruzzəman peyğəmbər gəlib bizə yardım edəydi!" deyə Allaha) yalvarırdılar. Bildikləri (peyğəmbər) (gəldikdə isə (paxıllıq edib) ona inanmadılar. Allah kafirlərə lənət eləsin!(١)

**ƏT VƏ YƏHUDİNİN DASTANI**

Bədr döyüşündə iştirak edən ət ibn Sələmət rəvayət edir: Əbdüləşhəl qəbiləsində yaşayan bir yəhudi qonşumuz var idi. Günlərin bir günü o evdən xaric olub Əbdüləşhəl qəbiləsi ilə üzbəüz dayandı– O vaxt mən qeyd etdiyim qəbilə üzvləri arasında ən balacası idim– sonra qiyamət gününə inanmayan bütpərəst insanlar üçün qiyamət, hesab- kitab, behişt və cəhənnəm haqqında mübahisəyə başlayıb, bu barədə bəzi .şeylər danışdı

Onlar dedilər: Astadan danış ay kişi! Məgər belə bir şey mümkün ola bilər ki, insanlar ?öldükdən sonra dirilib, behişt və ya cəhənnəmə getsinlər

Yəhudi kişi dedi: And olsun ona ki, adına and içərlər, cəhənnəmdə elə bir od var ki, kim .oradan ən böyük və ən isti təndirlərə daxil olsa oradan xilas olmağa can atar

Camaat dedilər: Əlaməti nədir? Dedi: burada bir peyğəmbər peyğəmbərliyə başlayacaq əli ilə Məkkə və Yəmənə işarə etdi . Ona dedilər: O, nə vaxt olacaq? Mənə .baxıb dedi: Əgər bu uşaq salamaq qalsa onu görəcək

ət deyir: And olsun Allaha ki, qısa müddət ərzində peyğəmbər zühur etdi və biz də ona iman gətirdik. Ancaq həmin yəhudi kin və həsəd üzündən iman gətirmədi. Biz ona deyəndə ki vay olsun sənə məgər sən deyildin ki bu peyğəmbər haqqında məlumat .verdin? Dedi: Əlbəttə, amma bu mənim dediyim peyğəmbər deyil



---

kəlməsini " يستفتحون" Bəqərə surəsi ٨٩- cu ayə. Ayənin aşağısında isə ibn Hişam . [١] -١ .təfsir edibdir. Sirənin I cildi səhifə ٢١٢

Səyə övladları olan Əsid və Soləbənin İslamı qəbul etməsi

Bəni Qərizə yəhudi başçılarından biri rəvayət edir ki, Söləbə ibn Səyə və Əsid ibn Səyə iki qardaş idi. Onlar Əsəd ibn Übeyd ilə birgə hamısı bəni Qərizə yəhudilərindən idilər. Bəni Qərizənin mühasirəsi zaman baş verən döyüşlər vaxtı İslamı qəbul etdilər. Onların müan olmasının səbəbi bu idi ki "ibn Həyyeban" adlı şam yəhudilərindən biri İslamın zühurundan öncə Mədinəyə gəldi və bizimlə birgə yaşamağa başladı. And olsun Allaha ki, biz onun kimi öz namaz və ibadətinə diqqət ayıran bir kimsəni görməmişdik. Quraqlıq baş verdiyi vaxt ona deyərdilər, Ey Həyyeban oğlu gəl səhraya gedək və Allahdan bizim üçün yağış istə, O deyərdi: Nə qədər ki sədəqə verməmisiniz mən gəlməyəcəm. Ona deyirdim nə qədər sədəqə verməк lazımdır? Deyirdi: ya bir sa (xurma və ya iki modd arpa.(١)

Bəs biz dediyi miqdarda sədəqə verdikdən sonra bizimlə səhraya gələr və Allahdan yağış istəyərdi. And olsun Allaha ki, hələ yerindən qalxmamış buludlar peyda olar və yağış yağardı. Bu hadisə bir-iki dəfə deyil, bəlkə dəfələrlə baş vermiş idi. Nəhayət onun ölüm vaxtı çatdıqda öləcəyini bilib dedi: Ey yəhudi qövmü heç bilirsiniz mənim bərəkətli Şam yurdumu tərk edib, bu quru və yandırıcı yerə gəlməyimin səbəbi nədir? Dedik sən daha yaxşı bilərsən. Dedi: Mən burada zuhur vaxtı yaxınlaşmış bir peyğəmbərin gəlməsinə göz dikmişdim ki, bu şəhər onun hicrət etdiyi yer olacaq. Onun gəlişini .gizləyirdim ki, ona iman gətirib ardıcılları sırasına qoşulum

Ey yəhudi qövmü xəbəriniz olsun ki, onun zühur vaxtı çatmışdır. Məbada ona iman gətirməkdə kimsə sizi qabaqlasın. Çünki ona göstəriş verilibdir ki, kim onunla müxalif olsa, qanını axıdıb, arvad və uşaqlarını əsir götürsünlər. Məbada onun bu işi sizin iman .gətirməyinizə maneə olsun

Elə ki İslam peyğəmbəri zühur etdi və bəni Qərizə yəhudilərini mühasirəyə almaq məsələsi ön plana çıxdıqda bu üç yeniyetmə oğlan digərlərinə dedilər: Ey Qərizə övladları and



---

.(Sa – üç kq, modd – ۱۰ sirdir (sir – ۷۵ qrama bərabər olan çəki vahidi – mütərcim . [۱]-۱

olsun Allaha ki, bu ibn Həyyebanın sizə xəbər verdiyi həmin oğlandır. Dedilər o deyil. Onlar dedilər: Niyə and olsun Allaha ki bu həmin peyğəmbərdir. Bu sözü deyərək qaladan enib İslam dinini qəbul etdilər. Beləliklə öz can, mal, qadın və uşaqlarını xilas etdilər. Bu dediklərimiz yəhudi din xadimlərinin peyğəmbərin gəlişi haqqında verdikləri müjdələr idi. Ancaq xristian rahiblərindən gələn xəbərlərə gəldikdə isə anın hədisi də .onlardan biridir

## SALMAN FARSİNİN İSLAM DİNİNİ QƏBUL ETMƏSİ

İbn Əbbas deyir: Salman mənə danışmışdı ki, mən İsfahan ətrafındakı "Həbi"(١) adlı bir kəndin sakini olan fars dilli bir kişi idim. Mənim atam o kəndin böyüyü idi. Atam məni hamıdan çox istəyirdi. Bu münasibət o qədər artdı ki, atam məni qadınlar kimi ev dustağı edib, ondan ayrılmağıma imkan vermirdi. Mənim dinim atəşpərəstlik idi. Bu dinə o qədər xidmət etdim ki, nəhayət atəşpərəstlərin məbədində xidmət etməyə .başladım

Atamın böyük tarlası var idi (hər gün əkinə və tarlaya baş çəkəmək üçün gedərdi). Bir gün tikinti işlərinə görə ora gedə bilməyib mənə dedi: Mən bu gün tikinti işlərinə görə tarlaya gedə bilməyəcəm. Sən mənim yerimə tarlaya baş çək. Sonra mənə tapşırıqlar verib dedi: Amma məbada bir yerdə yubanıb geri gəlməyəsən. Çünki səndən uzaq qalmaq mənim üçün tarlanın məhv olmasından dözülməzdir. Mənim yuxum ərşə .çəkiləcək və səni götür- qoy etməyə başlayacağam

Mən tarlaya tərəf yola düşdüm. Yolda xristianlara aid olan bir kilsə gördüm. Onların namaz qılmaq səslərini eşitdim. Atam məni ev dustağı etdiyi üçün evdən kənarda insanların vəziyyəti haqqında məlumatım yox idi. Onların birlikdə oxuduqları səsi eşitdim və onların əməllərini yaxından izləmək üçün yaxına getdim. Xristianların əməllərini müşahidə etdikdə onların dininə meylim artdı, öz- özümə dedim. And olsun Allaha ki, bunların dini bizim dinimizdən daha yaxşıdır. O gün günəş batana qədər



---

Yaqut Həməvi deyir "Həbi" İsfahan ətrafındakı kəndlərdən biri olub və indidə . [١] -١ ."Şəhristan" adı ilə tanınır

onların yanında qaldım və atamın tarlasına getmədim. Sonra onlardan soruşdum: Bu .dinin əsası haradadır? Dedilər: Şamdadır

Gecə vaxtı atamın yanına qayıtdım və gördüm ki mənim gecikməyimə görə narahat olub, öz işlərini bir kənara qoyaraq bir neçə nəfəri də arxamca göndəribdir. Onun yanına gəldikdən sonra məni görüb dedi: Oğlum harda idin? Məgər mən sənə deməmişdim ki, tarlaya gedib tez qayıt. Dedim: Atacan mən yolda bir kilsə gördüm, oradakı insanların məzhəbi və dini hərəkət və davranışları çox xoşuma gəldiyi üçün .gün batana qədər orada qaldım

.Atam dedi: Oğlum onların dinində bir xeyir yoxdur. Sənin və atanın dini daha yaxşıdır

.Mən dedim: And olsun Allaha ki, onların dini bizim dinimizdən daha yaxşıdır

Atam bu sözləri eşitdikdən sonra əqidəmdə yaranan bu dəyişiklikdən qorxub .ayaqlarımı kündə vurub məni ev dustağı etdi

Salmanın Şama qaçması

Salman deyir: Mən xristianlara xəbər göndərdim ki, (mən sizin dini qəbul etmişəm) nə vaxt Şamdan buraya bir karvan gəlsə mənə xəbər verərsiniz. Bir gün mənə xəbər verdilər ki, xristian tacirlərdən ibarət bir karvan buraya gəlibdir. Xəbər göndərdim ki, işləri qurtarandan sonra Şama qayıtmaq istədikdə mənə xəbər verərsiniz. Nəhayət bir .gün mənə xəbər verdilər ki, onlar Şama qayıdırlar

Mən hər bir vasitədən istifadə edib ayaqlarındakı kündələri açaraq onlarla Şama yola düşdüm. Orada araşdırma aparıb soruşdum: Bu dinin bilicisi kimdir? Dedilər kilsənin .böyük keşişi

Salman kilsənin böyük keşişinin xidmətində və onun işinin sonu

Rəvayət edir: Mən onun yanına gedib dedim: Məndə sənin dininə qarşı rəğbət yaranıb, istəyirəm bu kilsədə sənin yanına gələrək sənə xidmət edim. Səndən din dərsi öyrənib, səninlə namaz qılım. Keşiş qəbul etdi. Mən kilsəyə gəlib onun yanında qaldım. Amma bir müddət ötdükdən sonra başa düşdüm ki, o, ikiüzlü və alçaq adamdır. Camaatı

sədəqə verməyə məcbur edirdi. Sədəqə pulları onun yanına gətirildikdən sonra, onları özünə götürər və kasıblara bir dinarda verməzdi. O qədər var-

.dövlət toplamışdı ki, pul və qızıllarının hamısını ٧ ağzı bağlı küpə yığmışdı

Salman rəvayət edir: Onun bu hərəkəti mənə çox ağır gəldi. Nəhayət ölüm onu haqladı. O, öldükdən sonra xristianlar onu dəfn etmək üçün toplaşdılar. Mən onlara dedim: Bu yaxşı adam deyildi. Sizə sədəqə yığmağı əmr edər, sədəqə pulları onun yanına gətirildikdən sonra isə hamısını özü üçün saxlayar, kasıblara bir dinar da verməzdi. Onlar dedilər: Bunu hardan bilirsən? Dedim: Mən onun yığdığı pulların yerini bilirəm, istəsəniz onu sizlərə göstərə bilərəm. Dedilər: Hardadır? Mən pulların yerini onlara göstərdim. Onlar pul və qızıl dolu yeddi küpü oradan çıxardıb dedilər: Belə olan vəziyyətdə biz onun cəsədini dəfn etməyəcəyik. Nəhayət onun cəsədini dar ağacından .asaraq daşqalaq etdilər. Sonra digər bir ruhani şəxsi onun yerinə təyin etdilər

Salman dedi: Ondan sonra mən ona xidmət etməyə başladım. O, zahid və pəhrizkar bir kişi idi. Mən onun kimi pəhrizkar bir insanla rastlaşmamışdım. ۵ vaxtın namazlarını .hamıdan daha yaxşı qılırdı. Gecə- gündüz ibadət ilə məşğul olurdu

Mən ona çox bağlanmışdım. Onu o vaxta qədər kimsəni istəmədiyim qədər çox istəyirdim. Onunla uzun illər bir yerdə olduq. Nəhayət bir gün ölüm onun da sorağına gəlmişdi. Ona dedim: Mən uzun illər sənə xidmət etdim və indiyə qədər kimsəni sevmədiyim qədər səni sevdim. İndi isə ölüm yatağındasan. Elə isə de görüm mən bundan sonra kimə xidmət etməliyəm? Mənə göstərişin nədir? Dedi: Ey övlad! Camaat dəyişib, artıq bir çox dini göstərişlərə əməl etmirlər. Mən Mosulda olan bir şəxsdən başqa öz dini vəzifələrinə əməl edən kimsəni tanımıram. Keşiş onun adını da mənə söyləyib dedi: Sən onun yanına getməlisən. O vəfat etdikdən sonra mən Mosula onun dediyi adanın yanına gedib dedim: Filan Suriyalı (Şamlı) keşiş dünyadan köçərkən mənə sifariş etdi ki, sənin yanına gəlib, sənə xidmət edim. Nəhayət o da mənə onun yanında qalmağa icazə verdi. Həqiqətən o kişi də yaxşı bir insan idi. Şamlı dostu necə əməl edirdisə o da onun kimi əməl edirdi. Bir az keçməmiş onun da ölüm vaxtı çatdı. Ona dedim filan

keşiş mənə göstəriş verdi ki, sənin yanına gəlim. İndi isə sən ölüm yatağındasan. Mənə de görüm sənin yanından ayrılıb hara və kimin yanına getmləyiəm? O dedi: Ey övlad! And olsun Allaha ki mən “Nəsəbeyn”(۱) də yaşayan kişidən başqa kimisə sənə sifariş verə bilmərəm.

Nəhayət mən Nəsəbeynə gəlib o kişinin yanına gedərək, əhvalatı ona danışıb, yanında qaldım. O da yaxşı bir insan idi. Bir müddət sonra ölüm onu da haqlayanda ona dedim: Səndən gizli deyil ki mən Mosullu keşişin tapşırığı ilə buraya gəlmişəm. İndi isə sən nə deyirsən və məni kimin yanına göndərirsən? Dedi: Ey övlad and olsun Allaha ki, mən Əmuriyyədə(۲) olan kişidən başqa kimsəni sənə sifariş verə bilmərəm. Əgər istəsən onun yanına gedə bilərsən, çünki təkcə odur ki bizim kimi həyat sürür.

O, da dünyadan köçdükdən sonra mən Əmuriyyəyə yola düşdüm əhvalatı ona danışdığdan sonra, yanında qalmağa icazə verdi. Doğurdan da o şəxsdə yaxşı bir insan idi və qədim keşişlər kimi ömür sürürdü. Mən orada işlə məşğul olduğum üçün bir neçə baş inək və qoyun sahibi də olmuşdum. Nəhayət onun da ölüm vaxtı gəlib çatdı. Mən ona dedim: Sən mənim başıma gələn əhvalatları bilirsən de görüm sən mənə kimi sifariş edirsən? Dedi: Övladım and olsun Allaha ki, mən elə bir insan tanımıram ki, sənə sifariş verim. Ancaq bu qədər deyə bilərəm ki, İbrahimin dininə məbus olan peyğəmbərin zühur vaxtı çatıbdır. Bu o peyğəmbərdir ki, ərəblər arasında zühur edəcək və ətrafı qara daşlar ilə əhatələnmiş və xurma ağaclarının çox olduğu bir yerə hicrət edəcəkdir.

O peyğəmbərin bir sıra əlamətləri vardır. O, hədiyyəni qəbul edər, sədəqə yeməz, iki kürəyinin arasında peyğəmbərlik möhürü vardır. Əgər o diyara gedə bilərsənsə o, zaman yubanma.



---

۱- [۱] . Nəsəbeyn – Mosuldan Şama gedən istiqamətdə yerləşən İraqda bir şəhər adıdır.

۲- [۲] . Əmuriyyə Türkiyədə bir şəhər adıdır. Müsəlmanlar Mötəsinin dövründə oranı fəth etdilər. Hacı Nurinin dediyinə görə: həmin şəhər müasir Türkiyənin abad və

:Salmanın Mədinəyə gəlməsi

Salman rəvayət edir: Əmuriyyə keşişi də dünyadan köçdü. Ondan sonra bir müddət də Əmuriyyə də qaldım ki, nəhayət Kəlb qəbiləsindən olan bir ticarət karvanı ilə rastlaşdım. Onlara dedim: Məni ərəb diyarına aparsanız, əvəzində bu inək və qoyunları sizə verəcəyəm. Onlar razılaşıb məni özləri ilə apardılar. Amma elə ki, Vadiyulqura diyarına çatdıq, mənə zülm edib, yəhudi bir kişiyə qul kimi satdılar. Orada xurma ağaclarını görəndə elə bildim ki, bu yer dostumun dediyi yerdir. Ancaq dəqiq bilmirdim. Nəhayət bəni Qərizə yəhudilərindən olan o yəhudinin əmisi oğlu məni ondan alaraq Mədinəyə gətirdi. And olsun Allaha ki, elə ki, o şəhərə gözlərim sataşdı, əlamətləri .gördüm və bildim ki bura mənim xristian dostumun dediyi yerdir

Mən onun yanında qaldım. Bu zaman artıq peyğəmbər Məkkədə öz peyğəmbərliyini elan etmişdi. Qul olduğum üçün bu barədə heç nə eşitməmiş idim. Nəhayət o həzrət Mədinəyə hicrət etdi. Bir gün adətim üzrə ağanın xurma bağlarında xurma ağacına çıxıb ağacı darayırdım. Ağam da ağacın altında əyləşmiş idi. Qəflətən gördüm ki, onun :əmisi oğlu tələsik bağa daxil olaraq onun yanına gəlib dedi

Allah Bəni Qilə(۱) tayfasını öldürsün! Bunlar Qubada(۲) bu gün Məkkədən gələn kişinin ətrafına toplaşıb deyirlər: Bu kişi peyğəmbərdir! Salman deyir: Bu sözü eşitcək canıma lərzə düşdü. Az qalmışdı ki, ağacdan ağamın üstünə yıxılım. Sonra ağacdan enib o kişiyə dedim: Nə dedin? Mənim bu sualıma görə ağam qəzəbləndi. Qulağıma möhkəm bir şillə vurub dedi: Bunun sənə nə aidiyyatı var! İşinlə məşğul ol! Bir şey yoxdur .sadəcə onun nə dediyini bilmək istədim



---

Qilə: Bir qadının adıdır. Ovs və Xəzrəc qəbiləsinin soykökü bu qadına gedib çıxır. . [۱] -۱ İbn Hişam bu qadının soy kökündən bəhs edərkən, Ovs və Xəzrəcin tərifində Neman .ibn Bəsirdən iki şer də qeyd etmişdir. Sirə I cild s. ۲۱۸- ۲۱۹

Quba – Məkkə yolu üzərində Mədinənin cənub hissəsində iki mil aralı bir yerin . [۲] -۲ adıdır ki, peyğəmbər Mədinəyə hicrət edərkən ilk öncə oraya gəlmiş idi. Bir neçə gün orada qaldı. Əli (ə) qadınlar ilə gəlib o peyğəmbərə qoşulduqdan sonra Mədinəyə

.doğru hərəkət etdi. Orada bir Məsciddə inşa edibdir ki, hələ də o məscid qalmaqdadır

:Birinci görüş

Salman rəvayət edir: Mən özüm üçün bir miqdar azuqə toplamışdım. Həmin gecə onu götürüb, Qubada məskunlaşmış peyğəmbərin yanına getdim. Peyğəmbərlə görüşərək ona dedim: Eşitdiyimə görə siz saleh insansınız, ətrafınızdakılar isə köməyə ehtiyacı olan qərib və ehtiyaclı insanlardır. Mənim yanımda bir az sədəqə vardır. Siz ona daha layiqli olduğunuz üçün, onu sizə vermək istəyirəm. Bunları deyib özümlə götürdüyüm azuqəni onun qarşısına qoydum. O həzrət səhabələrinə buyurdu: Yeyiniz, amma özü !ona əl uzatmadı. Mən öz- özümə dedim bu bir əlamət

Sonra isə oradan çıxıb getdim. Bir neçə gün sonra peyğəmbər Mədinəyə daxil oldu. Mən yenə də bir şey tədarük edib, o həzrətin yanına gedərək ona dedim: Mən gördüm ki, siz sədəqə yemirsiniz, ona görə də siz meyl edəsiniz deyə hədiyyə götürmişəm! Peyğəmbər özü yeyərək səhabələrinə də göstəriş verdi ki, yesinlər. Mən öz- özümə !dedim bu ikinci əlamət

Sonra bir gün peyğəmbər öz səhabələrindən birinin Bəqi qəbrstanlığındakı dəfn mərasimində iştirak etdiyi vaxt onun yanına getdim. Mən iki kobud paltar geyinmişdim. Peyğəmbər səhabələrinin arasında əyləşmişdi. Mən irəli gedib salam verdim. Sonra ətrafına dolandım ki, bəlkə iki kürəyi arasındakı peyğəmbərlik möhürünü görə bildim. Peyğəmbər mənim bu cür davranışımın məqsədini başa düşdüyü üçün əbasını bir az .kənara itələdi və mən də peyğəmbərlik möhürünü görə bildim

Mən özümü peyğəmbərin çiyinləri üzərinə atıb onu öpür və göz yaşı tökürdüm. Peyğəmbər mənə buyurdu: Əvvəlki vəziyyətinə qayıt (özünü ələ al – mütərcim). Mən onunla üzbəüz əyləşdim və öz başıma gələnləri sona qədər onun üçün danışdım. .Peyğəmbər təəccübləndi və səhabələrinin bu əhvalatı eşitməsindən isə şad olmuş idi

Salman ondan sonra da yəhudi kişinin evində qul kimi yaşayırdı. Buna görə də O, Ühüd .və Bədr döyüşlərində iştirak edə bilmədi

İslam Peyğəmbərinin Salmanın azad edilməsində göstərdiyi kömək

Salman deyir: Bir gün peyğəmbər mənə buyurdu: Ey Salman azad olmağın üçün ağan ilə müqavilə bağlayıb, bir şey yazın. Mən ağam ilə azad olmağım üçün müqavilə bağladım. Müqaviləyə görə onun üçün üç yüz xurma ağacı əkməli və ona qırx vəqiyə(۱) verməliydim. Sonra peyğəmbər səhabələrinə buyurdu. Öz din qardaşınıza kömək ediniz! Doğurdan da səhabələr bu sözü eşitdikdən sonra mənə yaxşı kömək etdilər. Biri otuz ədəd cavan xurma ağacı, digəri ۲۰ ədəd, biri ۱۵ ədəd, başqa biri isə on xurma ağacı verdi. Sözün qısası hər kəs əlindən gələn köməkliyi əsirgəmədi və mən də üç yüz .xurma ağacını düzəltdim

Peyğəmbər buyurdu: Ey Salman get və ağacların yerini qaz. Elə ki, hamısının yeri hazır .oldu, mənə xəbər ver ki, gəlib onları yerinə qoyum

Salman deyir: Mən xurma ağacları üçün yer qazmağa getdim, peyğəmbərin səhabələrinin də köməkliyi ilə üç yüz çuxur qazdım. Sonra peyğəmbərin yanına gəlib ərz etdim. Çuxurlar qazılıbdır. Peyğəmbər qalxaraq bizimlə o yerə gəldi. Biz bir- bir xurma ştillərini o həzrətə verir və peyğəmbərdə bir- bir onları yerinə otuzdururdu. Nəhayət iş başa çatdı. And olsun ona ki, Salmanın canı onun əlindədir (adətən yeri tərpədilmiş ştil tutmur və çox vaxt quruyur) bütün ağaclar tutdu və onların heç birisi (qurumadı.(۲

Beləliklə, müqavilənin bir hissəsi olan xurma ağaclarının əkilməsi məsələsi həll oldu. Amma qiymətli malın ödənməsi məsələsi hələ də gündəmdə idi: Nəhayət bir gün peyğəmbər



---

Vəqiyə Cohəri və Kazərvəninin dedikləri kimi – o vaxtlar qırx dirhəmə bərabər . [۱] -۱ olub. Hər bir dirhəm yarım misqal və misqalın beşdə biridir. Hər on dirhəm yeddi misqaldır. Şəri misqal seyrəfi misqalının dörddən üçüdür. Buna görə də hər vəqiyə ۲۲ seyrəfi misqaldır. Salmanın müqaviləsində qeyd edilmiş ۴۰ vəqiyə ۸۸۰ seyrəfi qızıl misqala bərabər hesab olunurdu ki, bu da ۱۱۰۰ dinara bərabərdi. Bəzi yazıçıların vəqiyəni gümüş adlandırması və eləcə də onu bir kilo kimi izah etmələri yanlışdır. Daha .çox tədqiqat aparmaq üçün Haci Nurinin “Nəfsurrəhman”ınına müraciət edə bilərsiniz

Bəzi rəvayət və tarixlərə görə, ştillərdən birini Salman qalanını isə peyğəmbər . [٢] -٢ əkibdir. Salmanın əkdiyi yeganə ştil qurudu. Peyğəmbərin əkdiyi ştillərin hamısı tutdu .və heç biri qurumadı

üçün mədənlərin birindən toyuq yumurtası boyda xalis qızıl qırıntısı gətirdilər. Həzrət buyurdu: Öz azad olması üçün müqavilə bağlayan fars kişi haradadır? Mənə xəbər verdilər. Birbaşa o həzrətin yanına getdim. Peyğəmbər o qızıl parçasını mənə verib buyurdu: Bunu götür və yəhudi ilə öhdənə götürdüyün şərtlərin qalanını da yerinə yetir. Mən ərz etdim: Ey peyğəmbər bu qızıl parçası necə mənim borcumu ödəyə bilər? .Buyurdu: Tut görüm. Allah onun vasitəsi ilə sənin borclarını ödəyəcək

Salman deyir: And olsun ona ki, canım onun əlindədir mən onu götürüb çəkdim. Düz .qırx vəqiyə idi. Onu ödəyib qul olmaqdan xilas oldum

Bu Salmanın azad olma sərgüzəşti idi) Ondan sonra Xəndək və digər döyüşlərdə) (peyğəmbərlə birgə iştirak edirdi.(١)

## VƏRƏQƏT İBN NOFƏL VƏ DOSTLARININ ƏHVALATI

Qüreyşin hər il qeyd etdikləri bir bayram var idi ki, o gündə bütlərin birinin ətrafında toplaşar və qurban kəsərdilər. Axşama qədər bütün günü o bütün hüzurunda şad və .təvazökarcasına keçirərdilər

Hər il olduğu kimi yenə də bütün ətrafına toplaşmışdılar. Onların arasından dörd nəfər kənara çəkilib, bütün qarşısında etdikləri davranış və hərəkət haqqında söhbətə :başladılar. Bu dörd nəfər aşağıdakılardan ibarət idilər

.Vərəqət ibn Nofəl– şəcərəsi Kəb ibn Ləriyə çatırdı –١

Ubeydullah ibn Cəheş – şəcərəsi peyğəmbərin ulu babalarından olan Qəsi ibn – ٢ .Kəlaba çatırdı

Osman ibn Huyers – şəcərəsi peyğəmbərin ulu babalarından olan Qəsi ibn Kəlaba –٣ .çatırdı

Zeyd ibn Əmr ibn Nufeyl– Onun da şəcərəsi səkkiz vasitə ilə Kəb ibn Ləriyə gedib –۴ çıxırdı.(٢) Bu dörd nəfər yavaşca

İbn Hişam hədisi rəvayət etdikdən sonra, onda olan ixtilafları da rəvayət edir. . [١] -١
.Sirə I cild səh. ٢٢١

Bu dörd nəfərin şəcərnaməsi geniş şəkildə bilmək istəyirsinizsə sirənin I cildinin . [٢] -٢
.٢٢٢- ٢٢٣- cü səhifələrinə müraciət edə bilərsiniz

kənara çəkilib söhbətə başladılar. İlk öncə söz verdilər ki, burada danışdıqlarının hamısı gizlin qalmalıdır. Sonra onlardan biri dedi: Dostlar! Xəbəriniz olsun ki, and olsun Allaha bu insanlar doğru düzgün iş görmürlər, ataları həzrəti İbrahimin dini belə olmayıb! Axı bu necə işdir ki, biz görməyən, eşitməyən, nə xeyir və nədəki ziyanı olmayan bir daşın ətrafına fırlanırıq və bu hərəkətləri icra edirik. Gəlin hərəniz bir səmtə tərəf üz tutub özümüzə din seçək. Çünki hal- hazırda inandığımız din deyil. Onlar bu qərara gəlib hər biri həqiqi din axtarmaq üçün bir səmtə üz tutdu. Vərəqət ibn Nofəlin özü xristian dinini qəbul edib, ona inanaraq bu din haqqında bəzi bilgilərdə .öyrəndi

Ubeydullah ibn Cəheş şəkk- şübhədə qaldığı üçün heç bir din qəbul etmədi və nəhayət İslam dinini qəbul edib müan oldu. Müanlar Həbəşistana (Efiopiyaya) hicrət etdikdə o, da həyat yoldaşı Əbu Süfyanın qızı Umm Həbibə ilə hicrət etdi. Lakin orada İslam .dinindən üz döndərib xristian dinini qəbul edərək, orada da dünyadan köçdü

Muhəmməd ibn Cəfər ibn Zübeyr rəvayət edir: Ubeydullah ibn Cəheş xristian dinini qəbul etdikdən sonra Efiopiyaya hicrət etmiş müanlar ilə rastlaşdıqda onlara deyirdi: !Biz hidayət olmuşuq, Siz isə həqiqi din və hidayət axtarışındasız

O, cümlədən Ubeydullah dünyadan köçdükdən sonra peyğəmbər Əmr ibn Üməyyə Zəmrini Efiopiyaya Nəcaşinin yanına göndərərək onun vasitəsi ilə Umm Həbibəyə elçi düşdü. Nəcaşi o qadını ۴۰۰ dinar mehriyyə müqabilində peyğəmbərin əqdinə keçirdi. Xalid ibn Səd ibn As onu həzrətin yanına gətirdi. Əbdülməlik Mərvanın qadınların əqdini :۴۰۰ dirhəm müəyyən etməsinin səbəbi də həmin cərəyan idi

Osman ibn Huyers oradan ayrılıb Roma padşahının yanına gələrək xristian dinini qəbul etdi. Onu Roma padşahının yanında xüsusi hörmət və vəzifəsi var idi. Osman haqqında .bir əhvalat da yazılmışdı ki, yığcam olsun deyə onu qeyd etməmişik

Zeyd ibn Əmr ibn Nufeylə gəldikdə isə o şəkk-şübhə içində qalmışdı. Qüreyşin dini ayinləri və bütpərəstlikdən əl çəkdi. Murdar ətdən, qandan və bütlər üçün kəsilmiş qurbanlardan

yeməzdi. Qızların öldürülməsinə qarşı çıxırdı. Eyni zamanda yəhudi və xristian dinlərini də qəbul etdi. O, İbrahimin dinində olduğunu bildirir və Qüreyşin işlərində olan eyblərə .irad tuturdu

Əsma rəvayət edir: Mən qocalıb əldən düşmüş Zeyd ibn Əmri Kəbə evinə söykənmiş halda gördüm ki, deyirdi: Ey Qüreyşlilər! And olsun ona ki, Zeyd ibn Əmrin canı onun əlindədir. Məndən başqa heç kəs İbrahimin dinində deyil. Sonra deyirdi: İlahi pərvərdigara əgər bilsəydim ki, sənin yanında ən sevimli yol hansıdır, o yol ilə sənə pərəstiş edərdim. Ancaq mən belə bir yolu tanımıram, sonra öz əlinin üzərinə səcdə .edərdi

Hədislərdə vardır ki, oğlu Səid ibn Zeyd və Zeyd ibn Əmrin əmisi oğlu Ömər ibn Xəttab peyğəmbərdən soruşdular: Zeyd üçün bağışlanmaq istəyək. Buyurdu: Bəli o ayrı bir (ümmət kimi məşhur (qiyamətdəmütərcim) olacaq.(١)

Zeyd dəfələrlə istəmişdi ki, həqiqi dini tapmaq üçün Məkkə şəhərini tərk etsin. Amma əmisi Xəttab ibn Nufeyl (Ömərin atası) onun həyat yoldaşı Hızır qızı Səfiyyəyə ona xəbər verməsini tapşırmışdı. Buna görə də Zeyd bu addımı atmaq istədikdə Səfiyyə .Xəttaba xəbər verərdi. Xəttabda əziyyət verib danlayaraq ona mane olurdu

Xəttab ibn Nufeyl Yezidə o qədər əziyyət verdi ki, nəhayət Zeyd naçar qalıb Məkkədən çıxıb Həra dağına getdi. Ancaq yenə də Xəttab ona əziyyət verirdi. Xəttab avaraları, şəxsiyyətsiz adamları və Qüreyş uşaqlarını məcbur etdi ki, Zeyd ibn Əmrin Məkkəyə daxil olmasına mane olsunlar. Vəziyyəti belə görən Zeyd arasıra gizli surətdə Məkkəyə gəlirdi. Onlar Zeydin gəlişindən xəbər tutan kimi Xəttaba xəbər verərdilər. Xəttab da kimsənin onun dininə meyl etməməsi üçün avaralar ilə onun yanına gələr ona müxtəlif .şəkildə ziyan vuraraq Məkkədən qovardı

Lakin bütün bunlara baxmayaraq Zeyd Məkkədən xaric olaraq



---

İbn Hişam sirənin I cildinin ٢٢۶- ٢٣٠- cu səhifələrində Zeydin Qüreyş dinindən . [١] -١ ayrılması, Qüreyşin onu incitməsi və məxsusən də əmisi Xəttab ibn Nufeyl (Əmrin

atası) və həyat yoldaşı Məzrənin qızı Səfiyyə barəsində şerlər söyləmişdir ki, istəyənlər .qeyd etdiyimiz yerə müraciət edə bilər

həzrəti İbrahimin dininin arxasıyca getmək üçün səhra əziyyətinə dözməli oldu. O, öz hədəfinə çatmaq üçün Yəhudi və xristian din xadimlərinin yanına getdi. Ərəbistan və Mosul (İraq) ərazisini gəzdi. Sonra Şama gedərək oranı gəzdi. Nəhayət Bəlqa(۱) yurdunda bir dağda yaşayan rahibin diyarına çatdı. Xristianların əqidəsinə görə .xristian dininin bütün elm və bilgiləri onun yanındadır

Zeyd onun yanına gedərək həzrəti İbrahimin din və ayinləri haqqında ona suallar verdi. Rahib dedi: Sən elə bir şey axtarırsan ki, heç vaxt onu tapa bilməyəcəksən. Amma bunu deyə bilərəm ki, sizin vilayətdən olacaq peyğəmbərin zuhur vaxtı yaxınlaşmışdır. Məhz o , həzrəti İbrahimin pak dininə məbus olacaq və sən özünü ona .yetir ki, artıq onun peyğəmbərlik dövrü gəlib çatıbdır

Xristian və yəhudi dini haqqında araşdırma aparan, lakin onlardan heç birinə meyli olmayan Zeyd bu sözləri eşitdikdən sonra sürətlə Məkkəyə tərəf yola düşdü. Ancaq Ləkm tayfasının yaşadığı yerə çatdıqda, onlar tərəfindən öldürüldü.(۲) Zeyd Məkkəyə .gəlib peyğəmbərin xidmətinə müşərrəf ola bilmədi

Həzrəti İsanın həvarilərindən olan “Yəhnəs”in İslam peyğəmbəri haqqında dedikləri

İbn İshaq deyir: Həzrəti İsanın həvarilərindən biri olan “Yəhnəs” xristianlar üçün İncil kitabının üzünü köçürərkən həzrəti İsanın öz dilindən əziz islam peyğəmbəri haqqında dediklərini rəvayət etdi: Hər kim mənə (İsayamütərcim) düşmən olsa Allaha düşmən olub. Əgər mən (İsa) kimsənin məndən öncə etmədiyi işləri onların (həvarilərmütərcim) hüzurunda etməsəydm, onların günah və səhv etməsinə səbəb olmazdı. Onların günahı yox idi. Amma bundan sonra təkəbbür edərək, mənə və habelə öz Allahına qalib gəldiklərini güman etdilər. Lakin çarəsizlik üzündən “namus” da olan o kəlmə sona yetməlidir ki bunlar əsassız yerə məni düşmən hesab edirlər. (yəni peyğəmbər gələndən sonra mənə qarşı olan yersiz



---

.Bəlqa – İordaniya dövlətinin cənub şərqində yer adıdır . [۱] -۱

Vərəqət ibn Nofəl Zeydin müsibətində şerlər deyib ki, ibn Hişam sirənin Icildinin . [۲] -۲ .۲۳۲- ci səhifəsində qeyd edibdir

düşmənçilik aradan qalxacaq). Elə isə Allahın sizə tərəf göndərəcəyi "Minhəmna" və Allahın yanından xaric olan "Ruhulquds" nə vaxt sizin yanınıza gəlsə, o mənə və sizə şahiddir. Siz mənimlə qədim zamandan bu cərəyanda bir yerdə olduğunuz üçün şəkkə .düşməməyiniz üçün bunu dedim

Bu hədisdə olan "Minhəmna"nın mənası Siryani dilində Məhəmməd, Roma dilində isə .Bereqlitsdir

## (İSLAM PEYĞƏMBƏRİNİN BESƏTİ (PEYĞƏMBƏR SEÇİLMƏSİ

### İŞARƏ

Həzrəti Məhəmməd qırx yaşına çatdıqda ona peyğəmbərlik verildi. Allah- Təala ondan qabaq peyğəmbərlik verdiyi hər bir peyğəmbər ilə əhd-peyman bağlamışdı ki, o həzrətə iman gətirməli, onu təsdiq etməli düşmənləri ilə döyüşməli, onun .peyğəmbərlik cərəyanını öz ardıcılları və ona iman gətirənlərə söyləməli idi

Quranda da onu peyğəmbəri həzrət Məhəmməd üçün rəvayət edərək buyurur: (Ey kitab əhli) Yadınıza salın ki, o vaxtı Allah peyğəmbərlərdən “Sizə verdiyim kitab və bilikdən sonra, sizdə olanı təsdiq edən bir peyğəmbər gəldikdə ona mütləq inanıb yardım edəcəksiniz”, deyə əhd almış və onlara: “Bunu təsdiq edib, ağır olan əhdimi qəbul etdinizmi?– demişdi. Onlar da: “Təsdiq etdik!”– deyə cavab vermişdilər. (Bu zaman) Allah: “Elə isə (bir- birinizə) şahid olun! Mən də sizinlə bərabər (şahidlərdənəm”,deyə buyurmuşdu!(١)

.Bu minvalla Allah- Təala bu barədə öz peyğəmbərləri ilə əhdpeyman bağlamışdı

Peyğəmbərlik işinin başlanğıcı: Ayişədən olan rəvayətə görə: peyğəmbərliyin başlanğıcında Allahın elçisi reallıqda baş



---

.Ali İmran surəsi ٨١- ci ayə . [١] -١

verən yuxular görürdü, yavaşyavaş AllahTəala onu tənhalıq və ğuşənşinliyə sövq etdirdi. Peyğəmbər üçün tənhalıqdan sevimli bir şey yox idi. Bəzi rəvayətlərə görə: Peyğəmbərin peyğəmbərliyə yetişmə vaxtı çatdıqda hər hansı bir iş üçün Məkkə evlərindən uzaqlaşdıqda, dağ və dərələr arasında tənha qaldıqda ağac və daşlar onunla danışar, ona salam verib deyərdilər: "Salam olsun sənə ey Allahın elçisi". Məhəmməd (Allahın salamı olsun ona və övladlarına) hər tərəfə baxdıqda daş və ağacdan savayı başqa bir şey müşahidə etməzdi. Bir az vaxt ötdükdən sonra Cəbrail .ona nazil oldu

Cəbrailin ilk dəfə olaraq peyğəmbərə nazil olması

Ubeyd ibn Umeyr rəvayət edir: Peyğəmbərin adəti üzrə hər il bir ay Həra dağındakı mağarada ibadət ilə məşğul olardu. Bu işi cahiliyyət dövründə Allaha ibadət edən .Qüreyşlilər yerinə yetirərdilər

Bu bir ay ərzində peyğəmbər yaxınlıqda ki, Həra dağını seçər və orada yanına gələn çarəsiz və kasıbları yedizdirərdi. Bir ay tamam olduqdan sonra Məkkə şəhərinə qayıdardı. İlk öncə Kəbənin kənarına gedər yeddi və ya daha çox onun ətrafına dolandıqdan sonra öz evinə tərəf yola düşərdi. Bütün illərdə olduğu kimi peyğəmbər bu ildə Ramazan ayında öz evindəkilər ilə ibadət üçün Həra dağına köçmüşdü. Habelə AllahTəalanın ona peyğəmbərlik verdiyi gecə də ibadətə məşğul idi. O gecə Cəbrail (ona nazil oldu.(١

Burada peyğəmbərin özü əhvalata belə davam edir: Mən yuxuda olarkən, gördüm ki, Cəbrail əlindəki ipək parçanın içərisində tutduğu kitabı (məktubu) mənim yanıma .gətirərək dedi

Oxu! Dedim: Nə oxuyum? Cəbrail məni tutub elə sıxdı ki, fikirləşdim ki, əcəlim çatıbdır. Sonra məni buraxıb dedi: Oxu. Dedim: Nə oxuyum? Yenə məni sıxdı... (beləcə üç dəfə). Hər dəfə də mən deyirdim nə oxuyum? Düşünürdüm ki, bəlkə məndən əl çəkər. Bu dəfə dedi: "(Ya peyğəmbər! Quranikərimi

Şiə və sünnilərin, eləcə də digər tarixçilərin nəzərinə görə O həzrətə . [۱] -۱ peyğəmbərlik Rəcəb ayının iyirmi yeddisində verilibdir. Amma digər bir dəstə tarixçilər .o cümlədən ibn Hişama görə bu Ramazan ayında ba. Vermişdir

və bütün məxluqatı) Yoxdan yaradan Rəbbinin adı ilə (bismillah deyərək) oxu! O insanı laxtalanmış qandan yaratdı. (Ya peyğəmbər) Oxu! Sənin Rəbbin ən böyük kərəm sahibidir! O, Rəbbin ki qələmlə (yazmağı) öyrətdi. (O Rəbbin ki) İnsana bilmədiklərini (öyrətdi.(١)

Peyğəmbər buyurdu: Elə ki, mən bu ayələri oxudum. Cəbrail getdi. Mən yuxudan ayıldım. Hiss etdim ki, deyəsən qəlbimə bir kitab qoyulub. Sonra mağaradan çıxdım, dağın ortasına çatmışdım ki, yuxarıdan bir səs eşitdim ki deyirdi: Ey Məhəmməd sən Allahın peyğəmbəri, mən isə Cəbrailəm mən başımı qaldırdıqda Cəbraili gördüm. O kişi qiyafəsində, iki ayağını birləşdirmiş və üfüq istiqamətində dayanmış idi. Cəbrail mənə deyirdi: Ey Məhəmməd sən Allahın peyğəmbəri və mən isə Cəbrailəm. Mən yerimdən tərpənmədən ona tamaşa edirdim. Göyün hansı tərəfinə baxsam da onu həminki vəziyyətdə görürdüm. Mən eləcə yerimdə dayanmış idim, nə irəli nə də geri gedirdim. Xədicə (mənim uzaqlaşmağıma görə narahat olmuş idi) bir neçə nəfəri mənim ardımca göndərmiş idi. Onlar Məkkə şəhərinin yuxarı tərəfinə qədər gedib geri dönmüşdülər. Bütün bu müddət ərzində mən yerimdə dayanmışdım. Nəhayət Cəbrail görünməz .oldu

Bu vaxt mən Xədicənin yanına qayıdıb onun yanında əyləşdim Xədicə dedi: Ey Məhəmməd harada idin? And olsun Allaha ki mən bur neçə nəfəri sənin arxanca göndərdim. Onlar Məkkə şəhərinin yuxarı tərəfinə qədər gedib axtarıb geri döndülər, amma səni tapa bilmədilər. Mən qarşılaşdığım əhvalatı Xədicəyə danışdım. Dedi: Əmioğlu sevin möhkəm ol. And olsun Allaha ki, Xədicənin canı onun əlindədir. Mən .ümid edirəm ki, sən bu ümmətin peyğəmbəri olacaqsan

### XƏDİCƏ ƏMİSİOĞLU VƏRƏQƏT İBN NOFƏLİN EVİNDƏ

Allah elçisinin sözləri bitdikdən sonra Xədicə yerindən qalxıb, paltarlarını geyinərək birbaşa əmisi oğlu Vərəqət ibn Nofəlin evinə getdi. Vərəqət (keçən bəhslərdə qeyd .etmişdik) xristian dinini qəbuı edib, onların kitablarını oxumuş idi



---

١-[١] . Ələq surəsi ayə ١۵.

.Bundan əlavə şifahi formada yəhudi və xristianlardan bəzi sözlər eşitmiş idi

Hər halda Xədicə Vərəqətin yanına gəlib, peyğəmbərdən eşitdiklərini Vərəqət üçün danışdı. Vərəqət özündən biixtiyar dedi: "Quddus, Quddus"(۱) and olsun ona ki, Vərəqətin canı onun əlindədir. Ey Xədicə əgər dediklərin doğrudursa, deməli "Namusu əkbər (daha böyük namus" Musanın yanına gələn, onun da yanına gəlmişdir. Həqiqətən o bu ümmətin peyğəmbəri hesab olunur. Ona de ki, öz işində möhkəm .olsun

Xədicə Vərəqətin yanından qayıdıb peyğəmbərin yanına gələrək onun sözlərini (həzrətə çatdırdı (Bu sözlərlə həyat yoldaşının ruhiyyəsini yüksəltdi

Peyğəmbərin mağarada ibadət etmə müddəti başa çatdıqdan sonra Məkkə şəhərinə qayıtdı. Hər il olduğu kimi, ilk öncə Kəbəni təvaf etmək üçün oraya gəldi. Təvaf üçün gəlmiş Vərəqət ibn Nofəl təsadüfən peyğəmbər ilə rastlaşdıqda (fürsəti qənimət sayıb) ona dedi: Ey əmioğlu görüb-eşitdiklərini mənə də danış! Peyğəmbər öz müşahidələri .və Cəbraildən eşitdiklərini ona danışdı

Vərəqə dedi: And olsun o Allaha ki, Vərəqənin canı onun əlindədir. Sən bu ümmətin peyğəmbərisən. Musanın yanına gələn "Namuse əkbər" sənin də yanına gəlmişdir. Agah ol ki, səni (camaat) təkzib edəcəklər səni incidəcək, şəhərdən qovub və səninlə mübarizə edib döyüşəcəklər. Daha doğrusunu Allah bilir. Əgər mən o gün sağ olsam sənə kömək edəcəyəm. Sonra başını irəli uzadıb peyğəmbərin mübarək başının ön .tərəfindən öpdü. Sonra peyğəmbər ondan ayrılıb, təvafını qurtararaq evə qayıtdı

Xədicədən nəql edilən rəvayətə görə, peyğəmbərə ərz etdi: Ey əmioğlu mümkündür ki, dediyin məxluq bir daha yanına gələndə mənə xəbər verəsən? Buyurdu: Bəli. Elə ki, Cəbrail o həzrətin yanına gəldi. Xədicəyə buyurdu: Ey Xədicə Cəbrail gəldi. Xədicə ərz etdi. Qalx və mənim sol tərəfimdə əyləş. Həzrət belə etdi. Xədicə ərz etdi: Onu .görürsən? Buyurdu: Bəli



---

.Pakdır, Pakdır" çünki quddus – pak etmək, pak olmaq mənasını verir" . [۱] -۱

Xədicə dedi: Qalx və mənim sağ tərəfimdə əyləş. Peyğəmbər dediyi kimi etdi. Yenə də soruşdu: Onu görürsən? Buyurdu bəli. Xədicə dedi: ətəyimdə əyləş, peyğəmbər əyləşdi. Xədicə soruşdu yenə də onu görürsən? Buyurdu: Bəli. Xədicə baş və üz örtüyünü götürüb soruşdu: indi yenə də onu görürsən? Buyurdu: Yox. Xədicə dedi: .Möhkəm ol, sənə müjdə verirəm ki, bu şeytan deyil, mələkdir

Quranın nazil olmasının başlanğıcı

İbn İshaq rəvayət edir: Quranın nazil olma başlanğıcı Ramazan ayına təsadüf edir. Necə ki, Allah- Təala buyurur: “İnsanlara doğru yol göstərən, bu yolu açıq dəlilləri ilə aydınlaşdıran və (haqqı batildən) ayıran (Quran) ramazan ayında nazil edilmişdir”(١) və .yenə buyurur: “Biz onu Qədr gecəsində nazil etdik...” Qədr surəsinin axırına qədər

Yenə buyurur: “...(Haqqı batildən, halalı haramdan ayıran) açıqaydın kitaba and olsun ki, biz onu mübarək bir gecədə (qədr gecəsində) nazil etdik. Biz (o kitab vasitəsi ilə kafirləri öz əzabımızla) qorxuduruq! Hər bir hikmətli (dəyişilməsi mümkün olmayan) iş o gecə hökm (ayırd) olunur. Dərgahımızdan bir buyuruq olaraq! Həqiqətən, ((peyğəmbərləri) biz göndəririk”(٢

Başqa bir yerdə buyurur: (Ey möminlər!) Əgər siz Allaha və haqla batilin ayırd edildiyi gün– iki dəstənin birbiri ilə qarşılaşdığı gün (Bədr günü) bəndəmizə nazil etdiyimizə iman gətirmisinizsə...”(٣) iki dəstənin qarşılaşdığı gündən məqsəd peyğəmbərin qoşunu ilə müşriklərin Bədr günündə qarşılaşdığı gündür və o gün Məhəmməd ibn Əli .Baqerin mənə dediyinə görə ramazan ayının on yeddisi, cümə günü idi

Bir sözlə peyğəmbər möhkəm iradə və iman ilə AllahTəalanın əmrinin icrası üçün qiyam etdi. Nübuvvətin ağır yükü və habelə peyğəmbər və Allah elçiləri kimi möhkəm iradəli insanlardan başqa kimsənin dözə bilmədiyi saysızhesabsız əzabəziyyətə .dözməli oldu



---

Bəqərə surəsi ١٨٥- ci ayəş . [١] -١

Duxan surəsi ١۵- ci ayələrş . [٢] -٢

## XƏDİCƏNİN İSLAM DİNİNİ QƏBUL ETMƏSİ

Peyğəmbərə ilk iman gətirən onun peyğəmbər olmasını təsdiq edən, onun hədəflərinin inkişaf etməsinə hər cür şərait yaradan şəxs Xuveyld qızı Xədicə (peyğəmbərin vəfalı həyat yoldaşı) idi. Bu qadının İslam dinini qəbul etməsi peyğəmbərin ruhiyyəsinin möhkəmlənməsində çox böyük təsiri var idi. Çünki peyğəmbəri evdən kənarda incidən, ona namünasib sözlər deyən və peyğəmbərliyini inkar edən müşriklərin əlindən xilas olub evə gələndə yalnız onun imanlı həyat yoldaşı Xədicə ona təsəlli verər, onun daxili narahatçılıqlarını aradan qaldırar, ona ruh yüksəkliyi verər və onun qəm- qüssəsini şad və sevinclə əvəzləyirdi – Allah yaxşı .mükafatlar əta etsin

## İSLAM PEYĞƏMBƏRİNİN XƏDİCƏYƏ VERDİYİ MÜJDƏ VƏ CƏBRAİLİN SALAMI

İbn İshaq Əbdullah ibn Cəfər ibn Əbitalibdən rəvayət edərək deyir: Peyğəmbər buyurdu: Mənə dedilər ki, Xədicəni dürr və mərcandan (behiştdə) olan bir evlə .müjdələyim ki orada qışqırıq, söyüş, əziyyət və yorğunluq mövcud deyil

Başqa birisindən rəvayət edir ki. Cəbrail peyğəmbərin yanına gəlib dedi: AllahTəalanın salamını Xədicəyə çatdır. Peyğəmbər buyurdu: Ey Xədicə bu Allah- Təala tərəfindən sənə salan gətirən Cəbraildir. Xədicə dedi: Allahın özü salamdır, salam ona məxsusdur .və Cəbrailə də salam olsun

Vəhyin gecikməsi və “Vəzzuha” surəsinin nazil edilməsi

İbn İshaq rəvayət edir: Bir vaxtlar bir neçə gün müddətində peyğəmbərə gələn vəhy dayandı və Cəbraildə onun yanına gəlmədi. İslam peyğəmbəri bu hadisədən kədərlənib qəmqüssəyə düçar oldu. Bu zaman Cəbrail “Vəzzuha” surəsini peyğəmbərə nazil etdi. Bu surədə onu peyğəmbərlik ilə əzizləyən Allah and içdi ki, onu özbaşına qoymamış və ona qəzəblənməmişdir. Belə buyurdu: “And olsun gündüzə və and olsun qaranlıq salan gecəyə ki, Allah səni özbaşına qoymamış və sənə qəzəblənməmişdir. Həqiqətən sənin üçün həyata keçirtmə (yəni axirətdə mənim yanımda olan azuqənə görə) başlamaqdan daha yaxşıdır (yəni

dünyada sənə verdiyim kəramətimdən). Baxmayaraq ki, Allah tezliklə (bu dünyada qələbə, o dünyada yaxşı mükafatı) sənə əta edər ki, razı qalarsan. Aya sən yetim olandan sənə yer vermədimi? İtdikdə sənə doğru yol göstərmədimi? Ailəli olduqda səni ehtiyacsız etmədimi? (hər yerdə öz zəhməti ilə sənə nicat verdi) yetimə qəzəblənmə, ehtiyaclılarını qovma (yəni gücsüzlərə qarşı ürəyidaş, acıdil, qəzəbli və təkəbbürlü olma) ancaq ilahi nemətləri say. (Yəni ilahinin sənə verdiyi nemətləri və .(nübuvvəti insanlara çatdır və camaatı haqqa tərəf dəvət elə

Beləliklə İslam peyğəmbəri bu göstərişə əməl edərək ilahi nemətləri insanlar üçün xatırladırdı. Öz peyğəmbərlik cərəyanını gizlin şəkildə öz qohumları və yaxınlarına– (inandığı insanlara təbliğ edirdi.(١)

**NAMAZ QILMAQ ƏMRİ**

Sonra peyğəmbərə namaz qılmaq göstərişi verildi. Peyğəmbərə namaz vacib olduqda hər bir namaz iki rəkət idi. Sonra AllahTəala (onlardan bir hissəsini) səfərdə olmayan insanlar üçün namazı dörd rəkət müəyyən etdi. Səfərdə olan üçün əvvəldə olduğu kimi .iki rəkət olaraq qaldı

Bu hadisə belə olmuşdu. Bir gün əziz islam peyğəmbəri Məkkə şəhərinin yuxarı tərəfinə qalxmışdı ki, Cəbrail ona nazil oldu. Mələk ayaq pəncəsi ilə dağın kənarına vurduqda oradan su çeşməsi axmağa başladı. Peyğəmbər Cəbrailə tamaşa edirdi. Cəbrail dəstəmaz aldıqdan sonra peyğəmbərdə onun kimi dəstəmaz aldı. Sonra Cəbrail namaz qıldı. Peyğəmbər də onun kimi namaz qıldı. Sonra peyğəmbər Xədicənin yanına gəlib Cəbrailin öyrətdiyi dəstəmaz formasını Xədicəyə də öyrətdi. Xədicə onun dediyi kimi dəstəmaz aldıqdan sonra, peyğəmbər qalxıb Xədicəyə də ayağa qalxmağı və onun kimi namaz qılmasını tapşırdı. İbn Əbbas rəvayət edir: Cəbrail nazil olub zöhr (namazını günəşin meyl etməsi vaxtı (günorta dairəsindən



---

İbn Hişam burada İbn İshaqın sözünü rəvayət etdikdən sonra bu surənin . [١] -١ lüğətlərini təfsir edibdir ki, maraqlananlar sirənin I cildinin ٢۴٢- ci səhifəsinə müraciət .edə bilərlər

qılmağa başladı. Əsr namazını o miqdarda kölgə getdikdən sonra məğrib namazını günəş ğurub edərkən, işa namazını şəfəq itdikdən sonra (qızartı yox olduqdan sonra – mütərcim) sübh namazını fəcr (dan yeri söküləndən sonra– mütərcim) görsənəndən sonra qıldı. Növbəti gün gəlib zöhr namazını günəş qurub edən vaxt işa namazını gecənin əvvəlinin üçdən biri keçdikdən sonra, sübh namazını isə hava işıqlaşan, amma günəşin görsənmədiyi vaxt qıldı və dedi: Namazı bu vaxtlar arasında qılmaq lazımdır.(۱)



---

۱- [۱] . Təbii ki, hər bir şəxs İslam hökmlərindən istər ibadət və istərsə də müamilat (alver hökmləri) hökmlərində alim və fəqihlərin fiqh və şəri hökmlər kitabına müraciət etməlidir. İbn İshaq kimi və ya başqa bir tarixçinin söylədiyi bir hədisə görə əməl edib, digər hədislər, sübutlar, fiqh və şəri kitabları kənara qoymaq olmaz. Əziz oxucular bu məsələyə diqqət etmənizi xahiş edirik ki, kitabın gələcək bəhslərində də əgər dini hökmlərdən və göstərişlərdən bəhs edən bir hədis ilə rastlaşdıqda ondan yalnız tarixi cəhətdən istifadə edin. Digər fiqh və hədis kitablarına müraciət etmədən onlara əməl etməyiniz.

## İSLAM PEYĞƏMBƏRİNƏ İLK İMAN GƏTİRƏN KİŞİ ƏLİ İBN ƏBİTALİB İDİ

### İŞARƏ

İbn İshaq rəvayət edir: Xədicədən sonra peyğəmbərə iman gətirərək, onunla namaz qılıb nübuvvətini təsdiq edən ilk kişi Əli ibn Əbitalib ibn Əbdülmütəllib ibn Haşim (Allahın salamı olsun ona) idi. O, həzrətin iman gətirən vaxtı hələ ١٠ yaşı var idi.

AllahTəalanın Əli ibn Əbitalibə (salam olsun ona) qismət etdiyi ən böyük nemətlərdən biri bu idi ki, İslamdan öncə peyğəmbərin tərbiyəsi altında böyüyüb, boyabaşa çatmış idi. Mücahid rəvayət edərək deyir: Allahın Əli ibn Əbitalibə (salam olsun ona) qismət etdiyi kəramət və nemətlərdən biri də bu idi. Qüreyş möhkəm quraqlığa düçar olmuş idi. Əbutalibin ailəsi böyük idi. Bu vaxt peyğəmbər Haşimin digər övladlarından var-dövləti çox olan əmisi Əbbas ibn Əbdülmütəllibə buyurdu: Ey Əbbas qardaşın Əbutalibin ailəsi böyükdür. Gördüyün kimi bu quraqlıq camaatı çox əziyyətə salıb. Gəl birlikdə onun yanına gedək, bir vasitə ilə ona kömək edək. Mən onun oğlanlarından birini yanıma aparıram, sən də birini apararsan.

Əbbas ibn Əbdülmütəllib bu təklifi qəbul etdi. Hər ikisi Əbutalibin yanına gələrək məqsədlərini bildirdilər. Əbutalib dedi: Əqil mənim yanımda qalsın– Bəzi rəvayətlərə görə isə dedi: Əqil və Talibi mənim yanımda saxlayın, qalan hansı birini istəyirsinizsə özünüzlə apara bilərsiniz. Nəhayət İslam peyğəmbəri Əlini, Əbbas isə Cəfəri özü ilə götürərək evlərinə apardılar.

səh:١۶٧

Beləliklə Əli (ə) bütün hallarda peyğəmbərin yanında idi. O, həzrət peyğmbərliyə məbus olduqda, Əli (ə) ona iman gətirib nübuvvətini təsdiqləyərək, ona itaət etməyi .özünə lazım bildi

Cəfər də Əbbasın evində yaşayırdı. İslamı qəbul etdikdən sonra Əbbasın evindən .ayrıldı

Əlinin (Allahın salamı olsun ona) namaz qılmaq üçün peyğəmbərin arxasınca Məkkə dərələrinə getməsi

İbn İshaq deyir: Namaz vaxtı olduqda peyğəmbər Məkkə dərələrinə tərəf gedərdi. Əli ibn Əbutalib atası Əbutalib, əmiləri və Qüreyşdən gizlin olaraq peyğəmbər ilə birlikdə .namaz qılmağa gedərdi. Namazlarını orada qılıb, axşam olduqda evlərinə qayıdardılar

Bir müddət bu minvalla ötdü. Nəhayət bir gün hər ikisi namaz qılarkən Əbutalib onları görüb Peyğəmbərə dedi: Ey qardaşım oğlu bu qəbul etdiyin hansı dindir? Buyurdu: Bu Allahın, mələklərin və peyğəmbərlərin qəbul etdiyi həmin dindir. Bu bizim atamız İbrahimin gətirdiyi dindir. Allah- Təala məni o camaata doğru göndərmişdir. Sən ey əmi başqaları ilə müqayisə də mənim xeyirxahlıq və nəsihətlərimə daha layiqsən. Mən sənin xeyrini istəyir və səni hidayət olmağa səsləyirəm. Digərləri ilə müqayisədə mənə .kömək etməyə, dəvətimi qəbul etməyə daha layiqsən

Əbutalib dedi: Ey qardaşım oğlu mən öz ata-babalarımın dinindən əl çəkə bilmərəm, amma arxayın ol ki, nə qədər ki mən həyatdayam məndən sənə zərər (toxunmayacaq.(١

Rəvayət edirlər ki, Əli (ə)a dedi: Ey övladım qəbul etdiyin bu din nədir? Buyurdu: Atacan Allah və rəsuluna iman gətirib, Allah tərəfindən gələnləri təsdiq edib və onunla Allah üçün namaz qılıram. Əbutalib ona dedi: Ey övladım bilki o, səni xeyir və yaxşılıqdan .(başqa bir şeyə dəvət etməz. Onun yanında ol. (bu sözlə onu bu işdə ruhlandırdı

Peyğəmbərin qulu Zeyd ibn Harisənin İslamı qəbul etməsi

Biz Əbutalibin iman gətirməsi haqqında gələcək səhifələrin haşiyələrində . [١] -١ Əbutalibin ölüm cərəyanında bəhs edəcəyik ki, əziz oxucu mütləq oraya müraciət .etsin

Əli ibn Əbutalibdən sonra İslam peyğəmbərinə iman gətirən və onunla namaz qılan .ikinci kişi Zeyd ibn Harisə idi

Zeyd ibn Harisə Kəlb(۱) qəbiləsindəndir. Xədicənin qardaşı oğlu Həkim ibn Hizam, Şam şəhərindən qayıdarkən onu başqa bir neçə nəfər ilə birgə qul kimi alaraq Məkkəyə gətirmişdi. Zeyd həmin vaxtlar həddi buluğa çatmamış bir uşaq idi. Xədicə Həkim ibn Hizamı görməyə gəldikdə Xədicə artıq bu vaxt peyğəmbərin həyat yoldaşı idi – Həkim ona dedi: Bibican bu oğlanların hansını istəyirsənsə götür və özünlə apar. Xədicə Zeydi seçib götürdü. Peyğəmbər Zeydi gördükdə, Xədicədən onu Peyğəmbərə bağışlanmasını istədi. Xədicə qəbul edib Zeydi peyğəmbərə bağışladı. Peyğəmbər onu .azad edib, oğulluqa götürdü. Bu hadisə peyğəmbərlikdən qabaq olmuşdur

Zeydin atası Harisə oğlunun yoxluğuna çox ağlayıb, ahu- fəqan edirdi. Bu barədə şerlərdə söyləmişdi.(۲) Nəhayət ona xəbər çatdı ki, oğlu Məkkədə o həzrətin .(yanındadır. O, peyğəmbərin yanına gəldi (oğlunu yanına qaytarmaq üçün

Peyğəmbər Zeydə buyurdu: Əgər istəyirsənsə bizimlə qal yox əgər istəmirsənsə atanla qayıda bilərsən. Zeyd dedi: Sizinlə qalıram. Beləcə peyğəmbərin xidmətində qaldıki, nəhayət o, həzrət peyğəmbərliyə məbus oldu. Zeyd peyğəmbərə iman gətirdi. .Dediyimiz kimi ikinci kişi idi ki peyğəmbərə iman gətirib, onunla namaz qıldı

Beləliklə onu Zeyd ibn Məhəmməd səsləyirdilər ki, Müqəddəs Quran ayəsi nazil oldu: "... Sizin oğulluğa götürdüyünüz şəxsləri Allah- Təala sizlərin övladı hesab etmir (onlar əslində öz atalarının oğullarıdır)... onları (əsil- nəsəbləri bilinsin deyə) atalarının adları ilə çağırın..."(۳) Zeyd dedi: Mən Harisin oğluyam. Ondan sonra ona Zeyd ibn Harisə .deyirdilər

Əbubəkr, Əbdurrəhman, Zübeyr və digərlərinin İslam dinini qəbul etməsi



---

İbn Hişam onun soykökünü Kəlb ibn Vebrəyə qədər yazmışdır. Maraqlananlar . [۱] -۱ .sirənin I cildinin ۲۴۷- ci səhifələrinə müraciət edə bilər

.Sirənin I cildi, səhifə ۲۴۸ . [۲] -۲

İbn İshaq rəvayət edir: Sonra adı Ətiq olan – İbn Hişama görə isə adı Əbdullah idi – Əbubəkr ibn Qəhafə İslam dinini qəbul etdi. O, ticarət ilə məşğul olar, Qüreyşin soy-kökünü digərlərindən yaxşı bilən və daha çox insanlar ilə ünsiyyətdə olan bir şəxs idi. Müan olduqdan sonra, öz dinini aşkar edib onun ilə münasibətdə olan insanları bu dinə dəvət edirdi. Deyilənlərə görə: Əbdurrəhman, Osman., Təlhə, Zübeyr və Səd onun dəvəti ilə müan olublar. Qeyd etdiyimiz bu bir neçə nəfərdən sonra isə aşağıdakı ardıcıllıqla insanlar islam dinini qəbul etdilər.(۱)

Əbu Ubeydə, Əbu Sələmə, Ərqəm, Osman, Qədamə və Əbdullah hər üçü Məzun ibn Həbibin övladları idilər– Übeydət ibn Haris, Səid ibn Zeyd və həyat yoldaşı Xəttabın qızı və Ömərin bacısı Fatimə, Əbubəkrin qızları olan Əsma (Zatunnətaqeyn) və Ayişə, Xəbbab ibn Ərət, Umeyr ibn Əbi Vəqqas– Səd ibn Əbi Vəqqasın qardaşı– Əbdullah ibn Məsud, Məsud ibn Əlqari, Suleyt ibn Əmr və qardaşı Hatib ibn Əmr, Əyyaş ibn Əbi Rəbiə və həyat yoldaşı Sələmə qızı Əsma, Xuneys ibn Həzafə, Amir ibn Rəbiə, Əbdullah ibn Cəheş və qardaşı Əbu Əhməd ibn Cəheş, Cəfər ibn Əbitalib və həyat yoldaşı Əsma binti Umeys, Hatib ibn Haris və həyat yoldaşı Mucəllel qızı Fatimə, Həttab ibn Haris – Hatibin qardaşı – və həyat yoldaşı Yəsar qızı Fəkihə, Muəmmər ibn Haris – Hatibin digər qardaşı – Saib ibn Osman ibn Məzun, Mətləb ibn Əzhər və həyat yoldaşı Əbi Of qızı Rəmlə, Nəhham– adı Nəim ibn Əbdullah idi – Amir ibn Fuheyrə qara dərili qul idi ki, Əbubəkr onu almışdı – Xalid ibn Səid və həyat yoldaşı Xələf qızı Əminə, Hatib ibn Əmr, Əbu Huzeyfə adı Məhşəm ibn Ütbədir, Vaqid ibn Əbdullah, Xalid Amir, Aqil və Əyas – bu dörd nəfər Bəkir ibn Əbd Yaleyin övladları idilər. Əmmar ibn Yasir, Suheyb ibn Sənan – Nəmər ibn Qaset qəbiləsindən idi. Bəzi rəvayətlərə əsasən Suheyb Əbdullah ibn Cədanın qulu idi. Başqa rəvayətlərə görə isə O,



---

۱- [۱] . İbn Hişam burada Əbubəkr və qeyd etdiyimiz digər şəxslərin soy- kökünü qeyd edibdir ki, maraqlanananlar sirənin I cildinin ۲۴۹- ۲۶۲- ci səhifələrinə müraciət edə bilərsiniz. Bəzən haşiyədə də onların bəzilərinin qısa tarixçəsi qeyd edilibdir.

Romalı idi: Onu Romadan Məkkəyə gətirmişdilər. Bir hədisdə peyğəmbər .buyurmuşdur: Suheyb (iman cəhətdən) romalıların lideri hesab olunur

İslam peyğəmbərinin dəvətini aşkar etməsi və müşriklərin əzabəziyyəti

Adlarını qeyd etdiyimiz müanlarla yanaşı İslam dini Məkkədə azçox digər insanların da qulağına çatmışdı. Dəstədəstə insanlar İslam dininə iman gətirirdilər. Digər tərəfdən də İslam peyğəmbərinə Allah tərəfindən göstəriş verildiki öz dəvətini aşkar edib, insanları müqəddəs dinə dəvət etsin. O, həzrətə peyğəmbərlik verildiyi gündən, dəvətini aşkar edən günə qədər üç il ötmüşdü. Aşağıdakı ayələr bu barədə nazil edilibdir: (Ya rəsulum)“Sənə əmr olunanı (quranı) açıq- aşkar təbliğ et və müşriklərdən (üz döndər”(١)

Yenə buyurubdur: “Və ən yaxın qohumlarını qorxut! Sənə tabe olan möminləri qanadın (altına al! (Onlarla yumşaq davran, nəzakətlə rəftar et, köməklərinə çat!) ”(٢)

Başqa bir yerdə buyurur: “Və de: “Mən həqiqətən, (sizi Allahın əzabı ilə) açıqaşkar (qorxudanam!”(٣)

Bu vaxtlar müanlar namaz qılmaq üçün dağ və dərələrə üz tutar və gizlin şəkildə namaz qılardılar: Bir gün Səd ibn Əbi Vəqqas bir neçə nəfər ilə namaz qılarkən. Müşriklər gəlib gördülər. Namaz qılan vəziyyətdə onlara pis sözlər deyib, bu hərəkətlərinə görə onları danladılar. Söz uzandı və yavaş- yavaş davaya çevrildi. Səd ibn Əbi Vəqqas oraya düşmüş, dəvənin çənə sümüyü ilə müşriklərdən birinin başını .yardı. Bu İslam xatirinə tökülən ilk qan idi

Qeyd etdiyimiz kimi İslam peyğəmbərinə əmr olundu ki, öz dəvətini aşkar etsin. Ona bu tapşırığ verildikdən sonra dəvəti aşkar etmək üçün hərəkətə başladı. Əziz İslam peyğəmbərinin müşriklərin Allahlarının və bütlərinin adını çəkməyib onları tənqid .etməyincə Məkkə əhalisi və Qüreyş onun təbliğatına mane olmurdular



---

.Hicr surəsi ٩۴- cü ayə . [١]-١

۲- [۲]. Şuəra surəsi ۲۱۴-۲۱۵-ci ayələr.

۳- [۳]. Hicr surəsi ۸۹-cu ayə.

Bu hərəkət Məkkə əhailsinə ağır gəldi. Az bir dəstə müandan savayı hamı onun ilə müxalifətçiliyə başladı. Vəziyyəti belə görən Əbutalib ayağa qalxıb müşriklərin əziyyətinə maneə oldu. Peyğəmbər də öz növbəsində öhdəsinə qoyulmuş ağır vəzifəsin icrası ilə məşğul olur və insanları aşkar şəkildə vahid Allaha tərəf pərəstişə səsləyirdi. Onların çubuq və daşdan düzəldilmiş yalançı Allahları olan bütlərini isə .tənqid edirdi

Qüreyş rəhbərləri O həzrətin öz işi ilə məşqul olduqlarını və əmisi Əbutalibin onu təbliğatını müdafiə etməsi nəticəsində kimsənin ona zərər vura bilməməsini gördükdə höccətlərini tamamlamaq üçün Əbutalibin yanına yollandılar. Onlar aşağıdakılardan :ibarət idilər

Rəbiət oğlu Ütbə və Şeybə, Əbu Süfyan ibn Hərb – adı Səxr idi – Əbulbəxtəri – adı As ibn Hişam və ya As ibn Haşim idi – Əsvəd ibn Mütəllib, Əbucəhl – adı Əmr idi və künyəsi isə Əbulhikəm idi – Vəlid ibn Müğeyrə, Həccac ibn Amirin övladları Nəbiyə və Mənbə, (As ibn Vael(١

Qeyd etdiyiniz şəxslər Əbu Talibin yanına gələrək dedilər. Ey Əbu Talib bu qardaşın oğlu bizim Allahlara yaman deyir! Bizim dinimizi tənqid edərək, alimlərimizi səfeh və ağılsız adlandırır. Bizim atalarımızı yolunu azmışlar hesab edir. İndi ya özün onun qarşısını al ya da onu bizə tapşır. Çünki sən də bizim kimisən və biz ona kifayət .edəcəyik? Əbu Talib o gün mülayim və gülərüzlə onları sakitləşdirib yola saldı

Peyğəmbər dini təbliğ etməkdə davam edir və insanları vahid Allaha doğru dəvət edirdi. Getgedə Qüreyşin o həzrət ilə müxalifətçiliyi artmağa başladı, O həzrətin tərəfdarları ilə müxalifləri arasında mübahisələr başlandı. Qüreyş də camaatı o .həzrətə qarşı qaldırırdı

Qüreyş başçıları ikinci dəfə Əbu Talibin yanına gedib ona dedilər: Ey Əbu Talib sən bizim üçün alicənab və şərafətli insansan. Biz qardaşın oğluna görə bir dəfə sənin ,yanına gələrək

İbn Hişam hər birinin soy kökünü bir neçə ata- babası ilə qeyd etmişdi ki,. [۱] -۱
.maralqananlar sirənin I cildinin ۲۶۴- ۲۶۵- ci səhifələrinə müraciət edə bilərlər

onun qarşısını almağınızı xahiş etsəkdə, amma sən bizim sözümüzə əhəmiyyət vermədin. And olsun Allaha ki, daha dözə bilmirik. Bundan artıq dözə bilmərik ki, atalarımıza söyüş verib və böyüklərimizə pis söyləsinlər. Allahlarımıza eyb tutsunlar. İndi ya özün onların qarşısını al, ya da biz səninlə mübarizəyə qalxacağıq ki, iki tərəfdən biri gücdən düşüb nəhayət həlak olsun. Onlar bu tip sözlər deyərək çıxıb getdilər. Bu məsələ Əbutalibə ağır gəldi. Çünki Qüreyşin ondan ayrılması və ona düşmən olması onun üçün çətinlik yaradırdı. Digər tərəfdən də istəmirdi ki, .peyğəmbəri onlara təslim edib onu köməksiz qoysun

Buna görə də peyğəmbəri yanına çağırtdırıb ona dedi: Ey qardaş oğlu, bu Qüreyş mənim yanıma gələrək belə sözlər dedilər. İndi həm mənim və həm də öz canın üçün .nigaran ol. Mənim bacarmadığım bir işə məni məcbur eləmə

Peyğəmbər güman etdi ki, əmisi onu təkbaşına qoyur və ona kömək etmək fikri yoxdur. Buna görə də buyurdu: And olsun Allaha əgər günəşi mənim sağ əlimə və ayı sol əlimə qoysanız belə bu işdən əl çəkməyəcəyəm. Ya bu yolda həlak olacaq, ya da ki, .Allahın köməkliyi ilə onlara qələbə çalacağam

Həzrətin gözləri doldu və ağladı. Yerindən qalxıb qapıya tərəf addımladı. Əbu Talib onu səsləyib dedi: Qardaş oğlu qayıt! Həzrət qayıtdıqdan sonra dedi: Get və istədiyini de. .And olsun Allaha ki, səndən köməkliyimi əsirgəməyəcəyəm

Qüreyş Əbu Talibin peyğəmbərə kömək etməsindən əl çəkmədiyini və peyğəmbəri onların öhdəsinə buraxmadığını görüb Qüreyş içərisində ən qüvvətli və ən gözəl cavan olan Əmmarə ibn Vəlid Məxzumini Əbutalibin yanına gətirərək dedilər: Ey Əbutalib Qüreyş içərisində ən gözəl və ən qüvvətli cavan olan Əmmarəni götür və onun əvəzinə Məhəmmədi bizə ver. O, Məhəmmədi ki, sən və atalarının dini ilə müxalifətə qalxıb və Qüreyş arasında ixtilaf yaradıbdır. O bizim alimlər və böyüklərimizə nadan və səfeh deyir: Məhəmmədi bizə həvalə et ki, onu öldürək, əvəzində isə Əmmarəni övladlığa !götür

Əbutalib dedi: And olsun Allaha ki, mənə pis təklif etdiniz! Sizin övladınızı götürüb böyüdüm öz övladımı isə sizə verim ki, onu öldürəsiniz. And olsun Allaha ki heç vaxt bu !işi görmərəm

Mutəm ibn Ədi ibn Nofəl dedi: Ey Əbutalib and olsun Allaha ki, sənin tayfan səninlə insafla danışdılar. Bacardıqları qədər çalışdılar ki, sənə əziyyət verməsinlər, amma !deyəsən sən onların dostcasına insaflı təkliflərini qəbul etmək fikrində deyilsən

Əbutalib dedi: Ey Mutəm and olsun Allaha ki, onlar insafcasına danışmadılar. Bəlkə sən istəyirsən bu sözlər ilə onları mənimlə düşmənçiliyə təhrik edəsən. İndi ki, belə oldu .əlindən gələni əsirgəmə! Beləliklə onlar arasında düşmənçilik və mübarizə yarandı

(Burada Əbutalib Mutəm ibn Ədi və digər Qüreyş haqqında şerlər söylədi.(١

### MÜŞRİKLƏRİN İSLAM PEYĞƏMBƏRİNƏ İMAN GƏTİRƏN İNSANLARI İNCİTMƏSİ

Bu hadisədən sonra Qüreyş peyğəmbərlə mübarizə aparmaq üçün bir- birilə əhd bağlayıb, qərara gəldilər ki, hər biri öz tayfası arasına göz gəzdirsin. Əgər kimsə İslam .dinini qəbul edibsə onu incitsinlər. Beləliklə müanların əzab- əziyyətli günləri başladı

Vəziyyəti belə görən Əbutalib Haşim və Mütəllib övladlarını çağıraraq onları peyğəmbəri müdafiə edərək ona kömək etmələrini istədi. Hamı onun sözlərini qəbul (etdi. Təkcə Əbuləhəb öz düşmənçilik və ədavətini davam etdirdi (Allah lənət etsin

Əbutalib öz qəbiləsinin peyğəmbərə kömək etməsinə hazır olduğunu görüb vəcdə gələrək şerlər söyləyib(٢) onları mədh etdi. Peyğəmbərin fəzilətlərini onlara xatırlayıb .onlara himayələrinə görə təşəkkür etdi

### VƏLİD İBN MUĞEYRƏNİN İSLAM PEYĞƏMBƏRİ HAQQINDA DEDİKLƏRİ

Həcc günləri yaxınlaşırdı. Qüreyş nigaran idi ki, hacılar



---

.Sirənin I cildinin ٢۶٧- ٢۶٨- ci səhifələri . [١] -١

Şerlərin mətnindən xəbərdar olmaq üçün İbn Hişamın sirəsinin I cildinin ٢۶٩- cu . [٢] -٢
!səhifəsinə müraciət edə bilərsiniz

Məkkəyə gələndən sonra peyğəmbərin təbliğatı onlara da təsir edəcək. Buna görə də Qüreyş arasında yaşlı olan Vəlid ibn Muğeyrənin yanına getdilər. Vəlid dedi: Sizin xəbəriniz var ki, Məhəmmədin səsi ətrafa yayılıb. İndi isə həcc mövsümü çatıb və ərəb karvanları bu günlər sizin şəhərinizə gəlmək ərəfəsindədirlər. Onun barəsində öz sözünüzü bir ediniz, hamınız onun haqqında eyni söz deyin. Elə olmasın ki, hər bir kəs ayrı cürə danışsın. Dedilər: Sən nə desən biz də hamılıqla Məhəmməd haqqında onu .deyəcəyik

.Vəlid – Siz bir söz seçin, mən də sizinlə həmfikir olum

.Qüreyş – Biz deyərik ki, Məhəmməd kahindir

Vəlid yox and olsun Allaha ki, o kahin deyil. Biz kahinləri görmüşük. Amma !Məhəmmədin sözləri kahinlərin zümzüməsinə oxşamır

.Qüreyş – Elə isə deyərik: Dəlidir

Vəlid – Yox dəli də deyil. Çünki biz dəliləri görmüşük. Məhəmmədin söz və hərəkətləri !isə dəlilərin söz və hərəkətlərinə bənzəmir

.Qüreyş – Deyərik: Şairdir

Vəlid – Şair də deyil, çünki biz rəcəz, həcəz, məbsut və digər şer növlərini görmüşük, .amma onun sözləri şer deyil

.Qüreyş – Gəlin deyək ki, o sehrbazdır

Vəlid – Sehrbazlar və onların sehrlərinidə görmüşük, Məhəmməd sehrbaz deyil. Çünki onun sözləri ilə əllərində ip düyünlənib sonra ona üfürən sehrbazlar arasında oxşarlıq .yoxdur

?Dedilər: Elə isə nə deyək

Vəlid dedi: And olsun Allaha ki, danışığı şirindir. Əsil- nəcabəti də möhkəm və yerindədir. Onun meyvəsi də pak və təmizdir. Ona görə də hər nə desəniz camaat biləcək ki, sizin danışığınız boş və bihudədir. Amma yenə də hamısından yaxşı budur ki,

deyəsiniz ki, o sehrbazdır. Çünki onun sözləri sehrə bənzəyir ki, onun vasitəsi ilə ata, .oğul, qardaş, qadın, həyat yoldaşı, qohum və qəbilə arasında ayrılıq salır

Qüreyş Vəliddən ayrılıb karvan yollarının üzərində əyləşdilər. Qarşılarına çıxan hər bir kəsə peyğəmbərlə ünsiyyətdə olmaqdan çəkindirir və o həzrətin sehrbaz və cadugər .olması ilə qorxudurdular

Bu vaxt Allah- Təala Vəlid ibn Müğeyrə və onun sözləri haqqında aşağıdakı ayələri :nazil etdi

Ya Peyğəməbr) Məni öz yaratdığım kimsə ilə tək burax! (Vəlid ibn Muğeyrə kimi )“ kafirin cəzasını mənə tapşır) Mən ona bol mal- dövlət əta etdim. Yanında hazır duran oğullar (verdim). Ona (hər şeyi) artıqlaması ilə müyəssər etdim (sərvət və mənsəbi ayağının altına döşədim) .(Bütün bunlardan) Sonra yenə də (var- dövlətini) artırmağımı istəyir. Xeyr (bu ola bilməz). Çünki o, ayələrimizə qarşı inadkar oldu. Mən onu məşəqqətli bir əzaba düçar edəcəyəm! O (Quran barəsində) fikirləşdi və (orada deyilənləri öz ürəyində) ölçdü-biçdi. Ölüm olsun ona! Necə ölçdü- biçdi?! (peyğəmbərə sehrbaz dedi), Yenə də ölüm olsun ona! Necə ölçdü- biçdi?! Sonra (qövmünün üzünə) baxdı. Sonra üz- gözünü turşutdu, qaşqabağını tökdü. Sonra da (imandan) üz çevirdi, (peyğəmbərə tabe olmağa) təkəbbür göstərdi və dedi: Bu (sehrbazlardan) öyrənilən (sehrdən başqa bir şey deyil. Bu yalnız bəşər sözüdür!(۱)

Vəlid ibn Müğeyrənin yanına gələn Qüreyşlilər haqqında isə bu ayələr nazil oldu. “Eynilə (Quranı) bölənlərə endirdiyimiz (əzab) kimi! O kəslər ki, Quranı (müxtəlif) hissələrə böldülər! (Yəhudilər, və xaçpərətlər, yaxud müşriklər Quranın bir qisminə inanıb, digər qismini inkar edirdilər. Onların bəzisi Quranı şer, bəzisi sehr, bəzisi isə kahinlik əsəri adlandırırdı). (Ya rəsulum) Rəbbinə and olsun ki, biz onların hamısını (bütün məxluqatı) sorğu- suala çəkəcəyik. (Dünyada) etdikləri əməllər barəsində ((onlardan haqqhesab tələb edəcək və cəzalarını verəcəyik!)”(۲)

Vəziyyəti belə görən Əbu Talib Qüreyşin məhəbbətini cəlb etmək və onların arasında olan şəxsiyyəti haqqında məşhur qəsidəni oxudu və bir daha xatırladı ki, heç bir halda .peyğəmbəri onlara təslim etməyəcək və son anına qədər o həzrəti müdafiə edəcək

Əbu Talibin Allahın elçisinin mədhi haqqında dediyi məşhur şerdə həmin qəsidədir ki, :deyir



---

.Müdəssir surəsinin ۱۱- ۲۵- ci ayələri . [۱] -۱

.Hicr surəsinin ۹۰- ۹۳- cü ayələri . [۲] -۲

و ابیض یستسقی الغمام بوجهه ثمال الیتامی عصمه للأرامل(۱)

Yəni, ağ üzlü ki camaat onun üzünün bərəkətinə görə yağış istəyir. Və o yetimlərin .fəryadına çatan və dul qadınların pənahıdır

Hədislərdə qeyd olunubdur ki, hicrətdən sonra bir müddət Mədinədə quraqlıq oldu. Camaat peyğəmbərin yanına gəlib quraqlıqdan şikayət etdilər. Həzrət minbərə qalxıb Allahdan yağış istədi. Bir az keçməmiş elə yağış yağdı ki, camaat o həzrətin yanına gələrək yağışın çoxluğundan və sel gəlməsindən şikayət etdilər. Peyğəmbər Allahın dərgahına əl qaldıraraq dedi: İlahi pərvərdigara bizə yox ətrafımıza yağdır! Buludlar birbirindən ayrılıb şəhərin ətrafında birləşdilər. Peyğəmbər buyurdu: Əgər bu gün Əbu Talib sağ olsaydı bu hadisə onu xoşhal edərdi. Səhabələrin bəziləri dedilər: Deyəsən .onun bu şerini xatırladınız

و ابیض یستسقی الغمام بوجهه ثمال الیتامی عصمه للأرامل(۲)

Hər halda peyğəmbər və onun nübuvvət məsələsi ərəb qəbilələri arasında yayılmağa başladı və şəhərlərin dillər əzbəri oldu. Mədinə şəhərində yaşayan Ovs və Xəzrəc qəbiləsi yəhudilər ilə qonşu olduqlarına əvvəlki səhifələrdə də qeyd etmişdik – və onlardan ərəblər arasında bir peyğəmbərin zühur edəcəyi haqqında eşitdikləri sözlərə görə o həzrətin gəlməsinin intizarını çəkir və onun vəziyyətindən xəbərdar idilər. O həzrətin zuhur xəbəri və Qüreyşin onunla mübarizəyə qalxması xəbəri Mədinəyə çatdıqda, Qüreyş arasında bir neçə il yaşamış, onlardan aldığı qıza görə onlara çox hörmət və məhəbbəti olan ibn Əslət Qüreyş üçün şerlər qoşdu. O bu şerlərində Qüreyşi peyğəmbər ilə ikitirəlik mübarizə və döyüşdən çəkindirirdi. Allahın onlara verdiyi nemətləri, əshabi fil, Dahəs və Hatib döyüşlərini (hər ikisi cahiliyyət zamanında .baş vermişdi) onlara xatırladırdı

Bəni Üməyyənin həmpeymanlarından və islam dinini qəbul



---

Bütün qəsidə və bir sıra izahatlar haqqında xəbərdar olmaq istəyirsinizsə sirənin . [۱] -۱
.I cildinin ۲۷۲- ۲۸۰- cı səhifələrinə müraciət edə bilərsiniz

Bütün qəsidə və bir sıra izahatlar haqqında xəbərdar olmaq istəyirsinizsə sirənin . [٢] -٢
.I cildinin ٢٧٢- ٢٨٠- cı səhifələrinə müraciət edə bilərsiniz

edən hörmətli və şərafətli bir kişi olan Həkim ibn Üməyyə də bu barədə şerlər söylədi.(١) Müşriklərin peyğəmbərə verdiyi zərər və əzab-əziyyətlər

İslam peyğəmbərinin təbliğatı nəticəsində Qüreyşdə yaranan ədavət və düşmənçilik onları peyğəmbər və İslam dininə qarşı iman gətirənlərə qarşı sərt rəftar etməyə məcbur edirdi. Qüreyş nadan camaatı təhrik edirdi ki, onu təkzib edib incitsinlər. Onların özüdə peyğəmbəri şair, cadugər, dəli və bunun kimi şeylər ilə ittiham edirdilər. Lakin əziz İslam peyğəmbəri Allah tərəfindən ona həvalə olunmuş ağır vəzifəni (qorxu və vahimə bilmədən onlar qarşısında süst olmadan) icra edir və aşkar formada təbliğatını davam etdirirdi. Habelə Qüreyşin din və məramını tənqid etmək, bütlərdən çəkindirmək və kafirlər ilə mübarizə yolunu seçməklə onların daha da çox narahat .olmasına səbəb olurdu

Əmr As oğlu Əbdullah deyir: Atama dedim: Qüreyşin peyğəmbərə verdiyi ən böyük əziyyət hansı idi? Dedi: Bir gün həcəri İsmaildə (Məscidul-həramda) əyləşmiş Qüreyş başçılarının yanına getdikdə gördüm ki, o həzrətdən danışır və bir-birinə deyirlər: İndiyə qədər bu kişiyə göstərdiyiniz səbr və dözümü heç bir xoşagəlməz iş müqabilində etməmiş və sakit dayanmamışıq. Ağıllılarımıza nadan dedi. Atalarmıza söyüş verdi. Bizim dinimizi tənqid edir. Bizim ittifaqda olan qruplarımızı pərakəndə salıb .Allahlarımıza söyüş verir. Həqiqətən də biz ona çox dözmüşük

Bu barədə söhbətləşirdilər ki, Allahın elçisi daxil olub Kəbə evinin sütununa toxunub sonra təvaf etməyə başladı. Onların yanından ötdükdə o həzrətə pis sözlər deyib tənə .vurdular

Mən peyğəmbərin çöhrəsində narahatlıq müşahidə etsəmdə, amma həzrət onlara əhəmiyyət verməyib yanlarından ötdü. İkinci dəfə yanlarından ötdükdə yenə də tənə vurub pis sözlər söylədilər. Mən yenə də peyğəmbərin narahat olduğunu müşahidə etdim. Üçüncü dəfə onlara yenə də peyğəmbərə qarşı pis sözlər deməyə



---

١- [١] İbn Əslət və Həkimin şerlərinin mətnindən və habelə Dahəs və Hatib döyüşlərindən xəbərdar olmaq istəyirsinizsə sirənin I cildinin ٢٨٣- ٢٨٩- cu səhifələrinə

:başladıqda, peyğəmbər onların qarşısında dayanıb dedi

Ey Qüreyş tayfası: Agah olun and olsun o Allaha ki, canım onun əlindədir. Mən sizinlə !müharibə etməyə (və ya sizi həlak etməyə) məmur edilmişəm

Bu sözləri dedikdən sonra onlar elə sakit dayanmışdılar ki, elə bil başları üzərində quş oturmuşdu. Onun qarşısında elə sakit oldular ki, bu sözdən qabaq ona daha çox qəzəblənən və hamıdan çox insanları ona qarşı qaldıranlar, o həzrətə ən gözəl sözlər ilə cavab verib ona qarşı hörmət göstərdilər. O həddə qədər ki, deyirdilər: Ey Əbül Qasim bizi görməzdən gəl (bizim pis rəftarımıza fikir vermə) and olsun Allaha ki, sən (elə bir şəxs deyilsən ki, elmsiz danışasan (bizim kimi nadan deyilsən

Allahın elçisi onlardan ötüb keçdi: Sabahısı gün yenə də oraya toplaşmışdılar. Mən də onlarlaydım. Onlardan biri dedi: Siz dünən Məhəmmədə bəzi sözlər dediniz, onun da sizin haqqınızda dediklərini eşitdiniz. Amma eləki sizin haqqınızda narahat edici sözlər bəyan etdi, onu buraxıb cavab vermədiniz. Bu haqda danışırdılar ki, uzaqdan peyğəmbər göründü. Onlar peyğəmbəri görcək hamı bir yerdə ona tərəf hücum edib onu əhatəyə aldılar. Onlar kobudluq edərək deyirdilər: Sən bizim din, məzhəb və ?Allahlarımız haqqında filan- filan sözləri deyirsən

!Peyğəmbər buyurdu: Bəli mən demişəm

Əmr As deyir: Bu vaxt onlardan biri həzrətin əbasının iki tərəfini əldə tutdu (ona əziyyət verməyə başladı). Oradakı mənzərəni müşahidə edən Əbu Bəkr ağlayaraq (o həzrətə ürəyi yandığından) dedi: Ey insanlar bir kişinin “mənim Allahım vahid olan Allahdır dediyinə görəmi əziyyət edirsiniz?” Beləliklə o həzrəti buraxıb hər kəs öz işinin arxasınca getdi. Bu hadisə Qüreyşin peyğəmbərə qarşı həyata keçirdiyi ən çətin əziyyəti idi. Əbu Bəkrin qızı Ümm Külsümdən rəvayət edirlər ki, o gün Əbu Bəkr evə .qayıdanda gördüm ki, Qüreyş onun başını yarıblar

Yenə rəvayət edirlər ki: Peyğəmbərin Qüreyşdən gördüyü ən şiddətli əzab bu idi ki, bir gün peyğəmbər evdən çıxdı. O günü peyğəmbəri görən qul və azad olmasından asılı .olmayaraq hər bir kəs onu təkzib edib, ona əziyyət verdilər. Həzrət evə qayıtdı

yatdı. Sonra bu ayə nazil oldu: “Ey (libasına) örtülüb bürünmüş (peyğəmbər)! Qalx ((qövmünü Allahın əzabı ilə ) qorxut! ”(۱)

#### HƏMZƏNİN İSLAM DİNİNİ QƏBUL ETMƏSİ

Əsləm qəbiləsindən bir kişi rəvayət edir ki, bir gün Əbu Cəhl Səfa yaxınlığında peyğəmbərlə rastlaşdıqda, o həzrəti incidib ona pis sözlər dedi. O həzrətin dinini tənqid edən və onun işini zəifldən ifadələr işlətdi. Peyğəmbər ona cavab verməyib, evinə döndü. Əbdullah ibn Codanın kənizlərindən biri Əbu Cəhlin o həzrətə dedikləri sözləri eşitdi. Əbu Cəhl peyğəmbərdən ayrılıb Kəbə evinin kənarında Qüreyşin təşkil etdiyi .iclasa gəldi

Bir az sonra Həmzə ibn Əbdül Mütəllib (Allah ondan razı olsun) kamanı çiyninə almış və ovdan qayıdırdı. Həmzə adəti üzrə ovdan qayıdanda evə dəyməmiş ilk öncə Kəbə evini təvaf edərdi. Əgər Qüreyşdən bir qrup ilə rastlaşsaydı dayanar və onlar ilə söhbətləşərdi. O, kəniz ilə rastlaşdıqda kəniz dedi: Ey Həmzə burda olsaydın görərdin ki, qardaşın oğlu Məhəmməd, Əbu Cəhlin əlindən nələr çəkirdi və hansı söyüşləri eşidirdi. Ona hansı zərərlər vurdu. Amma Məhəmməd onun qarşısında susub evə .getdi

Allah Həmzənin İslam dinini qəbul etməsini iradə etdiyi üçün bu söz ona ağır gəldi. Qəzəblənərək Əbu Cəhlin peyğəmbərə qarşı mənfi davranışının cəzasını vermək üçün onu axtarmağa başladı. Bu məqsədlə Məscidul- Hərama gəldikdə Əbu Cəhli bir qrup insanın arasında əyləşdiyini gördü. Həmzə irəli gələrək əlində tutduğu kamanı onun başına elə çırpdı ki, Əbu Cəhlin başı yarıldı. Həmzə dedi: Aya sən Məhəmmədə söyüş verirsən? Bir halda ki, mən də onun dinini qəbul etmişəm. İndi cəsarətin çatırsa .o söyüşləri mənə də ver

Bəni Məxzum qəbiləsindən bir qrup Həmzəyə hücum edərək Əbu Cəhli müdafiə etməyə qalxdılar. Əbu Cəhl dedi: Həmzə ilə işiniz olmasın, çünki mən onun qardaşı .oğluna möhkəm söyüşlər vermişəm

Bu hadisədən sonra Həmzə İslam dini və peyğəmbərdən

itaətçilikdə sabit qədəm oldu. Həmzə İslam dinini qəbul etdikdən sonra Qüreyşin o həzrətə qarşı əziyyətləri azalmağa başladı. Çünki bilirdilər ki, Həmzə onu müdafiə .edəcək

### ÜTBƏ İBN RƏBİƏNİN PEYĞƏMBƏRİN YANINA GƏLƏRƏK ONA ETDİYİ TƏKLİFLƏR

Qüreyş başçılarından biri olan Ütbə ibn Rəbiə günlərin bir günü Məscidulhəramda Qüreyşin iclasında əyləşmişdi. Peyğəmbər də digər bir küncdə əyləşmişdi. Qüreyş peyğəmbərin təbliğatlarından narahat idilər. Ütbə məclisdəkilərə dedi: Ey Qüreyş yaxşı olar ki, mən Məhəmmədin yanına gedib onunla söhbət edim. Ona bir sıra təkliflər verim bəlkə birini qəbul edib, öz sözlərini geri götürdü. Məclisdəkilər onun sözünü qəbul edib Ütbəni peyğəmbərin yanına göndərdilər. Ütbə ayağa qalxaraq peyğəmbərin yanına gəlib onun ilə üzbəüz əyləşdi. Bu vaxt dedi: Ey qardaş oğlu(١) sən özün bilirsən ki, bizim aramızda hansı hörmətə maliksən, istər qohumluq, istərsə də soykök nəzərindən. İndi isə böyük bir işlə məşğul olub, aramızda iki tirəlik salmısan, böyüklərini səfeh və nadan adlandırırsan, onların Allahlarını kafir və dinsiz adlandırırsan! İndi isə mənim təkliflərimə qulaq as ki, bəlkə onlardan birini qəbul edib, bu işlərdən əl çəkəsən! Allahın elçisi buyurdu: Ey Ütbə təkliflərini söylə görüm mən dinləməyi bacarıram. Ütbə dedi: Ey qardaş oğlu, əgər bu sözləri deməkdən məqsədin var- dövlət toplamaqdırsa, onda biz sənə o qədər var-dövlət verərik ki, bizim hamımızın sərvəti qədər olar. Əgər məqsədin şəxsiyyətini artırmaqdırsa biz hazırıq ( bu sözləri söyləməsən) səni öz böyüyümüz seçib sənin icazən olmadan heç bir şey etməyək. Əgər məqsədin hakimiyyətdirsə biz səni öz sultan və rəisimiz seçərik. Əgər səni cin vurubsa və onu uzaqlaşdıra bilmirsənsə sənin üçün həkim gətirək və səni müalicə etdirək. Müalicənin bütün xərclərini öz var- dövlətimizdən ödəyərik, təki sən sağalasan. Bu sözlər oxşar bir sıra sözlər dedi və peyğəmbər



---

Çünki Ütbə, Rəbiət ibn Əbd Şəms ibn Əbdü Manafın övladı idi. Soy- kökü Əbdü . [١] -١ Manafda peyğəmbərlə birləşirdi. Buna görə də o həzrətə qardaş oğlu deyə müraciət .edirdi

:də dinləyirdi. Sözləri bitdikdən sonra peyğəmbər buyurdu

.Ey Ütbə sözlərini bitirdin? Dedi: Bəli

.Həzrət buyurdu: İndi isə məni dinlə! Ütbə dedi: De

Peyğəmbər “Fussilət” surəsini oxumağa başladı. Ütbə də pəncələrini yerə söykəyib, qulaq asırdı. Peyğəmbər bu surəni oxumağa davam edirdi ki, səcdə ayəsinə çatdıqda !səcdəyə getdi. Sonra qalxıb dedi: Mənim cavabımı eşitdin. İndi özün bilərsən

Ütbə ayağa qalxıb öz dostlarının yanına yola düşdü. Qüreyş uzaqdan gördülər ki, Ütbə qayıdır. Ona baxaraq dedilər: Ütbə dəyişilib. Bu bir az əvvəl gedən Ütbə deyil. Ütbə gəlib onların yanında əyləşdikdən sonra ona dedilər: Nə oldu? Dedi: Mən elə bir söz eşitdim ki, and olsun Allaha ki, indiyə qədər belə söz eşitməmişdim. And olsun Allaha ki, .nə şer, nə kəhanət və nədəki cadugərlik idi

Ey mənim Qüreyşli dostlarım sizə bir söz deyirəm ki, bunu eşidin. Bu kişi ilə işiniz olmasın, çünki mənim ondan eşitdiyim söz böyük söz idi və mühüm gələcəyə malik idi. İndi onunla işiniz olmasın, əgər ərəblər onu aradan götürsələr sizin məqsədinizi digərlər həyata keçirtmiş olacaq, yox əgər ərəbləri özünə tabe etsə bu sizin üçün fəxrdir. Çünki onun səltənəti sizin səltənətidir. Onun izzəti sizin izzətinizdir. O zaman siz də onun vasitəsi ilə böyük mənsəbə nail olacaqsınız. Məclisdəkilər ona dedilər: And olsun ki, Məhəmməd dili ilə səni ovsunlayıb! Ütbə dedi: Bu mənim fikrimdir. İndi özünüz !bilərsiniz

## İSLAM PEYĞƏMBƏRİNİN QÜREYŞ RƏHBƏRLƏRİ İLƏ MÜBAHİSƏSİ

Günlər ötdükcə müqəddəs İslam dini Məkkədə və Qüreyş qəbilələri arasında daha sürətlə yayılmağa başlayırdı. Məkkə əhalisi hər gün yuxudan durduqda təzə İslam dinini qəbul etmiş bir kişi və ya qadınla rastlaşırdılar. Məkkə müşrikləri İslam peyğəmbərinin bu uğurları qarşısında boğulan insan kimi özlərini itirmişdilər. Onlar hər bir vasitədən istifadə edərək bu dinə iman gətirənlərin qarşısını almaq istəyirdilər. Hər bir müan ilə rastlaşdıqda onu həbs edib işgəncə verərdilər. Əgər bu yol ilə mümkün .olmasaydı onu mal- dövlət ilə şirnikləşdirərdilər

Süfyan, Nəzr ibn Haris, Əbulbəxtəri (Əbu Cəhlin qardaşı) Əsvəd ibn Mütəllib, Zumə ibn Əsvəd, Vəlid ibn Müğeyrə, Əbu Cəhl, Əbdullah ibn Üməyyə, As ibn Vail (Əmr Asın atası), Nəbiyə, Mənbə, Üməyyə ibn Xələf... və digər Qüreyş rəhbərləri Kəbə evinin kənarında toplaşıb dedilər: Məhəmmədin yanına bir şəxsi göndərib onu buraya çağırtdırın. Onunla söhbət ediniz ki, əgər bundan sonra ona qarşı bir addım atsanız, !üzrünüz olsun

Nəhayət o həzrətin yanına adam göndərib dedilər: Sənin tayfa başçıların toplaşıb səninlə söhbətləşmək istəyirlər. Onların yanına gəl! Allahın elçisi onların sifarişini eşitdikdə güman etdi ki, artıq onlar mübarizədən əl çəkib, təzə fikrə düşüblər. Onların hidayət olmasını istədiyi üçün və onların azğınlığı həzrətə əzab verdiyi üçün dərhal onların iclasına gəlib, yanında əyləşdi. Onlar həzrətə üz tutub dedilər: Ey Məhəmməd biz səni bura çağırmışıq ki, sənin üçün üzr yollarını bağlayaq. Çünki and olsun Allaha ki, biz sənin öz qövmünlə davrandığın kimi davranan başqa bir kəsi tanımırıq. Atalarımızı söyürsən? Bizim dinimizi tənqid edirsən, Allahlarımızı pisləyirsən, böyüklərimiz və ağıllılarımızı səfeh və nadan adlandırırsan, insanlar arasında ixtilaf yaradırsan. Xülasə layiq olmayan bütün işləri yerinə yetirirsən. Sənin bu işlərdən məqsədin nədir? Əgər məqsədin var- dövlət toplamaqdırsa sənin üçün o qədər var- dövlət toplayaq ki, bizim ən varlımız olasan. Əgər şəxsiyyət və rəyasət axtarışındasınızsa biz səni rəhbərimiz seçərik, əgər səni cin vurubsa – çünki mümkündür ki, cin sənə giriftar olsun – biz səni .müalicə edərik və sağalarsan

Peyğəmbər sakit idi, onların sözləri bitdikdən sonra peyğəmbər buyurdu: Sizin təsəvvür etdiyiniz şeylər deyil. Nə gəlmişəm sizdən mal- dövlət alam, nə sizin aranızda nüfuz qazanam və nədə ki, sizə rəhbərlik fikrindəyəm. Bəlkə Allah- Təala məni sizə tərəf peyğəmbər göndərmiş və mənə bir kitab nazil etmişdir. Mənə göstəriş verib ki, sizi (onun əzabı ilə) qorxudum və (o dünyanın sonsuz nemətləri və ləzzətləri ilə) müjdələyəm. Mən də bu işi başlayıb öz peyğəmbərliyimi sizə təbliğ edirəm. Əgər qəbul etsəniz dünya və axirət faydası sizinlə olacaq. Əgər qəbul etməsəniz mən sizin qarşınızda səbr edəcək və

!...gözləyəcəyəm ki, Allah mənimlə sizin aranızda hökm etsin

Dedilər: Ey Məhəmməd indi ki, bizim təkliflərin heç birisini qəbul etmədin. Onda özün bilirsən ki, şəhərlər arasında bizim şəhər kimi darısqal susuz və otsuz bir şəhər yoxdur. Bizim əhali kimi kasıb əhali yoxdur. İndi səni peyğəmbər seçmiş Allahdan istə ki, bizim bu şəhər ətrafındakı dağları uzaqlaşdırsın və bizim ərazimizi genişləndirsin. Şam və İraqda olduğu kimi arx və çeşmələr axsın. Bizim ata-babalarımız və məxsusən də düzgün danışan bir kişi olan Qəsi ibn Kəlabı dirilt ki, biz də onlardan soruşaq. Görək sənin sözlərin doğrudur ya batil? Bəs əgər bizim dediklərimizi edə bilib, onları dirildə bilsən və onlarda səni təsdiq etsələr biz də səni təsdiq edəcəyik və biləcəyik ki, sənin .Allah yanında məqamın yüksəkdir və səni dediyin kimi peyğəmbərliyə təyin etmişdir

Peyğəmbər buyurdu: Mən seçilməmişəm ki, sizin dediklərinizi icra edim, bəlkə mən seçilmişəm ki, Allahın mənə verdiyi əmr və göstərişləri sizə çatdırım. əgər qəbul etsəniz dünya və axirət xeyri sizinlədir. Yox qəbul etməsəniz səbr edib gözləyəcəyəm !ki, Allah mənimlə Sizin aranızda hökm etsin

Dedilər: Elə isə öz Allahından istə ki, səninlə bir mələk göndərib səni təsdiq etsin və bizi səndən uzaq tutsun. Habelə ondan istə ki, sənin üçün qızıl- gümüş dolu xəzinələr, qəsrlər və bağlar yaratsın ki, ruzi üçün xəyalların rahat olsun və bizim kimi o tərəf bu tərəfə qaçıb dolanışıq fikrində olmayasan. Bu halda biz bilərik ki, sən Allah tərəfindən .göndərilmisən və onun yanında məqam sahibisən

Peyğəmbər buyurdu: Mən Allahdan belə şeylər istəmirəm və belə şeylər üçün də peyğəmbər seçilməmişəm. Amma göndərilmişəm ki, sizi (əzabdan) qorxudam və (əbədi nemətlərlə) müjdələyəm. (əmindir ki, dedim) əgər qəbul etsəniz dünya və axirət faydası sizin olacaq. Belə olmasa səbr edəcəyəm ki, Allah mənimlə sizin aranızda .hökm etsin

Dedilər: Elə isə göy parçaları başımıza düşsün. Çünki sən fikirləşirsən ki, Allah istəsə bu işi edəcək. Əgər sən bunu etməsən biz sənə iman gətirməyəcəyik. Peyğəmbər buyurdu: Bu

.Allahın işidir. Əgər istəsə sizə qarşı bu işi həyata keçirəcək

Dedilər: Ey Məhəmməd əgən sənin Allahın bilirdisə biz belə bir iclas təşkil edəcək və səndən belə xahişlər edəcəyik. Bəs niyə əvvəlcədən bu haqda sənə məlumat verib, bizim sözlərin cavablarını sənə öyrətmədi ki, biz də sənin sözlərini qəbul edəydik. Çünki biz bu sözlərlə sənin danışıqlarını qəbul etməyəcəyik. Ey Məhəmməd bizim eşitdiyimizə görə sən Yəmamə şəhərində yaşayan Rəhman adlı bir şəxsdən təlim .alırsan. And olsun Allaha ki, biz heç vaxt Rəhmana iman gətirməyəcəyik

Ey Məhəmməd biz sənin üçün üzr yollarını bağladıq. And olsun Allaha ki, səni rahat !qoymayacağıq, ya səni öldürəcəyik, ya da ki, sən bizi öldürəcəksən

!Onlardan biri dedi: Biz Allahın qızları olan mələklərə sitayiş edirik

Başqa birisi dedi: Əgər sən Allah ilə mələkləri bizim yanımıza gətirsən biz sənə iman .gətirərik

Qüreyş sözlərini bitirdikdən sonra İslam peyğəmbəri o məclisdən qalxdı. Peyğəmbərin bibisi Əbdül Mütəllib qızı Atikənin oğlu olan Əbdullah ibn Əbi Üməyyə O həzrətin arxasınca qalxaraq dedi. Ey Məhəmməd! Bu camaatın sənə verdiyi təkliflərin heç birisini qəbul etmədin. Sonra sənin Allah yanında məqamını bilmək və sənə iman gətirmək üçün bəzi şeylər istədilər. Sən onları da icra etmədin. Yenə səndən istədilər ki, Allahdan özün üçün bir şey istə ki, sənin Allah yanında olan fəzilətin məlum olsun. Bunu da etmədin. Bütün bunlardan sonra səndən istədilər ki, onları qorxutduğun əzabların bəzisini onlara nazil et, bunu da etmədin... And olsun Allaha ki, sən nərdivanla göyə çıxıb, sonra dörd mələk ilə qayıdıb və o mələklər sənin dediyini təsdiq etməyincə mən heç vaxt sənə iman gətirməyəcəyəm. And olsun Allaha ki, əgər bu işi (edə bilsən də mən inanmıram ki, sənə iman gətirim.(١

Peyğəmbər pərişan və incimiş halda məclisi tərk edib evə



---

Amma məhz bu ibn Üməyyə Məkkə fəth edilməmiş müsəlman olub İslam . [١] -١

qayıtdı. O, həzrət getdikdən sonra Əbu Cəhl üzünü məclisdəkilərinə tutub dedi: Ey Qüreyş gördüyümüz kimi, Məhəmməd sizinlə mübarizədən, dinimizi təhqirdən, atalarımıza söyüş verməkdən, babalarımıza səfeh deməkdən və Allahlarımızı pisləməkdən əl çəkməyəcək. İndi mən özümə söz verirəm ki, sabah gücüm çatan ən böyük daşı götürüb, Məhəmmədin namaz qıldığı yerə gedəcək və səcdə vaxtı onun başına vuracağam. Əgər mən bu işi görsəm Bəni Haşim ilə mübarizədə mənə kömək edəcək, yoxsa məni tənha qoyacaqsınız? Məclisdəkilər dedilər: Yox and olsun Allaha .ki, səni tənha qoymarıq. Sən nə fikirləşirsənsə onu da yerinə yetir

Səhərisi gün Əbu Cəhl yekə bir daş götürüb dediyi yerə gələrək peyğəmbəri gözləməyə başladı. Peyğəmbər də adəti üzrə namaz qılmaq üçün Məscidul- Hərama gəldi. O həzrət namazını üzü Şama (BeytülMüqəddəsə) tərəf qılırdı. Əziz İslam peyğəmbəri Yəmani sutunu ilə qara daş arasında üzü BeytülMüqəddəsə tərəf dayandı. Bu zaman Kəbə o həzrət ilə üzbəüz dayanmışdı. Digər tərəfdən də Qüreyş Əbu Cəhlə tamaşa etmək üçün məscidə gəldilər. Peyğəmbər namaza məşqul idi. O həzrət səcdəyə getdikdə, Əbu Cəhl daşı götürüb peyğəmbərə tərəf addımladı. Peyğəmbərə yaxınlaşar- yaxınlaşmaz camaat birdən- birə Əbu Cəhlin əlindəki daşı ilə birgə rəngi qaçmış və bədəni titrəyə- titrəyə geri qayıtdığını gördülər. Biz az geri .döndükdən sonra əlindəki daşı yerə atdı

Qüreyşdən bir neçə nəfər ona tərəf qaçaraq dedilər: Ey Əba Həkəm nə olub bu nə haldır? Dedi: Mən dünən sizə dediyim kimi gedib daşı onun başına vurmaq istədim. Amma ona yaxınlaşan kimi erkək bir dəvə nərildəyə- nərildəyə mənə hücum etdi. And olsun Allaha ki, indiyə qədər uzun boylu iti dişli belə böyük bir dəvə görməmişdim. O dəvə ağzını açıb məni udmaq istədi. Hədislərdə belə rəvayət olubdur ki, peyğəmbər .buyurdu: O, Cəbrail idi. Əgər Əbu Cəhl yaxınlaşsaydı onu yer üzündən silərdi

Əbu Cəhl bu sözləri deyəndən sonra Nəzr ibn Haris yerindən qalxdı. Bu Nəzr Qüreyş iblislərindən və peyğəmbərin ən qatı düşmənlərindən idi. Heyrə şəhərinə səfər etdikdə orada

İran şahları haqqında maraqlı əfsanələr, İsfəndiyar və Rüstəmin qəhrəmanlıqları haqda dastanlar eşitmişdi. Peyğəmbərdə hər hansı bir məclisdə əyləşib, insanlara Allahı və keçmiş qövmlərə ( Ad və Səmud tayfası) nazil olan əzablardan uzaq durmağı xatırlayıb, getdikdən sonra dərhal Nəzr onun yerində əyləşib deyərdi: And olsun Ahha ki, mənim sizə danışdığım nağıllar Məhəmmədin sizin üçün söylədiklərindən daha yaxşıdır. Gəlin mən sizə daha şirin nağıllar danışım. Camaat onun ətrafına toplaşar o da Rüstəm, İsfəndiyar və İran padşahlarının əhvalatlarını onlara danışıb deyərdi: .Görəsən Məhəmməd hansı şeylər ilə məndən daha yaxşı dastan söyləyir

Rəvayətlərə görə o deyirdi: Tezliklə mən də Allahın nazil etdiyi kimi nazil edəcəyəm.(١) İbn Əbbas deyibdir: Nəzr ibn Harisin məzəmməti üçün səkkiz ayə nazil edilibdir ki, onlardan biri də bu ayədir: “Ayələrimiz ona oxunduğu zaman: (bunlar) qədimlərin əfsanələridir (uydurmalarıdır) deyər”(٢) Habelə “əsatir” kəlməsi işlənən hər bir ayə .onun haqqında nazil olubdur

O cümlədən Əbu Cəhlin sözlərindən sonra Nəzr qalxıb dedi: Ey Qüreyş and olsun Allaha ki, sizin üçün elə bir proses başlanıb ki, artıq hiylə yolları üzümüzə bağlanıbdır. Bu Məhəmməd uşaqlıqdan sizin aranızdadır və hər bir sahədə ondan razı idiniz. Hamıdan əmanətcil və düzdanışan idi. Nəhayət üzünün tükləri ağarmağa başladı və bu dini sizin üçün gətirdi. Dediniz: Sehrbazdır. Biz sehrbaz və ipə üfürənləri görmüşük. And olsun Allaha ki, o sehrbaz deyil. Sonra dediniz kahindir. And olsun Allaha ki, biz kahinləri görüb, danışıqlarını eşitmişik, bu kahin deyil. Sonra dediniz: şairdir, yox and olsun Allaha ki, şair də deyil, çünki biz şer növlərini görmüşük. O zaman dediniz: Dəlidir. O dəlilər kimi hərəkət etmədiyi üçün and olsun Allaha ki, o dəli deyil. Ey Qüreyş indi .özünüz haqda ətraflı götür- qoy ediniz, çünki sizə böyük bir hadisə üz vermişdir

Qüreyşin qərarı və yəhudilərin sualları



---

.Ənam surəsinin ٩٣- cü ayəsinə işarə edilibdir . [١]-١

.Mutəffifin surəsi ١٣- cü ayə . [٢]-٢

Nəzrin bu sözlərindən sonra müşriklər qərara gəldilər ki onu Üqbə ibn Əbi Muit ilə birgə Mədinədə yaşayan yəhudi alimlərinin yanına göndərib onlardan peyğəmbər haqqında suallar soruşaraq, həzrətin xüsusiyyətlərini onlar üçün xarakterizə edib, peyğəmbərin danışıqlarını onlar üçün danışsınlar. Birinci kitab əhli (Tövrat) olan elmi .bilik sahiblərindən o həzrətin haqq olub olmadığını öyrənsinlər

Nəzr və Uqbə Məkkədən Mədinəyə gələrək yəhudi alimlərinin yanına gedib öz işləri haqqında məlumat verdilər. Onlar dedilər: Siz Tövrat əhlisiniz. Biz gəlmişik öyrənək ki, görəsən Məhəmməd haqqdır yoxsa yox? Yəhudi alimləri dedilər: Siz onun yanına qayıdıb ona üç sual veriniz. Əgər sizin suallara cavab verə bildi bilinki o peyğəmbərdir. .Yox əgər cavab verə bilmədi onda bilinki yalançıdır

:Onda istədiyiniz kimi onunla davrana bilərsiniz. O üç sual budur

Ondan keçmiş zamanlarda yaşamış bir dəstə cavanın başına gələn əhvalat ( ١ haqqında soruşun

Ondan soruşun ki, qərb və şərqi gəzən kişi kim olub? Onun başına gələn əhvalat ( ٢ ?necə olub

?Ondan ruhun nə olduğunu soruşun (٣

Bu üç sualı ona verin. Əgər sizə cavab verə bilsə, onda bilin ki, o peyğəmbərdir və ona itaət edin. Əgər cavab verə bilməsə bilin ki, o yalançı bir insandır. Onunla istədiyiniz .kimi davrana bilərsiniz

Nəzr və Üqbə Məkkəyə qayıdıb bu haqda Məkkə müşriklərinə danışdılar. Onlar peyğəmbərin yanına gələrək ö üç mövzu haqqında sual etdilər. Həzrət inşallah demədən (cavabı ilahi iradənin öhdəsinə buraxmadan) buyurdu: Sabah gəlin sizin .cavabınızı verəcəyəm

Onlar getdilər: (Amma inşallah demədiyinə görə) on beş gün Cəbrail ona vəhy nazil etmədi. Bunu görən Məkkə müşrikləri tən edib, irad tutaraq dedilər: Məhəmməd bizə sabaha söz verib, indi isə on beş gün keçsədə bizə heç bir xəbər verilməyib! O həzrətin özü də bu hadisədən qəm- qüssəyə düçar olmuş və Məkkə müşriklərinin sözü ona ağır

olub Kəhf surəsini gətirdi. Allah müşriklərin sözünə görə peyğəmbərin qəm- qüssəyə düçar olmasını qınadı. Əshabi Kəhf və Zulqərneyn (onların ikinci sualı) dastanı və ruh .məsələsini onlar üçün bəyan etdi

Cəbrail o həzrətə nazil olduqda həzrət buyurdu: Ey Cəbrail o qədər mənim yanıma gəlmədin ki, mən bədgüman oldum. Cəbrail dedi: "Biz (dünyaya) yalnız sənin rəbbinin əmri ilə enirik. Önümüzdə, arxamızda və onların arasında nə varsa ancaq ona məxsusdur. (keçmişə, indiyə və gələcəyə aid işlər, dünya yaranandan qiyamət gününə qədər baş verəcək hər bir şey məhz Allahın iradəsinə tabedir) Rəbbin unudan (deyildir".(١)

Sonra Kəhf surəsini oxumağa başladı. İlahidən şükr etmək və müşriklərin inkar etdiyi :peyğəmbərlikdən təşəkkür edərək buyurdu

Həmd olsun O Allaha ki, kitabı (quranı mənasında və sözlərində) heç bir əyriliyə" (yanlışlığa və ziddiyyətə) yol vermədən öz bəndəsinə (rəsuluna) nazil etdi!". (Allah kafirləri) "öz dərgahından gələcək şiddətli bir əzabla qorxutmaq, yaxşı əməllər edən möminlərə isə gözəl mükafata nail olacaqları ilə müjdə vermək üçün onu doğrudüzgün olaraq (qiyamətə qədər bütün bəşəriyyətə haqq yolu göstərən bir nur olaraq) endirdi, onlar orada əbədi qalacaqlar" yəni ölümü olmayan əbədi mənzil. Möminlərdən məqsəd peyğəmbərə nazil olanlar təsdiq edən şəxslərdir. "O, həm də (Quranı): Allah özünə övlad götürdü! deyənləri qorxutmaq üçün nazil etdi. yəni Qüreyş deyirdilər: Biz Allahın qızları olan mələkləri pərəstiş edirdik "bu barədə nə onların özlərinin nə də atalarının heç bir biliyi yoxdur" Onların yolundan ayrılmayı və dinlərini tənqid etməyi böyük bilirlər "ağızlarından çıxan böyük söz" deyirlər: Mələklər Allahın qızlarıdır "onlar ancaq yalan deyirlər!" Ey rəsulum özünü təəssüf üzündən xərcləmə (ibn Hişam deyir: yəni özünü həlak edəcəksən) "əgər bu dastana iman gətirmirlər" yəni özünü üzüb, təəssüf etmə "həqiqətən yerlə bərabər olanı onun üçün bəzək qərar verdik ki, yoxlayaq ki, onların hansının əməli



---

.Məryəm surəsi ۶۴- cü ayə . [١]-١

daha yaxşıdır. “yəni hansı biri mənim göstərişimə daha yaxşı itaət edəcəklər “həqiqətən (yer üzərində) olanları quru səhraya döndərdik” fani və məhv olan “həqiqətən qayıdış mənə tərəfdir və hər kəsi əməlinə görə mükafatlandıracağam. Elə (isə sən gördüyün və eşitdiyin şeylərə görə təəssüf etmə.(١)

Bu ayələrdən sonra Əshabi Kəhf dastanı və soruşduqları suallara başlayaraq buyurur: “Yoxsa ƏshabiKəhfin və Rəqimin ayələrimizdən təəccübü bir şey olduğunu güman edirsən?” yəni öz nişanələrimdə insanlara göstərdiyim höccətlər bunlardan təəccüblüdür. “Xatırla ki, o zaman gənclər mağaraya sığınıb: Ey Rəbbimiz! Bizə öz dərgahından mərhəmət bəxş et və işimizə fərəc ver! demişdilər. Biz onları mağarada illərlə yuxuya verdik. Sonra iki tayfadan hansının onların qaldıqları müddəti daha düzgün hesabladıqlarını bilmək üçün onları oyatdıq. Biz onların xəbərini sənə doğru söyləyirik. Onlar Rəbbinə iman gətirmiş bir neçə gənc idi. Biz də onların hidayətini artırmışdıq. Onlar durub: Rəbbimiz göylərin və yerin Rəbbidir. Biz ondan başqa heç bir tanrıya ibadət etməyəcəyik. Əks təqdirdə danışmaqda həddi aşmış olarıq!” dedikləri zaman onların ürəklərinə qüvvət vermişdik” yəni onlar sizin nadanlıq üzündən müşrik olduğunuz kimi müşrik olmadılar. “bizim bu şəhərin əhalisi” elə insanlardırlar ki, Allahdan başqa özlərinə Allah qərar veriblər. Halbuki açıq- aşkar dəlilləri yoxdur. Allaha qarşı yalan uydurub düzəldəndən daha zalım kim ola bilər? Onları və Allahdan başqa tapındıqları tanrıları tərk edib getdiyiniz zaman mağaraya çəkilin ki, rəbbiniz sizə öz mərəmətindən nisar etsin və işinizdə sizin üçün fayda qərar versin. Günəşin doğduğu zaman onların mağarasının sağ tərəfinə meyl etdiyini, batdığı zaman isə onları tərk edib sol tərəfə yönəldiyini, onların da mağaranın ortasında geniş bir yerdə olduqlarını görərdin bu Allahın möcüzələrindəndir. Allahın doğru yola saldığı kəs doğru yoldadır. Allahın yoldan çıxartdığı kimsəyə isə əsla doğru yol göstərən bir dost tapa bilməzsən!

Onlar yuxuda ikən sən onları oyaq sanardın. Biz



---

Burada ibn Hişam ayənin bəzi lüğətlərini təfsir etmişdir ki, maraqlananlar Sirənin . [١]-١ .٣٠٢-٣٠٣- cü səhifələrinə müraciət edə bilərlər

onları sağa- sola çevirirdik. Onların iti də iki əlini mağaranın astanasında uzadıb yatmışdı. Əgər sən onları görsəydin, yəqin ki, dönüb qaçar, dəhşət səni bürüyərdi... sonra buyurur: “Onları tapanlar” yəni onların halından xəbərdar olan mömin padşah “tezliklə onlar üçün bir məscid tikək dedilər” Yəhudi din xadim və alimləri Qüreyşi, peyğəmbərdən bu sualları soruşmağa vadar etmişdilər “Onlar üçdür, dördüncüsü köpəklərdir deyəcəklər. Bəziləri beşdir altıncısı köpəklərdir deyəcəklər (bu sözlər) məlumatsızlıq üzündəndir (yəni dəqiq bilməzlər) deyəcəklər onlar yeddi nəfər idi səkkizinci köpəkləri idi: De: “Onların sayını Rəbbim daha yaxşı bilir bunu bilən çox azdır! Yalnız sənə açıqaşkar nazil olan ayələrə əsaslanıb onlarla mübahisə et və heç birindən onlar haqqında soruşma. Çünki onlar bu barədə bilmirlər “və heç bir şey barəsində” Mən onu sabah edəcəyəm demə! Ancaq İnşallah deyəcəyəm de (İnşallahı) unutduğun zaman Rəbbini yada salıb: “Ola bilsin ki, Rəbbim məni bundan haqqa daha yaxın olan bir yola yönəltsin” de. Yəni sizin məndən soruşduğunuz bu yoldan, çünki sən bilirsən ki, mən bu barədə nə edəcəyəm (tezliklə onlar deyəcəklər:) Onlar mağarada üç yüz doqquz il qaldılar. De Allah onların qaldığı müddəti daha yaxşı bilir. Yerin və göyün qeybi ona məxsusdur. Necə də görən və eşidəndir. Ondan başqa onlar üçün bir dost yoxdur. Öz hökmündə kimsəni şərik etməz”(١) Yəni səndən soruşduqları şeylərə görə .onun qorxusu yoxdur

### :İKİNCİ SUALA VERİLƏN CAVAB

İkinci sual haqqında buyurdu: “Səndən Zülqəreyn barəsində soruşurlar. De: onun barəsində sizə bir hekayət söyləyəcəyəm! Biz onu yer üzərində möhkəmləndirib qüvvətləndirdik və hər şey verdik...)(٢) ta Zulqəreyn dastanının axırına qədər xülasəsi .belədir

Allah kimsəyə vermədiyi qüdrəti ona verdi və onun üçün hər bir şərait yaratdı. O bütün .şərq və qərbi gəzərək özünə tabe etdi

İbn İshaq rəvayət edir: Zülqəreyn Misirli idi. Adı Mərzban



---

.Kəhf surəsi ١- ٢۶- cı ayələr . [١] -١

ibn Mərzəbə Yuyani olan bu şəxs Yunan ibn Yafəs ibn Nuhun övladlarından hesab olunur. Amma ibn Hişamın nəzərinə görə adı İskəndər olubdur. Bu həmin şəxsdir ki, .İskəndəriyyəni tikdirdi və onun adı ilə adlandı

Bir hədisdə İbn İshaq bir kişidən rəvayət edir ki, peyğəmbərdən Zülqərneyn barəsində .soruşdular. Həzrət buyurdu: Yeri vəsilələr vasitəsi ilə öz arşınına çevirən bir mələk idi

.Əgər hədis səhih olarsa Zülqərneyn mələk olub

Ömər bir kişini Zülqərneyn çağırdıqlarını eşidib dedi: Aya peyğəmbər adları kifayət .etmədi ki, indi mələklər adlarını özünüzə qoyursunuz

**:ÜÇÜNCÜ SUALA CAVAB**

Allah- Təala ruh barəsində buyurdu: Səndən ruh haqqında soruşurlar de ruh mənə (məxsusdur, sizə az bir miqdar elm verilmişdir".(١)

Hədislərdə vardır ki, peyğəmbər Mədinəyə gəldikdə yəhudi rəhbər və din xadimləri onun yanına gələrək dedilər: Ey Məhəmməd oxuduğun bu ayədə: "Sizə az bir .miqdarda elm verilibdir" məqsəd bizik və ya öz qövmün olan Qüreyş

.Həzrət buyurdu: Hamısı

Dedilər: Sən bizə aid digər bir ayədə oxumusan ki, Allah bizə Tövrat verib və hər şeyin izahı ondadır. Elə isə bu ayə necə bizə şamil edilə bilər? Peyğəmbər buyurdu: O da ilahi elm ilə müqayisədə azdır. Baxmayaraq ki, sizin üçün kifayət edir. Allah-Təala bu barədə aşağıdakı ayəni nazil etdi: "Əgər yer üzərindəki bütün ağaclar qələm, dərya da arxasından yeddi dərya qatılaraq (mürəkkəb) olsaydı yenə də Allahın sözləri ((yazmaqla) tükənməzdi. Həqiqətən Allah yenilməz qüdrət, hikmət sahibidir.(٢)

Bu dediklərimiz Qüreyşin soruşduqları suallara aid nazil olan ayələr idi. Onların danışıq və təklifləri haqqında da ayələr



---

Bəni İsrail surəsi ٨٥- ci ayə (Müasir dövrdə çap edilən bir çox quran kitablarında . [١] -١

nazil olubdur. O cümlədən onların o həzrətə dedikləri söz “bu şəhərin ətrafındakı dağları bizdən uzaqlaşdır, yeri hamarlaşdır, ölülərimizi dirilt” haqqında bu ayə nazil :oldu

Əgər Quranla dağlar hərəkətə gətirilsə, yaxud yer parçalansa və ya ölülər“ danışsaydılar (onlar yenə də iman gətirməzdilər) bütün işlər yalnız Allahın .ixtiyarındadır”(۱) yəni o istədiyi şeyi həyata keçirər

Onların dedikləri bu sözü “Allahından istəki sənin sözlərini təsdiq etmək üçün bir mələk göndərsin, sənə bağlar, qəsrlər və xəzinələr versin ki, daha ruzi üçün işləməyəsən” haqqında isə aşağıdakı ayələr nazil edildi: “Dedilər: Bu necə peyğəmbərdir ki, yemək yeyir, bazarları gəzib dolaşır? Məgər ona özü ilə birlikdə (insanları Allahın əzabı ilə ) qorxudan (və onun həqiqi peyğəmbər olduğunu təsdiq edən) bir mələk göndərilməli deyilmi? Yaxud ona (ruzi qazanmaqdan ötrü bazarları dolaşmasın deyə göydən) bir xəzinə endirməli və ya ondan yeyib dolanmaq üçün bir bağı olmalı deyilmi? Zalimlər dedilər: “Siz ancaq ovsunlanmış bir adama tabe olursunuz? Bir gör sənin haqqında necə məsəllər çəkdilər. Artıq azdılar və bir daha yol tapa bilməzlər! Əgər istəsə sənə ondan daha yaxşısını, altından çaylar axan cənnətlər verə bilən, sənin üçün qəsrlər (yarada bilən Allah nə qədər uludur!(۲

Və yenə bu barədə nazil oldu: “Səndən əvvəl göndərdiyimiz peyğəmbərlər də şübhəsiz ki, yemək yeyər (ruzi qazanmaq üçün) bazarları gəzib dolaşardılar. Sizin bir qisminiz digərinizə sınaq vasitəsi etdik ki, görək dözə biləcksinizmi? Sənin Rəbbin görəndir (çətinliklərə səbr edənləri və onlardan qorxanları)!”.(۳) Yəni sizin bəzilərinizi bəzileriniz üçün bəla və sınaq qərar verdim ki, səbr edəsiniz və əgər istəsəydim dünyanı peyğəmbərlərlə birgə qərar verər və kimsə onlar ilə müxalifət edə bilməzdi. Əbdullah ibn Əbi Üməyyənin sözləri barəsində bu ayələr nazil oldu: “və dedilər: Bizə yerdən bir bulaq



---

.Rəd surəsi ۳۱- ci ayə . [۱]-۱

.Furqan surəsi ۶۱۰- cu ayələr . [۲]-۲

çıxarmayınca sənə iman gətirməyəcəyik, yaxud arasından şırıl- şırıl irmaqlar axan xurma və üzüm bağı olmayınca; yaxud, iddia etdiyi kimi, göyü parçaparça edib başımıza endirməyincə, yaxud Allahı və mələkləri açıq- aşkar qarşımıza gətirməyincə və ya qızıldan bir evin olmayınca, yaxud sən göyə qalxmayınca (biz sənə iman gətirməyəcəyik) əgər bizə (səmadan) oxuyacağımız bir kitab endirməsən, göyə qalxmağına da əsla inanmayacağıq! De: Rəbbin pak və müqəddəsdir! Mən isə yalnız (peyğəmbər olan bir insanam"(١)

Dedikləri bu söz barəsində "biz eşitmişik ki, Yəmamədə olan Rəhman adlı bir şəxs bunları sənə deyir və heç vaxt ona iman gətirməyəcəyik" isə bu ayə nazil oldu: "səni də özündən əvvəl çoxlu ümmətlər gəlib- getmiş bir ümmətə peyğəmbər göndərdik ki, onlar Rəhmanı inkar etdikləri halda sənə vəhy etdiyimiz (quranı) onlara oxuyasan. De: O, mənim Rəbbimdir. Ondan başqa heç bir tanrı yoxdur. Mən ancaq ona təvəkkül (etdim. Axır dönüşüm də yalnız onadır!"(٢)

Əbu Cəhlin sözü və həyata keçirtmək istədiyi plan haqqında bu ayə nazil oldu: "Gördünmü o kimsəni ki, (Əbu Cəhli) mane olur. Bir bəndəyə (sənə) namaz qıldığı vaxt? Bir de görək, əgər o doğru yoldadırsa, yaxud qorxmağı əmr edirsə. Bir de görək, (əgər sənin namaz qılmağına mane olan kimsə Quranı )yalan sayır və üz döndərirsə məgər bilmir ki, Allah (onun bütün əməllərini) görür? Yox, yox! (Əbu Cəhl bu yaramaz əməllərinə son qoysun) əgər son qoymasa, and olsun ki, biz onu kəkilindən yapışıb sürükləyəcəyik, özü də yalançı günahkar kəkilindən, qoy o özünün bütün tərəfdarlarını çağırsın, biz də cəhənnəm gözətçilərini çağıracağıq! Yox, yox sən ona uyma! Sən (ancaq (rəbbinə) səcdə et və yaxınlaş!(٣)

Öz mallarını həzrətə ödəməyə hazır olduqları təklif barəsində

səh:١٩٤

---

Bəni İsrail surəsi ٩٠- ٩٣- cü ayələr. İbn Hişam ayədən sonra bəzi lüğətləri də izah . [١] -١ .edibdir. Sirənin I cildi ٣٠٩- ٣١٠- cu ayələr

.Rəd surəsi ٣٠- cu ayə . [٢] -٢

Ələq surəsi ٩١٩- cu ayələr. Bu ayələrin lüğətləri barəsində ibn Hişam təfsirlər . [٣] -٣

isə bir ayə nazil oldu: “De: Mən (bunun müqabilində) sizdən heç bir muzd istəmirəm, o (sizin olsun. Mənim mükafatım ancaq Allaha aiddir. O, hər şeyə şahiddir!(۱)

Peyğəmbərin cavablarını eşitdikdən sonra Qüreyşin davranışları

Qeyd etdiyimiz kimi İslam peyğəmbəri müşriklərin suallarını cavablandırdı. Lakin onlardakı həsəd müşriklərə mane olurdu ki, möhkəm nişanələri və qeyb aləmi ilə əlaqəli olan cavabları eşidirkən peyğəmbərin nübuvvətini təsdiq edib ona itaət etsinlər. Ona görə də öz kafirliklərinə davam edirdilər. Onlardan biri dedi: “Bu Quranı dinləməyin, o oxuduqda səs- küy salın ki, bəlkə qalib gələsiniz”(۲) yəni onu ləğv və batil ediniz məsxərəyə salın ki, bəlkə bu yol ilə qalib gəldiniz. Çünki, əgər onunla mübahisə və düşmənçiliyə qalxsanız, sizə qalib gələcək. Bu minvalla məsxərə və istehzaya əl .atdılar

Bir gün Əbu Cəhl peyğəmbərin sözlərini məsxərə edib dedi: Ey Qüreyş tayfası Məhəmməd güman edir ki, sizi cəhənnəmdə saxlayıb, əzab verənlər on doqquz nəfər olacaq. Amma əslində siz onlardan çoxsunuz. Aya sizin hər yüz nəfəriniz onların birinə ?cavab verə bilməyəcək

Bu zaman Allah- Təala aşağıdakı ayəni nazil etdi: “Biz cəhənnəm gözətçilərini yalnız mələklərdən etdik. Biz onların sayını ancaq kafirlərin imtahana çəkilməsi üçün etdik (...”(۳

Bu hadisədən sonra peyğəmbər hər vaxt namazı yüksək səslə qıldıqda müşriklər səpələnərək o həzrətin səsinə mane olmaq istəyirdilər. Buna görə də onlardan hər hansı biri namaz halında o həzrətin səsini və Quran ayələrini eşitmək istədikdə gizlin bir yerdə durub qulaq asardı. Nə zaman bilsəydilər ki, müşriklərdən biri duyuq düşüb, onu incidəcəklərindən qorxub qaçardılar. Bəzən isə həzrət yavaş səslə oxuyardı. Buna .görə də bəziləri qulaq asmaq üçün yaxına gələrdilər

İbn Abbas rəvayət edir ki, aşağıdakı bu ayə o barədə nazil olub: “Namaz qılarkən səsini .nə çox qaldır, nə də çox alçalt

١- [١] . Səbə surəsinin ۴٧- ci ayəsi.

٢- [٢] . Bu ayə “Füssilət” surəsinin ٢۶- cı ayəsinə işarə edir.

٣- [٣] . Müddəsir surəsi ayə ٣١.

(Bunun arasında orta bir yol tut!”(1)

Yəni o qədər səsini ucaltma ki, pərakəndə olsunlar və nə o qədər ahəstə səslə oxuma ki, eşitmək istəyənlər eşidə bilməsinlər. Çünki mümkündür bir kəs onu eşidərək, öz inadından dönüb ondan faydalana bilsin.

### PEYĞƏMBƏRDƏN SONRA QURANI UCA SƏSLƏ OXUYAN İLK ŞƏXS

Urvə ibn Zubeyr rəvayət edir: Islam peyğəmbərindən sonra Məkkədə Quranı yüksək səs ilə oxuyan ilk şəxs Əbdullah ibn Məsud olmuşdur. Əhvalat belə olmuşdu ki, bir gün peyğəmbərin səhabələrindən bir qrupu bir- birinin yanında əyləşmişdilər. Onlardan biri dedi: And olsun Allaha ki, hələ Qüreyş Quranı uca səslə eşitməyib. İndi sizlərdən hansınız hazırdır ki, Quranı uca səslə oxusun ki, Qüreyş də eşitsin?

Əbdullah ibn Məsud dedi: Mən hazıram.

Dedilər: Biz qorxuruq ki, onlar səni incidərlər. Biz elə bir kəsi istəyirik ki, qohum qəbiləsi çox ola və buna görə də Qüreyş onu incidə bilməyə!

Əbdullah dedi: İmkan verin bu işi mən icra edim. Həqiqətən Allah məni qoruyacaq! Növbəti gün zöhr vaxtı Qüreyş öz məclislərinə yığışdıqdan sonra məqamın (İbrahim məqamı – mütərcim) kənarında dayanıb mübarək “Ərrəhman” surəsini uca səslə oxumağa başladı:

بسم الله الرحمن الرحيم الرحمن علم القران

Qüreyş dinləyib dedilər: Bu kəniz balası nə deyir? Dedilər: Məhəmmədin gətirdiklərindən oxuyur. Belə olduqda qalxıb onun yanına gələrək yumuruqlamağa başlaıdlar. İbn Məsud da oxumağa davam edirdi. Bir miqdar oxuduqdan sonra yaralı və qana bulaşmış formada peyğəmbər səhabələrinin yanına gəldi. Səhabələr onu gördükdə dedilər: Biz elə buna görə də qorxurduq. İbn Məsud dedi: Bunlar Allah yolunda asandır. İstəyirsinizsə sabah yenə də onların yanına gedib, bu işi icra edim? Dedilər: yox, bəsdir. Sən öz işini yerinə yetirib Qüreyşin xoşlamadıqlarını

.onlara çatdırdın

Qüreyşin İslam peyğəmbərinin Quran oxumasına qulaq asması

Zöhri rəvayət edibdir ki: Bir gecə Əbu Süfyan Əbu Cəhl və Əxnəs ibn Şəriq bir- birindən xəbərsiz halda evdən çıxıb İslam peyğəmbərinin evinin ətrafında gizləndilər ki, peyğəmbərin gecə namazı qıldığı vaxt oxuduğu Qurana qulaq assınlar. Onların heç biri digərinin gizləndiyi yerdən xəbəri yox idi. Elə ki, sübh vaxtı dan yeri sökülәndə oradan çıxıb evlərinə getmək istədikdə, yolda bir- birinə rastlaşdılar. Buraya niyə gəldiklərini oyrəndikdən sonra bir- birini danlayıb dedilər: Bundan sonra belə bir iş görməyək. Çünki səfeh və cahillər işimizdən xəbər tutsa, bizim barəmizdə şübhəyə düşərlər. O .gün öz işlərinin arxasınca yola düzəldilər

Növbəti gecə onlar yenə də dünənki yerlərinə gəlib səhərə qədər peyğəmbərin Quran oxumasına qulaq asdılar. Elə ki, sübh oldu yenə də dağlışarkən bir-birinə rastlaşdılar və yenə də dünənki sözləri təkrar etdilər. Üçüncü gecə yenə də hər biri peyğəmbərin evinin ətrafında gizlənib səhərə qədər qaldılar. Səhər olduqda yenə də rastlaşdılar. Bu .dəfə əhd-peyman bağladılar ki, bir daha belə iş görməyələr

Əxnəs ibn Şəriq o gün evinə dönüb əsanı götürərək Əbu Süfyanın evinə gəlib dedi: Ey Hənzələnin atası Məhəmməddən eşitdiklərin haqqında fikrin nədir? Əbu Sufyan dedi: And olsun Allaha ki, eşitdiklərinin bəzilərinin mənasını başa düşdüm. Bəzilərinin isə mənasının nədən ibarət olduğunu anlaya bilmədim. Əxnəs dedi: And olsun Allaha ki, .mən də sənin kimi idim

Sonra Əbu Cəhlin evinə gedib dedi: Məhəmməddən eşitdiklərin haqqında sən nə fikirləşirsən? Əbu Cəhl narahatçılqla dedi: Nə eşitdim. Biz və Əbd Manaf övladları yarış meydanında iki atın ötüşdüyü kimi şərəf və rəhbərlik üçün çəkişmədəyik. Onlar bizdən üstün olmağa və biz də onlardan üstün olmağa çalışırdıq. Onlar yemək yedizdirəndə biz də yedizdirirdik. Onlar bəxşiş paylayıb, onun- bunun evinə bəxşişlər apardıqda biz də onlar kimi etdik. Bizim hər ikimiz bərabər səviyyədə olduqda onlar dedilər. Göydən vəhy olunan peyğəmbər bizim sıralarımızdandır! Biz belə bir fəzilətə necə nail ola ,bilərik! And olsun Allaha ki

.biz heç vaxt ona iman gətirməyəcək və onu təsdiq etməyəcəyik

Qüreyşin İslam peyğəmbərinə istehza etməsi və onlar haqqında nazil olan ayələr

Bəzən İslam peyğəmbəri müşriklər üçün Quran tilavət etdikdə onları Allah yoluna dəvət etdikdə onlar istehza üzündən deyərdilər: “Bizi dəvət etdiyinə qarşı ürəklərimiz örtüklər arasındadır”. Biz anlamırıq nə deyirsən. “Biz qulaqlarımızda əngəl var (karıq)” Sənin sözlərini eşitməyirik “Sizin ilə bizim aramızda hicab və pərdə var” ki, sizinlə bizim aramızda maneə vardır. “Elə isə sən öz işində, biz də öz işimizdə ol” Biz səndən bir şey .anlamayacağıq

AllahTəala bu ayələri nazil etdi: Sən Quran oxuduğun zaman səninlə axirətə inanmayanların arasına görünməz bir pərdə çəkərik...” Sonra buyurur: “Sən Quranda rəbbini bir tək tanrı olaraq andığın zaman onlar nifrət əlaməti olaraq arxalarını çevirib gedərlər” yəni mən necə onların ürəklərinə hicab çəkmişəm, qulaqlarını kar etmişəm sənin ilə onlar arasında pərdə və hicab vardır. Necə ki, onlar zənn edirlər. Bir halda ki, sənin Allahının və hidayətini Quranda anlayalar. Yəni mən belə bir şey etməmişəm “Onlar sənə qulaq asdıqları zaman nəyi dinlədiklərini və zalimlərin öz aralarında gizli-gizli danışıb: Siz ancaq ovsunlanmış bir adama uyursuz!” dediklərini də bilirik” Yəni bu bir- birlərinə etdikləri sifarişdir ki, məbus olduğunu tərk etisnlər “Bir gör səni kimlərə bənzətdilər! Onlar yoldan azdılar və bir daha doğru yolu tapa bilməzlər!” yəni sənin haqqında vurduqları məsəl yanlışdır, onun vasitəsi ilə hidayət olmazlar və danışıqları ədalətli deyil. “Və onlar: Biz sür- sümük çürüyüb ovxalanmış olduğumuz halda dirildilib yeni məxluqmu olacağıq? Deyirlər: bu mümkün olmayan şeydir: “De: İstər daş olun, yaxud dəmir və ya ürəyinizdə (özünüzü dağlar kimi) böyük bir məxluq bilin! Onlar deyəcəklər: “O halda bizi kim qaytaracaqdır? De: “İlk dəfə sizi yoxdan yaradan”(۱) Yəni Allah sizi məlum olan bir şeydən yaratdısa, onun üçün torpaqdan yaratmaq daha .asandır



---

.Əsra surəsinin ۴۵- ۵۱- ci ayələri . [۱]-۱

## MÜSƏLMANLARIN İŞGƏNCƏYƏ MƏRUZ QALMASI

Müşriklər İslam dinini qəbul edənlərə təzyiqləri artırdılar. Qəbilə üzvlərinə tapşırılmışdı ki, öz qəbilələri arasında müan olan hər bir kəsi incitsinlər ki, bəlkə bu yol ilə bu dindən əl çəkdilər. Buna görə də müanlara qarşı işgəncə başlamışdı. Onlar cürbəcür əziyyət verir. Bəzilərini döyür, bəzilərini ac saxlayır, bəzilərini isə Məkkə qumlarını qazdıqdan sonra soyundurub oxların üstündə yatırdırdılar. Beləliklə onlara işgəncə verirdilər ki, öz dinlərindən əl çəksinlər. Bu işgəncəyə tab gətirir, amma tutduqları dindən əl .çəkmirdilər

## EFİOPİYALI BİLAL

Müşriklərin işgəncələrinə dözüb tab gətirən şəxslərdən biri də Efiopiyalı Bilal idi. Atasının adı Rəbah, anasının adı isə Həmamə idi. O bəni Cəməh qəbiləsində yaşayırdı. İslam dinini ürək və candan qəbul etmişdi. Həmin bəni Cəməh qəbiləsindən olan və peyğəmbərin ən qatı düşmənlərindən hesab olunan Üməyyə ibn Xələf gündüzlər günorta vaxtı onu evdən çıxarıb Məkkənin isti qumları üzərinə yıxıb, sinəsi üstünə böyük bir daş qoyaraaq ona deyərdi: And olsun Allaha ki, ya bu halda öləcək, ya da Məhəmmədin Allahından əl çəkib Lat və Üzraya pərəstiş edəcəksən! Bilal o vəziyyətdə (deyirdi. Əhəd... Əhəd... (mənim Allahım təkdir

Günlərin bir günü Vərəqə ibn Nofəl (xristian dinini qəbul etmiş Xədicənin əmisi) oradan keçəndə gördü ki, Bilala işgəncə verirlər. O da işgəncələr altında deyir: Əhəd... Əhəd... Vərəqə də dedi: Əhəd... Əhəd... And olsun Allaha ki, ey Bilal Allah təkdir Sonra üzünü Üməyyə ibn Xələf və bəni Cəməh qəbiləsinin digər üzvlərinə tutub dedi: And olsun Allaha ki, əgər onu bu vəziyyətdə öldürsəniz mən qəbrimi müqəddəs ziyarətgaha .çevirəcəm ki, onunla təbərrük axtaram

Əbu Bəkrin evi bəni Cəməh məhəlləsində yerləşirdi. Bir gün evdən çıxıb öz işinin dalıyca getdikdə gördü ki, Üməyyə ibn Xələf Bilala həmin formada işgəncə verir. Üzünü Üməyyəyə tutaraq dedi: Allahdan qorxmursan? Nə vaxta qədər

bu bədbəxtə belə əzab-əziyyət verəcəksən? Üməyyə dedi: Sən əqidəsini korlamısan indi də onu bu bəladan xilas et! Əbu Bəkr dedi: Onu rahatlayaram. Mənim evdə Bilaldan da sağlam və qüvvətli qara bir qulum var. O həm də səninlə eyni əqidədədir. .Onu Bilal ilə dəyişirəm. Üməyyə qəbul etdi. Əbu Bəkr Bilalı alıb azad etdi

(Əmmarın atası Yasir anası (Süməyyə

Əmmar ata və anası hamılıqla İslam dinini qəbul etmişdilər. Bəni Məxzum (Əbu Cəhldə həmin qəbilədən idi) qəbiləsi bu müan ailəni incidirdilər. Hava istiləşən kimi onlara ...Məkkənin isti qumları üzərində müxtəlif cür işgəncələr verirdilər

Nəhayət anası Süməyyə bu yolda həlak oldu. O, İslamdan imtina etmədiyinə görə müşriklər onu öldürdülər. Amma Əmmar və atası Yasir hələ ki, dözürdülər. Ara- sıra peyğəmbər onların yanına gəlib onlara bu sözlər ilə ürək- dirək verərdi: Ey Yasir ailəsi .səbirli olun ki, sizin yeriniz Behiştdir

Ümumiyyətlə götürdükdə Əbu Cəhl və bir sıra insanların işi bundan ibarət idi ki, fikir verirdilər ki, görsünlər təzəlikcə kim İslam dinini qəbul edib. Əgər hörmətli və güclü bir tayfadan olsaydı (bu zaman onun canına ziyan vura bilmirdilər) onu danlamağa başlayıb deyərdilər: Bu dindən daha yaxşı olan atanın dinini tərk etmisən! Agah ol ki, biz insanların yanında səni ağılsız kimi təqdim edəcəyik. Sənin rəy və fikirlərinin pis və yanlış olduğunu qeyd edib sənin hörmətə və nüfuzunu azaldacağıq. Əgər tacir bir şəxs müan olsaydı ona deyirdilər: And olsun Allaha ki, bazarını kasadlaşdırıb, səni müflis edəcəyik. Əgər kasıb və yoxsullardan kimsə İslam dinini qəbul etsəydi cürbəcür işgəncələr verərdilər. Səid ibn Cübeyr deyir: İbn Əbbasa dedim: Yəni müşriklər peyğəmbərin səhabələrinə o qədər əzab- əziyyət verirdilər ki, onlar naçar qalıb öz dinlərindən əl çəksinlər. Dedi: Bəli and olsun Allaha ki, bəzən onlara o qədər işgəncə verər, kötək vurar və ac saxlayardılar ki, ayaq üstə dura bilməz və çarəsiz qalıb sözlərini qəbul edərdilər. Lat və Üzza sizin Allahlarınızdr deyə soruaşanların cavabında bəli deyə cavab verərdilər. Hətta bəzən “cəl” (fırlanan peyin) və

digər həşəratları göstərib deyərdilər: Bu cəl sizin Allahınızdır? Onlar xilas olmaq üçün .deyirdilər: Bəli

Bəni Məxzum cavanlarının İslamı qəbul etməsi

Tayfalar arasında üzvlərinin sayına görə Bəni Məxzum tayfası məşhur idi. İslam dini bütün qəbilələrdə az- çox özünə tərəfdar tapmış, o cümlədən bəni Məxzum qəbiləsindən də bir neçə nəfər müan olmuş idi. Bu şəxslər Vəlid ibn Vəlid (Xalid Vəlidin qardaşı), ə ibn Hişam (Əbu Cəhlin qardaşı) və Əyaş ibn Əbi Rəbiə idi. Qəbilənin digər üzvləri qərara gəldilər ki, bu cavanları tutsunlar ki, digərlərini öz dinlərinə dəvət edə bilməsinlər. Buna görə də Vəlid ibn Vəlidin qardaşı Hişam ibn Vəlidin yanına gedərək ona dedilər: Biz qərara almışıq ki, Vəlid və təzə dini qəbul etmiş digər bir neçə şəxsi də !tənbeh edək ki, qəbilənin digər üzvləri də onların yolunu getməsinlər

Hişam dedi: Mən Vəlidin danlanmasına razıyam amma məbada ona qarşı əl uzadasınız ki, and olsun Allaha əgər onu öldürəsiniz, sizin ən böyüyünüzü onun əvəzinə öldürəcəyəm! Hişamdan bu sözü eşitdikdə öz aralarında dedilər: Bu minvalla biz ona əl uzada bilmərik. Elə buna görə də ondan əl çəkdilər. Allah- Təala bu vasitə ilə onu .müşriklərdən qorudu

## MÜSƏLMANLARIN EFİOPİYAYA KÖÇMƏSİ

(Müanların haqqa tabe olmalarına görə vətəndən didərgin düşmələri)

İslam dinini qəbul edənlərə qarşı müşriklərin təzyiqi artmağa başlayırdı. İslam peyğəmərinin özü az- çox bu təzyiqlərindən amanda idi. Bunun səbəbi bir tərəfdən Allahın qoruması idisə, digəri isə əmisi Əbu Talibin Qüreyş arasında olan nüfuzu idi ki, müşriklərin o həzrətə zərər vurmalarının qarşısını alırdı. Amma bu şəraitə malik olmayan digər müanlar isə İslam düşmənləri tərəfindən günbəgün daha çox .incidilməyə başlayırdı

Əziz İslam peyğəmbəri bu səhnələrə dözə bilmir və digər tərəfdən də onları qoruya :bilmirdi. Buna görə də onlara buyurdu

Yaxşı olar ki, doğruluq diyarı olan Efiopiyaya gedəsiniz. Çünki orada olan padşaha görə

.olunmur. Oraya köçməklə müvəqqəti olaraq özünüzü bu insanlardan xilas ediniz

Bu təklifdən sonra müanlar dəstə- dəstə Efiopiyaya yola düşdülər. Onların köçməsi ilə .İslamda ilk hicrət baş verdi

## BİRİNCİ KARVAN

:Bu səfərə hazırlaşan ilk insanlar on nəfərdən ibarət idilər: Onlar aşağıdakı şəxslər idi

١. Osman ibn Əffan (bəni Üməyyə qəbiləsindən) həyat yoldaşı olan peyğəmbərin qızı Rüqəyyə ilə

٢. Əbu Huzeyfə ibn Ütbə (Əbdü Şəms övladlarından) həyat yoldaşı olan Süheyl ibn Əmrunun qızı Səhlə ilə (Allah- Təala Efiopiyada onlara bir oğlan bəxş etdi ki, adını Məhəmməd ibn Huzeyfə qoydular)

٣. Bəni Əsəd tayfasından Zübeyr ibn Əvam

۴. Əbduddar övladlarından Musəb ibn Əmir

۵. Zöhrə övladlarından Əbdurrəhman ibn Of

۶. Əbu Sələmə bəni Məxzum tayfasından – həyat yoldaşı Əbi Üməyyə qızı Ümm Sələmə ilə

٧. Bəni Cəməh qəbiləsindən Osman ibn Məzun

٨. Amir ibn Rəbiə Ədi ibn Kəb övladlarından – həyat yoldaşı Əbi Həsmə qızı Leyli ilə səfərə getdi

٩. Əbu Səbrə Amir ibn Ləvi övladlarından – bəziləri onun yerinə Əbu Hatib ibn Əmrin olduğunu qeyd ediblər və deyiblər. O Efiopiyaya çatan ilk şəxs idi.

١٠. Haris ibn Fəhr övladlarından Suheyl ibn Bəyza(١)

Bu on nəfər Efiopiyaya hicrət edən ilk on nəfər idi. Rəvayətə görə Osman ibn Məzun :Əmir də onlarla idi

Onlardan sonra Cəfər ibn Əbu Talib və onun arxasınca isə digər şəxslər Efiopiyaya hicrət etdilər. Əlbətdə bu hicrət edənlərin bəzisi tək, bəziləri isə öz həyat yoldaşı və uşaqları ilə səfər edirdilər.

Ümumiyyətlə götürdükdə isə Efiopiyaya hicrət edənlərin tayfalar üzrə bölgüsü aşağıdakı kimi idi.

Bəni Haşimdən:



---

۱- [۱] . İbn Hişam burada bu on nəfərin hər birinin soy- kökünü qeyd edibdir. Sirənin I cildi ۳۲۲- ci səhifə.

Bəni Haşim tayfasından Cəfər ibn Əbu Talib həyat yoldaşı əmisi qızı Əsma ilə :Efiopiyaya getdilər və Əbdullah ibn Cəfər orada dünyaya gəldi

:Bəni Üməyyədən

Bəni Üməyyədən ümumiyyətlə üç nəfər Efiopiyaya hicrət etdilər: Osman ibn Əfvan həyat yoldaşı peyğəmbər qızı Rüqəyyə ilə Əmru ibn Səid ibn As həyat yoldaşı Səfvan ibn Üməyyənin qızı Fatimə ilə...(١) və qardaşı Xalid ibn Səid ibn As həyat yoldaşı Xəzaə .qəbiləsindən Xələf ibn Əsədin qızı Əminə ilə

.Bəziləri Əminə yerinə “Həminə” deyiblər

Xalid ibn Səidin Efiopiyada bir qız və bir oğlan övladı dünyaya gəldi. Onların adları Səid və Ümmə idi. Ümmə həmin qızdır ki, Zübeyrin həyat yoldaşı oldu və onun Zübeyrdən .Əmru və Xalid adlı iki oğlu dünyaya gəldi

:Bəni Əsəd ibn Xəzimə və həmpeymanlılarından

Bu qəbilədən hicrət edənlər aşağıdakılardan ibarət idi: Əbdullah ibn Cəheş... qardaşı Übeydullah ibn Cəheş... həyat yoldaşı Əbu Süfyan qızı Ümm Həbibə ilə. Qeys ibn Əbdullah həyat yoldaşı Əbu Süfyanın kənizi olan Yəsar qızı Bərkə ilə və bir də Dus .qəbiləsindən olan Mueyqib ibn Əbi Fatimə

:ƏbdüşŞəms övladlarından

Bu qəbilədən iki nəfər idilər: Biri Əbu Huzeyfə ibn Ütbə və digəri adı Əbdullah ibn Qeys .olan Əbu Musa Əşəri ki, Ütbə ibn Rəfiə qəbiləsinin həmpeymanı idi

:Nofəl övladlarından

.Bu qəbilədən yalnız Ütbə ibn Ğəvzan hicrət etmiş idi

:Əsəd ibn Əbdüluzza övladlarından

Əsəd ibn Əbdüluzza övladlarından Efiopiyaya dörd nəfər hicrət etdilər: Zübeyr ibn Əvam, ... Əsvəd ibn Nofəl, ...Yəzid ibn Zumə,... Əmru ibn Üməyyə... Əbd ibn Qəsi

.övladlarından

...Bu qəbilədən bir nəfər idi ki, o da Təlib ibn Umeyr idi

:Əbduddar ibn Qəsi övladlarından

Bu qəbilədən beş nəfər hicrət etmişdi: Musəb ibn Əmir... Soybət ibn Səd ibn Hərmələ... Cəhəm ibn Qeys... həyat yoldaşı



---

Burada nöqtə qoyduğumuz yerlərdə ibn Hişam mətndə qeyd edilənlərin . [۱] -۱ .söykökünü yazmışdır

Xəzaə qəbiləsindən olan Əbduləsvəd qızı Ümm Hərmələ, Əmru ibn Cəhəm və Xəzimə ibn Cəhəm adlı iki övladı ilə, Əburrum ibn Umeyr ibn Haşim ... Fəras ibn Nəzr ibn Haris ...

:Bəni Zöhrədən

Bəni Zöhrədən Efiopiyaya üç nəfər getdilər: Əbdurrəhman ibn Of... Amir ibn Əbi Vəqqas... Mətləb ibn Əzhər... həyat yoldaşı Əbi Of qızı Rəmlə ilə getmişdi ki, Efiopiyada .Əbdullah ibn Zaid adlı bir övladları dünyaya gəldi

:Bəni Huzeyl tayfasından

Miqdad ibn Əmr ibn Söləbə ... ona Miqdad ibn Əsvəd də deyirlər. Bunun səbəbi isə .cahiliyyət dövründə Əsvəd ibn Yəğusun onu övladlığa götürməsi idi

:Tim ibn Mərrə qəbiləsindən

Bu qəbilədən iki nəfər hicrət etmişdir, Haris ibn Xalid ... həyat yoldaşı Haris ibn Cəblətin qızı Ritə ilə birlikdə. Onların Efiopiyada Musa, Aişə, Zeynəb və Fatimə adlı övladları .dünyaya gəlmişdir. Digəri isə Əmr ibn Osman ... idi

:Bəni Məxzum və həmpeymanlarının qəbiləsindən

Əbu Sələmə ... həyat yoldaşı Əbi Üməyyə qızı Ümm Sələmə onun adı ə Hinddir. Şəmmas ibn Osman ... Şəmasın adı Osman idi – Həbar ibn Süfyan ... qardaşı Əbdullah ibn Süfyan. Hişam ibn Əbi Huzeyfə ... ə ibn Hişam ... Əyaş ibn Əbi Rəbiə ... Mütəb ibn Of .... Onu Eyhamə deyə səsləyirdilər

:Bəni Cəməh qəbiləsindən

Bu qəbilədən Osman ibn Məzun ... oğlu Saib ibn Osman və iki qardaşı Məzun övladları Qədamə və Əbdullah, Hatib ibn Haris ... həyat yoldaşı Mucəlləl qızı Fatimə və iki övladı: Məhəmməd ibn Hatib və Haris ibn Hatib ki, anaları elə həmin Mucəlləl qızı Fatimə idi. Qardaşı Hatib ibn Haris həyat yoldaşı Yəssar qızı Fəkihə ilə. Süfyan ibn Momər ... iki övladı Cabir ibn Süfyan və Cənadə ibn Süfyan və həyat yoldaşı Cabir və Cənadənin anası olan Həsənə ilə birlikdə . Həsənənin digər ərindən olan övladı Şərhəbil ... Osman

Hişam ibn As, Qeys ibn Həzafə… Əbu Qeys ibn Haris … Əbdullah ibn Həzafə … Haris ibn Haris, Muəmmər ibn Haris… Bəşər ibn Haris … ana tərəfdən bir olan Səid ibn Əmr adlı qardaşı, Səid ibn Haris… Saib ibn Haris … Umeyr ibn Riab … Muhəmyət ibn Cəza ki, onların həmpeymanı olan bənu Zübeyd qəbiləsindən idi. Ümumiyyətlə bu qəbilədən ۱۴ .nəfər Efiopiyaya hicrət etdilər

:Ədi ibn Kəb qəbiləsindən

Muəmmər ibn Əbdullah… Urvət ibn Əbdüləzi, Ədi ibn Nəzlə… oğlu Neman ibn Ədi, Amir .ibn Rəbiə həyat yoldaşı Əbu Həsmə ibn Ğanem qızı Leyli ilə

:Əmr ibn Ləvi qəbiləsindən

Əbu Səbrə … həyat yoldaşı Suheyl ibn Əmr qızı Ümm Külsüm ilə … Əbdullah ibn Məxrəmə, Əbdullah ibn Suheyl … Suleyt ibn Əmr … qardaşı Sukran ibn Əmr həyat yoldaşı Zumə qızı Sodə … Malik ibn Zomə (Sokranın qaynı) həyat yoldaşı Səd ibn Veqdan qızı Umrə ilə… Hatib ibn Əmr … Səd ibn Xolə ki, Yəmənli idi və bu qəbilə ilə .həmpeyman idi

:Haris ibn Fəhr qəbiləsindən

Əbu Ubeydə ibn Cərrah … adı Amir idi – Suheyl ibn Bəyza … Bəyza onun anasının adıdır, atası Vəhəb adlanırdı – Əmr ibn Əbi Sərəh … Əyaz ibn Zuheyr – bəziləri onun əvəzinə Rəbiə ibn Hilali … qeyd etmişlər – Əmr ibn Haris … Osman ibn Əbd Ğənəm … Səd ibn Əbd Qeys … Haris ibn Əbd Qeys … ümumiyyətlə səkkiz nəfər idilər. Özləri ilə apardığı və Efiopiyada dünyaya gələn uşaqları çıxmaq şərti ilə ümumiyyətlə ۸۳ nəfər Efiopiyaya hicrət etmişdir. Bu o haldadır ki, Əmmar ibn Yasiri də hesablayırıq. Ancaq onun .Efiopiyaya hicrət edib- etməməsi məsələsi şübhəlidir

Efiopiyaya hicrət etmək haqqında şer yazanlardan biri Əbdullah ibn Haris… idi ki, bu haqda bir neçə şer qoşubdur. Digəri isə Osman ibn Məzundur (hər ikisi mühacirlərdən idilər) ki bu barədə şerlər söyləmiş və onu Məkkədə incidən əmisi oğlu Üməyyə ibn (Xələfə də etirazlarını bildirmişdir…(۱

Bu şerlərdən xəbərdar olmaq istəyirsinizsə Sirənin I cildinin ٣٣١- ٣٣٢- ci . [١] -١ .səhifələrinə müraciət edə bilərsiniz

## QÜREYŞ ELÇİLƏRİ NƏCAŞİ SARAYINDA

Məkkə mühacirləri Efiopiyada yerləşdilər. Müşriklərin işgəncəsi, onların əziyyətlərindən uzaq, asudə və əminamanlıq mühitində yaşayırdılar. Müşriklər gördülər ki, müanlar onların əllərindən canlarını qurtarıb, Efiopiyada rahat şəkildə yaşayırlar. Buna görə də onları Məkkəyə qaytarmaq və onlara əziyyət vermək üçün iclas çağırıb qərara aldılar ki, Qüreyşin zirək və natiqlərindən iki nəfəri seçib Efiopiyaya Nəcasi sarayına yollayıb, beləliklə də mühacirləri Efiopiyadan xaric edib Məkkəyə .qaytarsınlar

Bu məqsəd ilə Əbdullah ibn Əbi Rəbiə və Əmr ibn Ası (müşriklərin cərgəsində yaşayırdılar) seçib, Nəcaşi və saray əyanları üçün çoxlu hədiyyələr ilə birlikdə yola .saldılar

Digər tərəfdən də Əbu Talib məsələdən agah olub, şerlər qoşub onları Nəcasiyə göndərdi. O bu şerlərdə Nəcaşini mədh edib onu mühacirləri müdafiəyə (həvəsləndirdi.(١

## ÜMM SƏLƏMƏNİN DİLİNDƏN DASTANIN DAVAMI

Ümm Sələmə (özü də mühacirlər dəstəsində idi və sonradan peyğəmbərin həyat yoldaşı oldu) rəvayət edir: Biz Efiopiyada tamamilə təhlükəsiz və rahat yaşayırdıq. Müşriklərin əzabəziyyəti, vahiməsi olmadan və Məkkədə bizlərə dediyi namünasib sözlər olmadan rahat şəkildə Allahımıza pərəstiş edirdik. Qüreyş bizim əhvalımızdan xəbər tutduqda özlərinin arasından iki zirək şəxsi Məkkəyə məxsus olan qiymətli əşya və hədiyyələr ilə Nəcasi sarayına göndərdilər. O cümlədən Məkkədən apardıqları qiymətli şeylərin içərisində Tasefin qiymətli dəriləri də var idi ki, onlardan çoxlu miqdarda Nəcasi üçün aparırdılar. Nəcaşinin saray əyanları və sərkərdələri üçün də .onların şəninə uyğun olaraq hədiyyələr aparırdılar

Hədiyyələri Əbdullah ibn Əbi Rəbiə və Əmru ibn As ilə birgə Efiopiyaya göndərdilər. Onlara tapşırdılar ki, Nəcaşinin sarayına getməmişdən və onunla söhbət etməzdən ,öncə əyanlar və sərkərdələrin hədiyyələrini veriniz. Məsələni onlara izah edib

onları öz tərəfinizə keçirin. Sonra Nəcaşinin yanına gedib onun hədiyyələrini verərək, Nəcaşinin mühacirlərlə söhbət etməsinə imkan verməyərək onları sizə təhvil .verməsini xahiş edin

Qüreyş elçiləri Efiopiyaya gəldilər: Onlar Nəcaşinin hüzuruna gedib hədiyyələri təqdim etməzdən öncə əyan və sərkərdələrin hədiyyələrini onlara təqdim edib, hər birinə ayrıca dedilər: Biz bura ona görə gəlmişik ki, bizim qəbilənin ağılsız və əbləh cavanlarından ibarət bir qrup təzəlikcə bizim əcdadlarımızın dinini tərk edib və təzə bir din qəbul ediblər ki, nə sizin dininizdir (xristian dini) nə də ki, bizim dinimiz. Onlar gizlin şəkildə Məkkədən qaçıb və Efiopiya padşahı Nəcaşinin məmləkətinə daxil olmuşlar. İndi Qüreyş rəhbərləri bizi Nəcaşinin hüzuruna göndəriblər ki, onları bizə təhvil verəsin və biz də Məkkəyə qaytaraq. Elə ki, Nəcaşinin hüzuruna getdik, siz bizə kömək edib şahı razı salın ki, mühacirləri hüzuruna çağırmadan onları bizə təslim etsin. Çünki onları saraya çağırtdırmağa ehtiyac yoxdur. Bizi bura göndərən Qüreyş rəhbərləri onların .xarakter və vəziyyətini sizdən daha yaxşı bilir

Nəcaşi sarayının əyanları Qüreyşə şahın hüzurunda onlara hər cürə dəstək verəcəklərini söyləyib, nəhayət Nəcaşi ilə görüşməsi üçün vaxt təyin etdilər. Nəcaşi Qüreyş hədiyyələrini qəbul edib onların vəziyyətini soruşdu. Elçilər dedilər: Əla həzrət, bizim qəbilənin ağılsız və əbləh cavanlarından ibarət bir qrup təzəlikcə əcdadlarımızın dinini tərk edib və təzə bir din qəbul ediblər ki, nə sizin nə də bizim dinimizdir. Bunlar (bizim qorxumuzdan Məkkədə yaşaya bilmirdilər) sizin ölkəyə qaçmış və buraya gəlmişlər. İndi isə onların böyükləri yəni onların qəbilə rəhbərləri, əmiləri və ataları bizi sizin yanınıza göndəriblər ki, onları geri qaytarasınız. Çünki onların vəziyyətini qüreyş .sizdən daha yaxşı bilir

Məclisə sükut çökdü. Əbdullah və Əmr ibn As nigaran idilər ki, məbada şah mühacirləri hüzuruna çağırsın. Çünki şahın mühacirləri hüzuruna çağırtdırıb onları dinləməsi onların planlarını pozub məhv edəcəkdi. Əyanlar və qoşnu sərkərdələri qüreyşə kömək üçün dillənib dedilər: Əla həzrət! Bu elçilər düz danışırlar. Onların tayfa başçıları onları daha yaxşı tanıyır və onların

rəhbərləri hesab olunurlar. Yaxşı olar ki, onları elçilərə təhvil verəsiniz ki, onları !rəhbərlərinin yanına qaytarıb, təhvil versinlər

Nəcasi bu sözlərə qəzəblənərək dedi: And olsun Allaha ki, mən onlarla görüşüb, dinləməyincə bu iki nəfərə təhvil verməyəcəm. Bunlar mənim himayəmdədirlər və mənə pənah gətiriblər. Gərək ilk öncə onları buraya çağırtdırıb bu iki nəfərin dedikləri haqqında soruşum. Əgər bu iki nəfərin sözü doğru olarsa mən onları elçilərə təhvil verəcəyəm, yox əgər doğru olmasa onları müdafiə edəcək və istədikləri zamana !qədər bizim məmləkətdə asayiş içində yaşayacaqlar

## Mühacirlər Nəcaşi hüzurunda

Efiopiya padşahı mühacirlərin yanına adam göndərib onları hüzuruna çağırtdırdı. Mühacirlər iclas çağırıb Nəcaşi ilə necə söhbət edəcəkləri haqqında məşvərətləşdilər. Nəhayət qərara aldılar ki, məsələ necə olursa olsun bunlar ancaq doğrunu deyəcək və İslam peyğəmbərinin göstərişlərini olduğu kimi bəyan edəcəklər. Bu fikir ilə Nəcaşinin .hüzuruna gəldilər

Məclis bəzədilmiş idi: Keşişlər padşahın kənarlarında əyləşmiş və qarşılarında incilləri açmışdılar. Mühacirlər bir- bir yerlərində əyləşdikdən sonra padşah onlara üz tutub dedi: Bu hansı dindir ki, onu qəbul etmisiniz. Bir halda ki, nə sizin qövmün dini, nə bizim ?dinimiz və nə də digər millətlərin dini deyil

Onların arasından Cəfər ibn Əbu Talib dillənərək dedi: Ey padşah! Biz elə insanlar idik ki, cahiliyyət dövründəki kimi yaşayırdıq, bütləri (ağac və daş bütləri) pərəstiş edirdik. Murdar ətyeyirdik, pis işlər görürdük, qohum və yaxınlarımıza hörmət etmirdik, qonşular ilə pis davranırdıq. Bizim güclülərimiz zəiflərimizə zülm edirdilər... Biz bu vəziyyətdə yaşayırdıq ki, nəhayət AllahTəala bizim aramızdan peyğəmbər seçdi. Bu elə bir şəxs idi ki, biz onun soy- kökünü tanıyırdıq onun pak və iffətli olmasını biz hamımız təsdiq edirdik. Bu əziz peyğəmbər bizi tək olan Allaha doğru dəvət etdi və onu pərəstiş və vəhdaniyyətinə səslədi. Bizə söylədi: Atalarımızın pərəstiş etdiyi daş bütlərə sitayiş və ibadət etməkdən çəkinin. O bizi doğru danışmağa, əmanətcil olmağa qohumlarla get- gəl etməyə, qonşuya yaxşılıq etməyə, haramlardan, qan tökmək və insan

öldürməkdən çəkinməyə səslədi. Pis işlər görmək, zülm etmək yetimin malını yemək, iffətli qadınlara böhtan atmaq və s. çəkindirdi. Bizə tapşırdı ki, tək olan Allaha pərəstiş edib, ona şərik qoşmayaq. Bizə namaz qılmağı, zəkat verməyi və oruc tutmağı əmr etdi... Xülasə İslam gösətrişlərini birbir Nəcaşi üçün saydı. Sonra Cəfər öz sözünü belə :davam etdirdi

Biz onu təsdiq edib ona iman gətirdik. Onun Allah tərəfindən gətirdiklərinə tabe olduq. Tək olan Allaha pərəstiş etdik. Bizə haram etdiyi şeylərdən uzaq durduq. Onun bizə halal etdiklərindən başqa heç nəzi özümüzə halal etmədik... Xülasə olaraq onun göstərişlərini bir- bir icra etdik. Qüreyş vəziyyəti belə gördükdə bizimlə düşmənçilik edib bizi incitməyə başladılar. Bizə bu dindən itaət etməyə mane oldular ki, bəlkə yenidən bütləri pərəstiş etməyə başladıq. Yenə də halal bildiyimiz pis işlərə qurşanaq. Biz onların əziyyət və zülmləri ilə rastlaşdıqda və bizim dini ayinlərimizi icra etmələrimizə maneə olduqlarını gördükdə sizin ölkəyə gəldik və dünya padşahları içərisində sizi seçdik. Sizin ədalətinizə pənah gətirdik və ümüd edirdik ki, sizin .ədalətiniz sayəsində kimsə bizə zülm etməyəcək

Cəfər ibn Əbu Talib daha heç bir söz deməyib sükut etdi. Nəcaşi dedi: Peyğəmbərinin sizin üçün gətirdiklərindən yadında qalan nə isə var? Cəfər dedi: Bəli. Nəcasi dedi: Oxu! surəsinin əvvəlindən oxumağa başladı. Ümm Sələmə (hədisi rəvayət "كهيعص" Cəfər edən) deyir: Nəcaşi Quran ayələrini eşitdikdən sonra elə ağladı ki, göz yaşları onun üzünün qalın saqqalını isltadı. Onun ətrafında əyləşən keşişlər də elə ağlayırdılar ki, ...qarşılarındakı incillər onların göz yaşlarından islanmışdı

Sonra Nəcasi mühacirlərə üz tutub dedi: Sizin peyğəmbərə nazil olan ilə İsa ibn Məryəmə nazil olanlar vahid çeşmədən qaynaqlanır. Arxayın olun ki, and olsun Allaha .ki, sizi heç vaxt bu iki nəfərə təslim etməyəcəm

Qüreyş elçiləri arzularına çatmayaraq Nəcaşinin sarayını tərk etdilər. Onlar çox pərişan və narahat görünürdülər. Əmr ibn As üzünü dostu Əbdullah ibn Əbi Üməyyəyə tutub dedi: And olsun Allaha sabah yenə Nəcaşinin yanına gedib bunların kökünü .(vuracağam (Nəcasiyə onları öldürtdürəcəyəm – mütərcim

Mehriban və ürəyi yumşaq olan Əbdullah dedi: Yox bu işi görməyəcəyik. Bunlar bizim dinimizi tərk etsələrdə hər halda bizimlə qohum hesab olunurlar. Əmr ibn As dedi: Mən bunu edəcəyəm. Sabah onun yanına gedəcək və ona bildirəcəm ki, onlar deyirlər: İsa !Allahın bəndəsidir

Növbəti gün Əmr ibn As Nəcaşinin yanına gələrək dedi: Əla həzrət! Bu ağılsızlar İsa barəsində təəccüblü sözlər danışırlar. Siz onların yanına bir nəfər göndərib onların İsa haqqında nə danışdıqlarını soruşun! Nəcaşinin elçisi mühacirlərin yanına gələrək şahın sifarişini onlara çatdırdı. Mühacirlər təzəcə arxayın olmuşdular ki, yenə də fikrə qərq oldular. Onlar toplanıb bir- birinə dedilər: İsa haqqında Nəcaşiyə nə cavab verəcəyik? !Hamı dedi: Allah Quranda nə buyurubsa onu da deyəcəyik. Nə olacaqsa olsun

Elə ki, Nəcasinin hüzuruna gəldilər. Şah üzünü onlara tutub dedi: Siz İsa ibn Məryəm ?oğlu haqqında nə deyirsiniz

Cəfər ibn Əbu Talib dedi: Bizim peyğəmbər Allah tərəfindən nə gətiribsə biz də onu deyirik. Yəni bizim əqidəmizə görə həzrəti İsa pak Məryəmə göndərilən ilahi kəlmə, .Allahın ruhu, peyğəmbər və bəndədir

Nəcaşi əlini uzadıb yerə düşmüş çubuğu götürüb dedi: And olsun Allaha ki, sənin İsa haqqında dediklərinlə həqiqət bu çubuğun uzunluğundan ötməz (yəni doğru söz elə (sənin dediklərindir

Nəcaşinin bu sözü onun ətrafına yığışmış Efiopiyalı xristian sərkərdələrin xoşuna gəlmədiyindən bir-birinə özlərinə məxsus tərzdə baxdılar. Onların baxışlarını nəzərdən qaçırmayan Nəcaşi onlara dedi: Sizin xoşunuza gəlməsədə! Sonra mühacirlərə dedi: Siz tam arxayınlıqla Efiopiyanın istənilən yerinə gedə bilərsiniz. Agah olun ki, bizim amanımızda olduğunuz üçün kimsə sizə ziyan vura bilməz! Bu cümləni üç dəfə .təkrarladı. Gedin əgər mənə qızıldan dağ versəniz də onlardan birinidə sizə verməzəm

Sonra ətrafındakılara dedi: Bu iki nəfərin hədiyyələrini özlərinə qaytarın. Çünki bizim onlara ehtiyacımız yoxdur. Allah səltənəti mənə qaytarmaq üçün məndən rüşvət almayıb ki, məndə bu barədə onlardan rüşvət götürüm. İlk öncə əhali mənə itaət etmədilər ki, məndə onlara itaət edim. Beləliklə Qüreyş

elçiləri xəcalət və əliboş halda Məkkəyə qayıdaraq, Qüreyşin hədiyyələrini də geri .gətirdilər

Atasının ölümündən Nəcaşinin hakimiyyətə gəlməsinə qədər olan əhvalat

Burada yaxşı olar ki, Nəcasinin hakimiyyətə necə yiyələnmisi haqqında bəhs edək və onun dediyi "Allah hakimiyyəti mənə qaytarmaq üçün rüşvət almadı..." sözündən .məqsədinin nə olduğunu qeyd edək

Uzun illər idi ki, Efiopiya Nəcaşinin atası tərəfindən idarə olunurdu. Onun təkcə bir oğlu olduğu halda qardaşının isə on iki oğlu var idi. Efiopiya əhalisi öz aralarında məsləhətləşdilər ki, əgər biz Nəcasinin atasını öldürsək və hakimiyyəti qardaşına həvalə etsək bu dövlət uzun illər davam edəcək. Çünki onun on iki oğlu olduğuna görə bir- birinin ardıyca hakimiyyətə yiyələnə bilərlər. Amma o padşah olmaqda davam edərsə bizdən artıq övladı olmadığı üçün bu hakimiyyət davam edə bilməz. Buna görə də onu öldürüb hakimiyyəti qardaşına – Nəcaşinin əmisinə həvalə etdilər. Beləcə uzun illər ötdü, Nəcaşi yavaş- yavaş böyüdü, istedadlı və fərasətli olduğu üçün əmisinin sarayında vəzifə sahibi olaraq hakimiyyət işlərinin bir çoxunu ələ aldı. Vəziyyəti belə görən camaat başa düşdülər ki, gec- tez Nəcaşi hakimiyyəti ələ alaraq, əmisini də hakimiyyətdən uzaqlaşdırdıqdan sonra, atasının intiqamını alacaq və onların heç birini .də sağ qoymayacaqdır

Buna görə də əmisinin yanına gəlib dedilər: Ya bu cavanı öldür ya da şəhərdən kənarlaşdır ki, biz özümüzə görə narahatıq. Nəcaşinin əmisi dedi: Siz necə insanlarsınız! Dünən onun atasını öldürdüm, bu gün isə oğlunu öldürməyi mənə təklif edirsiniz! Ancaq sizin ikinci təklifinizlə razılaşıb onu bu şəhərdən qovacağam. Efiopiya əhalisi Nəcaşini bazara gətirib ۶۰۰ dirhəmə bir tacirə satdılar. Tacir Nəcaşini özü ilə götürüb dəniz sahilinə gəldi. O gün şam vaxtı göyün üzərini bir bulud aldı. Nəcaşinin əmisi öz sarayından çıxıb buludun bərabərində durdu ki, bəlkə o buluddan bir neçə .damcı yağşəş onun bədəninə yağdı. Qəflətən bulud şimşək yaradaraq onu öldürdü

Camaat onun övladlarının yanına getdilər ki, birini hakimiyyətə gətirsinlər. Lakin gördülər ki, onların heç biri bu işə layiq deyil və elə də ağıllı insanlar deyillər. Buna görə də camaat arasında hərc- mərclik, ixtilaf və məyusluq yarandı. Naçar qalıb çıxış yolu axtarmağa başladılar və hamı bu qənaətə gəldilər ki, Nəcaşidən başqa heç kəs bizi bu vəziyyətdən xilas edə bilməz. Dərhal onun arxasınca gedib, bütün mümkün .vasitələrdən istifadə edib onu satdığınız şəxsdən geri alıb gətirməlisiniz

Camaat Nəcaşinin araxsınca yola düşüb, onu satdığı kişidən geri alıb şəhərə gətirərək .başına padşahlıq tacı qoyub taxta əyləşdirdilər

Onu alan tacir onların arxasınca şəhərə gələrək dedi: Ya mənim ۶۰۰ dirhəmimi geri qaytarın və ya da padşahın yanına gedib ona şikayət edəcəyəm. Ona dedilər: Biz sənə heç nə verməyəcəyik. Tacir dedi: Elə isə mənim başqa çıxış yolum yoxdur, padşahın yanına gedib ona bu barədə danışacağam! Dedilər özün bilərsən. Tacir kişi Nəcaşinin yanına gəlib onun taxtı qarşısında əyləşib dedi: Padşah sağ olsun! Mən bazardan ۶۰۰ dirhəmə bir qul almışam. Onlar pulu məndən alaraq qulu da mənə təhvil verdilər. Eləki mən qulu özümlə aparmışdım. Onlar arxasınca gəlib qulu məndən alaraq, pulu da vermədilər. Nəcaşi üzünü camaata tutub dedi: Ya pulunu qaytarın və ya qulu özünə verin ki, hara istəyirsə çıxıb getsin. Camaat pulu ödəməyi qəbul etdilər. Beləliklə tacirin .pulunu ona qaytardılar. Bu Nəcaşi tərəfindən verilən birinci ədalətli hökm idi

Nəcaşinin Qüreyş elçilərinə dediyi bu sözdən məqsəd: "Allah səltənəti mənə qaytarmaq üçün məndən rüşvət almayıb ki, mən də rüşvət alım..." elə həmin bu qeyd .etdiyimiz əhvalat idi

Ümm Sələmə dilindən mühacirlərin dastanının davamı

Ümm Sələmə deyir: Qüreyş elçiləri Məkkəyə qayıtdıqdan sonra biz tam əmin- amanlıq şəraitində yaşayırdıq ki, baş verən təzə bir hadisə bizi də pərişan etdi ki, o günə qədər .belə bir şey ilə rastlaşmamışdıq

Hadisə belə oldu ki, inadkar bir düşmən Nəcaşi ilə mübarizəyə qalxdı və hakimiyyəti ondan almağa cəhd etdi. Biz qorxurduq ki, bizim vəziyyətimizi dərk edən və bizə arxa duran

Nəcaşi məğlub olar və hakimiyyətə elə bir şəxs gələr ki, Nəcaşidən fərqli olaraq onun bizim vəziyyətimizdən xəbəri olmadığına görə qərib bir diyarda bizim başımıza hansısa !bir xoşagəlməz hadisələr gələ bilər

Hər halda Nəcaşi düşmənlə döyüşmək üçün şəhəri tərk etdi. Bizim ilə döyüş meydanı arasında Nil çayı axırdı. Mühacirlər dedilər: Kim döyüş meydanına gedib, nəticəni bizə deyə bilər? Digərlərindən daha cavan olan Zübeyr ibn Əvam dedi: Bunu mən edə bilərəm. Nəhayət biz tuluğu hava ilə doldurduqdan sonra, Zübeyr onu sinəsinə bağlayıb, Nil çayını üzərək o tərəfə keçdi. O döyüş meydanını izləməyə başladı. Biz də Nilin bu tərəfində Nəcasinin qələbəsi üçün dua edirdik və habelə onun üçün nigarançılıq keçirirdik ki, qəflətən gördük ki, Zübeyr sürətlə gəlir və uzaqdan öz platarını muştuluq ünvanı ilə yellədirdi. Elə ki, bizə yaxınlaşdı Nəcaşinin qələbə xəbərini bizə çatdırdı. And olsun Allaha ki, özümüzü belə şad- xürrəm görməmişdim. Beləliklə Nəcasi döyüşdən qələbə ilə döndü və bütün ölkə onun tabeçiliynə keçdi. Biz də tam əmin- amanlıqla orada yaşayırdıq ki, bir gün Məkkəyə peyğəmbərin yanına geri .döndük

Nəcaşi və mühacirlər haqqında digər bir dastan

Məhəmməd ibn İshaq həzrəti Məhəmməd ibn Əli Baqirdən (Allahın salamı olsun ona) rəvayət edir ki, buyurdu: (Nəcaşi mühacirlərin həzrəti İsa haqqında dedikləri sözləri müdafiə etdikdən sonra) Efiopiya əhalisi onun əleyhinə qiyam edib dedilər: Sən bizim dindən çıxmısan! (Sən İsanın Allahın bəndəsi olduğu fikrindəsən) Nəcaşi Cəfər ibn Əbu Talib və onun dostlarının arxasınca adam göndərib dedi: (Mən camaat ilə mübarizəyə gedirəm. Sizin giriftar qalmamağınız üçün gəmilər hazırlamışam) Siz bu gəmilərə minib, orada gözləyin. Əgər görsəniz ki, mən bu camaatın qarşısından qaçıb məğlub oldum bu gəmilər ilə istədiyiniz yerə çıxıb gedin. Əgər görsəniz ki, qalib olmuşam onda .yenədə buraya qayıdın

Mühacirlərə bu göstərişi verdikdən sonra məktubu ki, orada yazılmış idi: "Şəhadət verirəm ki, Allahdan başqa Allah yoxdur və Məhəmməd Allahın bəndəsi və elçisidir və şəhadət verirəm ki, İsa ibn Məryəm Allahın Məryəmə göndərdiyi elçisi ruhu və

kəlməsidir" paltarının altında sinəsinin sağ tərəfində gizlədib, onun ilə üzbəüz qalan Efiopiyalıların yanına gəlib dedi: Ey Efiopiya əhalisi digərləri ilə müqayisədə mən sizin üçün daha layiqli (rəhbər – mütərcim) deyiləm? Dedilər: Niyə ki. Dedi: Mən bu günə qədər sizinlə necə rəftar etmişəm? Dedilər: Çox yaxşı rəftar etmisən. Dedi: Elə isə sizə nə olub (ki mənə qarşı qiyam edirsiniz). Dedilər: Çünki sən bizim dini tərk edib və düşünürsən ki, İsa Allahın bəndəsidir! Nəcaşi dedi: Məgər sizin İsa haqqında olan düşüncələriniz nədir? Dedilər: Biz inanırıq ki, İsa Allahın oğludur. Nəcaşi əlini sinəsinin üstünə qoyub – yazını gizlətdiyi yerə dedi: Mən də şəhadət verirəm ki, İsa ibn Məryəm .bundan artıq deyil – nəzərində məktubda yazılanları tutmuş idi

Camaat onun sözündən xoşhal olub mübarizəni dayandıraraq şəhərə qayıtdı (mühacirlər də öz qaldıqları yerlərə qayıtdılar). Bu əhvalatı Allahın rəsuluda eşitdi. Nəcasi dünyadan köçdükdən sonra ona namaz qılıb onun üçün Allahdan bağışlanmaq .tələb etdi

Aişə rəvayət edir ki: Nəcasi öldükdən sonra onun qəbri üstündə bir nur müşahidə .edilirdi

### ÖMƏR İBN XƏTTABIN İSLAM DİNİNİ QƏBUL ETMƏSİ

Əbi Həsmə qızı Əbdullahın anası deyir: Biz Efiopiyaya getməyə hazırlaşırdıq. Amir (ərim) ev işləri üçün evi tərk etmişdi. Birdən- birə hələ də müşrik kimi yaşayan Ömərin bizə tərəf gəldiyini gördüm– Müan olduğumuz müddətdə ondan çoxlu əzabəziyyət görmüşdük– mənim səfərə hazırlaşdığımı görüb dedi: Ey Əbdullahın anası Məkkədən köçmək fikrindəsiniz? Dedim bəli and olsun Allaha ki, siz bizə əzab- əziyyət verdiyinizə görə biz də ilahinin geniş dünyasında səfər etmək istəyirik ki, bəlkə Allah bizə rahatlıq !bəxş etdi. Ömər dedi: Allah sizinlə olsun

Onun bu sözündən anladım ki, onda bir şəfqət yaranıb və ürəyi yumuşalıbdır. Sonra .bizdən ayrılıb getdi. Zənnimcə bizim səfər etməyimiz onu qəm-qüssəyə düçar etmişdi

Nə isə Amir qayıtdı və mən Ömərin simasında müşahidə etdiyim qəm- qüssə və yumşalmağı Amirə dedim. Amir dedi: Ümid edirsən ki, bu vəziyyətdə İslamı qəbul edəcək? Dedim: Bəli, onun müanlara qarşı amansız rəftarını görüb və onun müan

olmasına tam ümidini itirən Amir dedi: Əgər Xəttabın (Ömərin atası) uzunqulağı dönüb müan olarsa bu mümkündür. (uzunqulağın İslamı dinini qəbul etməsi mümkün .(olmadığı üçün deməli Ömərin də İslam dinini qəbul etməsi mümkün deyil– mütərcim

İbn İshaq rəvayət edir: Xəttabın qızı Fatimə (Ömərin bacısı) Səid ibn Zeydin həyat yoldaşı idi. Onların hər ikisi gizlincə İslam dinin qəbul etmiş və bunu Ömərdən gizlədirdilər. Nəim ibn Əbdullah da Ömərin qəbiləsindən idi. O da İslam dinini qəbul etsədə, qəbiləsindən qorxduğu üçün bunu gizlədirdi. Xəbab ibn Ərət (müanlardan biri) .ara- sıra Fatimənin (Ömərin bacısı) evinə gələr və ona Quran öyrədərdi

Bir gün Ömər ibn Xəttaba xəbər verdilər ki, Məhəmməd öz səhabə və dostları ilə birlikdə Səfa (Səfa dağı– mütərcim) yaxınlığındakı evdə toplaşıblar. Onlar Həmzə, Əbubəkr, Əli ibn Əbu Talib kimi Efiopiyaya köçməmiş və Məkkədə qalan insanlar idi. Ümumiyyətlə Məkkədə təqribən ۴۰ nəfər qalmış idi. Ömər ibn Xəttab qılıncını götürüb peyğəmbəri öldürmək məqsədi ilə yola düşdü. Nəim ibn Əbdullah yolda onun ilə rastlaşaraq dedi: Ey Ömər hara gedirsən? Dedi: Məhəmmədin yanına gedirəm. Qüreyşi pərən- pərən salan, alimlərinə ağılsız deyən, dinlərini tənqid edən, Allahlarını söyən şəxsin yanına gedirəm ki, onu öldürüm. Nəim dedi: Ey Ömər and olsun Allaha ki, özünlə qürrələnirsən. Görəsən sən Məhəmmədi öldürdükdən sonra Əbdü Manaf övladları səni belə rahat gəzməyinə imkan verəcəklər! Əgər doğru deyirsənsə öz ailəni saxla! (yəni onların İslam dinini qəbul etmələrinin qarşısını al- mütərcim) Ömər dedi: Mənim ailəm kimdir? Nəim dedi: Bacın əri və əmin oğlu Səid ibn Zübeyr və habelə bacın !Fatimə. And olsun Allaha ki, onlar müan olmuş və Məhəmmədin dininə tabedirlər

Bu sözü eşidən Ömər bacısı Fatimənin evinə yollandı. Onlara çatanda Xəbab ibn Ərət Fatimə və Səid üçün bir səhifədə (kağız və ya dəri üzərində) yazılmış “Taha” surəsini oxuyur və onlara öyrədirdi. Ömərin gəldiyini bildikdə Xəbab ibn Ərət (Ömərdən qorxduğu üçün) arxa otağa keçib orada gizləndi. Fatimə də o səhifəni götürüb ayaqları altında gizlətdi. Xəbabın səsini eşidən Ömər evə daxil olub dedi: Mənim

eşitdiyim səs nə idi? Dedilər: Bir şey yoxdur. Dedi: Niyə and olsun Allaha ki, mən səs eşitdim, eşitdiyimə görə sizə Məhəmmədin dininə itaət edirsiniz? – bu sözü deyib – .Səid bin Zeydə tərəf hücum etdi

Fatimə ayağa qalxıb ərini müdafiə etmək istədikdə Ömər ona möhkəm bir şillə vurdu ki, (divara dəyib) başı yarıldı. Bu vəziyyəti müşahidə edən Səid və Fatimə dedilər: Bəli .ey Ömər biz müan olmuşuq indi istədiyini edə bilərsən

Ömərin bacısının üzündən qan axdığını görüb öz əməlindən peşman olaraq dedi: İndi səndə olan səhifəni mənə ver ki, görüm Məhəmməd nə gətiribdir? Fatimə dedi: Biz sənə inanmırıq (qorxuruq ki, onu məhv edəsən mütərcim) Ömər and içdi ki, oxuduqdan sonra sizə qaytaracağam. Fatimə bu sözləri eşitdikdə onu İslam dinini qəbul etməyə şirinikləşdirmək fikrinə düşdü və dedi: Axı sən müşrik və nəcissən. Bu Qurana isə yalnız pak insanlar toxuna bilərlər. Ömər qalxıb yuyunduqdan sonra Fatimə bu Quran səhifəsini ona verdi. Ömər mübarək "Taha" surəsini oxumağa !başladı. Bir az oxuyub dedi: Nə gözəl sözlərdir

Ömərin bu sözlərini eşidən Xəbab ibn Ərət arxa otaqdan çıxıb dedi: Ey Ömər and olsun Allaha ki, mən gözləyirəm ki, peyğəmbərin Allahdan sənin müan olmağın üçün etdiyi dua qəbul olsun. İndi isə ey Ömər Allaha görə nigaran olma (bəlkə İslam dinini qəbul !(edəsən

Ömər dedi: Ey Xəbab Məhəmmədin yerini mənə söylə ki, yanına gedim və İslam dinini qəbul edim. Xəbab dedi: O bir neçə səhabə ilə birlikdə Səfa yaxınlıqdakı evdə yığışıblar. Ömər qılıncı boynundan asıb peyğəmbər və əshabının yığışdığı evin qapısına gəldi. Qapını döydü. Səhabələrdən biri qalxıb qapının dəliyindən baxdıqda Öməri qılınc ilə görüb qorxmuş halda peyğəmbərin yanına qayıdaraq dedi: Ömər ibn Xəttabdır ki, qılıncını boynundan asmışdır! Həmzə ibn Əbdülmütəllib dedi: Qapını açın, içəri kesin. Əgər buraya xoş niyyət ilə gəlibsə biz də xoş rəftar edərik. Əgər pis niyyət ilə gəlibsə .onu elə öz qılıncı ilə öldürərik. Peyğəmbər buyurdu: İcazə vein içəri girsin

Ömər otağa daxil oldu. İslam peyğəmbəri ona tərəf yeriyib evin kandarında, onu qarşıladı. Qarşı tərəfdən onun paltarını tutub möhkəmcə silkələyərək buyurdu: Ey Xəttab oğlu buraya niyə gəlmisən? Deyəsən Allah səni müsibətə vadar etməyincə və özünü bəlaya salmayınca bizimlə mübarizədən əl çəkməyəcəksən? Ömər dedi: Ey Allahın elçisi gəlmişəm ki, Allah və onun rəsuluna iman gətirəm! Peyğəmbər elə təkbir dedi ki, evdəkilər başa düşdü ki, Ömər müan olubdur (uca səslə "Allah daha böyükdür" .(dedi

Digər bir hədisdə Ömərin özü rəvayət edir ki: Mən cahiliyyət dövründə İslamdan uzaq idim. Şəraba qurşanmış və onu sevərdim. Biz Məkkədə "Həzvərə" adlı bir məhəllədə kef məclisi yaratmışdıq ki, Qüreyş başçıları da oraya toplaşardılar. Bir gecə o məclisə getmək üçün evdən çıxıb oraya gəldikdə dostlarımın heç birini orada görmədim. Özözümə dedim: İndi ki, dostlarım gəlməyib filan içki satanın yanına gedib və ondan bir cam şərab alıb içim. Onun dükanına gəldikdə onu da orada görmədim. Öz- özümə dedim: Kəbənin kənarına gedib orada bir neçə dəfə təvaf edərəm. Məscidə gəldikdə gördüm ki, peyğəmbər Kəbənin qarşısında üzü Şama (Beytül- Müqəddəsə) tərəf durub və namaz qılır. O həzrətin adəti belə idi ki, Şama tərəf dayanar və Kəbə evini özü ilə üzbəüz qərar verər və namaz yeri də rukne əsvəd (qara sütun – mütərcim) ilə .rukne yəmaninin arası idi

Öz- özümə dedim: Bu gecə gedib Məhəmmədin namazda nə dediklərinə qulaq asacağam. Amma fikirləşdim ki, əgər bu məqsəd ilə ona yaxınlaşsam onda qorxu yaranacaq (mümkündür ki, o həzrət ahəstə oxusun). Buna görə də daş tərəfindən (Həcəri İsmail) gedib Kəbə evinin pərdəsi altında gizlənərək, yavaşyavaş irəli gedib Məhəmməd ilə üzbəüz dayandım. Mənim ilə onun arasında təkcə Kəbənin pədəsi fasilə salmış idi. Bu vaxt onun namazda oxuduğu qiraətə qulaq asdım. Yavaş- yavaş Quran ayələri ürəyimi yumuşaltdı və ağladım. İslam dininin məhəbbəti ürəyimə daxil oldu. Eləcə yerimdə dayanmışdım ki, İslam peyğəmbəri namazını tamamlayaraq .məsciddən xaric oldu

O həzrətin evinə qədər olan yolu belə idi ki, ibn Əbi Hüseynin evinə tərəf gedər və Səy yerindən (Səfa və Mərvə arası) keçdikdən sonra Əbbas ibn Əbdülmütəllib və ibn Əzhər ibn Əbd Ofun evinin arasındakı yolu ilə irəliləyər və Əxnəs ibn Şəriqin evinin yanından ötərək öz evinə çatardı – O həzrətin yaşadığı yer indi Müaviyə ibn Əbi Süfyanın .əlindədir

Rəsulullah məsciddən xaric olduqdan sonra mən də arxasıyca yola düşdüm. Əbbas ibn Əbdül Mütəllib və ibn Əzhərin evinin arasındakı yolda ona çatdım. Peyğəmbər mənim ayaq səsimi eşitdikdə dayanıb məni tanıdı. O, elə zənn etdi ki, mən ona əziyyət verməyə getmişəm. Ona görə də dedi: Ey Xəttab oğlu bu saatda buraya niyə gəlmisən? Dedim: Gəlmişəm ki, Allah və rəsuluna iman gətirim! Peyğəmbər Allaha şükr edib dedi: Ey Ömər Allah səni hidayət etdi. Sonra əlini mənim sinəmə qoyaraq bu yolda sabit qədəm olmağım üçün dua edib evinə yollandı. Mən də öz işimin arxasıyca yola .düşdüm

Ömərin oğlu Əbdullah deyir: Atam müan olduqdan sonra camaatdan soruşdu: Qüreyş arasında kim hamıdan daha yaxşı dastan söyləyə bilir? Ona dedilər: Cəmil ibn Muəmmər Cəmhi! Ömər onun yanına gəldi. Əbdullah deyir: Mən də arxasıyca getdim ki, görüm nə etmək istəyir. Gördüm ki, Cəmilin yanına gəlib dedi: Ey Cəmil xəbərin var ki, mən müan olub, Məhəmmədin dinini qəbul etmişəm? Hələ atam qayıtmamışdı ki, Cəmil qalxıb tələsik yola düşdü. Atam da arxasıyca yola düşdü. Mən də atamın .arxasıyca getdim

Cəmil gəlib MəscidulHəramın qapısında dayandı və Kəbənin kənarında əyləşmiş Qüreyşə uca səslə qışqırdı: Ey Qüreyş tayfası xəbəriniz olsun ki, Ömər dindən çıxıbdır! Atam da arxasıyca qışqırdı: Yalan deyir mən müan olmuşam və şəhadət verirəm ki, bir !olan Allahdan başqa Allah yoxdur və Məhəmməd onun bəndəsi və elçisidir

Qüreyş bu sözü eşitdikdə atam Ömərin üstünə töklüşdülər və günəş başlarının üstünə qalxana kimi döyməyə davam etdilər. Nəhayət atam yorulub yer üzərində əyləşdi və ...dedi: İstədiyinizi edin

Bu vaxt əynində Yəmən paltarı və çıxıntılı köynək geymiş

qoca bir qüreyşli kişi irəli gəlib dedi: Nə olub? Dedilər: Ömər dinini tərk edib. Dedi: Əl çəkin, bir şəxs özünə yol seçib, onun canından nə istəyirsiniz? Sizcə siz ona istədiyinizi etdikdən sonra Ədi ibn Kənan övladları (Ömərin qəbiləsi) sakit oturacaqlar! Onunla .işiniz olmasın

Əbdullah ibn Ömər deyir: And olsun Allaha ki, bu qoca kişinin sözləri onlara elə təsir etdi ki, bu camaat bədəndən çıxarılan paltarlar kimi onun ətrafından dağlışdılar. Atam Mədinəyə hicrət etdikdən sonra ondan soruşdum: O vaxt camaatı sənin ətrafından .uzaqlaşdıran kişi kim idi? Dedi: O, As ibn Vael Səhmi idi

Ömərdən rəvayət edirlər ki, dedi: Mən müan olduğum gecə öz- özümə düşünürdüm ki, görəsən Məkkə əhalisindən kim hamıdan çox peyğəmbərə qarşı düşmənçilik göstərər ki, mən də onun yanına gedib, ona müanlığı qəbul etdiyimi xəbər verim. Yadıma düşdü ki, hamıdan çox Əbu Cəhl peyğəmbərlə düşmənçilik edir – Ömər Əbu Cəhlin bacısı oğlu idi – Deyir: Elə ki, səhər açıldı Əbu Cəhlin evinə gəlib qapını döydüm. Əbu Cəhl çölə çıxıb dedi: Xoş gəlmisən ey bacım oğlu, bura niyə gəlmisən? Dedim: Gəlmişəm sənə deyəm ki mən Allaha və onun peyğəmbəri Məhəmmədə iman gətirərək müan olmuşam! Əbu Cəhl qapını üzümə bağlayıb dedi: Allah gətirdiyin ilə üzünü pis etsin (Yəni iman .(gətirdiyin şey üzünü qara etsin – mütərcim

## İSLAM PEYĞƏMBƏRİNİN ƏLEYHİNƏ QÜREYŞİN ƏHDNAMƏSİ

### İŞARƏ

İslam peyğəmbərinin besətindən (peyğəmbərliyə yetişməsindən) bir neçə il ötdü. Yavaş- yavaş qüreyş gördülər ki, Həmzə ibn Əbdülmütəllib və Ömər ibn Xəttab kimi bir çox insanlar islam dinini qəbul etmiş, bir dəstə Efiopiyaya gedərək Efiopiya padşahının pənahında tam əminamanlıqla yaşayaraq onun himayəsindədirlər, eyni .zamanda ərəb qəbilələri arasında az- çox insanlar İslam dininin ardıcıllarına çevriliblər

İslam peyğəmbərinin təbliğat işini dayandırmaq üçün yığıncaq təşkil etdilər. Qərara alındı ki, əhdnamə yazıb hamılıqla imzalasınlar ki, bundan sonra bütün Haşim və Mütəllib övladları ilə alver əlaqələrini dayandırsınlar, onlara qız verməsinlər, onlardan qız almasınlar, onlara bir şey satmasınlar onlardan bir şey almasınlar. Bu əhdnaməni Kəbə evinin ortasında assınlar ki, daha çox ona əməl olunsun. Bu qərar qəbul edildi. .Əhdnaməni yazıb, imza atdıqdan sonra Kəbə evindən asdılar

Əhdnaməni yazan Mənsur ibn Əkrəmə adlı bir şəxs idi – bəziləri onun adını Nəzr ibn Haris kimi qeyd ediblər – Peyğəmbər onun barəsində nifrin etdi və barmaqlarının bir .hissəsi qüvvədən düşdü

Vəziyyəti belə görən Haşim ibn Mütəllib övladları Əbu

Talibin yanına getdilər. Təkcə Əbu Ləhəbdən başqa hamısı Əbu Talibə aid olan və Əbu Talib dərəsi kimi tanınan yerə getdilər. Əbu Talib bu haqda şerlər də demişdir. (۱) Bu minval ilə ikiüç il ötdü. Bu müddət ərzində Qüreyş gözətçilər qoymuşdular ki, kimsə onların yanına gedib onlara azuqə və xörək çatdıra bilməsinlər. Buna görə də onları .sevən insanlar gizlin şəkildə onlara azuqə çatdırırdılar

Bir gün belə bir hadisə baş verdi ki, Əbu Cəhl, Həkim ibn Hizamla– Xədicənin qardaşı oğlu ilə rastlaşdı və gördü ki, o öz qulamı ilə birlikdə bir miqdar buğda götürmüş və peyğəmbərin yanında olan bibisi Xədicə üçün aparır. Əbu Cəhl onun üstünə yeriyib dedi: Bəni Haşim üçün azuqə aparırsan? And olsun Allaha ki, burdan getməyinə imkan .verməyəcəyəm və səni Məkkədə rüsvay edəcəyəm

Əbulbəxtəri (Əbu Cəhlin qardaşı) özünü yetirib Əbu Cəhlə dedi: Nə olub? Dedi: Haşim övladları üçün azuqə aparır. Əbulbəxtəri dedi: Azuqə bibisi Xədicənin idi, o saxlayırdı, indi isə onun üçün aparır. Sən imkan vermirsən ki, Xədicənin öz malını onun yanına aparsınlar? Qarşısından çəkil kənara. Əbu Cəhl əl çəkməyib, maneə yaratmaqda .davam edirdi

Nəhayət Əbu Cəhl ilə qardaşı arasında dava düşdü. Əbulbəxtəri orada yerə düşmüş dəvənin çənə sümüyünü götürüb Əbu Cəhlin başına elə çırpdı ki, onun başı yarılıb möhkəm yaralandı. Əbu Cəhlin bu hadisədə xoşuna gəlməyən cəhət bu idi ki, qorxurdu bu xəbər peyğəmbər və səhabələrinin qulağına çatar. Nəticədə onların ruhlanmasına .səbəb olar. Təsadüfən Həmzə ibn Əbdülmütəllib orada idi və bu mənzərəni gördü

İslam peyğəmbəri bu müddət ərzində camaatı dəvət edər, müşriklərdən çəkinmədən .gecəgündüz camaatı Allaha tərəf səsləyirdi

Müşriklərin peyğəmbərə vurduğu zərərlər və bu barədə nazil olan ayələr

Qüreyş gördülər ki, o həzrətə və qövmünə qarşı nə qədər yaşayışı çətinləşdirirlərsə yenə də Haşim və Mütəllib övladları, xüsusən də əmisi Əbu Talib ondan öz köməyini .əsirgəmir

Ondan sonra məsxərəyə başlayaraq o həzrətdən eyb axtarmağa başladılar. Onunla mübarizəyə qalxıb əziyyət etməyə başladılar. Allah Təala da onların barəsində ümumi .şəkildə və bəzilərinin barəsində isə xüsusi olaraq ayələr nazil etdi

O cümlədən xüsusi olaraq haqqında ayə nazil etdiyi şəxslərdən biri də əmisi Əbu Ləhəb və habelə arvadı Hərb ibn Üməyyənin qızı Ümm Cəmil idi. Allah Təala onu "حماله الحطب" (odun yığan) adlandırmışdı. Çünki səhradan tikanları yığar və peyğəmbərin .yoluna tökərdi

:O iki nəfər haqqında nazil olan ayələr bunlardır

"... Əbu Ləhəbin əlləri qurusun... Yığdığı mal-dövləti ona fayda verməyəcək. O, alovlu atəşə girəcəkdir. Həyat yoldaşı odun daşıyandır. Onun boğazında xurma lifindən hörülmüş ip olacaqdır!"(١)

İbn İshaq rəvayət edir: Elə ki Ümm Cəmil bu ayələri eşitdi peyğəmbərin arxasıyca gəldi. Bu zaman peyğəmbər Məscidul- Həramda əyləşmiş və Əbu Bəkrdə yanında idi. Əlində daş tutmuş Ümm Cəmil məscidə gəldi. Elə ki, peyğəmbərin qarşısında durdu, Allah- Təala onun ilə peyğəmbər arasında hicab (manеə- mütərcim) yaratdı ki, peyğəmbəri görə bilmədi. Buna görə də Əbu Bəkrin yanına gəlib dedi: Dostun hardadır? Eşitmişəm ki, məni həcv edib. And olsun Allaha ki, əgər onu görsəm bu daşı :ağzına vuracağam. And olsun Allaha ki o mənim şair olduğumu bilmir. Sonra dedi

مذمما عصينا

وأمره أبينا

و دينه قلينا

Yəni müzəmməmə peyğəmbəri nəzərdə tuturdu itaət etməyək, göstərişlərini qəbul) etməyək və dinini düşmən tutaq). Elə ki, geri döndü Əbu Bəkr peyğəmbərə ərz elədi: Ey Allahın elçisi necə oldu ki, o sizi görmədi? Buyurdu: Allah, onun gözlərinin məni .(görməsinə manеə oldu (mənim ilə onun arasında manеə yaratdı

Üməyyə ibn Xələf haqqında

.Xələf oğlu Üməyyə... peyğəmbərin qatı düşmənlərindən idi



---

.Ləhəb surəsi . [۱] -۱

Nə zaman peyğəmbəri görsəydi onu danlayar və ona qarşı bihudə sözlər danışardı. .Allah- Təala onun haqqında aşağıdakı ayələri nazil etdi

Qeybət edib tənə vuran hər kəsin vay halına! O kimsə ki mal yığıb onu dönə- dönə“ sayar və elə zənn edər ki, mal- dövləti onu əbədi yaşadacaqdır. Xeyr! O mütləq hütəməyə atılacaqdır. Sən nə bilirsən ki, hütəmə nədir? O Allahın yanar odudur. Elə bir od ki, ürəkləri yandırıb- yaxar. O belələrinin üzünə qapanıb kilidlənəcəkdir. Onlar (hündür sütunlarla bağlanmış olacaqlar!(١

### AS İBN VAİL HAQQINDA

Xəbab ibn Ərət müanlardan və peyğəmbərin yaxınlarından biri idi. O dəmirçilik edər və Məkkə şəhərində qılınc (və başqa şeylər) düzəltməklə gününü keçirərdi. As ibn Vail – (Qüreyş rəhbərlərindən biri və Əmr Asın atası) – ona bir neçə qılınc düzəltməyi sifariş verdi. Xəbab qılıncları düzəldib onun üçün göndərdi. Bir gün onların pulunu almaq üçün As ibn Vailə müraciət etdi. As dedi: Məgər sənin dinini qəbul etdiyin Məhəmməd demir ki, behişt elə bir yerdir ki, kim nə qədər qızıl-gümüş, paltar və xidmətçi istəsə ona verəcəklər. Xəbab dedi: Necə ki, As dedi: Elə isə mənə möhlət ver. Behiştə gedən kimi orada sənin borcunu ödəyəcəm. Çünki sən və Məhəmməd Allahın yanında məndən daha yaxşı və sevimli deyilsiniz (yəni Allah sizi behiştə aparıb məni kənarda qoymayacaq ki). Allah- Təala As və onun dedikləri haqqında aşağıdakı ayələri nazil etdi. “Ayələrimizi inkar edib mənə mütləq mal- dövlət və övlad veriləcəkdir deyən adamı gördünmü? Görəsən o qeybə vaqif olmuş yoxsa Rəhmandan söz almışdır? Xeyr onun dediklərini yazacaq, əzabını artırdıqca artıracağıq, onun dediyi şeylər bizə (qalacaq və hüzurumuza təktənha gələcəkdir”.(٢

### ƏBU CƏHLİN SÖZLƏRİ VƏ ONUN BARƏSİNDƏ NAZİL OLAN AYƏ

Bir gün Əbu Cəhl İslam peyğəmbərini görüb dedi: Ey



---

.Hüməzə surəsi . [١]-١

.Ənam surəsi ١٠٨- ci ayə . [٢]-٢

Məhəmməd bizim Allahlarımızı söyməkdən əl çək yoxsa biz də sənin Allahını :söyəcəyik. Bu haqda aşağıdakı ayə nazil oldu

Allahdan başqalarına tapınanları söyməyin. Yoxsa onlar da bilmədikləri üzündən“ Allahı düşməncəsinə söyərlər”.(١) Ondan sonra İslam peyğəmbəri onların Allahlarını söyməkdən (pis sözlər söyməkdənmütərcim) əl çəkdi və təkcə onları Allaha doğru .dəvət etməklə kifayətləndi

### NƏSR İBN HARİS VƏ ONUN BARƏSİNDƏ NAZİL OLAN AYƏLƏR

Nəzr ibn Haris– bundan öncə qeyd etdiyimiz kimi(٢)Qüreyş şeytanlarından və peyğəmbərin qatı düşmənlərindən hesab olunurdu. Heyrəyə səfər etdiyi üçün İran şahları, Rüstəm və İsfəndiyar haqqında dastanlar öyrənmiş idi. Peyğəmbər hər hansı bir məclisdə əyləşib insanları Allaha tərəf dəvət edib onları keçmiş tayfalar kimi əzaba düçar olmaqları ilə qorxutduqdan sonra, Nəzr ibn Haris o həzrətin yerində əyləşər İran padşahları, Rüstəm və İsfəndiyar haqqında dastanlar söyləyib deyərdi. And olsun Allaha ki, Məhəmməd məndən yaxşı dastan danışa bilməz. Necə ki, mən yazıram, onun dastanı da özünün keçmişdəkilər haqqında yazdığı əfsanədən başqa bir şey .deyil. Onun haqqında bu ayələr nazil oldu

Onlar həmçinin: “Bu qədimlərin əfsanələridir. O, onları yazdırtmışdır, səhər- axşam“ özünə oxunur”, dedilər. De: “Onu göylərin və yerin sirrini bilən nazil etmişdir. Həqiqətən (O, bağışlayandır, rəhm edəndir!”(٣

(Ayələrimiz ona oxunduğu zaman o: qədimlərin əfsanələridir! dedi”.(۴“

Vay olsun pis iş görən yalançı insanlara. O, Allahın ayələrinin özünə oxunduğunu“ eşidir, sonra guya onları eşitməmiş kimi təkəbbür göstərərək israr edib durur. (Beləsinə şiddətli bir əzabla müjdə ver!”(۵



---

.Məryəm surəsi ٧٧- ٨٠- ci ayələr . [١] -١

.١٨٣cü səhifə . [٢] -٢

.Furqan surəsi ۵۶- cı ayə . [٣] -٣

۴- [۴]. Qələm surəsi ۱۵-ci ayə və Mutəffifin surəsi ۱۳-cü ayə.

۵- [۵]. Casiyə surəsi ۷-ci ayə.

Rəvayətə görə bir gün İslam peyğəmbəri Vəlid ibn Müğeyrə və digər bir neçə şəxs ilə birgə məsciddə əyləşmişdi ki, Nəzr ibn Haris məscidə daxil olub o həzrətin yanında əyləşdi. Peyğəmbər danışmağa başladı. Nəzr o həzrətin sözlərinə irad tutdu. Nəhayət :həzrət onu susdurdu. Sonra bu ayələri Nəzr və orada olanlara oxudu

Siz və Allahdan qeyri ibadət etdiyiniz bütlər isə cəhənnəmdə yanacaqsınız. Siz ora“ varid olacaqsınız. Əgər bunlar tanrı olsaydılar, ora girməzdilər. Hamısı orada həmişəlik qalacaqlar. Onları orada ah-nalə gözləyir. Onlar orada heç bir söz (ümidverici) (eşitməzlər”(١

İbn Zobərinin sözləri və ona cavab olaraq nazil olan ayələr

İslam peyğəmbəri o məclisi tərk edib evə getdi. O həzrət getdikdən sonra Əbdullah ibn Zoberi Səhmi o məclisə gəldi. Vəlid ibn Müğeyrə ona dedi: Bu gün Məhəmməd burada idi. Nəzr ibn Harisin suallarını belə cavablandırdı və belə güman edir ki, biz və pərəstiş etdiklərimizin hamısı cəhənnəmə gedəcəyik (peyğəmbərin dediyi sözü onun üçün .(danışdı

Əbdullah ibn Zoberi dedi: Əgər mən burda olsaydım onun cavabını verərdim. Allahdan başqa pərəstiş edilən hər bir şey pərəstiş edənləri ilə birlikdə cəhənnəmə gedəcək? Biz mələklərə də sitayiş edirik. Yəhudilər Üzeyrə pərəstiş edirlər, xristianlar İsaya pərəstiş edirlər (Məhəmmədin dediklərinə görə bunların hamısı cəhənnəmə (gedəcəklər

Vəlid və məclis əhli bu sözdən heyrətə gəldilər və güman etdilər ki, Məhəmməd bu söz .ilə məhkum olacaq

İbn Zoberinin sözünü peyğəmbərə danışdıqda həzrət buyurdu: Allahdan başqa hər kim istəsə ki, ona ibadət etsinlər belə bir kəs pərəstiş edilənləri ilə birlikdə olacaq. Bunlar (İsa, Üzeyr və mələkləri pərəstiş edənlər) şeytanlar və onları pərəstiş əmri verənlərə görə pərəstiş edirlər (Çünki onların özü belə bir pərəstişə göstəriş verməyib (və buna da razı deyillər

:Bu barədə Allah- Təala tərəfindən də belə bir ayə nazil oldu

gözəl nemət yazılmış şəxslər– məhz onlar ondan uzaqlaşdırılmış olacaqlar. Onlar Cəhənnəmin uğultusunu eşitməyəcəklər. Onlar ürəkərinin istədiyi (nemətlər) içində əbədi qalacaqlar”.(١) Yəni yolunu azmış camaat Məryəm oğlu İsa, Üzeyr və digər dini .şəxsiyyətləri öz Allahı adlandırdırdılar

Onların mələklərə pərəstiş etməsi və dedikləri: “Mələklər Allahın qızlarıdır” sözlər :barəsində bu ayələr nazil oldu

Rəhman övlad götürdü” dedilər. Allah pak və müqəddəsdir! Bəlkə (müşriklərin Allahın“ övladları adlandırdıqları onlar (yəni mələklərmütərcim)) onlar Allahın yaxın bəndələridir ki, heç vaxt ondan qabaqbir iş görməz və gördükləri hər bir işdə Allahın əmrinə əsaslanır...” Sonra buyurur: “Onlardan kimsə mən aləmin rəbbiyəm deyərsə biz onu cəhənnəm əzabı ilə cəzalandırarıq. Biz zülmkarları belə cəzalandırırq”(٢) İbn :Zöbərinin sözü, Vəlid və məclisdəkilərinin heyrəti barəsində bu ayə nazil oldu

Məryəm oğlu İsaya məsəl çəkilincə (məqsəd ibn Zobərinin məsəlidir) sənin qövmün“ .ondan üz döndülər” yəni onun sözünə görə sənin əmrindən döndülər

Sonra İsa ibn Məryəm haqqında buyurur: Məryəm oğlu İsa ancaq nemət verdiyimiz İsrail oğullarına ibrət dərsi etdiyimiz bir bəndədir. Əgər biz istəsəydik, yer üzündə sizin əvəzinizə mələklər yaradardıq. Şübhəsiz ki, o qiyamət saatı üçün bir əlamətdir. Ona (şəkk etməyin, mənə tabe olun. Bu doğru yoldur!”(٣

Əxnəs ibn Şəriq və Vəlid ibn Müğeyrə haqqında nazil olanlar

Əxnəs ibn Şəriq Qüreyş rəhbərlərindən biri idi. O, bəni Zöhrə qəbiləsi ilə həmpeyman idi. Peyğəmbər ilə də ədavət və düşmənçilik edirdi. Onun barəsində aşağıdakı bu ayə :nazil oldu

Ya peyğəmbər sən heç vaxt yalandan and içən kafirlərə itaət etmə, qeybət edənə,“ ,söz gəzdirənə, xeyrə mane olanla



---

.Ənbiya surəsi ١٠٠– ١٠١– ci ayələr . [١] –١

(həddi aşana, günaha batana, daş ürəkliyə, əsilnəcabəti bilinməyən, haramzadaya”(١)

Qüreyş rəhbərlərindən biri olan Vəlid ibn Müğeyrə camaata deyirdi: Necə məhəmmədə vəhy olur, amma Qüreyşin ağası olan mənə və Səqif tayfasının rəhbəri Əmr ibn Umeyrə vəhy olmasın. Halbuki bizim hər ikimiz Məkkə və Taifin :böyüklərindənik. Bu haqda aşağıdakı ayə nazil oldu

Və yenə dedilər niyə bu Quran Məkkə və Taifin iki böyüyünə nazil olmadı...” (٢) sonra“ .”buyurur: “Və İlahi rəhmət topladıqları (dünya malından) şeylərdən daha yaxşıdır

Übəy ibn Xələf və Üqbət ibn Əbi Muit

Əbi və Üqbə qədimdən birbiri ilə dost idilər. Ara-sıra Üqbə peyğəmbərin məclisinə gələr, o həzrətin oxuduğu Quran ayələri və sözlərinə qulaq asardı. Bu xəbər Əbi ibn Xələfin qulağına çatdı. O, Üqbənin yanına gəlib ona dedi: Eşitmişəm Məhəmməd ilə oturub- durursan və sözlərinə qulaq asırsan! Bundan sonra əgər onunla əyləşib onu dinləsən və ondan sonra onun üzünə tüpürməsən (Allahım bu və bu cür sözlərə görə bizi bağışla və bizə günah yazma. Çünki biz yalnız və yalnız əsərin orjinallığına xələl dəyməsin deyə bu sözləri yazmaq məcburiyyətindəyik – mütərcim) səninlə danışmayacağam və üzünə belə baxmayacağam... – bu barədə möhkəmcə and içdi – Üqbə ibn Əbi Muitdə Allah lənət etsin – bu işi öhdəsinə aldı və onu yerinə yetirdi. Allah- :Təalada o iki şəxs barəsində bu ayəni nazil etdi

O gün zalim əllərini çeynəyib deyəcəkdir” Kaş ki mən Peyğəmbər ilə dost olub ona“ (itaət yolunu tutaydım...” sonra buyurur “şeytan insanı yoldan çıxarandır”(٣

Həmin Ubəy ibn Xələf çürümüş sümüyü götürüb peyğəmbərin yanına gələrək dedi: Ey Məhəmməd sən elə düşünürsən ki, Allah bu sümük torpağa qarışıb çürüdükdən sonra onu yenə də



---

Qələm surəsi ١٠- ١٣- cü ayələr. Bu arada qeyd etmək lazımdır ki, burada ibn . [١] -١ İshaq “zənim” sözü barəsində tədqiqat aparıb ki, istəyən Sirənin I cildinin ٣۶٠- cı

dirildər? (bu sözü dedi) Sonra o sümyü öz əlində sıxıb kül elədi və ağzı ilə üfürüb .peyğəmbərə tərəf tökdü

Əziz İslam peyğəmbəri buyurdu: Bəli mən bu sözü deyirəm. Allah bu sümüyü dirildər və səni də bu hala gəldikdən sonra yenə də dirildər və cəhənnəmə aparar. Übəy barəsində bu ayə nazil oldu: "Öz yaradılışını unudub. Çürümüş sümükləri kim dirildə bilər? deyə hələ bizə məsəl çəkdi. De: "Onları ilk dəfə yoxdan yaradan ki, sizin üçün (yaşıl ağacdan od əmələ gətirdi. Budur siz indi ondan od yandırırsınız".(١)

### MÜBARƏK KAFİRUN SURƏSİNİN NAZIL OLMA SƏBƏBİ

Bir gün əziz İslam peyğəmbəri təvaf edərkən Qreyşin başçılarından olan Əsvəd ibn Mütəllib, Vəlid ibn Müğeyrə, Üməyyə ibn Xələf və As ibn Vail o həzrətlə qarşılaşıb dedilər: Ey Məhəmməd gəl biz sənin pərəstiş etdiyinə pərəstiş edək və səndə bizim pərəstiş etdiklərimizə pərəstiş et və nəticədə aramızda olan ixtilaflar aradan qalxsın. Bundan əlavə əgər sənin pərəstiş etdiyin bizim pərəstiş etdiyimizdən daha yaxşı olsa !biz faydalanmış oluruq. Yox əgər əksinə olsa sən də faydasız qalmamısan

Sonra bu mübarək surə nazil oldu: "De ey kafirlər mən sizin pərəstiş etdiyinizi heç vaxt pərəstiş etmərəm və siz də mənim pərəstiş etdiyim bir olan Allaha pərəstiş etməyəcəksən. Nə mən sizin batil olan Allahlarınıza ibadət edirəm və nə siz mənim bir olan Allahıma ibadət edəcəksiniz. Bəs sizin dininiz sizin üçün qalsın və mənim dinim mənim üçün". Əgər sizin Allaha pərəstiş etməyiniz mənim sizin dininizə pərəstiş etməyə bağlıdırsa onda mən sizin dininizə pərəstiş etməyəcəm. Sizin dininiz özünüz .üçün mənim dinim mənimçün

### ƏBU CƏHLİN SÖZÜ VƏ NAZİL OLAN AYƏ

AllahTəala cəhənnəm haqqında öz əziz peyğəmbərinə ayələr nazil etdi. Bu qeyd etdiyimiz ayələrin içərisində "Zəqqum" ağacından da söhbət açmışdı. Əbu Cəhl ((həmişə fürsət axtarırdı ki, peyğəmbərin təbliğatını gözdən salsın



---

.Yasin surəsi ٧٨- ٨٠- cı ayələr . [١]-١

müşriklərə dedi: Ey Qüreyş tayfası heç bilirsiniz Məhəmmədin sizi qorxutduğu o zəqqum ağacı nədir? Dedilər: Yox. Dedi: Zəqqum kərə və yağ ilə qarışmış əcvə (١) xurmasıdır. And olsun Allaha ki, əgər ondan tapsam çox böyük iştahla onu yeyərəm. Sonra bu ayələr nazil oldu: “Həqiqətən zəqqum ağacı günahkar kimsənin yeməyidir! O (ərinmiş mis kimi qarınlarda qaynar” yəni bu onun güman etdiyi kimi deyil.(٢

Və habelə bu barədə ayə nazil oldu: “Quranda lənətlə xatırlanan ağac ki, biz onu xatırlamaqla onları qorxuduruq, amma onlar üçün möhkəm inkar və tüğyandan başqa (bir şey artırmaz”.(٣

## ƏBƏSƏ SURƏSİNİN NAZİL OLMA SƏBƏBİ

Bir gün İslam peyğəmbəri dayanmış və Vəlid ibn Müğeyrə ilə söhbət edir və onun müan olmasına ümid edirdi. Bu halda kor olan Ümm Məktum oğlu oraya gələrək (çünki peyğəmbərin kiminlə söhbət etməsindən və eləcədə peyğəmbərin məqsədinin nə .olduğundan xəbərsiz halda) dedi: Ey Məhəmməd mənə Quranı öyrət

Ümm Məktum oğlunun bu hərəkəti peyğəmbərin xoşuna gəlmədi və hətta onu narahat etdi. Çünki o həzrətin Vəlid ibn Müğeyrəni müan etməsinə maneə olurdu. Peyğəmbər sakit qaldı. Ümm Məktum oğlu dediklərini təkrarladı, ikiüç dəfə peyğəmbərdən bu xahişi etdi. Belə olduqda peyğəmbər üzünü çevirib oradan uzaqlaşdı. AllahTəala bu mübarək surəni nazil etdi: “Qaşqabağını töküb üzünü çevirdi. Yanına korun gəlməsinə görə”... sonra buyurur: “O ilahi ayələr əziz məktublarda (Lohe məhfuz və ya səmavi kitablar), və o səhifələr çox pak və mohtərəmdirlər (yalan və (səhvdən)(٤

Məqsəd budur ki, ey peyğəmbər biz səni bütün insanları qorxutmağa və muştuluq verməyə göndərdik və səni bu və ya



---

Əcvə Mədinə şəhərində bitən xurmanın adıdır. O şəhərin ən yaxşı xurması . [١] -١ .hesab olunur

Duxan surəsinin ٤٣- ٤٥- ci ayələri, ibn İshaq burada “Məhəl” üçün də təfsir qeyd . [٢] -٢

.etmişdir. Sirənin I cildi ۳۶۳- cü səhifə

.İsra surəsi ۶۰- cı ayə . [۳] -۳

.Əbəsə surəsi ۱۱۴- cü ayələr . [۴] -۴

onunla konkretləşdirməmişik. Elə isə sənin sözlərini eşitmək istəyənlərin qarşısını alma .(yəni Ümm Məktum oğlunun) və özünü ona meyli olmayana (yəni Vəlidə) həsr etdin

İbn Hişam rəvayət edir ki, Ümm Məktub oğlu Əmr ibn Ləvi qəbiləsindəndir adı isə .Əbdullah olmuşdur və bəzi rəvayətlərə görə isə adı Əmr olmuşdur



## EFİOPİYAYA MÜHACİRƏT EDƏNLƏRİN BİR HİSSƏSİNİN MƏKKƏ ŞƏHƏRİNƏ GERİ DÖNMƏSİ

Əvvəllərdə qeyd etdiyimiz kimi Efiopiyaya hicrət edənlər o ölkənin padşahı Nəcaşinin himayəsində əminamanlıqla yaşayırdılar. Nəhayət onlara xəbər çatdı ki, bütün Məkkə müşrikləri İslam dinini qəbul ediblər. Bu yalan şayiəni araşdırmadan mühacirlərin bir hissəsi səfərə tədarük görüb Məkkəyə tərəf yola düşdülər. Məkkə şəhərinə yaxınlaşdıqda bildilər ki, bu xəbər yalandır və Məkkə müşrikləri müançılığı qəbul etməyiblər. Buna görə də onların bəziləri gizlin surətdə Məkkəyə daxil oldular! Bəziləri .isə Qüreyş başçılarının himayə və pənahı altında şəhərə daxil oldular

İndi isə Məkkəyə qayıdanların qüreyş tayfaları ardıcıllığı ilə adlarını qeyd edirik. Əlbəttə qeyd etmək lazımdır ki, Məkkəyə qayıdan bu mühacirlərin bəziləri Mədinə mühacirlərinin dəstəsində idilər. Bəzilərini Məkkədə həbs etmişdilər ki, bədr və digər döyüşlərdə də iştirak edə bilmədilər. Onların bəziləri Məkkədə qaldılar və ölənə qədər Mədinəyə hicrət edə bilmədilər. Hər halda Bəni Əbdü Şəms və həmpeymanlarından :olan mühacirlər aşağıdakılar idilər

Osman ibn Əfvan İslam peyğəmbərinin qızı olan həyat yoldaşı Rüqəyyə ilə

Əbu Huzeyfə ibn Ütbə həyat yoldaşı Suheyl ibn Əmrunun qızı Səhlə ilə

.Əbdullah ibn Cəheş ibn Reab – onların həmpeymanlarından idi

Bəni Nofəldən heç kim qayıtmadı. Yalnız onların həmpeymanlarından biri Qeys ibn .Eylan qəbiləsindən olan Ütbə ibn Ğəzvan Efiopiyadan geri döndü

Bəni Əsəddən: Zübeyr ibn Əvam

.Əbduddardan: Musəb ibn Umeyr ibn Vəhəb

Bəni Zöhrə ibn Kəlabdan: Əbdur- rəhman ibn Of, Miqdad ibn Əmr və Əbdullah ibn .Məsud ki, axırıncı iki nəfər onların həmpeymanlarından idi

Bəni Məxzundan: Əbu ə həyat yoldaşı Əbu Üməyyənin qızı ə ilə, Şəmas ibn Osman, ə ibn Hişam əmisi onu Məkkədə həbs etdi. Xəndək döyüşündən sonraya qədər. Məkkədə idi və Mədinəyə gedə bilmirdi – Əyaş ibn Əbi Rəbiə Mədinəyə hicrət etdi amma onun ana tərəfdən qardaşları olan Əbu Cəhl və Haris arxasıyca gedərək onu Məkkəyə qaytardılar və Xəndək döyüşündən sonraya qədər Mədinəyə gedə bilmədi. Əmmar ibn Yasir də onların həmpeymanlarından idi. Əmmarın Efiopiyaya hicrət .etməsi şübhəlidir. Habelə onların digər həmpeymanlarından olan Motəb ibn Of

Bəni Cəməhdən: Osman ibn Məzun, oğlu Saib ibn Osman və qardaşları Qədamə ibn .Məzun, Əbdullah ibn Məzun

Bəni Səhmdən: Xumeys ibn Huzafə, Hişam ibn As ibn Vail – onu Məkkədə həbs .etmişdilər və Xəndək döyüşündən sonraya qədər Mədinəyə gedə bilməmişdi

Bəni Ədiddən: Amir ibn Rəbiə bu qəbilənin həmpeymanları cərgəsində idi – həyat .yoldaşı Əbi Həsəmə qızı Leyli ilə

Bəni Amirdən: Əbdullah ibn Məkrəmə və Əbdullah ibn Suheyl – Məkkədə həbs edilmiş idi. Bədr döyüşünə qədər peyğəmbərin dəstəsinə qoşuldu. Əbu Səbrə ibn Əbi Rəhəm həyat yoldaşı Suheyl ibn Əmrunun qızı Ümm Külsüm ilə, Sokran ibn Əmru həyat yoldaşı Zumə qızı Sodə ilə Sokran Məkkəyə qayıtdıqdan sonra Mədinəyə hicrət etməzdən öncə dünyasını dəyişdi. İslam peyğəmbəri onun həyat yoldaşı Sudə ilə ailə .həyatı qurdu – onların həmpeymanlarından olan Səd ibn Xolə

Bəni Haris ibn Fəhrdən: Əbu Ubeydə ibn Cərrah, Əmr ibn Haris, Suheyl ibn Bəyza və .Əmr ibn Əbi Sorh

Ümumiyyətlə bu səfərdə əgər qadınları hesaba almasaq otuz üç nəfər Məkkəyə qayıtmışdı. İki nəfər Məkkə böyüklərinə sığındılar ki, onlardan biri Osman ibn Məzun idi ki, Vəlid ibn Müğeyrənin pənahında digəri isə Əbu ə idi ki, anası Bərrə Əbdülmütəllibin

Osman ibn Məzunun Vəlidin pənahından çıxmasına səbəb olan əhvalat

Osman ibn Məzun Vəlid ibn Müğeyrənin pənahında rahat və təhlükəsiz həyat sürürdü. Amma müşriklərin pənahsız müanlara verdiyi işgəncələr nəticəsində onların acınacaqlı halına görə bərk narahat olurdu. Buna görə də öz- özlüyündə dedi: Müşrik bir şəxsın pənahında hər səhər- axşam Məkkədə rahat gəzməyim amma Allah yolunda dindaşlarım və dostlarımın bu qədər işgəncəyə məruz qalması mənim üçün böyük bir eybdir. Buna görə də Vəlid ibn Müğeyrənin yanına gedib ona dedi: Ey Vəlid sənin pənahında olmaq başa çatdı, bundan sonra sənin pənahında yaşamayacağam! Vəlid dedi: Niyə? Olmaya kimsə səni incidib? Dedi: Yox. Amma mən istəyirəm ki, yalnız böyük Allahımın pənahında olam və ondan başqa kimsənin pənahında olmağı xoşlamıram Vəlid dedi: Sənə pənah verməyim aşkar şəkildə həyata keçirilib və mən onu Məscidul- Həramda elan etdiyim üçün, onu geri götürmək üçün yenə də məscidə getməliyik ki, !pənahımda olmadığını elan edim

Osman ibn Məzun Vəlid ilə birlikdə məscidə tərəf yola düşdülər. Oraya çatdıqda Vəlid qüreyşin arasında dayanıb dedi: Osman ibn Məzun bundan sonra mənim pənahımda deyil, onun özü bu pənahdan boyun qaçırır. Osman dedi: Bəli düz deyir. Mən onun pənahında olduğum müddətdə onun vəfalı və alicənab şəxs olduğunu müşahidə etdim. Lakin mən Allahdan başqa heç kimin pənahında olmaq istəmədiyim üçün onun .pənahından xaric oluram

O iclas bir- birinə qarışdı. Osman Lübeyd ibn Rəbiə (tanınmış şair) ilə birlikdə digər bir məclisə gəldilər. Lübeyd o məclisdə şerlər oxudu ki, o cümlədən bu şer də onlardan biri :idi

ألا كل شی ما خلاالله باطل   و كل نعیم لا محاله زائل.(۱)

Osman birinci misranı eşitdikdən sonra Lübeydə dedi: Düz deyirsən. Belədir! Amma ikinci misranı eşitdikdən sonra isə dedi: yalan deyirsən (bütün nemətlər fani deyil). Çünki behişt

Yəni agah olun ki, Allahdan başqa hər bir şey batildir və hər bir nemətin sonu . [١] -١
.fanidir

nemətləri fani deyil! Lübeyd dedi: Ey Qüreyş and olsun Allaha ki, hələ bu vaxta qədər sizin məclisinizdə kimsə məni incitməmişdi. Yenicə meydana atılan bu kişi kimdir? Onlardan bir kişi dedi: Ey Lübeyd sən bu kişinin sözlərini özünə aid etmə. Bu axmaq kişi şəhərin digər axmaqları ilə birlikdə dindən çıxıb və atalarının dininə arxa çeviriblər! Osman o kişiyə cavab verdi: O kişi də Osmana kobudluq etdi. Nəhayət hər ikisinin arasında mübahisə başlandı və birbirini döyməyə başladılar. O kişi qalxıb Osmanın qulağına elə bir möhkəm şillə vurdu ki, onun bir gözü göyərdi. Yaxınlıqda olan Vəlid ibn Müğeyrə bu hadisəni gördükdə üzünü Osmana tutub dedi: Əgər gözünü istəsəydin möhkəm pənahımdan kənara çıxmazdın! Osman dedi: And olsun Allaha ki, mənim sağlam gözüm də o biri gözüm kimi Allah yolunda müsibətə düçar olmaq istəyir. Mən şükür olsun Allaha ki, elə bir Allahın pənahındayam ki, səndən daha güclü və qüvvətlidir! Vəlid dedi: İndi yenə istəsən mənim pənahıma qayıda bilərsən? Osman .dedi: Yox ehtiyacım yoxdur

### ƏBU SƏLƏMƏ, ƏBU TALİBİN PƏNAHINDA

Əbu Sələmə, Əbu Talibin pənahında olduqdan sonra bəni Məxzumdan bir qrup insan Əbu Talibin yanına gəlib dedilər: Sən qardaşın oğlu Məhəmmədi öz pənahına daxil etdin və beləliklə biz ona əziyyət edə bilmədik. Sən bu miqdarla kifayətlənməyib bizim qəbilədən bir nəfərə də pənah verdin. Əbu Talib dedi: O mənim bacımoğlu olduğu üçün mənə sığındı, əgər mən bacımoğluna sığınacaq verməsəm, qardaşım oğlunuda pənahımda saxlaya bilmərəm. Əbu ləhəb, bəni Məkzunun Əbu Talibə etiraz etməsini eşidən kimi Qüreyşin yanına gəlib qışqırdı: Ey Qüreyş and olsun Allaha ki, bu qoca kişiyə kobudluq edirsiniz, həmişə onun sığınacaq verməsinə irad tutursunuz. And olsun Allaha ki, əgər bu davranışınızdan əl çəkməsəniz, mən də onu müdafiə etməyə qalxacağam ki, öz pənah verdiyi insanları daha yaxşı müdafiə edə bilsin. Qüreyş vəziyyəti belə gördükdə dedilər: Biz bundan sonra sənin narahatçılığına səbəb olacaq belə addım atmarıq. Beləliklə peyğəmbərlə düşmənçiliydə eyni mövqedə olduqları Əbu

Ləhəbi sakitləşdirdilər. Əbu Talib, Əbu Ləhəbin sözlərini və onu müdafiə etməsini gördükdə bəlkə peyğəmbəri müdafiə etmək məsələsində Haşim övladları ilə müxalifətdən əl çəkər deyə şerlər söylədi ki, o şerlərdə Əbu Ləhəbi özündən və peyğəmbərdən müdafiə etməyə səsləyirdi. Ancaq bu şerlər Əbu Ləhəbə təsir etmədi .və o eləcə müxalifətçiliyində davam edirdi

Əbu Bəkrin Əhabiş qəbilələrinin böyüyü Malik ibn Zəğtəyin pənahında yaşaması

Müşriklərin əzab- əziyyətindən təngə gələn Əbubəkr, İslam peyğəmbərinin yanına gəlib Məkkədən hicrət etməsinə icazə istədi. Həzrət ona icazə verdi və Əbu Bəkr Məkkə şəhərindən xaric oldu. Bir iki gün yol getdikdən sonra Malik ibn Zəğtə ilə .rastlaşdı

O zaman Malik ibn Zəğtə Əhabiş qəbilələrinin böyüyü idi. Bu qəbilələr üç qəbilədən ibarət idi. Onlar Bənul Haris, Hun ibn Xəzimə və Bənulmustələq tayfaları idilər ki, bu üç qəbilə Məkkənin "Əhbəş" dərəsində həmpeyman olduqları üçün onlara Əhabiş .deyirdilər

Malik ibn Zəğtə Əbu Bəkrə dedi: Hara gedirsən? Əbu Bəkr dedi: Camaatı incitdilər, Məkkə şəhərini mənə dar etdilər və nəhayət məni şəhərdən kənarlaşdırdılar. İbn Zəğtə dedi: Məkkəyə qayıt və mənim pənahımda yaşa. Beləliklə Əbu Bəkri şəhərə qaytardı və Qüreyşə bildirdi ki, mən Əbu Bəkrə sığınacaq verdiyim üçün kimsə onu .incidə bilməz

Əb Bəkr gündüzlər evinin qapısında əyləşər Quran oxumaqla məşqul olurdu. Oradan keçən qadın və uşaqlar Quran eşitmək və ona tamaşa etmək üçün ayaq saxlayırdılar. Elə buna görə də Qüreyş rəhbərlərindən bir hissəsi Malik ibn Ziğtənin yanına gedib .şikayət etdilər

Malik Əbu Bəkrin yanına gəlib dedi: Ey Əbu Bəkr biz sənə pənah vermədik ki, cəmiyyəti incidəsən, öz evinin içərisinə gir və istədiyini et! Həmin hadisə nəticəsində Əbu Bəkr .Malik ibn Ziğtənin pənahından xaric oldu və yenidən qüreyşin əziyyətinə düçar oldu

Qüreyşin mənfur əhdnaməni cırmaq qərarı

Əvvəlki səhifələrdə qeyd etmişdik ki, Qüreyş İslam peyğəmbərini məğlub etmək, Əbu Talibi və digər Haşim

övladlarını bezdirmək üçün əhdnamə imzalayıb. Kəbənin divarından asdılar ki, bundan sonra Haşim övladları ilə müamilə (alış- veriş ) etmək olmaz, onlara qız verib, onlardan .qız almaq olmaz, nə onlara bir şey satın nədə ki, onlardan bir şey alın

İki və ya üç il bu minvalla keçdi. Əhdnamənin maddələrinə qəti şəkildə əməl olunurdu. Nəhayət Qüreyşdən bir neçə nəfər bu müddət ərzində Haşim övladlarının necə əzablarla üzləşdiyini dözməyib, qərara aldılar ki, o vərəqi məhv edib və bu pis ləkəni öz .simalarından uzaqlaşdırsınlar

Başqaları ilə müqayisədə bu barədə daha çox canfəşanlıq edən Hişam ibn Əmr ibn Rəbiə idi. Bunun səbəbi isə ana tərəfindən Haşim ibn Əbdu Manafın soy- kökündən olması idi. Eyni zamanda Qüreyş arasında hörmət və izzət sahibi idi. Bəni Haşim dərədə qaldığı zaman gecə gizlincə gələr, dəvəyə ərzaq, yağ və yemək yükləyər və dərənin ağzına qədər dəvənin yüyənindən tutub gətirər və orada yüyəni dəvənin boynuna salar və dəvəyə tərəf yola salardı. Nəticədə olanlar da dərədə yemək .yeyərdi

O cümlədən Hişam ibn Əmr Əbdülmütəllibin qızı Atikənin övladı olan Züheyr ibn Əbi Üməyyənin yanına gəlib dedi: Ey Züheyr nə vaxta qədər sən bu məyusedici mənzərəyə tamaşa edəcəksən? Sən rahat formada yemək yeyirsən, paltar geyinirsən, qadınlar ilə ailə həyatı qurursan! Amma özün bilirsən ki, qohumların (Haşim övladları dayıları idi) hansı çətin vəziyyətdə yaşayırlar. Nə onlara qız verir, nə də onlardan qız alırlar. (Sən bu vəziyyətə razısan?!) And olsun Allaha ki, əgər bunlar Əbu Cəhlin qohumları olsaydı və sən onları dəvət etsəydin ki, gəlin belə bir əhdnamə .imzalayaq, o heç bir zaman qəbul etməzdi

Züheyr dedi: Ey Hişam mən təkəm və tək adam nə iş görə bilər ki? And olsun Allaha ki, əgər başqa bir nəfər də mənə qoşulsaydı mən o mənfur əhdnaməni aradan qaldırmağa cəhd edərdim! Hişam dedi: O dediyin bir nəfər mənəm və sənə kömək !etməyə hazıram! Züheyr dedi: Üçüncü şəxsi tap ki, bizə kömək etsin

Hişam Mutəm ibn Ədinin yanına gəlib dedi: Ey Mutəm sən razısan ki, Haşim övladlarının bir hissəsi məhv olsun və sən də

tamaşa edəsən və digər qüreyşlə birgə buna razı olasan? Dedi: Mən təklikdə heç nə edə bilmərəm. Hişam dedi: Başqaları da səninlə həmfikirdilər. Mutəm dedi: Kimdir? Dedi: Mən. Mütəm dedi: Üçüncü nəfər də olmalıdır. Hişam dedi: Tapmışam. Dedi: Kimdir? Hişam dedi: Züheyr ibn Əbi Üməyyə. Mütəm dedi: Başqa bir nəfəri də tap ki, .dörd nəfər olaq

Hişam Əbulbəxtərinin yanına gedib onuda razı salaraq bu işdə Züheyr və Mutəmin də .yardım edəcəyini ona bildirdi. Əbulbəxtəri dedi: Başqa birini də tap ki, beş nəfər olaq

Hişam Zümər ibn Əsvədin yanına gələrək onu da razı saldı. Zumə soruşdu: Bu işdə bizimlə həmfikir olan digər şəxslər də vardırmı? Hişam bəli deyib, bir neçə nəfərin adını .çəkdi

Onlar son qərara gəlmək üçün Məkkənin yuxarı tərəfindəki "Həcun" dağının ətəyində yığışmağa söz verdilər. Nəhayət oraya toplaşıb qərara gəldilər ki, sabah sübh Məscidul- Həramda toplaşsınlar. Züheyr ibn Əbi Üməyyə ilkin addımı atmağı əhdnamənin parça- parça edilməsi və peymanın sındırılması barəsində danışmağı .öhdəsinə götürdü

Səhər açılan kimi Züheyr əyninə bir kətan parça geyinib, Kəbə evinin kənarına gələrək yeddi dəfə təvaf etdikdən sonra üzünü camaata tutub dedi: Ey Məkkə əhalisi biz sərbəst formada yeyək, paltar geyək, amma Haşim övladları paltarsız və yeməksiz məhv olsunlar? And olsun Allaha ki, zülmkar müqavilə yazılmış bu vərəqi məhv .etməyincə mübarizəni dayandırmayacağam

Məscidin bir küncündə əyləşən Əbu Cəhl qışqıraraq dedi: And olsun Allaha ki, yalan dedin və heç kim onu məhv edə bilməz. Zumə ibn Əsvəd dedi: Yalanı sən danışırsan, and olsun Allaha ki, biz o hazır olan gündən onu imzalamaq istəmirdik. Əlbəxtəri digər küncdən fəryad etdi: Zumə düz deyir. Biz əvvəlcədən onun yazılmasına razı deyildik. Mutəm ibn Ədi dedi: Sizin hər ikiniz düz deyirsiniz və hər kim bundan başqa cür danışsa yalançıdır. Biz bu müqavilədə yazılanlardan təngə gəlmişik. Hişam ibn Əmr da buna oxşar sözlər dedi. Əbu Cəhl dedi: Bu sözlər əvvəlcədən məsləhətləşməniz əsasında həyata keçirilir və siz gecə bu barədə qərara gəlmisiniz. Bütün bu söhbətlər zamanı Əbu Talib məscidin küncündə əyləşmiş və

prosesləri izləyirdi. Hər halda Mutəm ibn Ədi Kəbənin divarı ilə yuxarı qalxıb "بسمك اللهم" əhdnaməni aşağı saldı. Onu cırmaq istərkən gördülər ki, orada yazılan .sözündən başqa bütün mətni qarışqalar yeyibdir

Bu hadisə barəsində İslam peyğəmbəri qabaqcadan xəbər vermiş və əmisi Əbu Talibə buyurmuşdu: Həqiqətən mənim Allahım qarışqalara tapşırmış ki, əhdnamədə Allah sözündən başqa bütün sözləri yesinlər. Bu sözü eşidən Əbu Talib Qüreyşin yanına gələrək dedi: Qardaşım oğlu mənə belə bir xəbər demişdir. İndi o əhdnaməni gətirin, əgər doğru olarsa bizə zülm etməkdən və bizimlə alveri qadağan etməkdən əl çəkiniz, yox əgər sözləri yalan çıxarsa onu sizə təhvil verərəm. Qüreyş bu təkliflə razılaşdılar. Əhdnaməni gətirdikdə gördülər ki, peyğəmbərin dediyi kimidir. Amma yenə də öz zülmkarlıqlarından əl çəkməyib əzab- əziyyəti artırdılar. Bu hadisə səbəb oldu ki, .(dediyimiz kimi) müqaviləni ləğv etmək və əhdnaməni cırmaq fikrinə düşsünlər

Əhdnaməni cırmaq prosesi başa çatdıqdan sonra Əbu Talib bu işi görən o bir neçə (nəfər barəsində qəsidə dedi və o qəsidədə onları bu addımlarına görə mədh etdi.(١

Habelə Həssan ibn Sabit Mutəm ibn Ədi ölərkən şerlər qoşdu ki, orada Mutəmin əhdnaməni ləğv etmək üçün atdığı addımlar mədh edilibdir. Eyni zamanda Hişam ibn Əmrin mədhində də şerlər deyibdir. O cümlədən o Mutəmin mədhində aşağıdakı şeri .demişdir ki, onu peyğəmbərə sığınacaq verdiyinə görə tərifləmişdir

أجرت رسول الله منهم فأصبحوا

عبيدك ما لبى و أحرما

Mutəm ibn Ədinin İslam peyğəmbərinə sığınacaq verməsi belə olmuşdu ki, peyğəmbər Taifə olan səfərindən qayıtdıqdan sonra Məkkəyə gəlməmiş, Həra dağına yollandı. Orada bir nəfəri Əxnəs ibn Şəriq və Suheyl ibn Əmrin yanına göndərdi ki, onların himayəsində Məkkə şəhərinə daxil ola bilsin. Lakin birincisi cavab verdi ki, mən Qüreyşlə həmpeymanam və ərəb qanunlarına

Qeyd etdiyimiz qəsidədən və habelə Həssanın şerlərindən xəbərdar olmaq . [۱] -۱
.istəyirsinizsə ۳۷۸- ۳۸۱- ci səhifələrə müraciət edə bilərsiniz

görə həmpeyman kimsəni öz himayəsinə ala bilməz. İkincisi isə cavab verdi ki, Amir övladları Kəb övladlarını əleyhinə kimsəyə sığınacaq verə bilməz. Buna görə də İslam peyğəmbəri Mütəm ibn Ədinin yanına adam göndərərək ondan Məkkəyə daxil olmasına görə sığınacaq verməsini istədi. O qəbul etdi. Məkkəyə qayıdıb silahını götürdü və qəbiləsinin də kişilərini silahlandıraraq onlarla birlikdə MəscidulHərama gəldilər. Sonra peyğəmbərin arxasıyca adam göndərdi ki, indi şəhərə gələ bilərsən. Beləliklə həzrət məscidə gedib yeddi dəfə təvaf edib, namaz qıldıqdan sonra öz evinə .getdi

### TUFEYL İBN ƏMR DUSİNİN MÜSƏLMANLIĞI QƏBUL ETMƏSİ

Peyğəmbərə zərər yetirə bilməyən Qüreyş, insanları həzrətin ətrafından uzaqlaşdırmağa çalışır və mümkün qədər ərəblərin o həzrətlə ünsiyyətinə mane .olurdular

Ərəblər arasında Dus qəbiləsindən Tufeyl ibn Əmr adlı biri yaşayırdı. O hörmətli, ağıllı və şair bir insan idi. Tüfeyl Məkkəyə səfər etdi. Qüreyş onun Məkkəyə gəldiyini eşitdikdə yanına gələrək dedilər: Sən alicənab və alim insansan ki, bizim şəhərə gəlmisən. Biz öz qəbiləmizin düçar olduğu kimi sənin də düçar olmağını istəmədiyimiz üçün buraya gəlmişik ki, sənə bir sifariş edək. O sifariş bundan ibarətdir ki, bizim şəhərdə natiq bir kişi öz sehirli nitqləri ilə işimizi çətinliyə salıb, bizim cəmiyyəti pərakəndə edərək insanları bizimlə düşmənçiliyə yönəldib, nə qardaş qardaş ilə dostluq edir, nə də ki, qadın əri ilə. İndi ehtiyatlı ol və məbada onunla söhbət edəsən. !Əgər sehirli kəlmələri sənə təsir etsə öz qəbiləni də pərakəndəliyə düçar edəcəksən

Tufeyl ibn Əmr deyir: Mənimlə o qədər bu barədə danışdılar ki, mən qərara aldım ki, o həzrət ilə ünsiyyətə girməyim və onunla bir kəlmə də söhbət etməyim. Hətta təsadüfən onunla rastlaşıb sözlərini eşitməməyim üçün qulaqlarıma pambıq tıxıb MəscidulHərama yollandım. Kəbəni təvaf edərkən Kəbə yaxınlığında namaz qılan peyğəmbəri gördüm. AllahTəala mənim hidayət olmağımı iradə etdiyi üçün ona yaxınlaşaraq ürəyə yatan sözlərinə qulaq asdım. Doğrudan da nə yaxşı sözlər və nə .gözəl bəyan idi

Özözümə dedim: Anam matəmimə ağlasın. Mən ki, ağıllı və şair bir insanam niyə onun yanına gedib ona qulaq asmıram ki? Əgər düz olsa qəbul edərəm, düz olmasa da yoluma davam edərəm! Orada gözlədim, peyğəmbər evinə qayıdanda mən də arxasıyca gedib ona dedim: Ey Məhəmməd həqiqətən sənin tayfan mənə beləcə sözlər dedilər: And olsun Allaha ki, bu barədə o qədər mənə tapşırdılar və səninlə danışmaqdan qorxutdular ki, mən sənin sözlərin mənə təsir etməsin deyə qulaqlarıma pambıq taxdım. Amma ilahi təqdirə görə ürəyə yatan sözlərini eşitdim. İndi ilahi tərəfindən sənə gələnləri mənə də təqdim elə. O həzrət İslamı mənə təqdim etdi və Qurandan mənə ayələr oxudu ki, and olsun Allaha ki, o vaxta qədər onlardan daha .yaxşı söz eşitməmişdim və onun dedikləri qanundan daha ədalətlisini eşitməmiş idim

Dərhal o həzrətə iman gətirib müan oldum. Sonra ərz etdim: Ya Rəsuləllah mən öz tayfam arasında hörmət və izzətli insanam. Onlara mənə tabedirlər. İndi onların yanına qayıdıb onları da İslam dininə dəvət etmək istəyirəm. Allahdan istə ki, mənim üçün bir əlamət müəyyən etsin ki, o əlamət mənim din təbliğatımda və İslama dəvət etməyimdə yardımçı olsun. O həzrət dua edib buyurdu: Ilahi pərvərdigara Tufeyl üçün bir nişanə qərar ver. Mən öz qəbiləmə doğru hərəkət etdim. Onların olduğu dağın ətəyinə çatdıqda birdənbirə mənim alnımda, gözlərimin arasında çırağ kimi işıq verən bir nur peyda oldu. Dedim: İlahi pərvərdigara bu nuru üzümdən digər bir yerimə köçürt. Çünki qorxuram ki, onlar desinlər: Bizim dini tərk etdiyinə görə pisi (yara–ekzama– mütərcim) xəstəliyinə düçar olmusan. Birdən o nur şallağımınn baş tərəfində peyda oldu. Baxan hər bir kəs zənn edirdi ki, o nur mənim şallağımın baş tərəfindən .asılmış çırağdır. Beləliklə dağdan enib öz evimə qayıtdım

Mənim dinimi qəbul edən ilk şəxs qoca atam oldu. Dedim: Atacan məndən uzaq ol ki, !artıq sənin ilə mənim aramda ayrılıq yaranıb

?Dedi: Niyə

Dedim: Ona görə ki, mən müanlığı qəbul etmiş və həzrəti Məhəmmədin dininin ardıcılı .olmuşam

.Dedi: Mən də sənin həmin dinini qəbul etmək istəyirəm

Dedim: Elə isə get və qusl aldıqdan sonra əyninə təzə paltar geyib, yanıma gəl ki, dinin .hökmlərini sənə izah edim

O gedib qüsl verib paltarlarını təmizlədikdən sonra yanıma gəldi. Mən İslam hökmlərini .ona izah etdikdə, o müan oldu

Sonra isə həyat yoldaşım gəldikdə ona dedim: Məndən uzaq ol ki, artıq sənin ilə mənim .aramda ayrılıq yaranıb

.Dedi: Niyə? – Atam və anam sənə qurban

Dedim: İslam dini mənim ilə sənin aranda ayrılıq salıb və mən Məhəmmədin dinini .qəbul etmişəm

.Dedi: Mən də sənin dinini qəbul edirəm

Dedim: Elə isə çeşmənin– Zulşəri bütünün yerləşdiyi yer– yanına get və yuyunduqdan .sonra qayıt

?Dedi: Sən Zülşəriyə görə mənim üçün qorxmursan

.Dedim: Yox sənin üçün heç bir qorxu yoxdur və mən sənə zaminəm

Həyat yoldaşım qeyd etdiyim çeşmənin yanına gedib, bədənini yuduqdan sonra geri .döndü. Mən İslam dinini ona izah etdikdən sonra o da müan oldu

Ondan sonra Duş qəbiləsini İslam dininə dəvət etməyə başladım. Amma mənim sözlərim nadir hallarda onların ağlına batırdı. Buna görə də İslam peyğəmbərinin yanına gəlib ona ərz etdim. Dus qəbiləsinin insanları mənim sözlərimi qəbul etmirlər. Dünya məşquliyyəti İslam dininin onların ürəyinə yol tapmasına maneə olur. Allah-Təaladan istə ki, onları hidayət etsin. İslam peyğəmbəri onların barəsində dua edib !dedi: İlahi pərvərdigara Dus qəbiləsini hidayət et

Sonra mənə buyurdu: Onlara tərəf qayıt və onları İslam dininə dəvət et, amma onlarla .güzəştlə davran

Mən qayıtdım və habelə onları İslam dininə dəvət edirdim ki, İslam peyğəmbəri Mədinəyə hicrət etdi: İllər ötdü, Xəndək döyüşündən sonra o həzrət Xeybərə getdikdə .biz də Mədinəyə hicrət etdik

O vaxta qədər Dus qəbiləsindən İslam dinini qəbul edən və mənimlə Mədinəyə hicrət edən ailələrin sayı ۷۰- ۸۰ olardı ki, Xeybərdə İslam peyğəmbərinə qoşulduq. O həzrət .bizi də digər müanlar kimi Xeybər qənimətlərinə şərik etdi

Ondan sonra Mədinədə yaşamağa başladıq. Məkkənin fəthi zamanı İslam peyğəmbərinə ərz etdim: Məni göndər gedim Əmr ibn Həməmə qəbiləsinin bütü .Zilkəfeyni yandırım

Bu təklif qəbul olundu və Tufeyl ibn Əmr qeyd etdiyimiz bütün yanına gələrək ona od :vurub bu şeri oxudu

ميلادنا أقدم من ميلادكا انی حشوت النار فی فؤادكا

Yəni ey Zilkəfeyn bütü mən səni pərəstiş edənlərdən deyiləm və bizim keçmişimiz .səndən qabaqdır və indi də ağzını od ilə dolduracağam

Tufeyl bu hadisədən sonra peyğəmbərin yanına qayıtdı və əziz peyğəmbərin dünyadan köçdüyü günə qədər Mədinədə yaşadı. İslam peyğəmbərinin ilahi rəhmətə qovuşmasından sonra müanlar ilə birlikdə dindən çıxmış mürtədlərlə döyüşdü. O, Yəmaməyə döyüşə getdi. Oğlu Əmr ibn Tufeyldə bu döyüşdə onunla birlikdə idi. Yolda yuxuda gördü ki, başını qırxıb, ağzından çölə quş uçdu və onu görən bir qadın onu !cinsiyyət üzvündə gizlətdi. Oğlu Əmr sürətlə onun arxasıyca gəlsədə ona çatmadı

Bu yuxunu yoldaşlarına danışıb dedi: Onu yozun! Hamı dedilər: Xeyirdir? Tufeyl dedi: Mən özüm onu yozmuşam. Dedilər: Necə? Dedi: Başım qırxılması onun kəsilməsi deməkdir, ağzımdan çıxan quş ruhumun bədənimdən çıxacağı deməkdir, məni öz cinsiyyət üzvündə gizlədən qadın isə yerin məni udmasına işarədir. Əmrin mənə çatmaq üçün etdiyi cəhd isə o deməkdir ki, o şəhadət üçün cəhd etsədə onun bu çalışması faydasızdır. Hər halda Tufeyl bu döyüşdə öldürüldü, oğlu Əmr möhkəm yaralansada amma ölmədi. Bir az sonra sağalıb, Ömərin dövründə baş verən Yərmuk .döyüşündə həlak oldu

### (ƏŞİ İBN QEYSİN ƏHVALATI (TANINMIŞ ŞAİR

Ərəblərin tanınmış şairi Əşi İslam peyğəmbərinə iman gətirmək üçün öz qəbiləsindən çıxıb Məkkəyə tərəf hərəkət etdi. O, peyğəmbərin mədhində bir neçə şer qoşdu(۱) və .onları yolda zümzümə edirdi

[١] -١. Həmin şerlərin məzmunundan xəbərdar olmaq istəyirsinizsə sirənin I cildinin ٣٨۶- ٣٨٧- ci səhifələrinə müraciət edə bilərsiniz.

Məkkə yaxınlıqlarına çatdıqda müşriklərdən biri ilə qarşılaşdı. Həmin şəxs Əsidən soruşdu: Hara getmək fikrindəsən? Dedi: Məkkəyə gedirəm ki, Məhəmmədə iman gətirim! Həmin şəxs (bu sözdən narahat olub, Əşini yoldan qaytarmaq üçün) dedi: Məhəmməd zinanı haram etmişdir! Əşi dedi: And olsun Allaha ki, mənim ona ehtiyacım yoxdur. Dedi: Mey içməyə də icazə vermir! Əşi bir az fikirləşib dedi: Hələ meydən tamamən doymamışam. Bu il öz şəhərimə qayıdım, növbəti ilə qədər badələrlə gözümü doydurar və gələn il onun yanına gəlib İslam dinini qəbul edib müan olaram. Beləliklə gəldiyi yol ilə geri döndü. Lakin həmin il peyğəmbərin yanına gəlməmiş .dünyadan köçdü

### ƏBU CƏHL İLƏ BİR NEÇƏ DƏVƏ SATAN KİŞİNİN DASTANI

Əbu Cəhlin peyğəmbər ilə düşmənçilik etməsi məşhur idi. Onun qədər heç kəsin peyğəmbərlə ədavəti yox idi. Amma bununla belə Allah- Təala həzrətin qorxusunu onun ürəyinə elə salmışdı ki, hər yerdə o həzrəti görsəydi peyğəmbərə təvazö edərdi. Bir gün belə bir hadisə baş verdi. Soy- kökü Firon Əmaliqəsinə gedib çıxan Əraş qəbiləsindən – İraşə qəbiləsi – bir kişi bir neçə dəvəni Məkkəyə gətirib Əbu Cəhlə satdı. Pulları almaq üçün Əbu Cəhlə müraciət etdikdə, bu gün sabah edib, tədricən onun haqqını inkar etdi. Əraşlı kişi Məscidul- Hərama gələrək qüeyşin arasında dayanıb dedi: Ey Qüreyş tayfası mən qərib bir kişiyəm və Əbu Cəhl mənim haqqımı tapdalayıb. Aya sizin içərinizdə elə bir insan tapılar ki, zalimdən məzlumun haqqını .tələb etsin və mənim haqqımı Əbu Cəhldən ala bilsin

Orada iştirak edənlər Əbu Cəhl ilə peyğəmbərin düşmən olduqlarını bildikləri üçün məscidin bir küncündə əyləşmiş həzrəti ona göstərərək rişxənd və kinayə ilə o kişiyə .dedilər: Sənin axtardığın o kişidir, onun yanına get ki, haqqını sənə qaytarsın

Əraşlı kişi İslam peyğəmbərinin yanına gəlib dedi: Ey Allahın bəndəsi mən qərib bir kişiyəm, bu kişi yəni Əbu Cəhl mənim haqqımı tapdalayıbdır. Mən bu insanların yanına ?gedib soruşdum. Görəsən mənim haqqımı ala bilən kimsə vardırmı

Onlar da səni göstərdilər. İndi isə sənin yanına gəlmişəm deyəm ki, Allah sənə rəhmət !etsin hansı vasitə ilə bacarırsansa mənim haqqımı Əbu Cəhldən geri al

İslam peyğəmbəri buyurdu: Gəl onun yanına gedək. Qüreyş o kişinin işinə görə nigaran idilər. Onun peyğəmbərlə məsciddən xaric olduğunu gördükdə peyğəmbərin arxasıyca bir adam göndərdilər ki, görsünlər Əbu Cəhl ilə o həzrətin işinin sonu necə ?olacaq

İslam peyğəmbəri o kişi ilə birlikdə Əbu Cəhlin evinə gəlib qapısını döydülər. Əbu Cəhl içəridən qışqırdı: Kimdir? Buyurdu: Məhəmmədəm, çıx bayıra. Qorxudan rəngi qaçmış !Əbu Cəhl tələsik qapını açdı. Peyğəmbər buyurdu: Bu kişinin haqqını ona qaytar

Əbu Cəhl dedi: İtaət edirəm, burda dayan haqqını ödəyirəm. Həzrət gözlədi. Əbu Cəhl evin içərisinə keçdi. Bir az sonra çölə çıxıb bütün dəvələrin pulu olan kisəni o kişiyə .verdi. İslam peyğəmbəri o kişiyə buyurdu: Öz haqqını al və işlərinin arxasıyca yola düş

Əraşlı kişi pulları alıb Məscidul- Həramda qüreyşlilərin yanına gəlib dedi: Allah bu kişiyə xeyr savab versin ki, mənim haqqımı aldı! Əraşlı kişinin sözləri Qüreyş üçün inanılası deyildi. Amma onların göndərdikləri də geri qayıtdı. Ondan soruşdular: Nə oldu? Bir aləm təəccüblə dedi: Doğrudanda inanılmaz bir şeylə rastlaşdım. And olsun Allaha ki, Məhəmməd Əbu Cəhlin qapısını döydükdə o ruhsuz heykəl kimi evdən çıxdı. Məhəmməd ona dedi: Bu kişinin haqqını ona qaytar! Əbu Cəhl dedi: Elə bu saat verirəm. Yerindən tərpənmə ki, mən onun pulunu gətirirəm. Bunu deyib dərhal evə .keçdi və Əraşlı kişinin pulunu olduğu kimi ona qaytardı

Bu arada Əbu Cəhl məscidin qapısından daxil olub, birbaşa Qüreyşin yanına getdi. Onlar mat- məətəl qalmışdılar. Əbu Cəhli görən kimi ona dedilər: Vay olsun sənə! Nə oldu?... Nə oldu ki, özünü beləcə Məhəmmədin qarşısında itirdin? Dedi: Sakit olun. And olsun Allaha ki, qapını döydükdə məni qorxu bürüdü. Qapını açanda onun başının üstündə hələ indiyə qədər görmədiyim erkək dəvəni gördüm ki, ağzını açıb və məni .udmağa hazırdır. Əgər bir az fikirləşməli olsaydım məni udacaqdı

Haşim övladları arasında Əbd Yezid ibn Haşim ibn Əbd Manafın oğlu Rəkanə adlı bir kişi var idi. Fiziki cəhətdən o qədər güclü idi ki, Qüreyş arasında tayı- bərabəri yox idi. Bir gün İslam peyğəmbəri onu Məkkə dərələrinin birində görüb ona buyurdu: Ey Rəkanə görəsən Allahdan qorxub və mənim dəvətimi qəbul etmək vaxtı çatmayıb! Rəkanə dedi: Mən əgər bilsəm ki, sənin sözlərin düzdür, şübhəsiz ki sənin ardıcıllarından olaram. İslam peyğəmbəri buyurdu: Əgər mən səninlə güləşsəm və .səni yerə çırpsam mənim sözlərimi qəbul edərsən? Dedi: Bəli

Peyğəmbər buyurdu: Qalx. Rəkanə qalxdı. Heç bir iradəsi olmayan insan kimi o .həzrətin qolları arasında müqavimət göstərə bilməyib, bərk yerə çırpıldı

İkinci dəfə yerdən qalxıb dedi: Ey Məhəmməd bu dəfə səni yerə çırpacağam. Bu dəfə də yerə çırpıldı. Qalxan kimi dedi: Ey Məhəmməd and olsun Allaha çox maraqlıdır ki, sən məni yerə çırpırsan! İslam peyğəmbəri buyurdu: Əgər mənə itaət etsən bundan !da maraqlısını görəcəksən

?Rəkanə dedi: Nədir

!Buyurdu: Bu ağacı çağırsam qopub yanıma gələr

.Dedi: Çağır

Allahın elçisi o ağacı səslədi, ağacı yerindən ayrılıb o həzrətin yanına gəldi. Yenə ona buyurdu: Yerinə qayıt, ağac yenə əvvəlki yerinə qayıtdı. Bu hadisəni müşahidə edən Rəkanə öz tayfasının yanına gəlib dedi: Ey Əbdu Manaf övladları and olsun Allaha ki, bu kişinin vasitəsi ilə bütün yer üzünü sehrləyə bilərsiniz. Çünki mən ondan sehrbaz bir .insanla rastlaşmamışam

Efiopiya – və ya Nəcran – xristianlarından bir neçəsinin İslam dinini qəbul etməsi

Peyğəmbər Məkkədə qaldığı günlərdə bir gün iyirmi və ya bir qədər az Efiopiyalı xristian – bəzilərinin dediyinə görə Nəcran xristianları – o həzrətin peyğəmbərlik xəbərini eşidib Məkkəyə gələrək o həzrəti axtarmaq üçün Məscidul- Harama daxil

oldular. Orada İslam peyğəmbəri ilə görüşüb onunla üzbəüz əyləşdilər. O həzrətdən suallar soruşub bir-bir cavablarını aldılar. Sualları qurtarandan sonra peyğəmbər onları İslam dinini qəbul etməyə

dəvət etdi və bir neçə Quran ayələrini də onlara oxudu. Onlar müqəddəs Quran ayələrini eşitdikdən sonra elə təsir altına düşdülər ki, gözlərindən yaş axaraq müan oldular. Sonra oturduqları yerdən ayağq qalxdılar. Qüreyş uzaqdan bu olanları müşahidə edirdi. Bu vaxt Əbu Cəhlin rəhbərliyi altında onların yolunun üstünə adam göndərdilər. Əbu Cəhl üzünü onlara tutub dedi: Siz əcəb ziyankar karvan idiniz! Efiopiya əhalisi sizi bu şəhərə göndərib ki, bu kişinin vəziyyətini araşdırıb, kifayət qədər tədqiqat apardıqdan sonra onlara da məlumat verəsiniz. Amma siz elə ilk görüşdəcə tədqiqat aparmadan öz dininizi tərk edib onun dinini qəbul etdiniz və onun sözlərini !...təsdiq etdiniz. Doğurdan da biz indiyə qədər sizin kimi axmaq görməmişik

Efiopiyalılar ona cavab olaraq dedilər: Biz sizinlə mübahisə və dava fikrində deyilik. Siz .öz dininizin arxasıyca gedin və biz də qəbul etdiyimizin

:Deyilənlərə görə aşağıdakı ayələr onların barəsində nazil oldu

Əvvəl kitab vermiş olduğumuz kəslər ona inanırlar. Onlara oxunduğu zaman “Biz ona“ inandıq. Doğurdanda bu Quran Allah tərəfindən nazil olub və biz bundanda öncə ona təslim idik”... Sonra buyurur: “Onlar boş bir söz eşitdikləri zaman ondan üz çevirib: “Bizim əməllərimiz bizə, sizin əməlləriniz də sizə aiddir. Gedin sağlam olun ki, biz heç (vaxt nadan camaatı istəmirik”.(١)

### ...MÜŞRİKLƏRİN PEYĞƏMBƏRİN SƏHABƏLƏRİ HAQQINDA

## MÜŞRİKLƏRİN PEYĞƏMBƏRİN SƏHABƏLƏRİ HAQQINDA DEDİKLƏRİ VƏ BU BARƏDƏ NAZİL OLAN AYƏLƏR

Əziz İslam peyğəmbəri hər zaman Məscidul-Hərama gəldikdə kasıb və yoxsul şəxslər olan Xəbab, Əmmar və Süheyb kimi səhabələrdə onun yanında əyləşərdilər. Qüreyş başçıları bu mənzərəni müşahidə etdikdə məsxərə və rişxəndə ilə bir- birinə deyərdilər: Məhəmmədin ardıcılları bunlardır! Allahın bizim aramızdan haqq və hidayət üçün seçdiyi insanlar bunlardır! Əgər doğurdanda Məhəmmədin dinində hər hansı bir xeyir olsaydı bunlar bizdən qabağa keçməzdilər və Allah- Təala onları bizlərdən üstün !etməzdi

:Və beləcə sözlər deyirdilər ki, bu barədə aşağıdakı ayələr nazil oldu

Rəbbinin rizasını diləyərək səhər- axşam ona dua edənləri (yoxsul möminləri) ..." yanından qovma. Onların əməllərinin sənə, sənin əməllərinin isə onlara heç bir dəxli yoxdur. Onları qovsan zalimlərdən olarsan. Beləliklə, onları bir- birilə imtahana çəkdik ki, onlar desinlər: "Əcəba, Allahın aranızda lütfünü rəva görüb bəxş etdiyi kimsələr bunlarmıdır? Məgər Allah şükr edənləri daha yaxşı tanıyan deyildirmi? Ayələrimizə iman gətirənlər yanına gəldikdə onlara de: "Sizə salam olsun! Rəbbiniz özünə bəndələrinə qarşı rəhmli olmağı yazmışdır. Belə ki, sizlərdən hər kəs pis iş görsə sonra (tövbə edib düzəlsə, şübhəsiz ki, Allah bağışlayandır, rəhm edəndir!"(١)

### ...MÜŞRİKLƏRİN PEYĞƏMBƏR HAQQINDA CƏFƏNGİYYAT

MÜŞRİKLƏRİN PEYĞƏMBƏR HAQQINDA CƏFƏNGİYYAT DANIŞMALARI VƏ QURANIN ONLARA CAVABI

Mərvə yaxınlığında bir dükan var idi ki, İslam peyğəmbəri gündüzlər o dükanda bir saat əyləşərdi. Bu dükan Cəbr adında pulla alınmış xristian bir qula məxsus idi. Bəni Həzrəmi qəbiləsinin pul ilə alınmış qulu olan Cəbr bu dükanda alver edirdi. İslam peyğəmbərinin bu xristian kişi ilə münasibəti müşriklərin əlinə bəhanə verdi ki, yeni cəfəngiyyatlar irəli sürüb desinlər: Məhəmməd dediyi sözləri xristian Cəbrdən öyrənibdir və onları Məhəmmədə öyrədən də məhz odur. AllahTəala onların cavabında bu ayəni nazil etdi: "Biz yaxşı bilirik ki, kafirlər deyirlər: Quranı peyğəmbərə öyrdən insan fəsahətsiz bir qeyriərəbdir. Peyğəmbər ondan öyrəndikdən sonra onu (fəsahətli ərəb dilini döndərir.(٢)

### KÖVSƏR SURƏSİNİN NAZİL OLMASI

As ibn Vail Səhmi qüreyşin nüfuzlu rəhbərlərindən və peyğəmbərin düşmənlərindən biri idi. Hər hansı bir məclisdə o həzrətdən söhbət düşəndə As deyirdi. Onunla işiniz ... olmasın



---

.Ənam surəsi ۵٢- ۵۴- cü ayələr . [١] -١

yəni nə deyirsə desin, nə edə bilirsə etsin) O nəsli kəsilmiş bir insandır. Öldükdən) sonra adı yox olacaq və siz də rahat olacaqsınız! AllahTəala ona cavab olaraq bu :mübarək surəni nazil etdi

Ey Məhəmməd biz sənə kövsər əta etdik ki, (yəni Kövsər arxı) dünya və onun“ içərisində olanlardan daha yaxşıdır” Kövsərin böyük və daha çoxlu mənaları da vardır. Necə ki, Lübeyd, Kumeyt və Üməyyə ibn Əbi Aiz öz şerlərində bu mənaları qəsd (ediblər.(١)

Ənəs ibn Malik bir hədisdə rəvayət edir: İslam peyğəmbərindən soruşdular: Allahın sənə əta etdiyi bu Kövsər nədir? Buyurdu: O bir arxdır ki, Sənə və İylə(٢) arasındakı məsafə qədər genişdir. Onda göyün ulduzları qədər qədəhlər var. Oraya elə quşlar .qonurlar ki, dəvə boynu kimi boyunları var

Əmr ərz etdi: Ey İslam peyğəmbəri o quşlar həmin suyun kənarında yaxşı yaşaya .biləcəklərmi? Həzrət buyurdu: Onları yeyənlər, onlardan daha yaxşıdır

Digər bir hədisdə bu sözün arxasıyca buyurdu: Hər kim onun suyundan içsə heç vaxt .susuz olmayacaq

ayəsinin nazil olma səbəbi ”وقالو الولا انزل عليه ملك“ Mübarək

Əziz İslam peyğəmbəri öz təbliğatına və insanları Allaha tərəf dəvət etməyə davam edirdi. Məkkə müşrikləri də hər gün bir söz deyirdilər. İslamın inkişafının qarşısını almaq üçün təzə iradlar irəli sürürdülər. O cümlədən Zumə ibn Əsvəd, Nəzr ibn Haris, Əsvəd ibn Əbd Yəğus, Əbi ibn Xələf və As ibn Vail o həzrətə dedilər. Ey Məhəmməd əgər sən doğurdanda Allah tərəfindən seçilmisənsə, ondan səninlə bir mələk gələr və .insanlarla söhbətləşərdi! AllahTəala bu barədə aşağıdakı ayəni nazil etdi

Və onlar dedilər: “Məgər ona bir mələk endirilməli deyildirmi?” əgər biz bir mələk“ göndərsəydik, iş bitmiş olar və onlara bir an möhlət verilməzdi. Əgər biz onu mələk etsəydik

Şerin mətnlərindən xəbərdar olmaq istəyirsinizsə Sirənin I cildinin ٣٩٤- cü . [١] -١
.səhifəsinə müraciət edə bilərsiniz

.Səna – Yəmən paytaxtıdır, İylə Suriyada şəhər adıdır . [٢] -٢

yenə də onu bir insan qiyafəsində göndərər və ona kişilərin geyindikləri paltarı (geyindirərdik...”(۱)

ayəsinin nazil olması ”و لقد استهزی برسل من قبلک“

Bir gün əziz İslam peyğəmbəri Məkkə küçələrindən keçərkən Vəlid ibn Müğeyrə Uməyyə ibn Xələf və Əbu Cəhl ilə rastlaşdı. Onlar həzrəti görən kimi məsxərə və istehza etməyə başladılar. Bunu o həddə çatdırdılar ki, peyğəmbər qəzəbləndi. Allah-Təala bu barədə aşağıdakı ayəni nazil etdi.

“Səndən əvvəl də keçmiş ümmətlər ilahi peyğəmbərləri istehza və məsxərə edərdilər. (Lakin məsxərəyə qoyanları məsxərəyə qoyduqlarının özü məhv etdi”.(۲)



---

۱- [۱] . Ənam surəsi ۸۹- cu ayələr.

۲- [۲] . Ənam surəsi ۱۰- cu ayə.

## İŞARƏ

Məkkə əhalisi və qüreyş qəbilələri arasında İslam yayılmaqda idi. Hər gün təzə qrup və insanlar bu müqəddəs dinə iman gətirirdilər. Bu zaman İslam peyğəmbərinin meracı baş verdi (bir müddət müşriklərin dillər əzbəri idi). Qeyd etdiyimiz dastan Əbdullah ibn Məsudun rəvayətinə əsasən belə olmuşdur. O gecə peyğəmbər üçün Buraqı gətirdilər– Buraq həmin minik idi ki, İslam peyğəmbərindən qabaqkı peyğəmbərlər də ona minmişdilər. O hərəkət edərkən dırnaqları gözlərinin bərabərinə qalxırdı– peyğəmbərdə o miniyə minib hərəkət edərək BeytülMüqəddəsə gəldi. Həzrəti İbrahim, Musa, İsa və digər peyğəmbərlərin də bəzisi orada idilər. Peyğəmbər onların .qarşısında, onlar da peyğəmbərdən arxada namaz qıldılar

Namazdan sonra o həzrət üçün üç içməli qədəh gətirdilər. Onlardan birində süd, .ikincisində şərab və üçüncüsündə isə xalis su var idi

Onlara əl uzatmaq istədikdə arxadan biri dedi: Əgər suyu götürsən özün və ümmətin qərq olacaq, əgər şərabı götürsən özün və ümmətin yollarını azacaqlar, yox əgər südü .götürsən özün və ümmətin hidayət olacaqlar

İslam peyğəmbəri buyurur: Mən bu səsi eşitdikdən sonra südü götürüb içdim. Cəbrail .dedi: Sən və ümmətin hidayət oldu

Həsən Bəsrinin rəvayətinə əsasən isə peyğəmbər buyurdu: Həcəri İsmaildə yatmışdım. Cəbrail gəlib ayağının baş barmağı ilə məni ayıltdı. Mən qalxıb oturduqda kimsəni görməyib yenə yatdım. Bu dəfə də gəlib məni oyatdı. Mən qalxıb kimsəni görmədim. Üçüncü

dəfə qalxdıqda mənim çiynimdən yapışdı. Mən onunla qalxıb Məscidin qapısına gəldik. Orada eşşəkdən daha böyük, qatırdan daha balaca ağ rəngli bir minik gördüm. Onun hər budunun yanında qanad var idi. Qanadlar ilə ayaqlarını tərpədirdi. Əllərini gözünün .yuxarısına aparırdı. Cəbrail məni ona mindirib mənimlə gəldi

Qətadənin hədisinə əsasən isə: İslam peyğəmbəri buyurdu: Mən o miniyə yaxınlaşanda üçüncü cəhdə qədər tərslik etdi. Cəbrail əlini boynuna qoyub dedi: Heç xəcalət çəkmirsən? And olsun Allaha ki, hələ indiyə qədər Allah dərgahına Məhəmməd qədər yaxın olan bir kimsə sənə səvar olmayıb. Bu vaxtı Buraq xəcalət çəkib, bədənini .tər basdı. Sakitləşdikdən sonra mən ona səvar oldum

Burada müxtəlif hədislər vardır, Həsən Bəsri deyir: İslam peyğəmbəri Beytül-Müqəddəsə getdikdən sonra Məkkəyə qayıtdı. Bu dastanın arxasıyca aşağıdakı ayə :nazil oldu

Biz sənə göstərdiyimiz mənzərəni və Quranda lənətlənmiş ağacı insanlar üçün yalnız“ bir imtahan etdik. Biz onları qorxuduruq, lakin bu qorxutmaq onların tüğyanını (artırmaqdan başqa bir şeyə kara gəlmir!”(١

Ayişə və Müaviyənin rəvayətinə əsasən isə peyğəmbərin gecə səyahəti (meracı) (yuxuda baş vermişdir.(٢



---

.Əsra surəsi ١٠- cu ayə . [١]-١

Həsən Bəsri, Ayişə və Müaviyənin dedikləri sənəd və etibarlıq baxımından bizim . [٢]-٢ üçün heç bir əsas malik deyil. Məxsusən də onların sözü şiə və sünnilər tərəfindən rəvayət olunmuş mütəvatir hədislərlə ziddiyyət təşkil edir. Eyni zamanda Quran ayələri ilə də üst- üstə düşmür. Çünki Allah-Təala Quranda Əsra surəsində merac dastanını belə rəvayət edir: “Bəndəsini bir gecə MəscidulHəramdan ətrafını mübarək Məscidul- Əqsaya aparan Allah pak və müqəddəsdir. O doğurdan da eşidəndir, görəndir...” Bu ayədə ilk öncə Allah- Təala dastanın əhəmiyyət və aliliyi haqqında buyurur: “Münəzzəhdir...” bu cür deyim tərzi peyğəmbərin yuxuda merac etməsi fikri öz bəndəsini) və) ” بعبده“ :ilə ziddiyyət təşkil edir. Digər tərəfdən onun ardıyca buyurur

“bəndə” sözü həm ruh, həm də cismi əhatə edir... habelə “əsra” (seyr verdi) və “linuriyəhu” sözləri (öz nişanələrinimizi ona göstərək, aşkar olmağa dəlalət edir. Bu dəlalət edir ki, bu proseslərin hamısı oyaq vaxtı baş verib və o həzrət öz cism və ruhu ilə birlikdə merac edibdir. Habelə Nəcm surəsində buyurur: “... Yenə bir dəfə onu müşahidə etdi. Sidrətul- muntəhanın yanında, Məva cənnəti onun yanındadır. O zaman sidrəni nələr bürümüşdü, nələr! Göz nə yayındı nə də uzağa getdi (hər şeyi olduğu kimi gördü)...” bütün bu ayələr sübut edir ki, qeyd etdiyimiz merac oyaq vaxtı baş vermişdir ... Əgər yuxarıakı ayələr dəlalət etməsə belə, yenə də Həsən, Aişə və Müaviyə kimilərinin sözləri məsum imamlardan qeyd edilmiş rəvayətlər və eləcədə .digər sünnilərin hədislərinə görə bizim üçün heç bir etibara malik deyil

Hər halda Zöhrinin hədisinə görə dastanın ardı həzrəti İbrahim, Musa və İsanın təsviri :ilə davam edir

Amma İbrahim insanlar içərisində mənə ən çox bənzəyən idi. İndiyə qədər onun kimi oxşarıma rast gəlməmişəm. Amma Musaya gəldikdə isə sarışın, arıq, tükləri qıvrım, burnu çəkilmiş (uzanmış) və çıxıntılı, ümumiyyətlə Şenvət qəbiləsinin kişilərindən birinə oxşayırdı. Amma İsa ibn Məryəmə gəldikdə isə qırmızı sifət, orta boylu, üz və başının tükləri yatmış (hamar– mütərcim), üzündə çoxlu xallar olan bir kişi idi. Elə bil təzəcə hamamdan çıxıb, başı quru olsada elə bil ki, ondan su damcılayırdı, ona ən çox (oxşayan insan Urvə ibn Məsud Səqəfidir.(١)

Digər bir hədisə görə Ümm Hani deyir: İslam peyğəmbəri o gecəni mənim evimdə yatmış idi. O işa namazını qılıb yatdı. Biz də onunla eyni vaxtda yatdıq. Səhərə yaxın o həzrət bizi yuxudan oyatdı. Biz onunla sübh namazını qıldıqdan sonra indi gördüyümüz kimi yenə də sübh namazını sizinlə qılıram. Bu sözü deyib getmək istəyirdi ki, mən əl atıb ətəyindən elə yapışdım ki, paltarı kənara itələndi və qarnının dərisi görsəndi. Ona dedim: Ey Allahın elçisi bizə danışdıqlarını camaata danışma ki, sənə əziyyət verərlər! O həzrət buyurdu: And olsun Allaha ki, onlara da danışacağam. Ümm Hani deyir: Mən Efiopiyadan olan kənizimə dedim: Peyğəmbərin arxasıyca get və gör onunla camaatın söhbətinin axırı nə olacaq, onun camaata danışdıqlarına camaat nə deyəcək. Kəniz dedi: O həzrət bu haqda camaata danışdıqda onlar təəccüb edib dedilər sənin doğru danışmağının əlaməti nədir? Biz hardan bilək ki, sən düz danışırsan? Buyurdu: Əlaməti budur ki, mən Şama gedən zaman filan yerdə bir karvan gördüm, Buraqın səsini eşidən dəvələr hürkdü, onlardan biri qaçdı və mən yerini onlara göstərdim. Qayıdan başı isə Zəcnanda (Məkkədən ٢٥ mil aralı) filan karvanla rastlaşdım karvan əhli yatmışdılar. Başlarının üstündə bir qab su qoymuş və onun üstünü örtmüşdülər. Mən qapağı götürüb suyu içdikdən sonra yenə də qapağı onun üstünə qoydum. Hal-hazırda bu



---

١- [١] . Burada İbn Hişam peyğəmbərin xarakter və sifətləri haqqında Həzrəti Əlidən bir hədis rəvayət edib ki, burada qeyd edilməsi bizim mövzumuzdan kənar olduğu üçün

karvan Tənim dərəsindən Məkkəyə tərəf hərəkət edirlər. Onların qabağında biri qara olmaqla üstündə iki yük qoyulmuş boz rəngli dəvə vardır ki, yüklərinin biri də qara .rəngdədir

Bu sözü eşidən camaat Tənim dərəsinə yollandılar. Peyğəmbərin dediyi kimi karvan və deyilən əlamətlərə malik dəvə göründü. Su qabı haqqında peyğəmbərin dediyi kimi soruşduqda dedilər: Qabı su ilə dolu qoymuş üstünə qapaq da qoymuşduq. Səhər .durduqda qabın ağzı qapaqla örtülü olsada orada su yox idi

Digər karvanda Məkkəyə gəldikdə, dəvələrin hürkməsi və bir dəvənin itməsi haqqında soruşduqda onlar dedilər. Filan vadidə dəvələrimiz hürkdü onlardan biri itdi. Bu zaman bir kişinin səsini eşitdik ki, dəvənin yerini bizə göstərdi. Biz oraya yollanıb dəvəni geri .gətirdik

Əba Səid Xıdrının rəvayətinə uyğun olaraq Merac dastanının davamı

Əbu Səid Xıdrı rəvayət edir: Peyğəmbərdən eşitdim ki, buyurdu: BeytülMüqəddəsdə öz işimi gördükdən sonra səmaya gedilən vasitəni yanıma gətirdilər. Mən ondan daha .gözəl bir şey görməmiş idim. O həmin şeydir ki, can verən ölüm vaxtı onu görür

Mənimlə birgə olan Cəbrail məni o vasitə ilə səmaya qaldırdı. “Babulhəfzə” adlanan səmanın qapısına çatdıq. Orada əmrində on iki min mələk olan İsmail keşik çəkirdi. O, mələklərin də hər birinin rəhbərliyi altında on iki min mələk var idi. Allahın qoşunlarının sayını özündən başqa heç kim bilməyir. Oraya daxil olanda mələk Cəbraildən soruşdu: .Bu şəxs kimdir? Cəbrail cavab verdi: Məhəmməddir

Mələk dedi: Peyğəmbərlik verilib? Cəbrail dedi: Bəli. Mələk haqqımda xeyir dua .etdikdən sonra ordan uzaqlaşdıq

Orada hər hansı bir mələk ilə rastlaşdıqda hamısı gülər üzlə məni qarşılayıb, barəmdə xeyir duası etdilər. Təkcə onlardan biri haqqımda xeyir dua etsədə amma üzü gülmürdü. Cəbraildən soruşdum: Bu hansı mələkdir ki, digər mələklərin dediklərini o .datəkrarlasada ancaq üzü gülmədi

Cəbrail dedi: Əgər bu mələk indiyə qədər və ya bundan

sonra gülsəydi sənə də gülərdi. Bu elə bir mələkdir ki, heç vaxt gülməz. Bu mələk .cəhənnəm gözətçisidir

?Cəbrailə dedim: Mümkündür ona əmr edəsən ki, odu göstərsin

Cəbrail dedi: Bəli. Sonra qeyd etdiyimiz mələyə dedi: Cəhənnəm odunu Məhəmmədə .göstər

Qeyd etdiyimiz mələk cəhənnəmin örtüyünü götürdü. Birdən birə gördüm ki, od zəbanə çəkdi və onun şölələri çox hündürlüyə qalxdı, güman etdim ki, bizi qoynuna alacaq. Cəbrailə dedim: Ona əmr elə odu yerinə qaytarsın. Cəbrail əmr verdikdən sonra mələk odu yerinə qaytardı, sanki od getdikdən sonra onun yerini kölgə aldı. Od .yerinə qayıtdıqdan sonra yenə də qapağı üstünə qoydu

Habelə dünya səmasında əyləşmiş bir kişini gördüm ki, Adəm övladının ruhlarını ona :təqdim edirdilər. Bəzilərini gördükdə isə xoşhal olur və deyirdi

”Pak cəsəddən çıxmış pak ruhdur“

:Bəzilərini gördükdə isə sifətini turşudur və deyirdi

”Napak cəsəddən çıxmış napak ruhdur“

Cəbrailə dedim: Bu kişi kimdir? Dedi: Bu atan Adəmdir, övladlarının ruhunu ona təqdim edirlər. Mömin insanın ruhunu gördükdə xoşhal olur və deyir: “Pak cəsəddən çıxmış pak ruhdur” Kafirin ruhu ilə rastlaşdıqda narahat olur və deyir: “napak cəsəddən çıxan ”napak ruhdur

Oradan ötüb dəvə dodaqları kimi qalın dodaqlı bir dəstəylə qarşılaşdıq ki, əllərində od ?parçaları tutub ağızlarına aparıb içəri ötürürdülər. Cəbrailə dedim: Bunlar kimlərdir

Cəbrail dedi: Bunlar yetimin malını zülm ilə yeyən insanlardır. Ondan sonra indiyə qədər görmədiyim yekə qarınlı insanlarla rastlaşdım ki, fironçular kimi şiddətli əzaba düçar olmuşdular. Hər vaxt onları oda versəydilər çox susuz dəvələr kimi dilləri bayıra .çıxar və yerlərindən tərpənə bilməzdilər

.Cəbraildən soruşdum: Bunlar kimdir? Cəbrail dedi: Riba yeyənlər

Sonra qarşılarında iki qab ət qoyulmuş insanları gördüm. Birində kök və təmiz ət var idi. Digərində isə iyli və çürümüş ət

var idi. Onlar təmiz və kök ətin əvəzinə o çirkin ətdən yeyirdilər. Cəbraildən soruşdum ?ki, bunlar kimdirlər

Dedi: Bunlar öz halal arvadlarını qoyub, onlara haram olan arvadların arxasıyca .gedirdilər

Sonra döşlərindən asılmış qadınları görüb soruşdum: Cəbrail bunlar kimdirlər? Cavab verdi: Bunlar digərlərinin övladlarını (ərlərinə xəyanət edərək) öz ərlərinə nisbət verən .qadınlardır

Bu haqda Qasim ibn Məhəmməd İslam peyğəmbərindən hədis rəvayət edir ki, o həzrət buyurdu: Allahın o qadına qəzəbi artır ki, onlardan olmayan bir tayfaya övladı aid edir ki, bu yol ilə övladlar onların malından yesin və onların namuslarından (onlarla .məhrəm olmaya- olmaya) xəbərdar olsun

Hər halda Əbu Səid Xıdrı merac hədisinin davamını peyğəmbərin dilindən belə davam edir: Sonra Cəbrail məni ikinci göyə apardı. Orada xala uşaqları olan Məryəm oğlu İsa .və Yəhya ibn Zəkəriyyəni gördüm

Sonra üçüncü göyə gedib orada on dörd gecəlik ay kimi gözəl üzlü bir kişi gördüm. .Cəbraildən soruşdum: Bu kişi kimdir? Dedi: Qardaşım Yəqub oğlu Yusifdir

Oradan dördüncü göyə getdik. Orada isə başqa bir kişini görüb Cəbraildən soruşdum bu kişi kimdir? Cavab verdi: İdrisdir– Allah həmin peyğəmbərin barəsində buyurdu: (“Onu yüksək mövqeyə apardıq”.(١

Cəbrail oradan məni beşinci göyə apardı. Orada qalın saqqalı olan qoca bir kişini gördüm. İndiyə qədər o gözəllikdə bütün saç- saqqalı ağarmış qoca bir kişi görməmiş idim. Soruşdum: Bu kimdir? Cəbrail dedi: Bu öz tayfasının sevimli insanı İmran oğlu .Harundur

Sonra altıncı göyə getdikdə oradan sarışın, burnu çıxıntılı və çəkilmiş (uzanmış) və Şenvət qəbiləsinə oxşar bir kişini gördüm. Cəbraildən soruşdum: Bu kişi kimdir? Cavab .verdi: Qardaşın İmran oğlu Musadır

Oradan yeddinci göyə getdik. Beytul Məmurda kürsi üzərində əyləşmiş sağlam bir kişini gördüm. Beytulməmur həmin evdir



---

.Məryəm surəsinin ۵۷- ci ayə . [۱] -۱

ki, hər gün yetmiş min mələk oraya daxil olsada, ancaq qiyamət gününə qədər daha bir də onlara növbə çatmayacaq. Qeyd etdiyimiz kişi mənə ən çox bənzəyən insan idi. Cəbrailə dedim: Bu kimdir? Dedi: Atan İbrahimdir

Sonra məni behiştə apardı orada dodaqlarının rəngi qaraya çalan qırmızı dodaqlı balaca bir qız gördüm. Onu gördükdə şad oldum və soruşdum: Sən kimə məxsussan? Dedi: Zeyd ibn Harisəyə məxsusam. Peyğəmbər qayıtdıqdan sonra bu müjdəni Zeyd .ibn Harisə çatdırdı

Əbdullah ibn Məsudun hədisində var ki, peyğəmbər buyurdu: Hər bir göyə getdikdə o göyün sakinləri Cəbraildən soruşurdular: Bu kimdir? Cavabında deyirdi: Məhəmməddir. Soruşurdular: Peyğəmbərlik verilibdir. Deyirdi: Bəli. Onlar deyirdilər: Allah saxlasın, nə alicənab qardaş və peyğəmbərdir! Beləcə yeddinci göyə çatdım ki, orada hər gün ۵۰ namaz vacib oldu. Sonra yerə doğru qayıtdım. Musa ibn İmranla rastlaşdıqda soruşdu: Sənə neçə namaz vacib oldu? Dedim: Hər gün ۵۰ namaz! Musa dedi: Namaz ağır göstərişdir və sənin ümmətin zəif insanlardır (hər gün ۵۰ namaz qılmağa taqətləri çatmaz) Allaha doğru qayıt, ondan özün və ümmətin üçün namazı yüngülləşdirməsini !istə

İslam peyğəmbəri buyurdu: Mən qayıdıb, yüngülləşmə xahiş etdim. Allah Təala on namaz yüngülləşdirdi. Elə isə qayıtdım və yenə də Musa ilə qarşılaşdım. O yenə həmin sözləri təkrar etdi. Mən də yenə qayıdıb on namaz yüngülləşdirdim. Üçüncü dəfə yenə Musa həmin sözləri dedi. Mən qayıdıb yenə də on namaz yüngülləşdirdim. Beləcə ta o vəqtə qədər ki, hər gecə gündüz beş namaz müəyyən edildi. Sonuncu dəfə Musa yenə .dedi: Qayıt və azalt. Mən ona dedim: O qədər gedib azaltdım ki, daha həya edirəm

Bu zaman buyurdu: Sizin hər biriniz bu namazı savab ümidi və imanla qılarsa Allah .həmin ۵۰ namazın savabını ona verəcək

### İSTEHZA EDƏNLƏRİN TALEYİ

İslam peyğəmbəri Məkkədə insanları haqqa dəvət etdiyi müddət ərzində tədricən onu vaxtaşırı incidib, narahat edən bir sıra düşmənləri meydana gəlmişdi. O, alicənab peyğəmbər də

onların qarşısında heyrətamiz dərəcə də səbr edib keçinərdi. Bu düşmənlərin bəzisi öz düşmənçiliyini məsxərə və istehza ilə bildirərdilər. Onların öndə gedənləri isə əsasən beş nəfər idilər ki, hər biri də öz tayfa və qəbiləsi arasında şəxsiyyət və vəzifə sahibi idilər.

Hərəsi bir qəbilədən olan bu beş nəfərin adı belə idi:

Bəni Əsəd qəbiləsindən: Əsvəd ibn Mutəllib. Bu həmin şəxsdir ki, peyğəmbər onun barəsində nifrin edib dedi: “İlahi pərvərdigara gözlərini kor elə və övlad dağı çəkdir”

Bəni Zöhrə qəbiləsindən: Əsvəd ibn Əbd Yəğus.

Bəni Məxzumdan: Vəlid ibn Muğeyrə.

Bəni Səhmdən: As ibn Vail Səhmi.

Bəni Xəzaədən: Haris ibn Təlatilə.

Bunlar peyğəmbərlə düşmənçilik və onu istehza etməkdən əl çəkmirdilər. Onlar peyğəmbərə qarşı ədavət göstərməkdə davam edirdilər ki, bu ayə nazil oldu: “Sənə əmr olunanı açıq- aşkar təbliğ et və müşriklərdən üz döndər! Şübhəsiz ki, istehza edənlərə qarşı biz səni qoruyuruq. O kəslər ki, Allaha başqa tanrı qoşurlar! Onlar mütləq biləcəklər!”(۱)

Bu beş nəfərin taleyi belə oldu: Onlar Kəbə evinin ətrafına təvaf edərkən Cəbrail peyğəmbərin yanına gəldi. O həzrət qalxıb Cəbrailin kənarında dayandı. Bu zaman Əsvəd ibn Mütəllib oradan keçdi. Cəbrail ona tərəf yaşıl yarpaq atdı və bu onun iki gözünün də kor olmasına səbəb oldu.

Sonra Əsvəd ibn Yəğus onların yanından keçdi. Cəbrail onun qarnına işarə etdi. Ondan sonra istisqa (vodyanka, hidropos– bədən boşluğuna su yığılması xəstəliyi– mütərcim). Xəstəliyinə tutuldu və elə bu səbəbdən də həlak oldu.

Vəlid ibn Muğeyrənin də ayağının aşağı hissəsində yara vardı. Onların qarşısından keçdikdə Cəbrail onun ayağındakı yaraya işarə etdi. Bu yara bir neçə il öncə Xəzaə qəbiləsindən keçərkən paltarının arxasından vurulan ox yarası idi. Amma yara elə də

dərin olmadığı üçün Vəlid ona əhəmiyyət verməmiş idi. O gün Cəbrail ona işarə etdikdən sonra o yara yenidən



---

۱-[۱]. Hicr surəsinin ۹۴-۹۶-cı ayələri.

açılmağa başladı və Vəlidin ölümünə səbəb oldu. Sonradan isə Xəzaə və bəni Məxzum arasında döyüşə gətirib çıxardı. Sonra isə As ibn Vail oradan keçdi Cəbrail ayağının altındakı çökəkliyə işarə etdi. As təvaf edib MəscidulHəramdan çıxaraq uzunqulağa minərək Taif istiqamətində hərəkət etdi. Yolda uzunqulağ onu tikan ağacına çırpdı. O .ağacın tikanlarından biri Asın ayağına bataraq onu öldürdü

.Beləliklə o beş nəfərin hamısı həlak oldular

Bu arada Vəlid ibn Muğeyrə ölüm yatağında Misam, Vəlid və Xalid adlı oğlanlarını :çağırıb dedi: Mənim ölümüm çatıb. Amma siz üç şeyi unutmayın

Xəzaə qəbiləsindən mənim qan intiqamımı almağı, çünki and olsun Allaha ki, Xəzaə - ١ qəbiləsinin məni öldürmədiyini bilsəmdə amma qorxuram ki, mənim qanımı onlardan .almasanız, camaat sizi məzəmmət edib, söysünlər

Mənim Əbi Uzeyhərin qızı üçün ödədiyim kəbini geri alın ki, o qızını mənə verməkdən -٢ .imtina etdi

Mənim Səqif qəbiləsindən tələb etdiyim ribanı (sələm) hər yol ilə mümkünsə - ٣ .onlardan alın

Həmin vəsiyyət bəni Məxzum ilə Xəzaə qəbilələrinin birbirindən intiqam almasına səbəb oldu və hər iki dəstə bu barədə şerlər qoşdular.(١) Nəhayət Vəlidin qanbahasının .bir hissəsini ödədikdən sonra çəkişmə başa çatdı

Digər tərəfdən isə Vəlid oğlu Hişam Uzeyhəri - Dus qəbiləsinin hörmətli insanlarından biri idi qızı Atikə isə Əbu Sufyananın həyat yoldaşı idi– öldürmək fikrinə düşdü. nəhayət Zilməcaz bazarında onu öldürdü. Yəzid ibn Əbi Sufyan intiqam fikrinə düşüb Manaf övladlarını toplayaraq onlara döyüş paltarı geyindirdi. Onlar bəni Məxzumla döyüşə hazırlaşdılar. Amma bu xəbər Məkkədən kənarda olan Əbu Sufyanın qulağına çatdıqda dərhal özünü Məkkəyə yetirib bu döyüşə mane olaraq oğlu Yezidə dedi: “Dus” qəbiləsindən bir nəfərə görə qüreyş arasında iki tirəlik, qırğın və düşmənçilik !?...yaratmaq fikrindəsən

۱- [۱] . Bu şerlərin mətnindən xəbərdar olmaq istəyirsinizsə Sirənin I cildinin ۴۱۱- ۴۱۲ci səhifələrinə müraciət edə bilərsiniz.

Amma iş bununla bitmədi. Dus qəbiləsi Əbi Uzeyhərin intiqamını almaq istəyirdilər. Bir vaxt Zirar ibn Xəttab bir dəstə qüreyş ilə bu qəbiləyə getdilər. Onlar bəzəkçi qadın Umm Ğəylanın evinə gəldilər. Dus qəbiləsi onları Üzeyhərin yerinə öldürmək fikrinə düşdülər. Amma Ümm Ğəylan digər qadınlar ilə o cümlədən Umm Cəmil ilə Ömər ibn Xəttabın bacısı– onlara mane olub öz qüreyşli qonaqlarını müdafiə edərək onların .öldürülməsinə imkan verməlidilər

Elə buna görə də Zirar ibn Xəttab Ühüd döyüşündə Öməri öldürmək istərkən "Dus" qəbiləsinin qadınlarının müdafiəsi yadına düşdü. O, Öməri öldürmədi. Nizənin enli .tərəfi ilə onu vurub dedi: Ey Xəttab oğlu narahat olma, mən səni öldürməyəcəyəm

## XƏDİCƏ VƏ ƏBUTALİBİN VƏFAT ETMƏSİ

Əziz İslam peyğəmbərinin bir neçə qohumu var idi ki, digərləri ilə müqayisədə o həzrətə daha çox əziyyət verərdilər. O cümlədən: Əbu Ləhəb (peyğəmbərin əmisi) Həkəm ibn As, Uqbə ibn Əbi Muit, Ədi ibn Həmma Səqəfi və ibn Əsda Həzəli. Bunlar .eyni zamanda peyğəmbərin qonşuları idilər

Onlar peyğəmbərə qarşı müxtəlif zərər və ziyanlar vururdular. Onlar hətta kəsdikləri qoyunun qarnından çıxan uşaqlığını peyğəmbər namaz qılarkən onun başına atardılar. Digəri isə onu o həzrətin yemək qazanına atardı. Bu cür hərəkətlər edərdilər ki, hər dəfə də İslam peyğəmbəri onu çubuqla mübarək əlində tutar və küçəyə ataraq !?deyərdi: Ey Əbdu Manaf övladları bu nə cür qonşuya əziyyət verməkdir

Nəhayət o həzrət məcbur qalıb öz evinin bir küncündə daş divar hördü ki namaz vaxtı .o divarın arxasında dayansın və beləliklə də onların şərindən arxayın olsun

Bu zaman əziz İslam peyğəmbəri üçün iki xoşagəlməz müsibət baş verdi ki, onlardan biri Əbutalibin və digəri isə Xədicənin dünyadan köçməsi idi. Bunların hər ikisi eyni ildə .az bir zaman fasiləsi ilə baş verdi

Əbu Talib və Xədicə İslamın inkişafı yolunda vəfalı, güclü və yardımçı insanlar idi. -Xədicə İslam peyğəmbərinə ürək

dirək vermək və maddi sərvəti ilə İslam dininin inkişafına və həzrətin ruhlandırılmasına kömək edirdi. Əbu Talib isə Qüreyş arasında olan nüfuz və alicənablığına görə onu .düşmənlərin əziyyətindən qoruyurdu

Hicrətdən üç il əvvəl bu iki şəxsiyyət dünyasını dəyişdilər. Qüreyş İslam peyğəmbərinə qarşı azğınlaşdı və o günə qədər edə bilmədikləri ziyanları həzrətin möhtərəm .vücuduna vurdular və hətta başına torpaq da tökdülər

Ürvə ibn Zubeyr deyir: O həzrətin başına torpaq tökdükləri zaman peyğəmbər başında torpaq ola- ola evə gəldi. Qızlarından biri qalxıb toz- torpağı atasının başından təmizləyə- təmizləyə ağlayırdı. Peyğəmbər ona ürək- dirək verib buyurdu: Qızım ağlama, Allah atanı qoruyacaq. Bəzən isə deyirdi: Nə qədər ki, Əbu Talib sağ idi, Qüreyş mənə qarşı belə xoşagəlməz davranmırdı. Hər halda Əbu Talib yataq xəstəsi olarkən, qüreyş onun xəstəliyinin ağır olduğunu bilib öz aralarında dedilər: Məhəmmədin işləri ərəb tayfaları içərisində yaxşı gedir və digər tərəfdən də Həmzə, Ömər ... də müan olublar. Əgər Əbu Talib dünyadan köçsə qorxuruq ki, Məhəmməd bizimlə müharibəyə qalxıb, bizi məğlub etsin. Yaxşı olar Əbu Talib həyatda ikən onun yanına gedək və onun qardaşı oğlundan (Məhəmməd) əhd alaq ki, bizimlə döyüşə .qalxmasın

İbn Abbas deyir: Bu söhbətdən sonra Utbə, Şeybə, Əbu Cəhl, Uməyyə ibn Xələf, Əbu :Sufyan və digər qüreyş rəhbərləri Əbu Talibin evinə gəlib, hal-əhvaldan sonra dedilər

Ey Əbu Talib özün bilirsən ki, bizim aramızda necə də böyük şəxsiyyət və hörmət sahibisən. İndi xəstəliyin möhkəmlənib və qorxuruq ki, bu xəstəliklə dünyadan köçəsən. Digər tərəfdən bizimlə qardaşın oğlu arasındakı ixtilaf və çəkişməni də yaxşı bilirsən. İndi səndən istəyimiz budur ki, onu buraya çağırıb ondan bizimlə mübarizədən əl çəkməsinə əhd alasan ki, biz də onunla düşmənçilikdən əl çəkək. O bizim öz dinimizdən itaət etməyimizdə sərbəst buraxsın, biz də onu dinindən itaət etməsində .sərbəst buraxırıq

Əbu Talib bir nəfəri peyğəmbərin arxasıyca göndərdi. Həzrət

məclisə gəldikdən sonra ona dedi: Ey qardaşım oğlu buraya toplaşanlar sənin tayfanın hörmətli və böyük insanlarıdır. Onlar istəyirlər ki, səndən mübarizədən əl çəkməyin və :onlarla işinin olmaması haqqında öhdəçilik alsınlar

İslam peyğəmbəri buyurdu: Mənim onlardan istəyim budur ki, təkcə bir kəlmə söyləsinlər və bununla da bütün ərəblərə ağalıq edib, əcəmi (qeyri ərəbləri – .mütərcim) də özlərinə tabe etsinlər

Əbu Cəhl dedi: And olsun atanın haqqına biz bir kəlmənin əvəzinə on kəlmə deməyə ?hazırıq. De görüm o bir kəlmə nədir

deyib, bütpərəstlikdən əl çəkəsiniz. İslam "لا اله الا الله" :Buyurdu: O kəlmə budur ki peyğəmbəri bu sözü dedikdən sonra onlar əllərini bir- birinə vurub dedilər: Ey Məhəmməd (sən yenə bu sözləri təkrar edirsən) sən istəyirsən ki, bütün Allahları bir ...Allahla dəyişəsən? Doğurdan da sənin işlərin təəccüblüdür

Bunu deyib bir- birinə baxaraq etiraf etdilər: And olsun Allaha ki, bu kişi sizin ilə heç bir əhd- peyman bağlamayacaq və sizə heç bir söz verməyəcək. Qalxın və işlərinizin .arxasıyca yollanın ki, nəhayət Allah bizimlə onun arasında qəzavət etsin

Onlar getdikdən sonra İslam peyğəmbəri Əbu Taliblə otaqda tənha qaldılar. Əbu Talib İslam peyğəmbərinə dedi: Ey qardaşım oğlu and olsun Allaha ki, sənin bunlara etdiyin təklif səbəbsiz və çətin deyildi! Əbu Talibdən bu sözləri eşidən islam peyğəmbərinin onun islam dinini qəbul etməsinə ümidi artdı və buyurdu: Əmican o kəlməni sən de və mən qiyamət günü sənə şəfaət verim. Əbu Talib Məhəmmədin onun İslam dinini qəbul etməsinə marağını görüb dedi: Ey qardaşım oğlu and olsun Allaha ki, qüreyşin sənin və qohumlarını danlayaraq "mən ölümdən qorxduğuma görə bu kəlməni demişəm" demələrindən qorxmasaydım onu deyərdim. İndi də yalnız sən şad olasan deyə onu deyirəm. Ölümü yaxınlaşdıqda isə Əbdül Mütəllib oğlu Əbbas gördü ki, Əbu Talibin dodaqları tərpənir. Qulaq asıb peyğəmbərə dedi: Ey qardaşım oğlu and olsun Allaha ki, sənin

.istədiyin kəlməni dedi(۱) və beləliklə Əbu Talib dünyasını dəyişdi

İbn İshaq deyir: Aşağıdakı ayələr yuxarıda qeyd etdiyiniz məsələ və qüreyşin danışıqları haqqında nazil olub: “Sad! Öyüd- nəsihətlə dolu Qurana and olsun! Doğrusu o kafirlər



---

۱- [۱] . Əbu Talibin İslam peyğəmbərinin besətindən sonra iman gətirməsi haqqında şiə və sünni alimlərinin arasında ixtilaf və fikir ayrılığı yoxdur. Sünni məzhəb tarixçilərin bir çoxu şiələr ilə bu məsələdə həmfikirdilər. Hətta bəzi sünni tarixçilərinin nəzərinə görə İslam peyğəmbərinə hələ peyğəmbərlik verilməmiş Əbu Talib onun peyğəmbər olacağını bilirmiş. Peyğəmbər hələ uşaq ikən Əbu Talib o həzrətin əlindən tutub Məscidul- Hərama gətirdi və Allahı o uşağa and verib yağış yağmasını istədi. Elə bu münasibət ilə də məşhur şerini qoşubdur. ولما را ی ت القوم لاود ف ی هم و قد قطعوا کل العرا و الو ساوئل Hər halda onun peyğəmbərin yolunda təmənnasız fədakarlıq və müdafiəsi o həzrətin peyğəmbərliyi haqqında dediyi bütün şer və sözlərlə peyğəmbərliyini etiraf etməsini nəzərə alaraq yenə də kimsənin “Əbu Talib dünyadan kafir getdi” deməsi və yaxud da İbn Hişam kimilərin Əbu Talib ölüm vaxtı şəhadət verdi deməsi çox təəccüblüdür. Bundan da təəccüblüsü odur ki, ibn Hişamın özü peyğəmbərin peyğəmbərliyini etiraf edən Əbu Talibin şerlərini qeyd etməsidir. Amma burada Əbu Talibin ölüm ayağına qədər kafir olmasını qeyd edibdir. Biz burada oxucuların daha çox məlumatlı olması üçün ibn Hişamın qeyd etdiyi bir neçə şeri yazmaqla yanaşı, digər sünni kitablarından da Əbu Talibin imanını təsdiq edən bir neçə şeri qeyd edirik. Daha çox izahı isə bu barədə geniş bəhs edən kitabların öhdəsinə buraxırıq. İbn Hişamın qeyd etdiyi şerlər aşağıdakılardır (Sirənin I cildi ۲۷۲- ۲۸۰cı səhifələr) و لما را ی ت القوم لاود ف ی هم و قد قطعوا کل العرا و لاوسا ی ل Sonra isə İslam peyğəmbəri haqqında deyir: فأیده رب العباد بنصره و أظهر دنیأ حقه غیر باطل Sonra ibn Hişam doxsan beytdən artıq qəsidənin arxasıyca deyir “هذا ما صح لی من هذه القصیده” ۳۵۲ci səhifədə müşriklərin əhdnaməsini qeyd etdikdən sonra Əbu Talibin bu şerlərini yazır: الا ابلغا عنی علی ذات بیننا لویا و خصامن لوی بنی کعب ألم تعلموا انا و جدنا محمدا نبیا کموسی خط فی اول الکتب O cümlədən digərlərinin rəvayət etdikləri şerlər içərisində ibn Əbil Hədidin Nəhcül-

Bəlağəyə yazdığı şərhin III cildinin ٣١٣- cü səhifəsində Əbu Talibdən qeyd etdiyi aşağıdakı şerlərdir. زعمتم بـا نـا مسـلمون محمـدا ولما نقاذف دونه و نزاحم Sonra buyurur: نبى أتـاه الوحى من عنـد ربه و من قـال يقرع بهـا سن نادم Bir çox şerlərdə vardır ki, Əllamə Əmini Əlğədir kitabının VII cildinin ٣٣٠٣۴٠cı səhifələrində qeyd edibdir. Onların burada yazılması həm mövzunu çox uzadan, həm də bizim haşiyələrə sığmaz. Daha çox məlumat əldə etmək istəyən hörmətli oxucular qeyd etdiyimiz kitaba və habelə Əbdullah Xənizinin "Əbu Talib qüreyşin mömini" kitabına və sair kitablara müraciət edə bilərlər.

qürur və nifaq içindədirlər”. Sonra buyurur: Əcəba o tanrıların hamısını bir tanrımı edir. Bu doğrudan da, çox təəccüblü bir şeydir. Onların əyanları çıxıb gedərək belə dedilər: “Gedin öz tanrılarınıza möhkəm olun. İstənilən şey budur. Biz bunu (yəni Məhəmmədin hamını bir Allaha itaət etməsini istəməsi) sonuncu dində də eşitməmişik. Bu ancaq .”uydurmadır

### İSLAM PEYĞƏMBƏRİNİN TAİF SƏFƏRİ

Əbu Talibin dünyasını dəyişməsindən sonra İslam peyğəmbərinin düşmənləri o həzrətə qarşı daha da azğınlaşdılar. Buna görə də İslam peyğəmbəri Səqif qəbiləsindən yardım almaq (Taifdə yaşayırdılar) fikrinə düşdü ki, bəlkə onların diqqətini cəlb etməklə öz dinini inkişaf etdirmək üçün yeni bir arxadayaq tapmış olar. .Peyğəmbər bu məqsədlə təktənha Taif doğru yola düşdü

Taif şəhərinə daxil olduqdan sonra birbaşa o zaman Səqif qəbiləsinin rəhbərləri hesab olunan Əbd Yaleyl və digər iki qardaşı Məsud və Həbibin evinə yollandı. Onun .qardaşlarından birinin həyat yoldaşı Bəni Cəməh qəbiləsindən olan bir qadın idi

Allahın elçisi Taifə gəlməsinin səbəbini onlara söyləyib, ona məqsədini reallaşdırmada .kömək etmələrini istədi

Onlardan biri dedi: Əgər Allah səni peyğəmbər kimi göndərərsə mən Kəbənin .örtüyünü cıraram

Digər qardaş dedi: Allah peyğəmbər göndərmək üçün səndən başqa birini tapa .bilmədi

Üçüncü dedi: And olsun Allaha ki, mən sənin ilə söhbət etməyəcəyəm. Çünki əgər sən iddia etdiyin kimi doğurdan da Allah tərəfindən göndərilmisənsə, onda mən səninlə danışmağa layiq deyiləm, yox əgər yalan deyirsənsə, Allahın adından yalan .danışırsansa, onda mənimlə danışmağa layiq deyilsən

İslam peyğəmbəri məyus halda onlardan uzaqlaşdı. Gedən vaxt isə onlardan istədiyi yeganə şey bu idi ki, onlar arasında olan söhbəti gizlin saxlayalar və onlar arasında olan danışıqları Taif camaatına söyləməyələr. Çünki peyğəmbər istəmirdi ki, Əbd

Lakin onlar o həzrətin xahişinə əhəmiyyət verməyib bu haqda Taif camaatına xəbər verib, şəhərin avara və şəxsiyyətsiz insanlarını peyğəmbəri söyməylərinə və hamının .gözü qarşısında istehza etmələrinə məcbur etdilər

Beləliklə Taif avaraları o həzrətə əhatəyə alıb, onu Ütbə və Şeybəyə məxsus bağa pənah aparmasına məcbur etdilər. Həzrət o bağa daxil olduqdan sonra Səqif qəbiləsinin avaraları o həzrətdən əl çəkdilər. Həzrət özünü bir üzüm ağacının altına verib orada əyləşdi. Bu vaxt Ütbə və Şeybə o həzrətin davranışlarını görürdülər. Əbd Yaleylin qardaşı arvadı qüreyşli qadın o həzrətin yanından keçəndə peyğəmbər ona !buyurdu: Nigaran ol ki, biz ərinin qohumlarının əlindən nə çəkirik

Hər halda İslam peyğəmbəri o halda əlini ilahi dərgahına (öz həmişəlik dostu) :qaldıraraq dedi

Pərvərdigara! Mən sənə öz pənahsızlığım və gücsüzlüyüm, camaatın isə mənə qarşı“ istehzasından şikayət edirəm. Ey mehribanların mehribanı sən mənim və gücsüzlərin Allahısan. Məni bu halımla kimin əllərinə tapşırırsan? Mənimlə acıqlı davranan ?biganələrin əlinəmi? Və ya mənim taleyimə sahib çıxan düşmənəmi

İlahi! Əgər sən mənə qəzəblənməsən bütün bu çətinliklərə sinə gərərəm və əgər“ !məndən razı olsan mənim üçün xoşa gələn olacaq

Pərvərdigara mən səndəki nura pənah aparıram, həmin nur ki, bütün qaranlıqları“ !yarır, dünya və axirət işlərini islah edir

Mən sənin mənə qarşı qəzəbindən pənah aparıram, razı qalana qədər danlamaq sənin ”haqqındır. Güc və qüdrət təkcə sənin vasitən ilə əldə edilir

Ədas və onun İslam peyğəmbəri ilə söhbəti dastanı

Bu vəziyyəti müşahidə edən Ütbə və Şeybənin (ürəyləri o həzrətə yandı) qohumluq damarları hərəkətə gəldi. Buna görə də öz xristian qulu olan Ədası yanına çağıraraq ona dedilər: Bu ağacdan bir salxım üzüm dərib onu bir qaba qoy və o kişinin yanına .apararaq, ona yeməsini söylə

Ədas o iki nəfərin əmrini yerinə yetirib, qabı həzrətin qarşısına qoydu. İslam dedi. İlk dəfə بسم الله“ peyğəmbəri qaba tərəf əlini uzatdı və üzüm giləsini götürmək üçün bu sözü

eşidən Ədas peyğəmbərin üzünə heyrətlə baxıb dedi. Sən dediyin bu söz bu tərəflərin əhalisi arasında adətən işlədilmir. Peyğəmbər ona buyurdu: Sən hansı şəhərdənsən və ?hansı dindənsən

.Ədas dedi: Mən xristianam və Neynəva şəhərindənəm

?İslam peyğəmbəri buyurdu: Layiqli bir şəxsiyyət Yunis ibn Mətinin şəhərindən

?Ədas təəccüblə dedi: Sən Yunis ibn Mətini haradan tanıyırsan

Peyğəmbər buyurdu: O mənim qardaşım və Allahın peyğəmbəri idi. Necə ki, mən də .ilahi elçi və peyğəmbərəm

Bu sözü eşidən Ədas irəli gəlib o həzrətin başından öpdü. Sonra isə əyilib o həzrətin əl- .ayağından öpməyə başladı

Onları müşahidə edən Ütbə və Şeybə bir- birinə dedilər. Bu kişi bizim qulu yoldan çıxardı. Ədas onun yanına qayıtdıqda ona dedilər: Ey Ədas niyə bu kişinin başından, əl və ayaqlarından öpdün? Ədas dedi: Mənim üçün ondan daha layiqli bir mövcud yoxdur. .Çünki bu kişi yalnız peyğəmbərlərin xəbər verə bildiyi şeylərdən xəbər verir

Ütbə və Şeybə ona dedilər: Ehtiyatlı ol məbada bu kişi səni dinindən xaric etməsin. .Çünki sənin dinin onun dinindən daha yaxşıdır

Cinlərin İslam peyğəmbərinə iman gətirmələri

İslam peyğəmbəri Səqif qəbiləsinin iman gətirməsindən məyus olduqdan sonra öz vətəninə doğru qayıtmaq üçün, Məkkəyə tərəf yola düşdü. Nəxləyə (Məkkədən ilə bir gecəlik məsafədə yerləşir) çatdıqda gecəni orada qalıb gecə yarısı namaza durdu. Nəsibeyn şəhərinin bir neçə cini – sayları yeddi nəfər idi – o həzrəti gördülər və onun Quran oxumaq avazını eşitdilər. Peyğəmbərin könlü oxşayan səsi və Quranın ürəyə yatan ayələri onları cəzb edib dayanmağa məcbur etdi. Quran və namaz bitənə qədər yerlərində qaldılar. Onu bitirdikdən və müqəddəs İslam dininə iman gətirdikdən sonra öz qəbilələrinə tərəf qayıdıb onları İslam dininə dəvət etdilər. AllahTəala onların :dastanını Quranda belə buyurur

üçün sənin yanına göndərmişdik. Onlar onu dinləməyə hazır olduqda: Qulaq asın!" dedilər və (Quran oxunub) qurtardıqdan sonra qorxudanlar sifəti ilə öz qövmlərinin yanına qayıtdılar..." ayələrin sonuna qədər.(١)

Habelə bu barədə buyurdu: De: Mənə vəhy olundu ki, bir dəstə cin dedilər: "Biz çox qəribə bir Quran eşitdik..." dastanın sonuna qədər.(٢)

səh:٢۶٧

---

١- [١] . Əhqaf surəsinin ٢٩-٣١-ci ayələri.

٢- [٢] . Cin surəsi.

## İSLAM PEYĞƏMBƏRİNİN ƏRƏB QƏBİLƏLƏRİNİ DƏVƏT ETMƏSİ

### İŞARƏ

İslam peyğəmbəri Məkkəyə qayıtdı. İslam düşmənləri də o həzrətə qarşı .düşmənçiliklərini daha da artırırdılar

İslam peyğəmbəri də mübarizədədn çəkinməyib hər bir fürsətdə islami inkişaf .etdirmək üçün təbliğat aparırdı

Neçə mövsüm idi ki, ərəb qəbilələri Məkkəyə gəlirdilər. İslam peyğəmbəri bu mövsümlərin hər birində onların yanına gedərək onları yeganə olan Allaha doğru dəvət edərdi. Öz peyğəmbərliyi haqqında məlumat verər və bu haqda təbliğat aparardı. Onlardan onu təsdiq etmələrini istəyirdi ki, öz peyğəmbər seçilməsinin səbəblərini onlara izah etsin. Rəbiə ibn İbad atasından rəvayət edir ki, dedi: Mən o vaxt yeniyetmə bir cavan idim. Minada İslam peyğəmbərini gördüm ki, ərəb .qəbilələrinin yanına gəlir və onların mənzillərinin qarşısında dayanır və deyirdi

"...Ey filan qəbilənin övladları"

Mən Allahın peyğəmbəriyəm. Sizin yanınıza gəlmişəm deyəm ki, Allahın əmrinə görə" yalnız ona pərəstiş ediniz, ona heç bir şeyi şərik qoşmayın, pərəstiş etdiyiniz bu bütləri kənara atınız, mənə iman gətirib dediklərimi təsdiq ediniz, mənə yardımçı olunuz ki, "Allah sizin üçün mənim vəzifəmin nə olduğunu izah etsin

Bu əziz İslam peyğəmbərinin qarşılaşdığı hər bir tayfaya söylədiyi sözlər idi. O həzrətdən sonra parlaq siması olan hər iki üzünə tərəf sallanmış qarışıq saçları olan və əyninə ədəni paltar geyən çəpgöz bir kişi onların yanına gələr və peyğəmbərin sözləri :sona çatdıqdan sonra deyərdi

”...Ey filan qəbilənin övladları“

Məbada bu kişinin dediklərinə aldanasınız. Bu kişi sizi və həmpeymanlarınız olan “bəni Uqeyş” cinlərini Lat və Üzzaya pərəstiş etməkdən çəkinməyə çağırır. Əvəzində isə .onun gətirdikləri bidətlər və azğınlıqları qəbul etməlisiniz

İbad deyir: Mən atamdan soruşdum: Onun arxasıyca gəzən və onun sözlərini inkar .edən bu kişi kimdir? Dedi: Bu əmisi Əbu Ləhəbdir

Beləliklə İslam peyğəmbəri getdiyi hər bir qəbiləyə öz dəvətini aşkar edərdi. O cümlədən bu tayfalardan biri də Məlih adlı bir kişinin başçısı olduğu Kində qəbiləsi idi. Həzrət onları cah- cəlal sahibi olan Allaha iman gətirməyə dəvət etdi. Amma onu inkar etdilər. Digər bir qrup isə Kəlb qəbiləsindən olan “Bəni Əbdullah” adlı bir dəstə idi. Həzrət öz dəvətini onlara bildirərək onlardan kömək istədi. Hətta onlara buyurdu: Allah- Təala atanız “Əbdullah” üçün yaxşı bir ad seçib (Bununla onların diqqətini cəlb .etmək istədi). Lakin o həzrətin sözlərinə əhəmiyyət verməyib, dəvətini rədd etdilər

Bu qəbilələrdən biri də o həzrətə ağır cavab verən bənu Hənifə qəbiləsi idi. Ərəblər .arasında heç bir tayfa bu tayfa kimi peyğəmbərə kobud şəkildə davranmadı

Başqa bir qəbilə isə Bəni Amir qəbiləsi idi. İslam peyğəmbəri öz dəvətini onlara bildirdikdə, onların arasından “Beyhərə” adlı bir kişi dedi: And olsun Allaha ki, əgər mən qüreyşdən olan bu cavanı təriflədsəm onun vasitəsi ilə ərəbləri özümə tabe edə bilərəm. Buna görə də üzünü o həzrətə tutub dedi: əgər biz sənin dediklərini qəbul etsək və Allah səni düşmənlərinə qalib etsə, özündən sonra rəhbərliyi mənə verərsən? Allahın elçisi buyurdu: Bu iş Allaha məxsusdur. Hər kimi iradə etsə məndən sonra .camaatın rəhbəri olacaq

səh:۲۷۰

Beyhərə" dedi: Heç rəvadırmı ki, biz sənin düşmənlərinin qarşısına sinələrimizi verək" və sən onlara qalib olduqdan sonra işi başqasına həvalə edəsən? Bizim nə sənə nə də .ki, sənin işinə ehtiyacımız yoxdur. Beləliklə o həzrətin sözünü qəbul etmədilər

Bəni Amir qəbiləsinin içərisində qoca bir kişi var idi ki, çox qoca olduğundan mövsüm vaxtı tayfası ilə birlikdə gələ bilmirdi. Bu qəbilənin adətinə görə onlar geri döndükdə o .kişinin yanına gedər və gördükləri hər bir şeyi ona danışardılar

Bu dəfə də qayıdanda ona dedilər: Əbdülmütəllib övladlarından bir kişi yanımıza gəldi. O peyğəmbərlik iddiası edib bizi də öz dininə dəvət edərək, bizdən istədi ki, ona kömək edib, öz qaldığımız yerə gətirək. Qoca kişi əllərini başına qoyub qışqırdı. İş işdən keçdi əvəzləmək olmayacaq. Niyə dəvətini qəbul etmədiniz? And olsun Allaha ki, o haqqlı idi. Çünki İsmail övladlarından heç kəs yalandan peyğəmbərlik iddiası etməz. Boş yerə .xoşbəxtliyi əlinizdən verdiniz

### İSLAM PEYĞƏMBƏRİ SUVEYD İBN SAMİT ILƏ

İslam peyğəmbəri öz təbliğatına davam edirdi. Qəbilələrin Məkkəyə gəldiyi vaxt onların yanlarına gedər, İslam dini və özünə kömək etməyə səsləyirdi. Həzrət Məkkə şəhərinə hər hansı bir qəbilədən hörmətli şəxs və ya digərlərinin gəldiyini eşitcək ayağa qalxar və o kişinin yanına gedər onu öz dininə dəvət edər və ondan kömək .etməsini istəyirdi

Bir gün o həzrətə xəbər verdilər ki, Bəni Əmr ibn Of qəbiləsinin böyüklərindən olan Suveyd ibn Samit Məkkəyə gəlibdir. Süveydin qəbiləsi onun adını Kamil qoymuşdular. Çünki qəhrəmanlıq, şer qoşmaq və soy kökü baxımından kamil həddə idi. Onun şücaət (və qəhramanlığı haqqında dastanlar danışırlar. Ondan şerlər də qeyd etmişlər.(١

.Xülasə İslam peyğəmbəri ayağa qalxıb onun yanına gedərək İslam dininə dəvət etdi

Suveyd dedi: Bəlkə də sənin gətirdiyin və təbliğ etdiyin şey



---

Suveydin qəhramanlığı və iki parçadan ibarət olan şerindən xəbərdar olmaq . [١] -١

məndə də vardır? İslam peyğəmbəri buyurdu: Sənin yanında olan nədir? Dedi: Loğmanın hikməti. İslam peyğəmbəri buyurdu: Onu mənə təqdim et. Suveyd Loğman hikmətindən bildiklərini peyğəmbər üçün dedi. Peyğəmbər buyurdu: Yaxşı sözlər olsada amma məndə olan sözlər bunlardan daha yaxşıdır. O Allahın mənə nazil etdiyi Qurandır. O (insanlar üçün) hidayət və nurdur. Sonra onun üçün bir az Quran tilavət edib, İslam dinini ona izah etdi. Suveyd fikrə getdi. Quran ayələri onu özünə cəzb .etmişdi. Buna görə də peyğəmbərə dedi: Bu yaxşı danışıqdır

Sonra Mədinəyə öz qəbiləsinin yanına qayıtdı. Bir az ötdükdən sonra Xəzrəc qəbiləsi (aralarında olan döyüş və qan tökməyə görə) onu öldürdülər. Bu hadisə Buasda(۱) Ovs .və Xəzrəc qəbiləsi arasında baş verən məşhur bir döyüş idi

.Suveyd qəbiləsinin bir hissəsi deyirdi ki, o müan olaraq öldürülmüşdür

### ƏYAS İBN MƏAZIN DASTANI

Mədinədə Ovs və Xəzrəc adlı iki böyük tayfa var idi ki, illərlə aralarında olan döyüşlərə görə qanlar axıdılmışdı. Ardıcıl çəkişmə və müharibələr onları yormuş və həyatlarını çətinləşdirmişdi. Bu tayfaların hər biri çalışırdı ki, hər hansı bir vasitə ilə digərinə qalib olub öz üstünlüyünü qorusun. Elə bu məqsəd ilə Ovs tayfasının Bəni Əbdüləşhəl qolundan olan bir dəstə cavan Əbul Heysərin (Ənəs ibn Raye) başçılığı altında Məkkəyə gəldi ki, Qüreyşlə Xəzrəclilərin əleyhinə ittifaq yaratsınlar. Bunların arasında .İyas ibn Məaz adlı bir cavan da var idi

İslam peyğəmbəri onların Məkkə şəhərinə daxil olmasından xəbər tutdu. Onları İslam dininə dəvət etmək məqsədi ilə yanlarına gedib dedi: Mən sizii buraya gətirən işdən də !daha yaxşı bir işi sizə təklif edirəm

Dedilər: O nədir? O həzrət onları İslam dinini qəbul etməyi təklif etdi və özünün peyğəmbər olmasını da onlara xatırlatdı. Sonra isə Qurandan onlar üçün bir neçə ayə .tilavət etdi



---

۱- [۱] . Buas Mədinə ətrafında bir yerin adıdır ki, Os və Xəzrəc arasındakı döyüş orada

Yeniyetmə olan İyas ibn Məaz üzünü digərlərinə tutub dedi: Ey qövm and olsun Allaha .(bu kişi düz deyir) bu iş sizin buraya gətirən işdən daha yaxşıdır

Ənəs ibn Rafe bir ovuc torpaq götürüb İyasın üzünə çırparaq dedi: Sus! Biz Məkkəyə buna görə gəlməmişik! İyas susdu. Amma elə o məclisdən etibarən İslam .peyğəmbərinə və müqəddəs İslam dininə qarşı onda meyl yarandı

Əziz İslam peyğəmbəri onların məclisini tərk etdi. Onlar da bir neçə gündən sonra Mədinəyə qayıtdılar. Çox çəkmədi ki, Ovs və Xəzrəc arasında məşhur Buas döyüşü baş .verdi

Buas döyüşündən sonra İyas ibn Məaz bir neçə gün ömür sürdü. Ölüm anı çatdıqda dilində

الله اکبر، لا اله الا الله، الحمد لله

kəlmələri dolaşırdı. Bu zikrləri təkrar edə- edə dünyasını dəyişdi. Şübhəsiz ki, Məkkədə İslam peyğəmbərini gördüyü məclisdə bu dini qəbul etmiş və son nəfəsinə qədər bu .müqəddəs dində olmuşdur

səh:۲۷۳

## MƏDİNƏ ƏNSARLARININ İSLAM DİNİNİ QƏBUL ETMƏSİ

### İŞARƏ

Bu minvalla bir neçə müddət ötdü. İslam peyğəmbəri Həcc mövsümü və digər Məkkə toplantılarında ərəb qəbilələrini İslam dininə dəvət edirdi. Nəhayət AllahTəala haqq dinin aşkar olması, peyğəmbərini izzətli etmək və verdiyi vədə uyğun olaraq onu .düşmənlərinə qalib etməyi iradə etdi

Qəbilələrin Məkkəyə gəldiyi bir dövrdə digər qəbilələr kimi Mədinədən Xəzrəc qəbiləsi də bu şəhərə gəlmişdilər. Onlar altı nəfər idilər: Bəni Nəccardan – Əsəd ibn Zurarə, Of ...ibn Haris – anası Übeydin qızı Əfra idi

...Bəni Zəriqdən... Rafe ibn Malik

Bəni ədən... Qutbə ibn Amir

Bəni Həram ibn Kəbdən... Uqbə ibn Amir

(Bəni Ubeyddən... Cabir ibn Əbdullah...(١

.Bu altı nəfər Xəzrəc tayfasının müxtəlif qollarından idilər

İslam peyğəmbəri onları “Minada” “Cəmərəye Üqbə” yaxınlığında görüb, onlara :buyurdu

?Siz hansı qəbilədənsiniz

.Dedilər: Xəzrəc qəbiləsindən

?Buyurdu: Yəhudilərin dostanlarındansınız



---

İbn Hişam burada bu altı nəfərin soykökünü beş və ya altı vasitə ilə qeyd edibdir . [١] -١ .ki, maraqlananlar Sirənin I cildinin ٤٢٩- ٤٣٠ səhifələrinə müraciət edə bilərlər

.Dedilər: Bəli

İslam peyğəmbəri onlara buyurdu: Mümkündür ki, burada bir az əyləşəsiniz ki, sizinlə söhbət edim? Dedilər: Bəli. Sonra hamılıqla yerin üzərində əyləşdilər. Əziz İslam peyğəmbəri onları Allahın yoluna dəvət edib, İslamı onlara izah etdi. Qurandan bir .neçə ayə də onlar üçün tilavət etdi

Allah- Təala haqqı qəbul edib, islam dininə itaət etməyi onlara inayət etdiyi üçün digər .qəbilələr kimi peyğəmbərə yox cavabı verməyib, fikrə getdilər

Onların İslam dinini qəbul etmələrinin səbəblərindən biri də bu idi ki, bunlar bütpərəst insanlar idilər. Onların şəhərlərində (Mədinədə) yaşayan yəhudilər isə səmavi kitab və din ardıcılları idilər. Öz kitablarından İslam peyğəmbərinin zühur edəcəyini bilirdilər. Buna görə də onlarla Mədinə camaatı arasında çəkişmə baş verdikdə onlara deyərdilər: Bu yaxınlıqda ərəblərin içərisindən bir peyğəmbər zühur edəcək və biz də .ona tabe olacaq və bununlada sizi məhv edəcəyik

Yəhudilərdən eşitdikləri bu sözlər onların bir- birinin sifətinə baxmasına səbəb oldu. Bəziləri isə üzünü dostlarına tutub dedi: And olsun Allaha bu yəhudilərin gəlməsi haqqında xəbər verdikləri peyğəmbərdir. Onlar bu peyğəmbərdən itaət etmələri ilə bizi qorxudurdular. Gəlin biz yəhudilərdən qabaq ona iman gətirək və imkan verməyək .ki, onlar bu səadətə nail olmaqda bizdən qabağa düşsünlər

Bu sözü İslam peyğəmbərinin möhkəm, ürəyə yatan sözləri və parlaq simasında kəşf olunmuş həqiqətdən sonra onların elə bu məclisdə İslam peyğəmbərinin dəvətini :qəbul etmələrinə və ona iman gətirmələrinə səbəb oldu. Sonra isə belə dedilər

Biz öz qövmümüz arasında elə bir vəziyyətdə yaşayırıq ki, ədavət və düşmənçilik ümumiyyətlə bizim həyatımızı bir- birinə vurmuş və birdəfəlik olaraq aramızda səfa və səmimiyyət götürülmüşdür. Bəlkə bu hadisə yəni bizim İslam dinini qəbul etməyimiz vasitəsi ilə Allah- Təala bizim aramızdakı ixtilafları aradan qaldıra. Biz elə indicə öz qəbiləmizə tərəf qayıdıb onları sizin ardıcıllardan olmağa dəvət edəcəyik. Onlar qəbul etdiyi və

sizə tabe olduqları halda şübhəsiz ki, bizim üçün səndən daha əziz və qüvvətli bir .kimsə olmayacaq

Onlar öz vətənlərinəMədinəyədöndülər. Öz qəbilələri üçün İslam peyğəmbəri ilə görüşmələrini ona iman gətirmələrini danışıb, onları da İslam dininə dəvət etdilər. Bu xəbər Mədinə şəhərinə yayıldı və o günün mühum xəbəri kimi evləri dolaşmağa .başladı

### İKİNCİ İLDƏ BİRİNCİ ÜQBƏ BEYƏTİ

O il beləcə ötdü. Həcc mövsümünün ikinci ilinin vaxtı çatdıqda Mədinə ənsarından on iki nəfər ötən ilin beyətini təkmilləşdirmək məqsədi ilə Məkkəyə tərəf yola düşdülər. .Onların adları belə idi

.Bəni Nəccardan: Əsəd ibn Zürarə, Haris ibn Rufaənin oğlanları olan Of və Məaz

.Bəni Rəziqdən: Rafe ibn Malik və Zikvan ibn Əbd Qeys

Bəni Ofdan: İbadə ibn Samit, Əbu Əbdurrəhman Yəzid ibn Söləbə

.Salim ibn Of qəbiləsindən: Əbbas ibn İbadə

.Bəni ədən: Üqbə ibn Amir

.Bəni Səvaddan: Qütbə ibn Amir

.Ovs ibn Harisə qəbiləsindən... Əbul Heysəm ibn Teyhan – adı Malik idi

Bəni Əmr ibn Ofdan: Uveym ibn Saidə

On nəfəri Xəzrəc və iki nəfəri isə Ovs qəbiləsindən olan bu on iki nəfər İslam .peyğəmbəri ilə beyət etdilər

Onların beyəti əvvəlinci Üqbə beyəti adı ilə məşhurlaşdı. Bu peyğəmbərin qadınlarla etdiyi beyətə oxşayırdı. Çünki o günə qədər peyğəmbərə müşrik və kafirlərlə döyüşə icazə verilmədiyi üçün onların beyətində döyüş şərti yox idi və təkcə aşağıdakı şərtlər :var idi

Allaha şərik qoşmayın, oğurluq etməyin, zinaya aludə olmayın, öz övladlarınızı“ .”öldürməyin, böhtan və iftira atmayın, xeyir işlərdə peyğəmbərin əmrindən çıxmayın

Bu peymandan sonra peyğəmbər buyurdu: Əgər əhdin

maddələrinə əməl etsəniz mükafatınız behişt olacaq. Əgər vəfa etməsiniz işiniz Allaha .qalıb. İstəsə əzab verəcək, istəməsə bağışlayacaq

Başqa bir rəvayətə görə isə buyurdu: Əgər vəfa etməsəniz, necə ki o əməlin müqabilində sizə dünyada hədd vurulsa , həmin hədd o günahın kəffarəsi olacaq. Yox əgər gizlin qalsa və ömrünün sonuna qədər məlum işiniz Allaha qalıb ki, ya əzab .verəcək, ya da ki, bağışlayacaq

Bu əhd- peyman bitdikdən sonra həmin, on iki nəfər Mədinəyə qayıtmaq istədikdə İslam peyğəmbəri Musəb ibn Umeyr ibn Haşim ibn Əbd Manafı onlarla birlikdə Mədinəyə göndərdi ki, Quranı və İslam təlimlərini onlara öyrətsin. Musəb ibn Əmir əziz İslam peyğəmbərinin əmri ilə on iki nəfər ilə birlikdə Mədinə şəhərinə gəlib, Əsəd ibn Zürarənin evinə yerləşdi. Namaz vaxtı olduqda qarşıda durar və Mədinə müanları da arxasında namaz qılardılar. Bu işin digər bir tərəfi də var idi ki, Ovs və Xəzrəcdən kimsə irəlidə durub namaz qıldıqda digər tayfa ona iqtida etmirdilər. Lakin Musəb .imam camaat (Məkkədən və Qüreyşdən olduğuna görə) durduqda hamı razı qalırdı

Mədinədə ilk dəfə “Cümə” namazını qılan şəxs Əsəd ibn Zürarə olmuşdur

Kəb ibn Malik İslam dini Mədinə şəhərinə daxil olanda ilkin iman gətirən şəxslərdən olmuşdur. O ömrünün sonlarında kor olmuşdu. Evdən çıxarkən övladı Əbdürrəhman əlindən tutar, məscid və bazara apardı. Əbdürrəhman deyir: Cümə günləri olduqda mən cümə namazı qılmaq üçün atamın əlindən tutar və onu məscidə aparardım. Cümə namazının azan səsini eşitdikdə bixtiyar Əsəd ibn Zürarənin ruhuna (dünyasını dəyişmişdi) salam göndərər və onun üçün bağışlanmaq diləyirdi. Hər cümə bu hərəkəti təkrar edərdi. Mən qərara gəldim ki, bu dəfə onun səbəbini soruğacağam. Cümə günü :olduqda ondan soruşdum

Atacan necə olur ki, cümə namazının azanını eşidən kimi Əsəd ibn Zürarəni xatırlayıb ?onun üçün istiğfar edirsən

Dedi: Övladım "Nəqiulxəzamat" adlanan "Hərreyi bəni Biyazə" tərəflərdəki "Həzmunneytdə" ilk dəfə bizim üçün cümə namazı qılan Əsəd ibn Zürarə olmuşdur. Cümə namazı olan kimi mən dərhal onu xatırlayıram. Dedim: O gün siz neçə nəfər ?olmusunuz

.Dedi: Onun cümə namazında iştirak edənlər qırx nəfər idilər

Səd ibn Məaz və Useyd ibn Huzeyrin İslam dinini qəbul etməsi

Qeyd etdiyimiz kimi Musəb ibn Əmir, Əsəd ibn Zürarənin evinə yerləşib, quran .öyrətməyə və İslam dinini təbliğ etməyə başladı

Əsəd ibn Zürarə gündüzlər Musəbi Mədinə şəhərinin müxtəlif məhəllələrinə aparır və .hər bir məhəllədə insanları İslam dininə dəvət etməklə məşğul olurdu

Bir gün bəni Əbdüləşhəl və bəni Zəfər məhəlləsinə gəldi. Bu iki qəbilənin başçıları Səd ibn Məaz və Əsid ibn Muzeyr adlı şəxslər idi. Səd ibn Məaz ilə Əsəd ibn Zürarə xalaoğlu idilər. Əsəd və Musəb bəni Zəfər bağlarından birində dayandılar və bir dəstə müan da onlara qoşuldu. Səd ibn Məaz onların məhəlləyə gəlmələrini eşitdikdə özü öz ayaqları ilə oraya gedib onları qovmaq istədi. Lakin Əsəd ilə rastlaşmamaq üçün fikrindən :daşınıb Əsid ibn Muzeyrə dedi

Bizim məhəlləyə gələn və bizim zəiflərimizi (ayaqyalınları) yoldan azdırmaq istəyən bu iki nəfərin yanına get və kobudluqla onları bu məhəllədən qovub çıxart. Əgər Əsəd ilə .qohum olmasaydım mən bu işi sənə həvalə etməz və özüm məşğul olardım

Əsid ibn Muzeyr qılıncını əlinə alıb o iki nəfərin yanına yollandı. Əsəd uzaqdan qılınc ilə qəzəbli halda onlara tərəf gələn Əsidi görüb Müsəbə dedi: Sənə tərəf gələn bu !qövmün böyüyüdür. Bəs Allahın haqqı onun barəsində nədirsə yerini yetir

.Müsəb dedi: Əgər əyləşsəniz onunla söhbət edəcəyəm

:Bu zaman Əsid onlara çataraq uca səslə qışqırıb dedi

Bura niyə gəlmisiniz? Fikriniz var ki, bizim düşüncəsiz və zəif (iradəsi zəif – mütərcim) !insanları yoldan çıxarasınız? Əgər sağ qalmaq istəyirsinizsə burdan çıxıb gedin

qulaq asaydın. Sonra isə bəyənsən qəbul edər, bəyənməsən bizi uzaqlaşdırmaq .fikrində olarsan

.Əsid dedi: İnsaflı söhbət etdin

.Sonra əlindəki qılıncın ucunu yerə qoyub o iki nəfərin yanında əyləşdi

Musəb Quran oxumağa və İslam hökmlərini izah etməyə başladı. Əsəd diqqətlə Əsidin üzünə baxırdı ki, Musəbin sözlərinin ona necə təsir etdiyinin şahidi olsun. Yavaş- yavaş Əsid Musəbin sözlərinin təsiri altına düşüb dedi: Necə gözəl sözdür! Sonra üzünü :Musəbə tutub dedi

?Bu dinə daxil olmaq üçün nə etmək lazımdır

Musəb dedi: Gərək qüsl verib (bədənini yuyasan) paltarını da yuyasan, sonra isə .şəhadətləri (kəlmeyi şəhadəti – mütərcim) deyib namaz qılasan

Əsid qüsl edib paltarlarını yuduqdan sonra şəhadətləri deyib, namaz qıldı. Sonra isə :Musəb və Əsəd dedi

Bu qəbilənin arasında bir şəxs var ki, əgər sizin ardıcıllardan olsa qəbilənin heç bir üzvü onunla müxalifət edə bilməz. O, Səd ibn Məazdır. Mən indi gedir və onu sizin yanınıza .göndərirəm

Bunu deyib yerindən qalxaraq qəbilə üzvlərinin yanında əyləşən Sədin yanına gəldi. Səd ibn Məaz onu gördükdə dedi: And olsun Allaha ki, bu Əsid bizim yanımızdan gedən .Əsid deyil. Görkəmi tamamilə dəyişib

?Onların bərabərinə çatdıqda ona dedi: Nə etdin

Əsid dedi: Mən o iki nəfər ilə danışdım. And olsun Allaha ki, onların məhəllədə olmasının ziyanı yoxdur. Amma yenə də sizin göstərişinizə uyğun olaraq onlara burada qalmağı .qadağan etdim. O iki nəfərdə getmələrini qəbul etdilər

Amma eşitdiyimə görə elə indicə bəni Harisə qəbiləsi Əsəd ibn Zürarənin sənin xalan oğlu olduğunu bilib. Yığılıblar ki, onu öldürməklə səni alçaldılıb, heysiyyət və abrını

.ləkləyələr

Bu sözü eşidən Səd qəzəblənib Əsəd ibn Zürarəni müdafiə etmək üçün ayağa qalxaraq Əsidin silahını əlindən alıb ona dedi: And olsun Allaha ki, sən bir iş yarıdan deyilsən. Sonra

səh:۲۸۰

Əsəd və Musəbə tərəf hərəkət etdi. Lakin onların yanına çatanda gördü ki, hər ikisi sağlam vəziyyətdə əyləşmiş və Bəni Harisə qəbiləsindən də heç bir əsər- əlamət yoxdur. Səid başa düşdü ki, Əsid hiyləgərliklə onu buraya göndərib ki, onların sözlərini eşitsin. Hər halda onu görən Əsəd Musəbə dedi: And olsun Allaha ki, bu qəbilənin başçısı yanına gəlir. Bu elə bir şəxsdir ki, əgər səni qəbul etsə bütün qəbilə onu qəbul .edəcək və heç kim onun ziddinə getməyəcək

Bu vaxt Səd gəlib çatdı, üzünü Əsəd ibn Zürarəyə tutub hündür səslə qışqırıb dedi: Ey Əmamənin atası əgər biz qohum olmasaydıq sənin cürətin çatmazdı ki, bizim .məhəlləyə gəlib xoşlamadığımız mətləblərin təbliğinə məşğul olasan

Musəb dedi: Mümkündür ki, bizim yanımızda bir az əyləşəsən və bizi dinləyəsən. Əgər xoşuna gəlsə onu qəbul edərsən və əgər xoşuna gəlməsə sən necə istəsən biz elə .edəcəyik

.Səd – Əsid kimi – dedi: İnsaflı söhbət etdin. Sonra əlindəki yaraqı yerə qoyub əyləşdi

.Musəb İslamı onun üçün izah edib bir az Quran oxudu

Əsəd deyir: Mən və Musəb, Sədin üzünə baxırdıq. Onun üzünün qırışlarının tədricən .açıldığını gördükdə bildik ki, İslam dini ona təsir etmiş və onu özünə cəzb etmişdir

?Buna görə də soruşdu: Siz bu dinə daxil olmaq üçün nə edirsiniz

Dedilər: Gərək qüsl verib paltarını da yuyasan, sonra isə şəhadətləri deyib namaz .qılasan

.Səd qalxıb qüsl verib paltarlarını yuduqdan sonra şəhadətləri deyib namaz qıldı

Sonra yarağını əlinə alıb öz qövmünə tərəf qayıtdı. Onu gözləyən Əsid ibn Hüzeyr ilə .tayfasına tərəf getdilər

Sədin qiyafəsini görən qəbilə üzvləri bir- birinə dedilər: And olsun Allaha ki, Sədin qiyafəsi dəyişilib və burdan gedən Sədə bənzəmir. Hər halda Səd ibn Məaz öz :qəbiləsinin arasına qayıdıb dedi

Dedilər: And olsun Allaha ki, sən bizim böyümüzsən, rəy və fikir cəhətdən hamıdan .üstün və yüksəksən

Səd dedi: Elə isə xəbəriniz olsun ki, nə qədər ki, Allah və onun rəsuluna iman gətirməmisiniz sizlərdən heç biri kişi və qadın ilə kəlmə kəsməyəcəyəm. O gün bütün Əbdüləşhəl qəbiləsi Sədə tabe olaraq müan oldular. Hələ axşam düşməmiş bu qəbilə .arasında müan olmayan bir qadın və kişi qalmamışdı

Axşam vaxtı Əsəd və Musəb qaliblər kimi evlərinə döndülər. Sonrakı günlər ilsə digər məhəllələrə getdilər və yavaş- yavaş İslam dini Mədinə şəhərində bütün evlərə nüfuz .etdi. Elə bir ev tapmaq olmazdı ki, orada bir neçə müan kişi və ya qadın olmasın

Təkcə bir neçə məhəllə qalmışdı ki, İslam orada möhkəmlənə bilməmişdi. Bu məhəllələr Bəni Üməyyə ibn Zeyd, Xətmə, Vail və Vaqif məhəllələri idi. Bu məhəllələrdə İslamın qəbul edilməsinə mane olan şəxs onların başçısı və şair olan Əbu Qeys ibn Əslət idi. Bu beləcə davam etdi və İslam peyğəmbəri Mədinəyə hicrət etdi. Bədr, Ühüd və Xəndək döyüşləri də arxada qaldı. Camaatın onun barəsində sözləri (çoxaldı və bu barədə şerlərdə qoşdu. (Amma İslamı qəbul etmədi).(١)

## İKİNCİ ÜQBƏ PEYMANI

Bir çox nailiyyətlər qazanan Müsəb bir az sonra Məkkəyə qayıtdı. Həcc mövsumu .zamanı bir qrup müan Mədinə karvanları ilə birlikdə Məkkə şəhərinə gəldilər

:O müanların biri olan Kəb ibn Malik deyir

Biz həmin il bizim rəhbər və böyüyümüz olan Bərra ibn Mərur ilə birlikdə Məkkəyə tərəf yola düşdük. O vaxta qədər bizim heç birimiz İslam peyğəmbərini görməmiş idik. Yol ilə gedərkən təzəcə İslamı qəbul etmiş Bərra ibn Mərur dedi: Mənə elə gəlir ki, ?bilmədiyiniz bir şey baş verəcək. Sizdə mənimlə razısınız yoxsa yox



---

Şerlərin mətnini bilmək istəyirsinizsə Sirənin I cildinin ٤٣٨ci səhifəsinə müraciət . [١] -١ .edə bilərsiniz

?Dedik: Nədir

Dedi: Mənim fikrimə görə namaz vaxtı bu evə yəni Kəbə evinə arxa çevirməyəcək və !namazı Kəbəyə tərəf qılacağıq

Biz cavabında dedik: And olsun Allaha biz eşitmişik ki, əziz peyğəmbərimiz Şama tərəf .(Beytül- Müqəddəs) namaz qılır. Biz də onun kimi edəcəyik

.Bərra dedi: Amma mən Kəbəyə tərəf namaz qılıram

Dedik: Biz bu məsələdə sənə tabe olmayacağıq. Beləliklə namaz vaxtı Bərra Məkkə .istiqamətinə, biz isə BeytülMüqəddəsə tərəf namaz qıla- qıla Məkkəyə çatdıq

Orada Bərra mənə dedi: Ey qardaş oğlu bizi İslam peyğəmbərinin yanına apar ki, ondan mənim hərəkətimin doğru və ya yanlış olmasını soruşaq. Çünki sizin mənimlə müxalif mövqedə durmağınız məni narahat edir və qorxuram ki, Allahın dininin əksinə .hərəkət etmiş olam

Mən də indiyə qədər İslam peyğəmbərini görməmişdim. Onunla birlikdə evdən çıxıb o həzrətin olduğu yeri axtarmağa başladıq. Məkkəlilərdən biri bizə dedi: İndiyə qədər onu görmüsünüz? Dedik yox. Dedi: Əbbas ibn Əbdül Mütəllibi görmüsünüz? Dedik: .bəli– çünki Əbbas ara- sıra Mədinəyə ticarətə gəldiyi üçün onu görmüşdük

O kişi dedi: Elə ki MəscidulHərama daxil olduğumuz, baxın görün Əbbas ibn Mütəllibin .yanında kim oturubsa, sizin axtardığınız şəxs odur

İslam peyğəmbəri üzünü Əbbasa tutub buyurdu: Bu iki kişini tanıyırsan? Dedi: Bəli öz .biri öz qəbiləsinin başçısı Bərra ibn Məmurdur. O birisi isə Kəb ibn Malikdir

Kəb deyir: And olsun Allaha ki, yadımdan çıxmır. Əbbasın sözünün arxasıyca buyurdu: .Həmin şair (Kəb), Əbbas dedi: Bəli

Bərra ərz etdi: Ey İslam peyğəmbəri mən təzəcə İslamı qəbul etmişəm və səfər boyu namazlarımı Kəbə istiqamətində qılmışam. Çünki xoşlamıram namaz qılan vaxtı bu evə arxa çevirim. Amma dost və yoldaşlarım mənimlə razılaşmayıb üzü Büytül-Müqəddəsə tərəf namaz qıldılar. Mən onların bu hərəkətinə görə ürəyimdə narahat oldum və sizin

!Buyurdu: Əgər səbr etsəydin üzü həmin qibləyə namaz qılardın

O gündən etibarən Bərra ibn Mərur peyğəmbərin qibləsinə tərəf yəni BeytülMüqəddəsə tərəf namaz qılmağa başladı. Amma ona yaxın olan insanlar elə güman ediblər ki, o ölənə qədər üzü Kəbəyə namaz qılıbdır. Bu söz düzgün deyil. Çünki .biz onun həyat yaşayışını onlardan daha yaxşı bilirik

:Oun ibn Əyyub Ənsari Bərra barəsində deyir

و منا المصلى أول الناس مقبلا

على كعبه الرحمن بين المشاعر

Yəni ilk dəfə Kəbə istiqamətində namaz qılan şəxs bizlərdəndir. Bərra ibn Məruru .nəzərdə tuturdu

O cümlədən Kəb deyir: Biz İslam peyğəmbəri ilə həcc əməllərindən sonra təşriq(١) günlərinin ortasında Üqbədə gecə vaxtı görüşmək barədə sözləşdikdən sonra həcc .əməllərini yerinə yetirməyə yollandıq

Həmin gecə vaxtı gəlib çatdıqda bizimlə gələn rəhbərlərimizdən biri olan Əbu Cabirin– Əbdullah ibn Əmən –yanına getdik. O vaxta qədər kafir və müşrik kimi yaşayan və digər Mədinə müşrikləri kimi İslamı qəbul etməyimizi ondan da gizlətdiyimizi rəhbərə dedik: Ey Cabirin atası sən bizim qəbilənin rəhbər və hörmətli şəxslərindən birisiniz. Doğurdan da biz istəmirik ki, sən şirk içində yaşayıb qiyamət günü isə cəhənnəm oduna çevriləsən. Sonra onu İslama dəvət edərək peyğəmbər ilə görüş üçün olan :vədəmizi onada dedik

Əbu Cabir bizim dəvətimizi yerə salmayıb İslam dinini qəbul etdi və bizim ilə birlikdə .İslam peyğəmbəri ilə görüşmək üçün Üqbəyə gəldi

Orada gecənin üçdən birinə qədər öz çadırlarımızda qaldıq. Ondan sonra Qəta quşları kimi yavaş və ahəstə getməyə başladıq. Oraya toplaşanların hamısı yetmiş üç nəfər idi. Aralarında iki qadın var idi. Biri Kəbin qızı “Nəsibə” digəri isə Əmr ibn Ədinin qızı

."“Əsma

Bir az sonra İslam peyğəmbəri əmisi Əbbas ibn Əbdülmütəllib



---

.Təşriq günləri Zi Həccə ayının on bir, on iki və on üçüncü günlərinə deyilir . [۱] -۱

ilə gəlib çıxdılar. Əbbas o zaman hələ İslamı qəbul etməmişdi. Ancaq yenə də qardaşı oğlunun işlərinə nəzarət etməyi və onun əhd-peymanlarının möhkəm olmasını istəyirdi.

Əyləşdikdən sonra ilk danışan şəxs həmin Əbbas ibn Əbdülmütəllib oldu. O üzünü bizə tutub dedi:

Ey Xəzrəc qrupu(١) Məhəmmədin bizim yanımızda necə hörmət və məqama malik olduğu sizə aydındır. Biz bu günə qədər özümüzlə həmfikir olan insanlarla birgə onu öz qövmümüzdən müdafiə etmişik və bundan sonra da bizim qövmümüz arasında əziz və hörmətli olacaq və tam təhlükəsiz yaşayacaq.

Amma onun özü istəyir ki, yanınıza gələrək sizə qoşulsun. Əgər doğurdanda dediklərinizə hazırsınızsa, əhdpeymanınıza sadiqsinizsə, onu düşmənləri və müxaliflərindən qoruya biləcəksinizsə, o zaman əhdpeyman bağlayıb hazır olduğunuzu elan edin.Yox əgər hazır deyilsinizsə, onu düşmənlərinin hücum və çətinlikləri qarşısında qoruya bilməyəcəksinizsə, sizin yanınıza gələn kimi düşmənə təslim edəcəksinizsə, onda onu burada qoyub gedin. Biz indiyə qədər onu qoruya bilmişiksə, deməli bundan sonra da qoruya biləcəyik!

Kəb deyir: Əbbas sözünü bitirdikdən sonra biz ona cavab olaraq dedik: Sənin sözlərini eşitdik, sonra isə üzümüzü İslam peyğəmbərinə tutub dedik: İndi isə sən danış, özün və Allahın üçün istədiyin əhdpeymanı söylə. Peyğəmbər söhbətə başlayaraq, quran ayələri oxuyub, bizi Allah və İslam dininə rəğbətləndirdikdən sonra buyurdu:

Mənim sizinlə olan əhdpeymanım budur: Öz qadın və uşaqlarınızı müdafiə edib qoruduğunuz kimi məni də müdafiə edib qorumayacaqsınız.

Bərra ibn Mərur o həzrətin əlini tutaraq dedi: And olsun səni peyğəmbər göndərənə, öz namusumuzu necə müdafiə ediriksə, sizi də müdafiə edəcəyik. Bizimlə əhdpeyman bağla, and olsun Allaha ki, biz döyüş və silah əhliyik. Döyüşməyi atalarımızdan irs aparmışıq...

Əbülheyəm ibn Teyhan, Bərra ibn Mərurun sözünü kəsib

---

[۱] -۱. İbn Hişam deyir: O gün Xəzrəc kəlməsi hər iki tayfa olan Xəzrəc və Os tayfalarına şamil edilirdi – İslam qəbul edən şəxslər–.

dedi: Ey Allahın elçisi bizimlə yəhudilər arasında əhdpeymanlar bağlanıb, amma vəziyyət belə olduqda bu əhdpeymanlar pozulacaq. Buna görə də elə olmasın ki, biz yəhudilər ilə olan əlaqəmizi kəsdikdən və siz də öz düşmənlərinizə qalib olduqdan !?sonra bizi tərk edərək öz qövmünün yanına qayıdasan

İslam peyğəmbəri təbəssüm edib buyurdu: (Arxayın olun) Mənim qanım sizin qanınız, mənim şərəfim sizin şərəfinizdir.(۱) Mən sizdən, sizdə məndənsiniz (bizim aramızda fərq və ayrıseçkilik yoxdurmütərcim). Sizin döyüşdüyünüz ilə döyüşər və sülh etdiyiniz .ilə də sülh edərəm

Sonra buyurdu: İndi isə öz aranızdan daha mühüm olan on iki nəfər seçin ki, onlar sizin .əvəzinizə mənim yanımda zamin olsunlar

Xəzrəcdən doqquz, Ovsdan isə üç nəfər seçib onları İslam peyğəmbərinə təqdim .etdilər

Xəzrəcdən seçilən insanlar bunlar idi. Əsəd ibn Zürarə, Səd ibn Rəbi, Əbdullah ibn Rəvahə, Rafe ibn Malik, Bərra ibn Mərur, Əbdullah ibn Əmr ibn Həram, İbadə ibn .Samit, Səd ibn İbadə, Münzər ibn Əmr

Ovs tayfasından seçilən insanlar isə Əsid ibn Huzeyr, Rufaə ibn ƏbdülMünzər idi.(۲) .Bəziləri isə Rüfaənin yerinə Əbülheysəm ibn Teyhanın olduğunu qeyd edirlər

Bu on iki nəfər seçildikdən sonra Kəb ibn Malik bu haqda bir qəsidə qoşdu.(۳) Bu vaxt :Allahın elçisi həmin on iki nəfərə buyurdu

Siz İsa ibn Məryəmin həvariləri kimi öz qövmünüzə zaminsiniz. Mən də öz qövmümə .yəni müanlara cavabdehəm



---

olmuşdur. Bizim fikrimizcə bu sözdən " الهدم والهدم" Bu sözün ərəbcə işlənməsi . [۱] -۱ məqsəd izzət, şərəfdir ki, bizdə onu farscaya güzəşt kimi (şərəf) tərcümə etmişik. Lakin ibn Hişam bu sözün izahında demişdir: Yəni mənim cavabdehliyim sizin .cavabdehliyiniz, mənim hörmətim sizin hörmətinizdir

İbn Hişam bu on iki nəfərin hər birinin səkkizon babasını ardıcıl olaraq qeyd edib. . [۲] -۲
Biz uzunçuluq olmasın deyə onları ixtisar etdik. Maraqlananlar sirənin I cildinin ۴۴۳-
.۴۴۴- cü səhifələrinə müraciət edə bilərlər

Qeyd etdiyimiz qəsidənin mətnindən xəbərdar olmaq istəyirsinizsə, sirənin I . [۳] -۳
.cildinin ۴۴ ci səhifəsinə müraciət edə bilərsiniz

## ƏBBAS İBN İBADƏ ƏNSARİNİN SÖZÜ

Üqbədə beyət edilməmişdən öncə danışan şəxslərdən biri də Əbbas ibn İbadə Ənsari idi. O, bəni Salim ibn Of qəbiləsindən idi. ۷۳ nəfərə daxil olan bu şəxs Mədinəlilərin :İslam peyğəmbəri ilə beyət etdiklərini görüb dedi

?Ey Xəzrəclilər(۱) bu kişi ilə necə və nə ilə beyət etdiyinizi bilirsinizmi

.Dedilər: Bəli

Dedi: Sizin bu beyətiniz qara və qırmızı insanlar il döyüşə gətirib çıxaracaq. Deməli əgər vardövlətiniz qarət edildikdə və tayfa başçılarınız öldürüldükdə, onu düşmənə təslim edəcəksinizsə, onda onunla beyət etməyin və onu bu vəziyyətdə tərk edin. Çünki and olsun Allaha əgər belə etsəniz dünya və axirətdə, pislik və rüsvayçılıq sizinlə olacaq. Yox əgər vardövlətiniz talan, rəhbərləriniz öldürüldüyü halda yenə də onu .müdafiə edəcəksinizsə, deməli bu beyət sizə dünya və axirət səadəti gətirəcək

Yoldaşları cavabında dedilər: And olsun Allaha ki, biz bütün bu hadisələrin qarşısında .yenə də onu himayə edəcəyik



---

Əvvəldə kitabın alt tərəfində haşiyədə qeyd etdik ki, Xəzrəc həmin vaxt bütün . [۱] -۱ .ənsara aid edilirdi

Sonra İslam peyğəmbərinə üz tutub dedilər: Əgər biz öz əhd- peymanımıza vəfalı ?olsaq, bizim mükafatımız nə olacaq

Buyurdu: Behişt

.Dedilər: Elə isə əlini aç və səninlə beyət edək

.Allahın rəsulu əlini açdı və onlar da o həzrət ilə beyət etdilər

Ancaq bu həssas məqamda Əbbas ibn İbadənin bu sözləri niyə deməsi haqqında .müxtəlif fikirlər mövcuddur

Asim ibn Ömər demişdir: And olsun Allaha ki, Əbbas ibn İbadə bu sözü camaatın öz əhdpeymanında möhkəm olması üçün demişdir. Əbdullah ibn Əbubəkr deyir: Əbbas istəyirdi ki, o gecə beyət təxirə salınsın, çünki ehtimal vardı ki, Əbdulla ibn Əbi ibn Selul(١) Məkkəyə gələcək və bu beyət onun hüzurunda yerinə yetiriləcək və beləliklə .də beyət daha da möhmək olacaq. Daha doğrusunu Allah bilər

Beləliklə o həzrətlə beyət etməyə başladılar və orada iştirak edənlərin hamısı İslam .peyğəmbəri ilə beyət etdilər

.İlk beyət edən şəxsin kim olması barəsində müxtəlif nəzərlər vardır

Bəni Nəccarın fikrinə görə, ilk beyət edən Əsəd ibn Zürarə olmuşdur. Bənu əbdüləşhəl deyir: Bu şəxs Əbülhəsən ibn Teyhan olmuşdur. Kəb ibn Malik isə deyir ki, birinci Bərra .ibn Mərur, sonra isə digərləri beyət etdilər. Daha doğrusunu Allah bilir

Beyət başa çatdıqdan sonra şeytan Uqbə dağının yüksək yerindən uca səslə fəryad :etdi

Ey Minada çadırda yatanlar, necə də rahat yatmısınız. Heç xəbəriniz var ki, sizin .mənfur rəhbəriniz öz dindən çıxan ardıcılları ilə sizinlə döyüşmək üçün toplanıblar

(İslam peyğəmbəri buyurudu: Bu şeytandır (qorxmayın

Sonra buyurudu: Öz yerlərinizə qayıdın

Əbbas ibn İbadə dedi: Səni peyğəmbər göndərən Allaha and olsun ki, əgər istsən .(icazə versən) sabah sübh qılınclarımız ilə “Mina” ya hucum edərik

İslam peyğəmbəri buyurdu: Döyüşə icazəm yoxdur. İndi öz mənzil və qaldığınız .yerlərə qayıdın

səh:۲۸۸

---

.Selul, Xəzaə tayfasından olan bir qadının adıdır . [۱] -۱

Peyğəmbərin göstərişinə uyğun olaraq onlar öz çadırlarına qayıdıb, gecəni orada .keçirtdilər

Qüreyşin Ənsarın beyətindən xəbər tutması

Kəb ibn Malik deyir: Səhər açılan kimi Qüreyş bizim çadırlarımıza gələrək dedilər: Ey Xəzrəc tayfası biz eşitmişik ki, siz Məhəmmədin yanına gəlmiş və bizim əleyhimizə peyman bağlayaraq, onu Məkkədən Mədinəyə aparmaq fikrinə düşmüsünüz. Halbuki biz sizinlə döyüşməyi düşünməmişik və sizinlə döyüşmək bizim üçün ən çirkin .şeylərdən hesab olunur

Bizim içərimizdə hələ də İslam dinini qəbul etməyən insanlar ayağa qalxıb and içdilər ki, belə bir şey olmayıb və bizim bundan xəbərimiz yoxdurdoğrudanda onların xəbəri yox idi-. Amma biz birbirimizə baxaraq heç bir şey demədik. Belə olduqda Qüreyş getmək üçün ayağa qalxdı. Qüreyşdən biri olan Haris ibn Muğeyrə ayağa qalxdıqda mən onun ayağında təzə bir cüt nəleyn (çarıq) görüb, yoldaşlarım kimi bu söhbətdə iştirak etmək məqədi ilə Əbu Cabirə dedim: Sən bizim böyük və rəhbərimiz olduğun .üçün bu cavan qüreyşli kimi çarıq geyinə bilməzsən

Haris ibn Muğeyrə bu sözü eşitcək dərhal ayaqlarındakı çarıqları çıxarıb mənə tərəf !ataraq dedi: And olsun Allaha ki, bunları geyinməlisən

Əbu Cabir mənə dedi: Yox ey Malik, sən bu cavanı əsəbləşdirdin, çarığı ona qaytar! Dedim: And olsun Allaha ki, qaytarmayacağam. Çünki mən bunu yaxşı yerə yozdum. Əgər falın düz çıxsa mən onun özünü də oğurlayacağam! Qüreyş oradan Əbdullah ibn Əbi ibn Selulun (Mədinə əhalisinin yanında çox böyük hörmətə sahib bir şəxs idi) .yanına gəlib bu barədə ondan soruşdular

Əbdullah dedi: Bu mühüm bir məslədir. Mənim tayfamın üzvləri mənə xəbər vermədən heç vaxt belə bir addım atmazlar. Qüreyş bu sözləri eşitdikdən sonra geri dönsələrdə .amma bədgüman olduqları üçün yenə də axtarışlarını davam etdirdilər

Qüreyş bu barədə doğrudürüstməlumat əldə etdikdə artıq hacılar Minadan köçmüşdülər və məxsusən də Mədinə əhalisi Məkkə şəhərini tərk etmişdilər. Buna

düşdülər. Lakin onlara çata bilmədilər. Təkcə “Əzaxer”(۱) adlanan yerdə Münzər ibn Əmr və Səd ibn İbadəni tuta bildilər. Səd və Münzər hər ikisi seçilmişlərdən idilər. Münzər bütün vasitələrdən istifadə edərək, qaçıb canını qurtara bildi. Amma Səd ibn İbadəni tutub, miniyinin palanını bağladığı iplə onun əllərini möhkəmcə boynuna bağladılar. Beləliklə onu Məkkə şəhərinə gətirib orada işgəncə etməyə başladılar. .Onun uzun saçlarından tutub Məkkə şəhərində sürüyürdülər

Səd deyir: Məni bu halda Məkkə şəhərinin küçələri ilə gəzdirərkən sonradan tanıdığım xoş sima və hündür boy Süheyl ibn Əmrin mənim yanıma gəldiyini gördüm. Öz- özümə dedim: Əgər bunlardan kimdəsə xeyir və yaxşılıq varsa elə bunun yanında olacaq. Amma mənə yaxınlaşan kimi əlini qaldıraraq mənə bir sillə vurdu. Mən başa düşdüm .ki, onların heç birində yaxşılqdan əsər- əlamət yoxdur

Bu zaman sonralar adını bildiyim Əbülbəxtəri ibn Hişamın mənə yazığı gəldiyi üçün onlardan ayrılıb yanıma gəldi və mənə dedi: Sənin hansısa bir qüreyşli ilə əhdpeymanın və ya pənahın varmı? Dedim: Əlbətdə mən Mədinədə olarkən iki qüreyşliyə pənah vermişəm. Onlardan biri Cubeyr ibn Mutəmdir. Cubeyrin tacirləri onun ticarət mallarını Mədinəyə gətirmişdilər. Camaat onlara zülm etmək istəyirdilər ki, mən mane olub onlara sığınacaq verdim. Digəri isə Haris ibn Hərb ibn Üməyyədir. Dedi: Elə isə qışqıraraq onlardan birini çağır və onlara sığınacaq verməyini xatırla ki, onlarda sənin .bu halında sənə sığınacaq versinlər

Mən qışqırıb o iki nəfəri çağırdım. Qeyd etdiyim kimi məscidə onların yanına gedib dedi: Qüreyşlilər, Xəzrəcli bir kişini tutub döyür və o da siziköməyə çağıraraq deyir: Mən .onlara sığınacaq vermişəm və bizim aramızda əhdpeyman var

?Dedilər adı nədir

.Əbülbəxtəri dedi: Adı Səd ibn İbadədir

,O iki nəfər dedilər: And olsun Allaha ki, düz deyir: O

Əzaxer” Məkkə yaxınlığında bir yerin adıdır və deyilənlərə görə İslam“ . [١] -١
.peyğəmbəri Məkkəni fəth edən zaman oradan Məkkəyə gəldi

Mədinəyə getmiş tacirlərimizə qarşı edilən zülmə mane olmuş və onlara sığınacaq vermişdir. Bunu deyib yerlərindən qalxaraq Sədin yanına gələrək onu Qüreyşin .çəngindən xilas edib Mədinəyə qaytardılar

Zirar ibn Xəttab ibn Mərdas, Sədi qüreyşin çəngindən xilas edən Cübeyr ibn Mütəm və Haris ibn Hərbi məzəmmət edərək iki şer söyləmiş və Həssan ibn Sabit onlara cavab .vermişdir.(١) Bu iki şer hicrətdən qabaq deyilən birinci şer idi

### ƏMR İBN CƏMUH BÜTÜNÜN DASTANI

İslam peyğəmbəri ilə Üqbədə beyət edənlər ümumiyətlə cavanlar idilər. Mədinə .qəbilələrinin yaşlılarının çoxu hələ də bütpərəst və müşrik kimi yaşayırdı

.O cümlədən onlardan biri də ə qəbiləsinin böyüklərindən biri olan Əmr ibn Cəmuh idi

Bir çox qəbilə başçıları kimi Əmr ibn Cəmuhda öz evində çubuqdan bir büt düzəldib ona pərəstiş edərək ehtiram göstərərdi. Bu bütün adı “Mənat” idi. İslamı qəbul edən bəni ə cavanlarının arasında Əmr ibn Cəmuhun oğlu “Məaz” da vardı. Onlar Mədinəyə qayıtdıqdan sonra gecələr Əmr ibn Cəmuhun evindəki bütü oğurlayıb başı üstə nəcis dolu zibilliyə atardılar. Səhər açılan kimi Əmr ibn Cəmuh öz bütünün arxasıyca gələr onu zibillikdən çıxarıb yuyar və yenə də öz yerinə qoyub ona deyərdi: And olsun Allaha ki, əgər sənə qarşı kimin bu cür cəsarət və ədəbsizlik etdiyini bilsəydim onu tənbeh .edərdim

Növbəti gecə yenə də bəni ə cavanları bütü evdən oğurlayıb zibilliyə tullayardılar. Bu iş bir neçə gecə təkrar oldu. Nəhayət bir gün Əmr onu yuyub evə gətirdikdən sonra boynuna bir qılınc asaraq dedi: And olsun Allah ki, mən sənə qarşı kimin cürət etiyini bilmirəm. İndi bu qılıncı boynundan asıram. Əgər doğrudanda səndə xeyir varsa bu .dəfə yanına gəldikdə özünü müdafiə et

O, gecə Bəni ə cavanları Mənatı çölə çıxartdılar. Boynundakı qılıncı açıb yerinə ölü iti .iplə bağlayaraq zibilliyə tulladılar

[۱] -۱. I Qeyd etdiyimiz şerlərin mətnindən xəbərdar olmaq istəyirsinizsə sirənin cildinin ۴۵۴۵۲- ci səhifələrinə müraciət edə bilərsiniz.

Səhər açılan kimi Əmr ibn Cəmuh öz bütünün arxasıyca həmin zibilliyə gəldikdə onu orada görmədi. Onu axtararaq digər bir zibillikdə boynuna ölü it bağlandığını və üzü .üstə yerə düşdüyünün şahidi oldu

O, bir az diqqətlə bütə tamaşa etdi. Digər tərəfdən də Bəni ənin İslam dinini qəbul etmiş üzvləri onu bütə pərəstiş etməkdə danlayıb İslam dininə dəvət etdilər. Beləliklə ondan sonra Əmr ibn Cəmuh müan olub, İslam dininə olan imanını möhkəmlətdi. Bu .zaman qeyd etdiyimiz büt və bütpərəstlik haqqında aşağıdakı şerləri oxudu

و الله لو کنت الها لم تکن

انت و کلب و سط بئر فی قرن

افّ لملقاك الها مستدن

الان فتشناك عن سوء الغبن

الحمد لله العلى ذى لامنن

الواهب الرزق ديان الدين

هو اللذى أنقذونى من قبل أن

اكون فى ظلمه قبر مر تهن

Şerin qısaca olaraq tərcüməsi belədir: And olsun Allaha ki, əgər sən Allah olsaydın it ilə eyni ipdə olmazdın. İndi başa düşdüm ki, sən Allah deyilsən və indiyə qədər səfehlik edib sənə pərəstiş etmişəm. Təşəkkür edirəm o Allaha ki, öz peyğəbəri Əhməd .vasitəsi ilə mənə nicat verdi

## ÜQBƏDƏ İSLAM PEYĞƏMBƏRİ İLƏ BEYƏT EDƏNLƏRİN ADLARI

Sonda yaxşı olar ki, Üqbədə İslam peyğəmbəri ilə beyət edən yetmiş üç nəfərin (adlarını qəbilə ardıcıllığı ilə qeyd edək.(۱

:Ovs və Bəni Əbdüləşhəldən

.Əsid ibn Huzeyrseçilmişlərdən olsa Bədr döyüşündə yox idi (۱

.Əbülhüseyn ibn TeyhanAdı Malik idi və Bədr döyüşündə də iştirak etmişdir (۲

.ə ibn SəlaməBədr döyüşündə də iştirak etmişdir (۳

:Bəni Harisədən



---

İbn Hişam bu qəbilələrin və oarada beyət edənlərin söy kökünü qeyd etmişdir. . [۱] -۱
.Maraqlananlar sirənin I cildinin ۴۵۴-۴۶۷ ci səhifələrinə müraciət edə bilərlər

Zuheyr ibn Rafe (١

(Əbu Bərdəadı Hani idi, Bədr döyşünü də dərk etdi (iştirak etdimütərcim (٢

Nuheyr ibn Heysəm (٣

:Bəni Əmr ibn Of tayfasından

.Səd ibn Xeysəməseçilmişlərdən idi və Bədr döyüşündə şəhid oldu (١

.Rufaə ibn MunzərO, da seçilmişlərdən idi, Bədr döyüşündə də iştirak etdi (٢

Əbdullah ibn Cubeyr… Bədr və Uhud döyüşlərində iştirak etdi. Uhud döyüşündə ( ٣ .oxatanların başçıları idi. Həmin döyüşdə də şəhid oldu

Moen ibn Ədibütün döyüşlərdə iştirak etdi və peyğəmbərin vəfatından sonra ( ۴ .Yəmamə döyüşündə öldürüldü

.Uveym ibn SaidəBədr, Uhud və Xəndək döyüşündə iştirak etdi (۵

Bu qeyd etdiklərimiz İslam peyğəmbəri ilə Ovs qəbiləsindən beyət edən on bir nəfərin .adları idi

:Xəzrəc qəbiləsindən

:Bəni Nəccardan

Əbu Əyyub ibn Zeydadı Xalid idi. Bütün ğəzvələrdə (ğəzvəpeyğəmbərin iştirak etdiyi (١ döyüşlərə deyilirmütərcim) iştirak etdi. İslam peyğəmbərinin vəfatından sonra .Müaviyənin dövründə Roma vilayətində dünyasını dəyişdi

.Məaz ibn Haris… O da bütün döyüşlərdə iştirak etdi (٢

.Qardaşı Of ibn HarisBədr döyüşündə şəhid oldu (٣

Digər qardaşı: Məuz ibn Haris. O, Bədr döyüşündə Əbu Cəhli öldürdükdən sonra ( ۴ .şəhid oldu

Əmmarə ibn Hezəm... bütün döyüşlərdə iştirak etdi və Əbubəkrin xilafəti zamanı baş (۵
.verən Yəmamə döyüşündə öldürüldü

Əsəd ibn Zurarə (Əbu Əmamə) seçilmişlərdən idi. Bədr döyüşündən əvvəl ( ۶
.peyğəmbər məscidinin tikintisi zamanı dünyadan köçdü

.Bəni Əmr ibn Məbzuldan: Suheyl ibn Ətik... Bədr döyüşündə iştirak etdi

:Bəni Əmr ibn Malikdən

Ovs ibn Sabit... Bədr döyüşündə iştirak etdi (۱

Adı Zeyd olan Əbu Təlhə ibn Səhl (۲

:Bəni Mazən ibn Nəccardan

Qeys ibn əbi Səsəİslam peyğəmbəri onu Bədr döyüşündə müan qoşununun ( ۱ .davamına rəhbər təyin etmişdi

Əmr ibn Ğəzyə (۲

Bəni Nəccardan ümumiyyətlə on bir nəfər idilər

:Bəlharis ibn Xəzrəcdən

Səd ibn Rəbiseçilmişlərdən idi. Bədr döyüşündə də iştirak etdi. Uhud döyüşündə isə (۱ .şəhid oldu

Xaricə ibn ZeydO, da Bədr döyüşündə iştirak etmişdi. Uhud döyüşündə də şəhid ( ۲ .oldu

Əbdullah ibn Rəvahəseçilmişlərdən idi. Fəth döyüşündən başqa peyğəmbərin iştirak(۳ etdiyi bütün döyüşlərdə iştirak etdi. Mutə döyüşündə peyğəmbər onu qoşun başçısı .təyin etdi və həmin döyşdə də şəhid oldu

.Bəşir ibn SədBədr döyüşündə iştirak etdi (۴

Əbdullah ibn ZeydO, da Bədr döyüşündə iştirak etdi. Bu həmin şəxs idi ki, namazın (۵ azanla qılınması göstərişini yuxuda görmüşdü. O, peyğəmbərin yanına gəlib yuxusunu danışdı. Peyğəmbər də onun yuxusuna uyğun olaraq namazın azanla qılınmasına (göstəriş verdi.(۱

Xilad ibn Suveyd... Bədr, Uhud və Xəndək döyüşündə iştirak etmişdi. Bəni Qərizə ( ۶ döyüşündə qalanın yuxarısından atılan daş nəticəsində həlak oldu. Deyilənlərə görə. .İslam peyğəmbəri onun barəsində buyurudu: Ona iki şəhidin mükafatı veriləcək

Uqbə ibn Əmr ibn SoləbəO, Üqbədə peyğəmbərə beyət edənlərin ən cavanı idi və (۷ .Müaviyənin dövründə dünyasını dəyişdi

:Bəni Bəyazə ibn Amirdən

.Rafi ibn Malik seçilmişlərdən idi (۱

Zokvan ibn Əbd QeysMədinədən Məkkəyə hicrət etdi. Peyğəmbərin yanında idi. O, (۲ həzrət Mədinəyə hicrət edəndə o



---

Bu məsələ deyilən formada düzgün deyil. Öz yerində haşiyə çıxaraq qeyd . [۱] -۱ . etmişik

da Mədinəyə qayıtdı. Buna görə də ona həm mühacir və həm də ənsar deyirlər. .Zokvan Bədr döyüşündə iştirakından sonra Uhud döyüşündə şəhi oldu

.İbad ibn Qeys... Bədr döyüşündə də iştirak etdi (۱

.Haris ibn Qeys... O, da Bədr döyüşündə iştirak etdi (۲

:Bəni ə ibn Səd tayfasından

Bərra ibn Mərur... seçilmişlərdən idi. Bəni ənin dediyi kimi o Üqbədə İslam ( ۱ peyğəmbərinə iman gətirən birinci şəxs idi. Həzrət Mədinəyə hicrət etməmiş dünyasını .dəyişdi

Oğlu: Bəşr ibn MərurBədr, Uhud və Xəndək döyüşlərində müan qoşununda idi. ( ۲ Xeybər döyüşündə peyğəmbər üçün hədiyyə gətirilən zəhərli qoyun kababından yeyib həlak oldu. O, elə bir şəxsdir ki, peyğəmbər bəni ədən soruşdu: Sizin rəhbəriniz kimdir? Dedilər: Bizim ağamız xəsis bir kişi olan Cədd ibn Qeysdir. İslam peyğəmbəri buyurdu:İnsan üçün xəsislikdən pis hansı dərd ola bilər. Bəni ənin ağası səxavətli, .üzüağ, Bəşr ibn Bərra ibn Mərurdur

Sənan ibn SeyfiBədr döyüşündə iştirak etdi. Xəndək döyüşündə şəhid oldu (۳

Tufeyl ibn NemanO, da Sənan kimi Bədr döyüşündə iştirak etmişdi. Xəndək ( ۴ .döyüşündə isə şəhid oldu

Moqəl ibn Munzər (۵

Qardaşı Yezid ibn Munzər (۶

Məsud ibn Yezid (۷

Zəhhak ibn Harisə (۸

...Yezid ibn Həram (۹

Cəbbar ibn Səxr ibn Uməyyə (۱۰

.Tufeyl ibn Malik (۱۱

.Məsud ibn Yezddən savayı hamı Bədr döyüşündə iştirak etdilər

:Bəni Səvad ibn Ğənəmdən

Kəb ibn Malik (۱

...Bəni Ğənəm ibn Səvad

Səlim ibn Əmr ibn Hədidə (۱

Qutbə ibn Amir (۲

Qardaşı: Yəzid ibn Amir (۳

ƏbulYəsrKəb ibn Əmr (۴

.Seyfi ibn Səvad... Seyfidən başqa hamısı Bədr döyüşündə iştirak etmişdilər ‎(٥

:Bəni Nabi ibn Əmr tayfasından

Soləbə ibn Ğənmə. Bədr döyüşündə iştirak etmişdir. Xəndək döyüşündə isə şəhid ‎(١ .oldu

.Əmr ibn ĞəmməO, da Bədr döyüşündə iştirak etmişdi ‎(٢

Əbbas ibn AmirBədr döyüşündə iştirak etmişdi ‎(٣

Əbdullah ibn Ənis ‎(٤

...Xalid ibn Əmr ‎(٥

:Bəni Həram ibn Kəb tayfasından

Əbdullah ibn Əmr... seçilmişlərdən idi. Bədr döyüşündə iştirak etmişdi. Uhud ‎(١ .döyüşündə isə şəhid oldu

Oğlu Cabir ibn Əbdullah ‎(٢

Məaz ibn Əmr ibn CəmuhBədr döyüşündə iştirak etdi ‎(٣

.Sabit ibn HəzO, da Bədr döyüşündə iştirak etdi. Taif döyüşündə isə şəhid oldu ‎(٤

.Umeyr ibn HarisO, da Bədr döyüşündə iştirak etdi ‎(٥

...Xədic ibn Sələmə ‎(٦

Məaz ibn Cəbəl. Bəziləri onun əvəzinə Əsəd ibn Saridənin olduğunu qeyd ediblər. O, ‎(٧ peyğəmbərin iştirak etdiyi bütün döyüşlərdə iştirak etdi. Ömərin xilafəti zamanı .Suriyada olan vəba xəstəliyinə yoluxaraq Əmvasda(١) dünyasını dəyişdi

:Bəni Salem ibn Of tayfasından

.İbadə ibn Samitseçilmişlərdən idi və bütün döyüşlərdə iştirak etdi ‎(١

.Əbbas ibn İbadəPeyğəmbəri dərk etmək üçün Mədinədən Məkkəyə hicrət etdi (۲

Peyğəmbər Mədinəyə hicrət etdikdə yenidən onunla Mədinəyə hicrət etdiyi üçün ona .ənsar və mühacir deyirdilər. O, Uhud döyüşündə şəhid oldu

Yəzid ibn SöləbəƏbu Əbdurrəhman(۳

Əmr ibn Haris ibn Lobdə (۴

Bəni Salem ibn Ğənəmdən: Onlara bəni Həbli də deyirdilər

.Rufaə ibn ƏmrBədr döyüşündə iştirak etdi (۱



---

.Əmvas” Beytulmüqəddəs yaxınlığında bir yer adıdır“ . [۱] -۱

Uqbə ibn VəhəbO, da Bədr döyüşündə iştirak etdi. Uqbə eyni ilə Əbbas ibn İbadə kimi(٢ Məkkəyə hicrət edib sonra İslam peyğəmbəri Mədinəyə hicrət etdikdən sonra .Mədinəyə hicrət etdiyi üçün ona Ənsar və Mühacir deyirdilər

:Bəni Saidə ibn Kəbdən

Seçilmişlərdən olan Səd ibn İbadə(١

Munzər ibn ƏmruBədr və Uhud döyüşündə iştirak etdi. İslam peyğəmbəri BerMəunə(٢ .döyüşündə onu qoşun rəhbərliyinə təyin etdi və həmin döyüşdə şəhid oldu

Bunlar Üqbədə beyət edən ٧٣ nəfərdən ibarət olan Ovs və Xəzrəc tayfasının üzvləri idilər. Orada iki qadın da iştirak edirdi ki, biri bəni Mazən ibn Nəccar qəbiləsindən olan Kəb qızı Nəsibə idi. Peyğəmbərin döyüşlərində bacısı, əri və iki övladı ilə birlikdə iştirak edərdi.(١) İslam peyğəmbərindən də sonra Yəmamə döyüşündə yalançı Museyləmə ilə olan döyüşdəiştirak edərək on iki yerdən yaralandı. Digəri isə adı Əmr qızı Əsma olan .Umm Məni idi

Peyğəmbərin qadınlarla beyəti bu cür olurdu ki, onlarla görüşmədən, beyətin şərtlərini .izah edər və onlarda təsdiqləyəndən sonra buyurardı: Gedin mən sizinlə beyət etdim

#### DÖYÜŞ ƏMRİ

Əvvəllər qeyd etdik ki, İslam peyğəmbəri Mədinə camaatının Üqbədə ikinci beyətinə qədər kafirlərlə döyüşməsinə icazə verməmişdi. Yalnız səbr, dözüm və ilahi dərgaha duaya göstəriş verilmişdi. Qüreyş müşrikləri də müanlara qarşı olan təzyiqəri güngündə artırırdılar. Vəziyyət o yerə çatmışdı ki, onları dinlərindən çıxarır, vətənini .tərk etməyə, Efiopiya və digər ölkələrə hicrət etməyə məcbur edirdilər



---

Nəsibənin oğlu Həbib barəsində yazırlar ki, Museyləmənin qoşunu onu tutaraq . [١] -١ yalançı Museyləmənin yanına gətirdilər. Museyləmə ona dedi: Şəhadət verirəm ki, Məhəmməd Allahın peyğəmbəri olmuşdur. Dedi: Bəli. Dedi: Şəhadət verirsən ki, mən də Allahın peyğəmbərəm? Dedi: Belə bir şey eşitməmişəmvə ya sözlərini eşidə

bilmirəmMuseyləmə onun bədən üzvlərini birbir kəsdirdi. O, da həmin sözləri təkrar .edə- edə Museyləmənin əlində öldürüldü

Bu təzyiqlər qarşısında müanlar neçə dəstəyə bölünmüşdülər. Bir dəstə naçar qalıb dinlərindən əl çəkdilər. İmkanı olan bir dəstə Efiopiya, Mədinə və ya digər şəhərlərə hicrət etdilər. Dində möhkəm olan amma hicrət edə bilməyən bir dəstə də məcbur .qalıb müşriklərin əzab- əziyyətinə dözürdülər

Müşriklərin özbaşınalığı həddini aşandan, onların müanlara nisbət şikəncə və əzabəziyyətləri çoxalandan və İlahi nemətdən boyun qaçırıb onu qəbul etməkdən imtina etməsindən sonra peyğəmbərə döyüş əmri gəldi. Bu barədə nazil olan birinci .ayə bu idi

Zülmə məruz qaldıqlarına görə İslam döyüşçülərinə döyüş icazəsi verildi. Allah onlara" kömək etməyə qadirdir. O, kəslər ki, haqsız yerə ancaq "Rəbbimiz Allahdır" dediklərinə görə yurdlarından çıxarıldılar. Əgər Allah insanların bir qismini digər qismi ilə dəf etməsəydi, sözsüz ki, içərisində Allahın adı çox zikr olunan somələr (rahiblərin yaşadıqları monastırlar), kilsələr, məbədlər və məscidlər uçulub dağılmışdı. Allah ona yardım edənlərə, şübhəsiz ki yardım edər, həqiqətən Allah yenilməz qüvvət və qüdrət sahibidir! O, kəslər ki, əgər onları yer üzərində yerləşdirsək, namaz qılar, zəkat verər, yaxşı işlər görməyi əmr edib, pis işlər görməyi qadağan edərlər. Bütün işlərin sonu )Allaha məxsusdur".(١

Yəni döyüşə ona görə icazə verdik ki, onlara zülm olunub və heç bir günahları yoxdur. Onların günahı tək Allaha pərəstiş etmək, namazı bərpa etmək, zəkat vermək, əmr be məruf (yaxşılara əmr etmək), nəhy əz münkərdir (pis işlərdən çəkindirməkdir). Burada onlardan məqsəd İslam peyğəmbəri və onun səhabələridir. Ondan sonra isə bu ayə :nazil oldu

Yer üzərindən fitnəfəsadın götürülməsi üçün kafirlərlə döyüşün".(٢) Yəni o vaxta" qədər ki, bir mömin öz dinində olduğuna görə fitnəyə məruz qalmaya. "Hamı Allahın .dinində ola" o vaxta qədər ki, yalnız Allah pərəstiş ola və digəri pərəstiş olmaya



---

.Həcc surəsi ٣٩- ٤١ ci ayələr . [١] -١

.Bəqərə surəsi ١٩٣ cü ayə . [٢] -٢

Məkkə müşrikləri ilə döyüş əmri və Mədinə ənsaları ilə beyət səbəb oldu ki, İslam peyğəmbəri Məkkədə zülm və işgəncə altında olan müanlara Mədinəyə hicrət edib oradakı müanlara qoşulmaq barədə göstəriş verdi. Bu barədə onlara buyurdu: “Əzəmət və cəlal sahibi Allah (Mədinədə) sizin üçün təhlükəsiz evlər və işinizə kömək ”.edən qardaşlar qərar veribdir

Bu göstərişdən sonra Məkkə müanları dəstədəstə Mədinəyə tərəf hicrət etməyə başladılar. O, həzrətin özü isə İlahi fərman intizarı ilə Məkkədə qaldı (Allah tərəfindən .(hicrət etmə əmrini gözləyirdimütərcim

Bu göstərişə əsasən ilk hicrət edən şəxs bəni Məxzum tayfasından Əbi ə ləqəbli Əbdullah oldu. O, ikinci Üqbə beyətindən bir il öncə Efipoiyadan Məkkəyə qayıtmışdı. Mədinə ənsarlarının İslamı qəbul etdiyini bilirdi. Digər tərəfdən isə Qüreyşin ona .verdiyi əziyyətləri görüb Mədinəyə hicrət etdi

Onun həyat yoldaşı Ümm Sələmə rəvayət edir: Bir gün həyat yoldaşım Əba Sələmə Mədinəyə hicrət etmək istədikdə əvəni hazırlayıb məni də ona mindirdi. Sonra övladı .Sələməni də mənim tərkimə mindirib yola düşdük

Vəziyyəti belə görən bəni Muğeyrə (mənim atam) irəli gəlib getməyimə mane oldu. Uzun çəkişmələrdən sonra məni və övladım əni dəvədən düşürdüb yanlarına apardılar. Əbu Sələmə tənha qalaraq Mədinəyə tərəf yola düşdü. Digər tərəfdən isə Əbu ənin tayfası bəni Əbdüləsəd vəziyyəti belə görüb bəni Muğeyrənin yanına gələrək əni tələb edib dedilər. Ata tərəfdən soykökü bizə gəlib çatan ənin anasının yanında qalmasına imkan verməri̇k. Uzun mübahisələrdən sonra əni götürb öz yanlarına .apardılar. Beləliklə mən, ərim və övladım arasında ayrılıq düşdü

Bu proses bir il davam etdi. Bu müddət ərzində mən hər gün evdən çıxar və Əbtəh məhəlləsində əyləşər və axşama qədər ərim və övladımın ayrılığına ağlayardım. Bir gün əmim övladlarından biri ordan ötdükdə mənim bu ürəkağrıdıcı halımı görüb, bəni Muğeyrənin yanına gedərək onlara dedi: Bu necə qeyri normal davranışdır? Niyə bu zavallı qadını azad

buraxmırsınız? Siz onu övlad və ərindən ayrı saldınız... Onun etirazları mənim azad .olmağıma səbəb oldu. Dedilər: Əgər ərinin yanına getmək istəyirsənsə sərbəstsən

Bəni Əbdüləsəd də bundan sonra övladım Sələməni mənə qaytardılar. Mən Sələməni .də götürərək dəvəyə minib Mədinə istiqamətində hərəkət etdim

Mənimlə başqa bir insan olmadığına görə bu səfər mənim üçün çoğ ağır keçirdi. Amma özözümə dedim. Yolda kiminlə rastlaşsam onunla Mədinəyə gedərəm. Beləliklə Tənimə qədər (Məkkə şəhərindən iki fərsəng aralıbir fərsəng təqribən altı kilometrə .bərabərdirmütərcim) getdim. Orada Osman ibn Təlhə ilə rastlaşdım

?Osman mənə dedi: Ey Əba Üməyyənin qızı hara gedirsən

Dedim: Mədinəyə ərimin yanına gedirəm

?Soruşdu: Səninlə gedən kimsə varmı

Dedim: Böyük Allah və bir də bu övladım. ədən başqa tənhayam. Osman dedi: And olsun Allaha ki, səni tənha yola salmaq olmaz. O, dəvənin cilovundan tutub Mədinəyə tərəf yola düşdü. And olsun Allaha ki, o günə qədər onun kimi səxavətli və mərd bir insan ilə səfərə çıxmamışdım. Çünki hər bir mənzil başına çatdıqda dəvəni yatızdırar və özü bir kənara çəkilər və mən də dəvədən düşərdim. Sonra irəli gəlib dəvənin cilovundan tutub bir ağaca bağlardı. Özü isə digər bir ağacın altında istirahət edərdi. Getmək vaxtı çatdıqda ayağa qalxar və dəvəni hazırlayardı. Sonra mənim yanıma gələr, dəvəni yatızdırar və mənim dəvəyə minməyim üçün özü bir kənara çəkilərdi. Mən dəvəyə mindikdən sonra yaxın gəlib cilovunu tutar və yola düşərdik. Bu minvalla .məni Mədinəyə gətirib çıxardı

Quba" kəndinə çatanda mənə dedi: Sağsalamat bu kəndə daxil! Həyat yoldaşın Əba" .Sələmə buradadır. Sonra özü Məkkəyə tərəf yola düşdü

Ümm Sələmə bu dastanın arxasıyca deyirdi: And olsun Allaha ki, İslam dinində bizim kimi müsibət çəkmiş bir ailə tanımıram. Osman ibn Təlhədən səxavətli bir səfər .yoldaşına da rast gəlməmişəm

Amir, həyat yoldaşı Leyli, Cəheş oğlanları və digərlərinin hicrət etməsi

Əbu Sələmədən sonra ardıcıllıqla Amir ibn Rəbiəbəni Ədi ibn Kəb ilə həmpeyman idihəyat yoldaşı Əbi Həsmə qızı Leyli ilə Mədinəyə hicrət etdilər.Onlardan sonra Əbdullah ibn Cəheş... bəni Uməyyə ilə ilə həmpeyman idiöz ailəsi və Əbu Əhməd ləqəbli şair qardaşı Əbd ibn Cəheş ilə Mədinəyə gəldilər. Həmin Əbd ibn Cəheş haqqında yazırlar ki, kor olmasına baxmayaraq, Məkkə şəhərini təkbaşına gəzib .dolanardı

Əbu Əhmədin həyat yoldaşı Əbu Süfyan qızı Fərə və anası Əbdülmütəllib qızı Əmimə .idi

Hər halda bəni Cəheş məhəlləsinin sakinləri, kişili – qadınlı hamı Mədinəyə hicrət etdilər. Bir gün Utbə ibn Rəbiə, Əbbas ibn ƏbdülMütəllib və Əbu Cəhl bu gün ibn Osmanın evlərinin yerləşdiyi və "Rədom" məhəlləsi kimi tanınan həmin məhəllədən keçdilər. Utbə ibn Rəbiə, bəni Cəheşin boş qalmış evlərinə baxıb ürəkdən ah çəkərək :dedi

و كل دار و ان طالت سلا متها

يومأستدر كها النكباء و الحوب

Yəni hər bir ev nə qədər abad olsada nəhayət bir gün viran qalacaq) Sonra dedi: Bəni) Cəheş evləri sakit xarabazarlıqlara dönübdür. Əbu Cəhl dedi: Dəyərsiz və adları itmiş insanların halına ağlayırsan? Bu Əbbasın qardaşı oğlunun işidir ki, bizim aramızda .ayrılıq saldı. Bizi pərişanlığa düçar edib, camaatı birbirindən uzaqlaşdırdı

O, cümlədən Əbu Sələmə, Amir ibn Rəbiə, Əbdullah ibn Cəheş, qardaşı Əbu Əhməd hamılıqla Qubada bəni Əmr ibn Of qəbiləsində ki Mubəşşer ibn əbdülMünzərin evinə toplaşdılar. Sonra dəstədəstə mühacirlərin sayı artmağa başladı. Bənu Ğənəm ibn .Dodan hamıdan çox Mədinəyə qadın və kişi yola saldılar

Əbdullah ibn Cəheş, qardaşı Əbu Əhməd ibn Cəheş, Okaşə ibn Mohsen, Vəhəb

oğlanları Uqbə və Şüca, Ərbəd ibn Həmirə, Munqəz ibn Nəbatə, Səid ibn Ruqəyyeş, Mohrez ibn Nəzlə, Yəzid ibn Rəqiş, Qeys ibn Cabir, Əmr ibn Mohsen, Malik ibn

Əmr, Səfvan ibn Əmr, Səqf ibn Əmr, Rəbiə ibn Əksəm, Zubeyr ibn Əbid, Təmam ibn .Ubeydə, Səncərə ibn Ubeydə və Məhəmməd ibn Əbdullah ibn Cəheş

Qadınlardan: Cəheş qızı Zeynəb, Cəheşin digər qızı Ümm Həbib, Cəndəl qızı Cuzamə, Möhsen qızı ümm Qeys, Səmamə qızı Ümm Həbib, Ruqeyş qızı Aminə, Təmim qızı .Səncərə və Cəheş qızı Cəhnə

(Əbu Əhməd ibn Cəheş Mədinəyə hicrət etmələrin barəsində şer qoşmuşdur.(١)

### ÖMƏR VƏ ƏYAŞ İBN ƏBİ RƏBİƏNİN HİCRƏT ETMƏSİ

Sonra Ömər ibn Xəttab, Əyaş ibn Rəbiə və Hişam ibn Asi Mədinəyə hicrət etmək üçün bir yerə toplaşdılar. Görüş yeri kimi “Tənazob” adlanan yeri müəyyən etdilər (Məkkə şəhərindən on mil aralı). Bu iş barəsində söhbət etdikləri vaxt bu qərara gəldilər ki, sabah sübh hər üçü oraya yığışsınlar. Əgər iki nəfər gəlib və üçüncüsü gecikərsə onu .gözləməsinlər. Çünki çox gümanki Qüreyş onun gəlməsinə mane olmuşlar

Ömər dedi: Mən və Əyaş “Tənazob ” adlanan yerə gəldik. Hişam gəlib çıxmadığı üçün elə başa düşdük ki, onu gəlməyə qoymayblar. Buna görə də biz iki nəfər yola düşərək .Mədinəyə gələrək, Quba adlı məntəqədə bənu Əmr ibn Of qəbiləsinə daxil olduq

Dugər tərəfdən də Əbu Cəhl ilə Haris ibn Hişam ana tərəfdən qardaş və həm də əmi oğlu olduqlarına görə Əyaş ibn Rəbiənin arxasıyca Mədinəyə gəldilərBu zaman hələ İslam peyğəmbəri Məkkədə idiOnlar Əyaşa dedilər: Anan nəzr edibdir ki, səni görməyincə başına daraq vurmayacaq və kölgə altına keçməyəcək (ancaq qızmar !(günəş altında qalacaqmütərcim

Əyaş bu sözü eşitdikdən sonra anasının halına acıyaraq, Məkkəyə qayıtmağa hazırlaşdı. Ömər ona dedi: Bunlar bu vasitə ilə səni dindən çıxartmaq istəyirlər. O, ki .qaldı anana başını bit basdıqda darayacaq, günəş onu incidəndə kölgə altına keçəcək



---

.Sirənin I cildinin ۴٧٢- ۴٧۴- cü səhifələrinə müraciət edə bilərsiniz . [١] -١

Əyaş qulaq asayıb dedi: Mən Məkkəyə qayıdıram. Orada həm anamı öz and və nəzrindən canını qurtarar və həm də Məkkədə qalan malımı götürüb Mədinəyə .qayıdaram

Ömər ona dedi: Mənim çoxlu vardövlətim var. İstəsəm onu səninlə tən yarı bölərəm. Əyaş bu sözlərə də qulaq asmayıb getməyə qərar verdi: Ömər dedi: İndi ki getmək əzmindəsən, onda mənim ram olub iti yol gedən dəvəmə min. Əgər görsən ki, bunlar səni qaytarmaq üçün plan cızıblar və səni tutmaq istədikdə onda bu dəvə ilə qaçıb .canını qurtararsan

Əyaş bu sözü qəbul edib, Ömərin dəvəsinə minərək onlarla Məkkəyə tərəf qayırmağa başladılar. Bir az yol gedəndən sonra Əbu Cəhl ona dedi: Ey qardaş oğlu mənim bu dəvəm yorulub, mümkündür ki, məni öz dəvənin tərkinə alasan. Əyaş qəbul etdi. Əbu Cəhlin minməsi üçün dəvəni yatızdıranda hər ikisi hucum edib onu tutaraq, əlayağını bağladıqdan sonra Məkkəyə apardılar. Məxsusəndə onu gündüz vaxtı Məkkəyə daxil edib qışqırdılar. Ey Məkkə əhalisi öz səfeh və axmaq adamlarınız ilə bu cür davranın .((onlar müanları səfeh və axmaq insanlar olduğunu fikirləşrilərmütərcim

Ömər deyir: Hişam ibn Asi və Əyaş ibn Əbi Rəbiə beləcə Məkkədə qaldılar. Biz gümanedirdik ki, təzyiq və işgəncə vasitəsi ilə İslam dinindən əl çəkdiklərinə görə .tövbələri qəbul olmayacaq

İslam peyğəmbəri Mədinəyə daxil olduqdan sonra bu ayə nazil oldu. “De ey mənim özlərinə zülm etməkdə həddini aşan bəndələrim! Allahın rəhmindən ümidsiz olmayın. Allah bütün günahları bağışlayar. Həqiqətən o bağışlayandır, rəhm edəndir. Rəbbinizə dönün. Əzab sizə gəlməmişdən öncə ona təslim olun. Sonra isə heç bir kömək olunmaz! Qəfil əzab özünüz də bilmədən başınızın üstünü almamışdan əvvəl (Rəbbimizdən sizə nazil edilmiş ən gözəl sözə tabe olun”.(١

Ömər bu ayələri bir məktuba yazıb Hişam ibn Asi üçün Məkkəyə gönərdi: Hişam deyir: Ömərin məktubu “Zituva”(٢) adlanan yerdə mənə gəlib çatdı. Ayələri oxuduqdan sonra nə

۱- [۱] . Zumər surəsi ۵۳- ۵۵- ci ayələr.

۲- [۲] . “Zituva” Məkkə şəhərinin aşağı hissəsində bir yer adıdır.

qədər götürqoy etdimsə bir şey başa düşməyib Ilahi dərgaha ərz etdim: İlahi pərvərdigara bu ayələrdən nə qəsd etdiyini mənim üçün aydınlaşdır. Ürəyimə gəldi ki, .onlardan məqsəd bizik və bu ayələr bizim barəmizdə nazil olubdur

.Elə bu səbəb oldu ki, öz dəvəmə minib Mədinəyə yollandım

Başqa bir hədisə belə rəvayət olunubdur ki, peyğəmbər Mədinədə olarkən bir gün səhabələrinə buyurdu: Kim Əyaş ibn Rəbiə və Hişam ibn Asi yanıma gətirə bilər? Vəlid ibn Vəlid dedi: Mən bu işi görməyə hazıram. Sonra qalxıb Məkkəyə tərəf hərəkət etdi: Gizli şəkildə şəhərə daxil oldu. Küçələr ilə gedərkən özü yemək aparan bir qadından soruşdu: Ey qadın hara gedirsən? Dedi: Bu iki nəfər dustağın yanına gedirəmməqsədi həmin iki nəfər yəni Hişam və Əyaş idiVəlid o qadının arxasıyca düşərək, həmin iki nəfərin yerini müəyyənləşdirdi. Onları damı olmayan bir yerdə zəncirlə bağlayaraq .dustaq etmişdilər

Gecə Vəlid divardan aşıb, onların bağlandığı zəncirin altına bir daş qoyub qılıncla vurub zəncirləri qırdı.(۱) O, iki nəfəri azad edib, dəvəsinə mindirərək Mədinəyə gətirdi. Onun özü piyada dəvənin cilovunu çəkdiyinə görə ayaqlarına yara düşmüşdü. Bu barədə :aşağıdakı şer söylədi

هل انت الا اصبح دميت

و فی سبیل الله ما لقیت

Yəni sən qana bulaşmış barmaqdan başqa bir şey deyilsən. Qorxusu yoxdur çünki) .(sənə olanlar Allah yolunda olur

#### MƏDİNƏ ŞƏHƏRİNDƏ MÜHACİR EVLƏRİ

Məkkədən Mədinəyə hicrət edən müanlar müxəlif qrup və dəstələrə bölünmüşdülər. Onların hamısı bir evə və ya bir qəbiləyə toplanmışdılar. O cümlədən Ömər ibn Xəttab və onunla birlikdə olanlar: Zeyd ibn Xəttab – Ömərin qardaşıSəraqə övladları Əmr və Əbdullah, Xənis ibn Həzafə SəhmiÖmərin kürəkəni (Həfsənin əri, ondan sonra isə

Əbi Xoli oğlanları Xoli və Malik… Bəkirin İyas,Aqil, Amir və Xalid adlı dörd oğlu, onların bəni Səd qəbiləsindən olan həmpeymanları hamılıqla Quba məhəlləsində bəni Əmr ibn .Of qəbiləsində Rufaə ibn ƏbdülMünzərin evində toplaşdılar

Səhib ibn Təlhə evi

O cümlədən Təlhə ibn Ubeydullah və Səhib ibn Sənan, Səx(١) Məhəlləsində Bilharis ibn .Xəzrəc qəbiləsindən olan Xətib ibn Asafın evində məskunlaşdılar

Bəziləri deyirdilər: Təlhə bəni Nəccar qəbiləsindən olan Əsəd ibn Zürarənin evində .məskunlaşmışdır

Suheybin hicrət etməsi dastanında rəvayət edirlər ki, Məkkədən xaric olmaq istədikdə Qüreyş onun yanına gələrək dedi: Sən bu şəhərə gələndə kasıb və yazıq bir kişi idin. Bu şəhərdə özünə sərvət toplamısan indi burada topladığın maldövləti şəhərdən .çıxarmaq fikrindəsən? And olun Allaha bu işə imkan verməik

?Süheyb dedi: Əgər mən öz vardövlətimdən imtina etsəm məni buraxacaqsınız

Dedilər: Bəli

Dedi: Nəyim varsa sizə həvalə edirəm. Beləliklə özünü onlardan qurtarıb Mədinəyə .hicrət etdi

İslam peyğəmbəri onun barəsində eşitdikdə iki dəfə buyurdu: Suheyb (bu ticarətdə) .qazandı

Həmzə, Zeyd, ibn Mərsəd və digərlərinin mənzili

İbn İshaq rəvayət edir: Həmzə ibn Əbdülmütəllib, Zeyd, ibn Harisə, Əbu MərsədKənnaz ibn Həsn (və ya Həsin)oğlu Mərsəd Ğənəvi, Ənsə və əbu Kəbşəhər ikisi İslam peyğəmbəri tərəfindən azad edilmişdiQuba məhəlləsində bəni Əmr ibn Of .qəbiləsindən Külsüm ibn Hədəmin evində məskunlaşdılar

Bəziləri rəvayət ediblər: Bunlar Səd ibn Xəmsənin evində məskunlaşdılar. Digər bəziləri .isə deyirlər: Həmzə ibn Əbdülmütəllib, Əsəd ibn Zürarənin evində məskunlaşdı

O cümlədən Ubeydə ibn Haris ibn Əbdülmütəllib iki qardaşı



---

Səx” məhəlləsi Mədinə şəhərinin ətrafında yerləşir və peyğəmbər məscidi ilə bir“ . [۱] -۱
.mil aralıdır

Tufeyl ibn Haris və Həsin ibn Haris, Məstəh ibn Əsasə, Suveybt ibn Səd (Əbduddar qəbiləsindən idi), Təlib ibn Umeyr (Əbd ibn Qəsi qəbiləsindən idi) və Xəbbab hamılıqla .Qubada Bələclan qəbiləsindən olan Əbdullah ibn ənin evində məskunlaşdılar

Zubeyr ibn Əvam, Əbu Səbrə ibn Rəhm, Munzər ibn Məhəmmədin evində .məskunlaşdılar

Zubeyr ibn Əvam, Əbu Səbrə ibn əbi Rəhm isə Munzər ibn Məhəmmədin evində .məskunlaşdılar

Musəb ibn UmeyrƏbduddar qəbiləsindənbəni Əşhəl qəbiləsində Səd ibn Məazın– .həmin qəbilədən idiməskunlaşdı

Əbu Huzeyfə ibn Utbə, Salim– Huzeyfənin atası Mövla Səlim adı ilə məşhurlaşmışdı(۱)və Utbə ibn Ğəzvan həmin bəni Əbdüləşhəl qəbiləsində İbad ibn .Bəşrin evində məskunlaşmışdılar

Osman ibn Əffan, bəni Nəccar məhəlləsində Os ibn Sabitinməşhur şair Həssan ibn .Sabitin qardaşıevində məskunlaşdı

Bəziləri rəvayət edirlər: Qadınsız kişilər (yəni həyat yoldaşları Məkkədə özləri isə Mədinədə olan müanlarmütərcim) və subaylar, tək olduqları üçün Səd ibn Xeysəmənin .evində məskunlaşdılar. Daha doğrusunu Allah bilər



---

İbn Hişam onun bu adla tanınması haqqında bəzi mətləbi qeyd edib ki, istəyənlər . [۱]-۱ .sirənin I cildinin ۴۷۹- cu səhifəsinə müraciət edə bilərlər

## İSLAM PEYĞƏMBƏRİNİN HİCRƏT ETMƏSİ

### İŞARƏ

Məkkə müanları tədricən Mədinəyə hicrət etdilər. Məkkədə İslam peyğəmbəri, Əmirəl möminin Əli ibn Əbitalib, Əbubəkr, müşriklərin əli altında dustaq olan və ya onların sözlərinin təsiri altına düşən bir neçə nəfərdən başqa kimsə qalmamışdı. Əbubəkr bir neçə dəfə hicrət etmək üçün İslam eyğəmbərindən icazə istədi. Amma həzrət .buyururdu: Tələsmə ki, bəlkə sənin üçün də yolyoldaşı tapıldı

Digər tərəfdən də Qüreyş gördü ki, İslam peyğəmbəri Mədinə şəhərində özlərinə davamçılar tapıb və Məkkə müanları da dəstədəstə onlara qoşulurlar. Çox keçməz ki, həzrət də Mədinəyə gedər və o həzrətin rəhbərliyi altında onlarla döyüşmək üçün bir qoşun hazırlanar. Buna görə də Darunnədvədə (qüreyşin məsləhət üçün toplandığı evmütərcim) – onu Qəsi ibn Kelab inşa etdirmişdi. Qüreyş hər hansı bir qərar qəbul etmək üçün oraya toplaşardtoplaşıb İslam peyğəmbəri barəsində məsləhətləşməyə başladılar. Onlar məsləhət üçün yığışdıqları vaxt, şeytan kürk geyinmiş, xoşsimalı və .islahedici bir qoca görkəminə oraya gəldi

?Qrüyş böyükləri dedilər: Qoca haralısan

Dedi: Nəcd əhlindənəm. Sizim mühüm bir məsələ üçün buraya toplaşdığınızı eşitdikdə gəldim ki, sözlərinizi dinləyib, lazım olduqda isə öz nəsihət və xeyirxahlığımı .əsirgəməyim

.Qüreyş dedilər: Xoş gəlmisən keç içəri

səh:۳۰۷

Nəcdli qoca içəri keçib Qüreyş rəhbərlərinin yanında əyləşdi. Onlar qəbilə ardıcıllığı ilə .bunlar idi

Utbə ibn Rəbiə, qardaşı Şeybə və Əbu Süfyan ibn HərbƏbdüşşəms qəbiləsindən

Təimə ibn Ədi, Cubeyr ibn Mutəm, Haris ibn Amir ibn NofəlNofəl ibn ƏbdManaf qəbiləsindən

Nəzr ibn Haris ibn Kildəbən Əbduddar ibn Qəsi qəbiləsindən

Əbilbəxtəri ibn Hişam, Zomə ibn Əsvəd ibn Muətllib, Həkim ibn Hizambəni Əsəd ibn Əbdülüzza qəbiləsindən

Əbu Cəhl ibn Hişambəni Məxzumdan

Həccac oğulları Nəbiyə və Mənbəbəni Səhmdən

Uməyyə ibn Xələfbəni Cəməh qəbiləsindən

Digər qəbilələrdən də bir sıra insalar iştirak edirdi ki, əlbətdə elə də tanınmış simalar .deyildilər

Məhəmməd (Allahın salamı olsun ona və övladlarına) barəsində söhbət başlandı. Hər kəs onun təbliğatının genişlənməsinin qarşısının alınmasından, onun tutulması, məhv .edilməsi və qətlindən danışırdı

Bəziləri dedilər: Onu zəncirləyib türməyə salın. Sonra oturub gözləyin ki, ölüm vaxtı çatsın. Nabiğə və Züheyr kimi özünə bənzər şairlərin taleyini yaşasın. Camaat onların .haqqında nə deyirdilərsə onun da barəsində deyəcəklər

Nəcdli qoca dedi: Yox and olsun Allaha ki, bu yaxşı fikir deyil. Çünki onun ardıcılları dinc oturmayacaqlar. Onlar mümkün olan bütün vasitələrdən istifadə edib onu sizin çənginizdən xilas edəcəklər və hələ üstəlik bu döyüşdə sizə qalib gəlib hamınızı .özlərinə tabe edə bilərlər. Başqa bir şey fikirləşin bu düzgün fikir deyil

Digəri dedi: Onu bu şəhərdən qovaq və onun işlərindən rahat olaq. Ondan sonra hara

istəyir getsin və nə bacarırsa etsin. Çünki onun getməsi ilə biz öz işlərimizi qaydaya .salarıq və onun Məkkədən kənar təbliğatından da qorxumuz olmaz

Nəcdli qoca dedi: Yox and olsun Allaha ki, bu da düzgün fikir deyil. Məgər siz onun sehirli, məntiqli və cəzbedici nitqinin şahidi olmamısınız! And olsun Allaha əgər brlə bir iş görsəniz, tezliklə ərəb qəbilələrinin arasına yollanıb şirin danışığı

ilə onları özlərinə tabe edərək sizə hucum edəcək. O, zaman sizin əlinizdəki qüdrəti .alıb, istədiyi kimi sizinlə davranacaq

Əbu Cəhl dedi: Mənim beynimə bir fikir gəlib, güman etmirəm ki, siz ondan yaxşısını .düşünə bilər və ya ona etiraz edəsiniz

!Hamı dedi: Fikrini söylə

Dedi: Mənim fikrimcə hər bir qəbilədən bir qüvvətli, şücaətli, adlısanlı bir cavan seçib hər birinə iti qılınc verərək birlikdə Məhəmmədə hucum edib onu öldürməyə məcbur edək. Bununlada canımızı ondan qurtarsınlar. Beləliklə onun qanı tayfalar arasında bölünəcək (çünki hamı onun qanının tökülməsində iştirak ediblər). Əbd Manaf övladları bütün tayfalar ilə döyüşə girə bilməyib, məcbur olaraq qanbahasını almaqla !kifayətlənəcəklər. Bu zaman biz də qanbahasını ödəyərik

.Nəcdli qoca kişi dedi: Bundan gözəl fikir ola bilməz. Düzgün fikir elə budur

.Beləliklə hamı bu təklifi qəbul edib dağılışdılar

### ...İSLAM PEYĞƏMBƏRİNİN EVİ TƏRK ETMƏSİ VƏ

## İSLAM PEYĞƏMBƏRİNİN EVİ TƏRK ETMƏSİ VƏ ƏLİ ƏLEYHİSSƏLAMI ÖZ YERİNDƏ YATIZDIRMASI

Məkkə müşrikləri qəbul etdikləri qərara görə gecənin düşməsini gözləyirdilər ki, gecənin qaranlığından istifadə edib öz planlarını həyata keçirtsinlər. Digər tərəfdən də Cəbrayil əziz İslam peyğəmbərinin yanına gəlib dedi: Sənin vəzifən bundan ibarətdir ki, .öz yatağında yatmayasan

Gecə olan kimi müşriklər o həzrətin evini mühasirəyə aldılar. Göləyirdilər ki, nə vaxt .yatağa girib uzansa, evə girib onu yataqda öldürsünlər

Belə olduqda İslam peyğəmbəri Əli ibn Əbu Talibə buyurdu: Bu gecə sən mənim yatağıma uzan və ən yatarkən üstümə atdığım örtüyə bürün və arxayın ol ki, bunlar .səni incitməyəcəklər

Evin kənarında gözləyən müşriklər müzakirəyə başladılar. Əbu Cəhl üzünü dtlarına tutub dedi: Məhəmməd güman edir ki, əgər siz ona tabe olsanız ərəb və əcəmə (əcəmqeyri ərəblərə deyilirdimütərcim) hakimiyyət edəcək.Ölümdən sonra yenə .diriləcək və İordaniya (Şam) bağları kimi bağlara daxil olacaqsınız

Amma əgər ona tabe olmasanız öldürüləcəksiniz. Öldükdən sonra yenə də dirildikdə .şölələnən alovlar sizin intizarınızdadır

Həmin vaxt İslam peyğəmbəri evdən xaric olub bir ovuc torpaq götürərək onlara tərəf atdı və üzünü Əbu Cəhl tərəfə tutub dedi: Bəli mən bu sözləri demişəm. Sən də onlardan birisən (yəni öləndən sonra cəhənnəm oduna düçar olacaqsan.) Onlara tərəf .torpaq ataata Yasin surəsindən aşağıdakı ayələri oxuyurdu

Ya Sin! Hikmətlə dolu olan Qurana and olsun ki, sən həqiqətən peyğəmbərlərdənsən!“ Düz yoldasan! Bu quran yenilməz qüvvət sahibi mərhəmətli olan Allah tərəfindən nazil olmuşdur”... sonra buyurur: “Biz onların önlərinə və arxalarına sədd çəkib bağlamışıq. (Buna görə də görməzlər”.(١)

Məhəmməd bu ayələri oxuyub onların hamısına tərəf torpaq atdı. Əmr olunduğu .istiqamətdə yola düşüb, nəzərlərdən uzaqlaşdı

.Bu vaxt bir yoldan ötən oradan keçərək onlara dedi

?Burada kimi gözləyirsiniz

Dedilər: Məhəmmədi

Yoldan ötən dedi: Allah sizi məyus etdi. And olsun Allaha ki, Məhəmməd evdən çıxıb, hamınızın üz-gözünə torpaq atıb, işlərinin arxasıyca yollandı. Əgər mənim sözlərimin düzgün olduğunu bilmək istəyirsinizsə onda əlinizi öz başınıza çəkin. Bunu dedikdən .sonra o da getdi

Müşriklər əllərini üzgözlərinə çəkdikdə gördülər ki, başları toztorpaqdır.Buna görə də qalxıb evə tərəf gəldilər. Mümkün vasitələr ilə yoxlanışa başladılar.. Amma Əli (salam olsun ona) peyğəmbərin yerində yatdığı və ona məxsus örtüyü üstünə saldığı üçün bir-:birinə dedilər

And olsun Allaha ki, bu yatan Məhəmməddir. Bu üstünə salınan daonun üstünə atdığı örtükdür. Elə buna görə də səhərə qədər orada gözlədilər. Eləki səhər açıldı, Əli (salam olsun ona) peyğəmbərin yatağından qalxdıqda anladılar ki, o yoldan ötən düz deyirmiş.

Yadına sal ki, bir zaman kafirlər səni həbs etmək və ya öldürmək yaxud da“ -١ (Məkkədən) çıxarıb qovmaq üçün sənə qarşı hiylə qururdular. Allah da tədbir tökdü. (Allah tədbir tökənlərin ən yaxşısıdır”(١)

Yoxsa onlar (sənin barəndə): Məhəmməd şairdir. Biz onun ölümünün intizarındayıq.“٢ De: siz mənim ölümümün intizarında olmaqda olun ki, mən də intizardayam (sizin (ölümünüzün)”(٢)

.Beləliklə Allahtaala öz peyğəmbərinə hicrət əmrini buyurdu

### ƏBUBƏKR İSLAM PEYĞƏMBƏRİ İLƏ BİRLİKDƏ

Əvvəllər də qeyd etdiyimiz kimi Əbubəkr bir neçə dəfə əziz İslam peyğəmbərindən Mədinəyə hicrət etmək üçün icazə istəmiş və hər dəfə də peyğəmbər həzrətləri .”“Tələsmə bəlkə Allahtaala sənin üçün də bir yolyoldaş yetirdi deyə buyurmuşdu

Peyğəmbərin bu sözlərini Əbubəkr belə yozmuşdu ki, bəlkə də o yolyoldaşdan məqsəd peyğəmbərin özü olsun. Buna görə də iki minik dəvəsi alıb evdə saxlayır və onları .bəsləyirdi

Aişədən edilən rəvayətə görə son zamanlar İslam peyğəmbəri hər gün bir dəfə ya sübh və ya da axşam tərəfi bizə gələrdi: Peyğəmbərə Məkkədən hicrət əmri gələn gün, günün ən isti vaxtı günorta qəflətən öz adətinin əksinə olaraq bizim evə gəldi. Ata onu gördükdə bizə dedi: Şübhəsiz ki, yeni bir hadisə baş verib ki, İslam peyğəmbəri bu saatda bizim evə gəlib. Sonra yerindən qalxaraq o həzrəti öz yerində əyləşdirdi. Atam, mən və bacım Əsmadan savayı evdə heç kim yox idi. İslam peyğəmbəri əyləşərək Əbubəkrə baxıb buyurdu: Otağı boşalt! Əbubəkr ərz etdi: Biz iki qızdan savayı otaqda heç kim yoxdur. Məgər nə isə olub? Buyurdu: Allahtaala mənə Məkkədən hicrət etmək barəsində icazə verib! Atam Əbubəkrə ərz etdi: Mən bir neçə müddət iki minik vasitəsi almış və belə bir gün üçün evdə saxlamışam. Həmin gün bəni Del ibn Bəkr tayfasından olan müşrik Əbdullah ibn Ərqətibəziləri isə onun adının Əbdullah ibn Əriqət olduğunu söyləmişləryolu göstərmək üçün muzdla tutdular. Birlikdə Mədinəyə tərəf hərəkət .etmək üçün minikləri ona tapşırdılar

۱- [۱] . “Ənfal” surəsi ۳۰- cu ayə.

۲- [۲] . Tur surəsi ۳۰- ۳۱- ci ayələr.

Peyğəmbərin hicrət edəcəyini Əli ibn Əbutalib (ə) və Əbubəkrin ailəsindən başqa heç kimi bilmirdi. Əli ibn Əbutalibin xəbəri olmasının səbəbi bu idi ki, Məkkə əhalisi Məhəmmədi (Allahın salamı olsun ona və övladlarına) doğru, sədaqətli və əmanətdar bir insan kimi tanıyırdılar. Hər kəs vardövlətini əmanətcil bir şəxsə tapşırmaq istədikdə o həzrətin yanına gələr və ona tapşıarardı. Buna görə də onun yanında çoxlu əmanətlər var idi. İslam peyğəmbəri Mədinəyə hicrət etmək istədikdə o əmanətləri Əli ibn Əbutalibə tapşıraraq, ona göstəriş verdiki Mədinədə qalsın və onları öz sahiblərinə .qaytarsın

İslam peyğəmbərinin Sur mağarasına doğru hərəkət etməsi

Peyğəmbər Məkkədən hicrət etmək barəsində öz fikrini reallaşdırmaq istədikdə Əbubəkrin yanına gəldi. Onların hər ikisi Əbubəkrin evinin arxa tərəfində olan kiçik qapıdan çıxıb Sur mağarasına tərəf hərəkət etdilər. Qeyd etdiyimiz bu mağara Məkkənin cənub hissəsində bir dağda yerləşirdi. Gecə vaxtı oraya çatıb hər ikisi mağaraya daxil oldular. Əbubəkr oğlu Əbdullaha Məkkədə qalmasını və hər gecə Məkkə və Qüreyş barəsində xəbərləri ona çatdırması haqqında göstəriş verdi. Digər tərəfdən də öz qulu Əmr ibn Təhirəyə tapşırdı ki, gündüzlər qoyunları otarsın, gecə isə onları mağaranın yanına gətirsin. Əbubəkrin qızı Əsmada hər gecə yemək hazırlayar .və həmin mağaraya aparardı

İslam peyğəmbəri üç gün Mağarada qaldı. O, həzrətin getməsindən məyus olan Qüreyş Məkkədə elan etdi ki, hər kəs Məhəmmədi diri ələ keçirtsə yüz dəvə mükafat pul alacaq. Əbubəkrin oğlu Əbdullah bu üç gün ərzində davamlı şəkildə Qüreyş və Məkkə xəbərlərini İslam pyğəmbəri və Əbubəkrə çatdırardı. Digər tərəfdən də Əmr ibn Təhirə günəş qurub etdikdə Əbubəkrin qoyun sürüsünü mağaranın yanına gətirərdi. İslam peyğəmbəri həzrəti Məhəmməd ilə Əbubəkr də onların südünü sağıb içərdilər. Bəzən də qounlardan birini kəsib ətindən yemək hazırlayardılar. Gecələr mağaraya gəlib sübh çağı qayıdan Əbdullah ibn Əbi Bəkrin ayaq izləri qalmasın deyə, hər gün sübh Əbdullah mağaradan getdikdən sonra Əmr ibn Fəhirə qoyunları onun .arxasıyca və gəldiyi yol ilə sürər və bununlada onun ayaq izləri qalmazdı

Üç gün bu minvalla ötdükdən sonra ylu onlra göstərmək üçün icarə tutduqları Əbdullah ibn Ərqət miniklərlə onların yanına gəldi. Əbubəkrin qızı Əsma da onlar üçün yemək süfrəsi gətirmişdi. Onu dəvənin tərkinə bağlamaq istədikdə onun üçün ip gətirmədiyini görüb öz bel şalını açıb (ərəblər ona nitaq deyirlər) birbirinə düyünləyib, onunla süfrəni dəvənin belinə bağladı. Bəzi rəvayətlərə görə onu ikiyə bölüb, yarısını ip kimi düzəltdi və süfrəni dəvənin belinə bağladı, yarısını isə təzədən belinə bağladı. .Buna görə də onu tarixdə "zatunnitaqeyn" adlandırıblar

Dəvələrə minərkən Əbubəkr irəli keçib ən yaxşı dəvəni İslam peyğəmbəri üçün irəli çəkdi. Həzrət buyurdu: Mənim olmayan dəvəyə minmərəm. Əbubəkr ərz etdi: Bu dəvə sizin olsun! Həzrət buyurdu: Mən bu halda onu qəbul edə bilmərəm. Amma ona qiymət müəyyən et. Əbubəkr dedi: Onu filan qiymətə almışam. İslam peyğəmbəri buyurdu: Mən də həmin qiymətə səndən alıram. Əbubəkr qəbul etdi. Həzrət dəvəyə səvar oldu. Beləliklə İslam peyğəmbəri, Əbubəkr, Əmr ibn Fəhirə və Əbdullah ibn Ərqətdən (yol .bələdçisi) ibarət dörd nəfərlik qafilə Mədinəyə tərəf yola düşdülər

Əbubəkr qulu Əmr ibn Fəhirəni də tərkinə alıb özü ilə apardı ki, yolda onların .xidmətndə dursun

Əbubəkrin qızı Əsma və Əbu Cəhl

Əbubəkr qızı Əsma deyir: İslam peyğəmbəri və atam Əbubəkr evdən çıxdıqdan sonra içərilərində Əbucəhlin də olduğu bir neçə qüreyş bizim evə hucum etdilər. Mən nə ?olduğunu bilmək üçün otaqdan çölə çıxdım. Məni görən kimi dedilər: Atan hardadır

Dedim: And olsun Allaha ki, onun yerini bilmirəm. Alçaq və xəbis bir insan olan Əbucəhl .əlini qaldırıb mənə elə bir şillə vurdu ki, sırğam yerə düşdü

Onlar daha bizim evdə gözləməyib getdilər. Mən və bacım Ayişı üç gecəgündüz evdə qaldıq. Atam və İslam peyğəmbərinin hara getməsi barəsində heç bir məlumatımız yox idi (onların harada olması barəsində mütərcim). Nəhayət Məkkə şəhərinin

aşağı tərəfində cinlərdən birisi şerlər oxuyurdu.(١) Onun səsini Məkkə əhalisi də eşidirdi. O, səsin arxasıyca Məkkənin yuxarı tərəfinə qədər gəlib çıxsalarda ancaq səsin sahibini görmürdülər. O, şerlərdə İslam peyğəmbəri və Əbubəkrin mağaradan çıxmaları və Xəzaə qəbiləsindən Kəbin qızı ümm Məbədin xeyməsinə qədər getmələri .barəsində xəbər verilirdi

Bu səsi eşitdikdən sonra başa düşdük ki, İslam peyğəmbəri Mədinəyə tərəf yola .düşübdür

Əbu Qəhafənin Əbubəkrin evinə gəlməsi

Əsma rəvayət edir: Atam mağaraya getdiyi zaman evdə olan beş və ya altı min dirhəmin hamısını özü ilə bərabər götürüb bizim üçün bir şey saxlamamışdı. O, getdikdən sonra hər iki gözündən kor olmuş bizim babamız Əbu Qəhafə yanımıza gələrək dedi: Əbubəkr pulları özü ilə aparmaqla sizi çətin vəziyyətdə qoydu. Mən ?dedim: Yox babacan, atam bizim üçün çoxlu vardövlət saxlayıb! Dedi: Hansı vardövlət

Mən qalxıb bir az kiçik daşlardan yığıb parçaya tökərək adətən atamın pullarını saxladığı yerə qoydum. Sonra əbu Qəhafənin əlindən tutub o parçanın üstünə qoydum və dedim: Bunlar atamın bizim üçün saxladığı pullardır. O, parçaya əl vuran Əbu :Qəhafə dedi

Əgər bu pulları sizin üçün saxlayıbsa, deməli sizə qorxu yoxdur. Elə bu qədər piul uzun .müddət sizə kifayət edər

Mənim bu addımı atmağımdam məqsədim qocanı arxayın salmaq idi. Əslində isə and .olsun Allaha Əbubəkr evdə bir dinar belə saxlamamışdı

Səraqənin İslam peyğəmbərini təqib etməsi

Qureyşin tanınmış simalarından olan Səraqə ibn Malik rəvayət edir: İslam peyğəmbəri Məkkədən Mədinəyə hicrət etmək üçün yola düşdükdən sonra Qüreyş onu tapan üçün .(“yüz dəvə” mükafat təyin etdi (doğurdan da çox böyük mükafat idi

Mən öz qəbiləmin əhatəsində əyləşmişdim ki, bu qəbilədən bir kişi gəlib bizim

:qarşımızda dayanaraq dedi



---

Həmin şerlərin mətnindən xəbərdar olmaq üçün sirənin I cildinin ۴۷۸- ci . [۱] -۱
.səhifəsinə müraciət edə bilərsiniz

And olsun Allaha ki, mən üç nəfəri gördüm ki, (Yəsrib istiqamətinə) gedirdilər. .Zənninmcə Məhəmməd və dtları idi

Mən (onun düz danışdığını bildim, amma kimsənin məndən tez tərpənib mükafat almaması üçün onu təkzib etdim) gözlə sakit dumasına işarə etdim və dedim: Bunlar filan qəbilənin itmiş dəvəsini axtaran üzvləridir. O, kişi vəziyyəti belə görüb mənə .cavab olaraq dedi: Bəlkə də sən dediyin kimidir

Beləliklə oraya yığışanları Məhəmmədi təqib etmələri fikrindən daşındırıb bir az fikirləşdikdən sonra qalxıb evə gələrək göstəriş verdim ki, ataımın üstünə yəhər qoyub yanıma gətirsinlər. Sonra döyüş paltarını geyinib, qılınc və nizəni götürərək yola çıxmaq üçün hazırlaşdım. Bu halda fala baxdığım ox çubuqlarını gətizdirib getmək .üçün fala baxsamda, ancaq yaxşı gəlmədi

Amma yenə də yüz dəvənin tamahı ilə yola düşdüm. (Məqədimə tez çatmaq üçün atı sürətlə çapırdım). Qəflətən həmin sürətdə atın ayaqları büdərdi, hər iki əli üzərində çöküb, başı üstə düşdü və mən də yerə çırpıldım. Bu hadisədən sonra narahat oldum. .Qalxıb yenə fal atdım, fal pis gəlsədə ona əhəmiyyət verməyib yola düzəldim

Bir az getdikdən sonra gözüm o həzrət və onun yolyoldaşlarına sataşdı. Amma qəflətən ikinci əfə atın əlləri yerə batdı (qumluq olduğu üçünmütərcim) və mən yerə .çırpıldım. Ayağa qalxdıqda elə toztorpaq qalxmışdı ki, mən heç bir yeri görmürdüm

Bu zaman başa düşdüm ki, mənim peyğəmbərə əlim çatmayacaq (Allah onu qoruyur). :Çarəsiz qalıb onu tutmaq fikrindən daşındım və qışqırdım

Ey karvan əhli! Mən Səraqə ibn Malikəm. And olsun Allaha ki, sizə qarşı pis fikirdə !deyiləm. Bir az səbr edin ki, mən də sizə çatım çünki sizə deyiləsi sözüm var

?İslam peyğəmbəri Əbubəkrə buyurdu: Ondan soruş: Nə istəyir

Mən onun cavabında dedim: Mən istəyirəm ki, bir neçə kəlmə yazasan və həmin yazı .mənimlə sənin aranda bir əlamət və nişanə olsun

.İslam peyğəmbəri Əbubəkrə buyurdu: Nə istəyirsə onun üçün yaz

Əbubəkrdə mənim istədiklərimi saxsı tikəsi və ya sümük üzərində yazıb mənə tərəf .atdı

Mən o yazını götürüb, ox qabına qoyaraq Məkkəyə qayıtdım. Bu haqda kimsəyə danışmadım. Nəhayət İslam peyğəmbəri Məkkəni fəth etdi. Huneyr və Taif döyüşləri də arxada qalırdı. Mən o yazını özümlə götürüb peyğəmbəri görmək üçün Taifə doğru .yola düşdüm və “Ceranə”(١) adlanan yerdə ona çatdım

Mən özüm peyğəmbərə yetirmək istədikdə, həzrəti əhatə etmiş ənsarın içərisinə düşdüm. Onlar nizələrini mənə tuşlayıb qışqırdılar. Hara gedirsən? Mən özümü peyğəmbərə tərəf yaxınlaşdırb dəvəyə minmiş və xurma budağının içi kimi ağ olan dizindən topuğuna qədər hissəsi görsənən peyğəmbəri göstərdim. Yazını əlimin .üstündə yuxarı qaldırıb qışqırdım

Ey Allahın elçisi! Mən Səraqə ibn Malikə. Bu isə sənin mənə verdiyin yazıdır. İslam peyğəmbəri buyurdu: Onu mənim yanıma gətirin ki, əhdə vəfa və yaxşılıq günüdür. Nəhayət məni onun yanına gətridilər və mən İslamı qəbul etdim. Ondan nə soruşum deyə çox fikirləşsəmdə axırı belə bir sual verdim. Ey Allahın elçisi! Mənim dəvələrim var. Mən dəvələr üçün bir çuxur qazmışam ki, onlar səhradan döndükdə oranı su ilə doldururam ki, onlar su içə bilsinlər. Bəzən isə səhrada yolunu azmış dəvələr bu ?çuxurun yanına gəlib onun suyunu içirlər. Buna görə mənə savab yazılırmı

.Buyurdu: Bəli. İnsan hər bir susuz heyvanı sirab etsə onun savabını alacaq

.Bundan sonra evə qayıdıb, müanların cərgəsinə qoşuldum

İslam peyğəmbərinin Məkkədən Mədinəyə qədər olan yolu

İbn İshaq deyir: Əbdullah ibn Ərqətin İslam peyğəmbərinə bələdçilik etdiyi yol belə idi. Məkkə şəhərinin cənub istiqamətindən yola düzəlib, Qırmızı dənizin sahillərinə gəldilər. Oradan “fan” adlanan yerin cənub hissəsindən yola düşüb

Əməc” adlanan yerin aşağı tərəfindən ötdülər. Sonra “Qədida” da çıxaraq, həmişə“ gedilən Mədinə yoluna çıxdılar. Oradan isə ardıcıllıqla “Xərrar”, “SəniyətulMərrə” və “Ləqəfa və ya Ləfəta” adlanan yeri geridə qoydular. Oradan “MədləcətLəqəf”, sonra “Mədləcət Məhac”, “Mərhəc Məhac” və “Mərhəc zilğəzveyn” adlanan yerə çatdılar. Habelə irəliləyərək “Zi Kəşr”, “Cədaced”, “Əcrəd”, “Za”, “ƏbabidyaƏbabib”, “FacəyaQahə” adlanan vadidən keçdilər. Sonra oradakı dağın keçidindən keçib “Ərc” .adalanan yerdə yerə mənzil saldılar

Burada İslam peyğəmbərinin dəvəsi yola davam edə bilmədi. Buna görə də Əsləm qəbiləsindən Ovs ibn Həcr adlı bir kişi peyğəmbər üçün dəvə gətirərib onu dəvəyə mindirdi və öz qulu Məsud ibn Hənidəni peyğəmbərlə yola saldı. Oradan yola düşüb “SəniyətulAer” dərəsindən Mədinəyə tərəf hərəkət etdilər. “Bətne Rəcm”dən keçib, .Mədinə yaxınlığındakı “Quba” məhəlləsinə daxil olduq

Quba” məhəlləsinə daxil olmaq“

Məkkə müanları İslam peyğəmbərinin Məkkədən çıxdığını eşitdilər. Bunlar hər gün sübh vaxtı öz vacib namazlarını qılar, sonra evlərini tərk edərək Məkkənin yolu üstündə olan şəhərin kənarına gəlir, gün yüksələnə və kölgə itənə qədər peyğəmbəri .orada gözləyər onun gəlmədiyini görüb pərişan halda öz evlərinə qayıdardılar

Bir neçə gün öncə bu minvalla ötdü. Birinci gün və rəbiuləvvəl ayının on ikisinə təsadüf edən peyğəmbərin Qubaya daxil olduğu gün, müanlar hər gün olduğu kimi hava istiləşənə qədər onu gözlədilər. Onun gəlmədiyini görüb evlərinə qayıtdılar. Amma az sonra günortaya yaxın İslam peyğəmbəri səfər yoldaşları ilə Qubaya çatdılar. Hər gün müanların peyğəmbəri gözlədiyinin şahidi olan bir yəhudi onlar gedəndən sonra hündür bir yerə çıxıb Məkkəyə tərəf baxdı. Birdən öz yoldaşları ilə gələn peyğəmbəri .gördü

.Dərhal qışqırdı: Ey Qilə(١) övladları gözlədiyiniz şəxs gəldi

Bu qışqırıqdan sonra müanlar evlərindən çıxıb İslam

١- [١] . “Qilə” Mədinə ənsarlarının nisbət verildiyi bir qadının adı idi.

peyğəmbərini axtarmağa başladılar. Onlar xurmanın kölgəsində istirahət edən həzrətin yanına qaçdılar. Onların çoxu Mədinəli olduğu və indiyə qədər peyğəmbəri görmədikləri üçün onu tanımırdılar. Digər tərəfdən də peyğəmbərin bədəninə gün düşdüyü üçün Əbubəkr qalxıb öz əbası ilə onun üçün kölgə düzəltdikdə oraya gələnlər .əziz İslam peyğəmbərini tanıdılar

.Bir az keçdikdən sonra peyğəmbər qalxıb Külsüm ibn Hədəmin evinə daxil oldu

Digərlərinin rəvayətinə görə: O, həzrət subay bir kişi olan Səd ibn Xeysəmənin evinə .getdi. O ev Səd kimi subay mühacirlərin qaldığı yer idi

.Əbubəkr isə Xəbib ibn Asaf və ya Xaricə ibn Zeydin evində məskunlaşdı

Əli ibn Əbitalib (ə) üç gecə gündüz Məkkədə qalıb, əmanətlərini sahibinə qaytardıqdan sonra Mədinəyə yola düşdü. Qubada Külsüm ibn Hədənin evində olan peyğəmbərin .yanına gəldi

Səhl ibn Hənif barəsində bir dastan

Əli ibn Əbitalib buyurur: Qubada məskunlaşan və əri olmayan müan bir qadın var idi. Biz Qubada qaldığımız bir iki gün ərzində gecə yarısı bir kişi həmin qadının evinə gələr, qapını döyüb o qadına bir şey verdikdən sonra gedərdi. Bir gün o qadından soruşdum. ?Sən müan və əziz bir qadınsan. Gecə evinə gəlib qapını döyən kişi kimdir

Dedi: Bu kişi Səhl ibn Hənifədir. O, mənim kimsəsiz olduğumu bildiyi üçün geəcələr öz qəbiləsinin bütlərini sındıraraq, çubuqlarını gətirəib mənə verir ki, onları yandırıb, odundan yemək bişirmək və digər şeylər üçün istifadə edim. Ondan sonra Əli ibn .Əbitalib, Səhl ibn Hənif dünyadan köçənə qədər bu dastanı arasıra danışardı

Quba məscidinin inşası və İslam peyğəmbərinin Mədinəyə tərəf hərəkət etməsi

İslam peyğəmbəri birinci gün Quba məhəlləsinə daxil olub, cümə gününə qədər (yəni dörd gün) Qubada bəni Əmr ibn Of qəbiləsinin arasında qaldı. O, bir neçə gün ərzində .İslam dinində ilk inşa edilmiş məscidi yəni Quba məscidini inşa etdirdi

Cümə günü Qubadan Mədinəyə tərəf hərəkət etdi. Bəni Səlim ibn Of məhəlləsinə çatdıqda “Ranuna” vadisində cümə namazı qıldı. Bu həzrətin Mədinədə qıldığı ilk cümə .namazı idi

Namazdan sonra Utban ibn Malik, Əbbas ibn İbadə ibn Nəzlə və digər qəbilə başçıları peyğəmbərin yanına gəlib dedilər: Ey Allahın elçisi bizim qəbiləyə gəl, istədiyin qədər .silah, döyüşçü və vardövlət səni müdafiə etməyə hazırdır

Həzrət buyurdu: Dəvəmi sərbəst buraxın və onun yolunu açın ki, o mənmur olbdur ((yəni harada qalacağımı dəvə Allahın izni ilə müəyyən edəcəkmütərcim

Oradan ötüb bəni Bəyazə qəbiləsinin yaşadığı yerə çatdı. Ziyad ibn Lubeyd və Fərvə ibn Əmr kimi qəbilə başçıları irəli gəlib bəni Salem qəbiləsi kimi peyğəmbərin bu qəbilədə məskunlaşmasını xahiş etdilər. Həzrət həmin cavabı verdi. Oradan keçib bəni Saidə məhəlləsinə çatdı. Burada Səd ibn İbadə, Munzər ibn Əmr və digər bəni Saidə qəbiləsinin rəhbərləri irəli gəlib ərz etdilər: Bizim qəbilə də qalki, səni müdafiə etmək üçün btün fədakarlığa hazıram. Həzrət əvvəlki iki qəbilə olan bəni Salem və bəni Bəyazəyə verdiyi cavabları onlara da buyurdu: Dəvəmi sərbəst buraxın ki, o .müəyyənləşdirəcəkdir

Oradan bəni Haris ibn Xəzrəc məhəlləsinə çatdı. Bu qəbilənin Səd ibn Rəbi, Xaricə ibn Zeyd və Əbdullah ibn Rəvahə adlı rəhbərləri irəli gəlib həmin xahişi təkrarladılar və .eləcə də peyğəmbərdən eyni ilə qeyd etdiyimiz cavabı eşitdilər

Sonra bəni Ədi ibn Nəccar məhəlləsində çatdı. Bunlar ana tərəfdən İslam peyğəmbəri ilə qohum idilər. Əbdülmütəllibin anası a bu qəbilədən idi. Öz tayfa rəhbərləri Suleyt ibn Qeys, Əbu Silət və Əsirə ibn Xaricəni digər bir dəstə ilə əziz İslam peyğəmbərinin yanına göndərib onun bu qəbilə arasında qalmasını xahiş etdilər və dedilər: Öz dayılarının yanına gəl və bu tayfada hər cürə himayəni gör! Amma İslam peyğəmbəri həmin cavabı bunlara da verdi. Onlar dəvənin qarşısından çəkilib, məyus halda öz .evlərinə qayıtdılar

Peyğəmbərin dəvəsi bəni Malik ibn Nəccar məhəlləsinə

qədər gəldi. İndiki peyğəmbər məscidinin yerləşdiyi yerdə dizə çökərək yatdı. Bu yer iki yetim uşağa məxsus idi. Əmr övlaları olan Səhl və Səhil adlı iki yetim uşaq Məaz ibn Əfranın himayəsi altında yaşayırdılar. O, yerdə ağacdan dərdikləri xurmaları qurudardılar. İslam peyğəmbərinin dəvəsi orada yerə yatsada, peyğəmbər yerə düşmədi. Buna görə dəvə qalxıb bir neçə addım getdi. Amma təzədən əvvəlki yerə .baxıb oraya qayıtdı. Orada dizə çöküb yataraq, sinə və boynunu da yerə yapışdırdı

?Bu vaxt İslam peyğəmbəri dəvədən düşüb soruşdu: Bu yer kimindir

Məaz ibn Əfra irəli gəlib dedi: Bunlar mənim himayəmdə olan Əmrin yetim uşaqları Səhl və Səhilə məxsusdur. Mən o iki nəfəri razı salaram ki, bu yeri sizə həvalə etsinlər .və siz də burada məscid tikərsiniz

Məaz o iki uşağın razılığını aldıqdan sonra) İslam peyğəmbəri orada məscid( düzəldilməsi barədə göstəriş verdi. Özü isə əbu Əyyubun evinə gəldi (o yerin kənarında idi). Məscidin və ətrafındakıların inşası qurtarana qədər əbu Əyyubun evində qaldı. Məscid və ətraf otaqları inşa edilib qurtarandan sonra İslam peyğəmbəri .oraya köçdü

Məscidin inşasına İslam peyğəmbərinin kömək etməsi

İslam peyğəmbəri məscidin inşa edilməsi barəsində göstəriş verdikdən sonra ilk öncə özü işə başladı ki, digər müanlar da öz işlərinə başlasınlar. Elə buna görə də bütün mühacir və ənsar bu tikintidə iştirak edib onu başa çatdırmaq üçün çox çalışırdılar. Hər .kəs özü üçün zümzümə edir və şer oxuyurdu

:Bəziləri bu şeri oxuyurdular

لئن قعد نا و النبى يعمل

لذالك منا العمل المضلل

Yəni əgər biz əyləşsək və peyğəmbər işləsə, pis və xoşagəlməz iş görmüş olarıq

لا عيش الا عيش الاخره

اللهم ارحم الانصار و المهاجره

Yəni eyşişrət yalnız axirətdə mövcuddur. İlahi ənar və mühacirə rəhm et. İslam peyğəmbəri bu şeri belə oxuyurdu

لا عيش الا عيش الاخره

اللهم ارحم المهاجرين و الاانصار

səh:۳۲۰

:Əli ibn Əbitalib isə belə oxuyurdu

لا يستوی من يعمر المساجد

يدأب فيه قائما و قا عدا

و من يری عن الغبار حائدا

Yəni məscidin tikintisində ciddicəhdlə işləyən insanlar ilə özünü toztorpaqdan .yayındıran insanlar bərabər deyillər

Əmmar ibn Yasir həmin şeri Əli (ə) dan öyrənmiş və çox təkrar edirdi. Bunu görən səhabələrdən(١) biri elə zənn etdi ki, Əmmar “sonuncu cümlə” ilə ona işarə edir və danlamaq fikrindədir (yəni kömək etmir, özünü kölgəyə verənlər kimi burnunu tutur ki, toztorpaq udmasın). Buna görə də qəzəblənərək əlindəki əsa ilə Əmmara işarə edib dedi: Ey Süməyyənin oğlu sözlərini eşitdim. Əgər bunları söyləməkdə davam etsən bu (əsa ilə burnundan vuracağam (səni ədəbləndirəcəyəm

İslam peyğəmbəri bu sözü eşitcək qəzəblənərək buyurdu: Bunların Əmmar ilə nə işi var? Əmmar bunları behiştə səsləyir, onlar isə cəhənnəmə tərəf səsləyirlər. Həqiqətən Əmmar mənim iki gözüm arasında olan dəridir.(٢) Bundan sonra əgər həmin kişidən .bir söz eşitsəniz ona etina etməyərək uzaqlaşın

.Şöbinin rəvayətinə görə: Əmmar məscidin inşasına başlayan ilk şəxsdir

Əmmarın şəhadəti haqqında İslam peyğəmbərinin hədisi

Əmmar məscidin inşası işində digərləri ilə müqayisədə daha çox əziyyət çəkir, məscid divarlarının yükəsi üçün daş və çiy kərpic daşıyırdı. Bir gün onun belinə o qədər çiy kərpic yüklədilər ki, İslam peyğəmbərinə ərz etdi: Bu gün bunlar məni öldürdülər. Mənə elə yüklər daşıtdırdılar ki, özləri onları daşıya bilmirdilər. Bu sözü Əmmardan eşidən İslam peyğəmbəri əlini onun toza batmış saçlarına çəkib buyurdu: Ey Süməyyənin oğlu. Bunlar səni öldürməyəcəklər. Bəlkə səni təcavüzkar və

---

İbn Hişam deyir: İbn İshaq bu səhabənin adını qeyd etsədə amma ibn Hişamın . [۱] -۱ özü bu səhabənin adını qeyd etmir. Lakin sirənin I cildinin ۴۹۷- ci səhifəsində haşiyə çıxaraq Əbuzərdən rəvayət edir ki, ibn İshaq demişdir. Həmin kişi Osman ibn Əffan .olmuşdur

.Bu söz peyğəmbərin Əmmara qarşı məhəbbətindən kinayədir . [۲] -۲

(zülmkar bir qrup öldürəcəkdir.(۱)

## ƏBU ƏYYUBUN EVİNDƏ

Qeyd etdiyimiz kimi məscid inşa olub qurtarana qədər İslam peyğəmbəri əbu Əyyubun evində yaşayırdı. Əbu Əyyubun evi çiy kərpic və gildən düzəldilmiş kiçik bir ev idi. Ev iki mərtəbədən ibarət idi. İslam peyğəmbəri aşağı mərtəbədə Əbu Əyyub və həyat yoldaşı isə yuxarı mərtəbədə qalırdı.

Əbu Əyyub rəvayət edir: Mən ərz etdim: Atam anam sənə qurban ey Allahın elçisi sənin aşağı mərtəbədə, bizim isə yuxarı mərtəbədə qalmağımız bizə xoş gəlmir (yəni yaxşı olar ki, sən yuxarı mərtəbədə olasan. Çünki biz səndən yuxarı mərtəbədə yaşamağı özümüzə sığışdırmırıqmütərcim) yxşı olar ki, sən yuxarıda biz isə aşağıda qalaq.

İslam peyğəmbəri buyurdu: Bizim və bizi görməyə gələnlər üçün aşağı mərtəbədə daha münasib və rahatdır.

Əbu Əyyub (yuxarıdakı otaqda hərəkət edərkən, çıxıbdüşərkən elə edirdi ki, İslam peyğəmbərinə narahatçılıq yaratmasın) deyir: Bir gün bizim su qabımız sındı və içərisində ki, su otağın içərisinə töküldü. Mən və Əyyubun anası (həyat yoldaşım) su aşağı sızmasın və onun damcıları İslam peyğəmbərinin üzərinə tökülməsin deyə dərhal qalxdıq və bizim yeganə yorğanımız olan qətifəni götürüb suyun üstünə atdıq. Beləliklə suyu otaqdan yığışdırdıq.

Bu müddət ərzində əbu Əyyub və həyat yoldaşı peyğəmbər üçün yemək hzırlayar və onun yanına gətirərdilər. Artıq qalan yeməyi öz otaqlarına aparardılar. Məxsusən də peyğəmbərin əl vurduğu hissədən təbərrük ilə yeyərdilər. Əbu Əyyub deyir: Bir gecə yeməyə bir az sarımsaq və ya soğan əlavə edib İslam peyğəmbəri üçün apardıq. Yemək qabını qaytaranda gördük ki, peyğəmbər yeməyə əl vurmayıb və bizim yeməyi geri göndərib.



---

۱- [۱] . Şiə və sünni arasında məşhur olan elə bu hədisdir ki, Əmmara buyurdu. “Səni

zülmkar qrup öldürəcək.”Əmmar “Siffeyn” döyüşündə Müaviyənin qoşunu tərəfindən öldürüldükdən sonra camaat başa düşdülər ki, “zülmkar qrup” dan məqsəd Müviyə və .ordusu imiş

:Mən çox narahat oldum və aşağı otağa peyğəmbərin yanına gedib dedim

Atam anam sənə qurban! Bu gecə yeməyə əl vurmamağın və bizi yeməyin artığını ?təbərrükən yeməkdən məhrum etməyinin səbəbi nədir

Buyurdu: Çünki camaat mənim yanına gələrək öz ürək sözlərini yavaşca qulağıma pıçıldayırlar. Bu bitkinin iyi (yeməyə qatılmış) təbiətən onları narahat etdiyinə görə ondan yemədim. Amma siz ondan yemək istəyirsinizsə heç bir maneəsi yoxdur. Mən bu sözü eşitdikdən sonra otağa qayıdaraq həyat yoldaşım ilə xörəkdən yedik. Amma .bir daha İslam peyğəmbərinin yeməyinə soğansarımsaq qatmadıq

Digər Məkkə müanlarının da İslam peyğəmbərinin yanına gəlməsi

Qeyd etdiyimiz kimi İslam peyğəmbəri Mədinəyə hicrət etdikdən sonra Məkkədə qalan müanlar da özlərini Mədinədə İslam peyğəmbərinə yetirdilər. Yalnız Məkkədən müşriklərin əsir edib, zindana saldığı bir neçə nəfərdən başqa hamı özünü Mədinəyə .çatdıra bildi

Bu arada bir sıra insanlar qadın, uşaq və eş əşyaları ilə birlikdə və ümumiyyətlə bütün qohumları ilə birlikdə Mədinəyə köçdülər. Onlar öz evlərinə açar vurmuş və evlərində :heç kim yaşamırdı. Həmin insanlar aşağıdakılardan ibarət idilər

Bəni Məzundanbəni Cəməh qəbiləsindənbəni Cəheş ibn Riabdanhamısı bəni Üməyyənin həmpeymanlarından idilər. Bəni Səd ibn Leys qəbiləsindən və bəni Ədi ibn .Kəb tayfasının həmpeymanlarından olan bəni Bəkr idi

Əbu Süfyanın (bəni Üməyyənin başçısı) öz həmpeymanlarına qarşı münasibət belə oldu ki, bəni Cəheşin evlərini zəbt edib Əmr ibn Əlqəməyə satdı. Bu xəbəri eşidən Əbdullah ibn Cəheş İslam peyğəmbərinin yanına gəlib bu barədə peyğəmbərə xəbər verdi. İslam peyğəmbəri buyurdu: Ey Əbdullah sən razı deyilsən ki, Allah sənə Behiştdə .ondan da yaxşı ev bağışlasın? Əbdullah cavab verdi: Əlbətdə razıyam

Məkkənin fəth edilməsi cərəyanında Əbu Əhməd (bəni

Cəheşin üzvlərindən biri) qeyd etdiyimiz evlərin qaytarılması barəsində İslam peyğəmbəri ilə müzakirə etsədə amma peyğəmbər ona açıqaşkar cavab verməyib onun xahişini cavabsız qoydu. Məsələdən xəbərdar olan müanlar Əbu Əhmədə dedilər: İslam peyğəmbəri Allah yolunda verdiyiniz bir şeyin yenidən qaytarılmasını xoşlamır.Buna görə də Əbu Əhməd bu fikrindən daşınıb Əbu Süfyana xitabən şer (oxudu.(۱)



---

Qeyd etdiyimiz şerlərin mətnindən xəbərdar olmaq istəyirsinizsə sirənin I. [۱] -۱
.cildinin ۵۰۰- cü səhifəsinə müraciət edə bilərsiniz

## İSLAM DİNİNİN MƏDİNƏDƏ YAYILMASI

### İŞARƏ

İslam peyğəmbərinin Mədinəyə gəlməsindən bir il ötdü. Bu müddətdə məscidin və ətrafındakı otaqların inşası başa çatmış idi. Mədinə əhalisinin şxu müəslman olmuşdu. Az ailələr tapmaq olardı ki, bütün ev əhli və ya bir neçə üzvü müan olmasın. Təkcə Ovs qəbiləsindən Xütmə, Vaqif, Vail, Uməyyə ailəsi şirk halında qalmış və İslam dinini qəbul .etməmişdilər

İslam peyğəmbərinin buyurduğu ilk xütbə

Əbu ənin rəvayət etdiyi kimi İslam peyğəmbərinin Mədinədə buyurduğu ilk xütbə bu :idi. İlahi həmd və sənadan sonra buyurdu

Ey insanlar özünüz üçün o dünyaya bir şey göndəriniz. Xəbəriniz olsun ki, and olsun Allaha sizin biriniz öldükdə öz qoyunlarını çobansız qoyanda, sonra Allah onu qoruya biləcək bir qapıçı olmayanda ona deyər: Məgər mənim peyğəmbərim gəlib səni təbliğ etmədi. Məgər sənə mal dövlət verib onu artırmadım. Elə isə özün üçün nə göndərmisən? Bu vaxt sağasola baxıb bir şey görmədikdə qarşısına baxar və cəhənnəmdən bağqa bir şey görməz. Hər kimi üzünü cəhənnəmdən döndərmək istəyirsə yarım xurma olsa belə bu cur addım atsın. Yox əgər (xurma kimi bir şey tapa bilmirsə) yaxşı sözlə özünü qorusun. Çünki onunla yaxşılığı on ilə yetmiş savaba qədər .bərabər tutar. Vəssəlamu əleykum və rəhmətullahu bərəkatuh

İkinci xütbə

:Sonra İslam Peyğəmbəri Mədinədə öz ikinci xütbəsini belə buyurdu

Həmd Allaha məxsusdur. Ona pərəstiş edib, ondan kömək diləyirəm. Öz şərrimdən və“ pis əməllərimdən Allaha pənah aparıram. Allah hər kəsi hidayət etsə kimsə onu yolundan azdıra bilməz. Kimi yoldan azdırarsa onu kimsə hidayət edə bilməz. Şəhadət verirəm ki, Allahdan başqa Allah yoxdur. O tənhadır və şəriki yoxdur. Həqiqətən danışıqların ən yaxşısı Allahın kitabıdır. Xoşbəxt o şəxsdir ki, Allah onun qəlbini Quranla bəzəyər və onu küfrdən sonra islam dininə gətirər və həmçinin xoşbəxt o şəxsdir ki, Quranı bəşər kəlamlarından ayırar. Çünki Quran ən yaxşısı və ən doğrusudur. Allah hər kəsi dt tutarsa siz də onu dt tutun. Allahı bütün qəlbiniz ilə sevin. İlahi danışıq və onun zikrindən yorulub, usanmayın. Sizin ürəkləriniz onun qarşısında daşlanmasın ki, Allah yatardıqları arasından bir şey (quran – mütərcim) seçərək ixtiyar etmiş və onu əməllər və bəndələr arasında seçilmiş və layiqli kəlam adlandırmışdır. İnsanların halal və haramını onda qərar vermişdir. Elə isə Allahı pərəstiş edib ona şərik qoşmayın. Onu layiq olduğu kimi pərəstiş ediniz. Allah ilə ən layiqli sözlərinizi seçərək doğru danışın. İlahi rəhəmt əsasında bir-biriniz ilə dtluq edin. Allah əhd peymanının sındırıldığı yerdə .(qəzəblənər. Vəssəlamu əleykum (salam olsun sizlərəmütərcim

### ...MÜHACİR VƏ ƏNSAR ÜÇÜN İSLAM PEYĞƏMBƏRİNİN ƏHDNAMƏSİ VƏ

## MÜHACİR VƏ ƏNSAR ÜÇÜN İSLAM PEYĞƏMBƏRİNİN ƏHDNAMƏSİ VƏ YƏHUDİLƏR İLƏ MÜQAVİLƏ

Əziz islam Peyğəmbəri Mədinədə islam düşmənlərinin fəallaşması və Yəhudi) fitnəkarlığının qarşısını almaq üçün bir müqavilə tərtib etdi. Tarixçilərin dediyinə görə müqəddəs islam dininin inkişaf təməlləri həmin müqavilə əsasında atıldı. Bu arada qeyd edək ki, bununla da, vahid ümmətin təşkil edilməsi və müxtəlif düşüncəli insanların işlərinin tənzim edilməsi üçün Islamın ali rəhbərinin düşüncə baxımından nə (.qədər dahi olması sübut edildi

Bu müqaviləni İslam Peyğəmbəri mühacir və ənsar üçün tərtib etdi. Eyn zamanda bu müqavilə vasitəsi ilə yəhudilər ilə peyman bağlayıb və onları öz dinində sərbəst ,buraxaraq

maldövlətini hörmətli bilib (yəni tounmaq ixtiyarı yoxdur– mütərcim), onlar üçün .şərtlər müəyyən etdi

**:BU İSƏ MÜQAVİLƏNİN MƏTNİDİR**

Bağışlayan və mehriban Allahın adı ilə. Bu Allahın Peyğəmbəri Muhəmməd ilə Yəsrib və qureyş müanları, möminləri, onlara tabe olaraq onlara qoşulan və onlarla müharəbə edən şəxslər arasında bir məktubdur. Bunların hamısı vahid bir ümmətdir, digər insanlar kimi deyilllər. Qureyş mühacirləri öz adətlərində qalsınlar və öz aralarında olan qan pulunu ödəsinlər. Öz əsirlərinin fidyəsini (əsirin canını xilas etməsi üçün ödənilən pul – mütərcim) yaxşılıqla və bərabər şəkildə möminlər arasında bölsünlər. Habelə bənu Saidə, bənu Haris, bənu Cəşm, bənu Nəccar, bənu Əmr ibn Of, bənu Nəbit və bənu Ovs adətləri üzrə, öz adətlərini qoruyub, qan pullarını ödəsinlər. Öz .əsirlərinin fidyəsini yaxşılıqla və bərabər şəkildə möminlər arasında bölsünlər

Möminlər ailəli və borclu şəxsləri öz halları ilə təkbaşına qoymamalıdırlar. Yaxşılıqla .onun qan pulu və fidyəsini öz aralarında ödəsinlər

Möminlər ağasının xəbəri olmadan mömin bir qul ilə peyman bağlamasınlar. Pərhizkar möminlər zülm və tüğyan edən ya onların əleyhinə hiylə edən və ya zülm etmək qəsbində olan və ya möminlər arasında fitnəfəsad törətmək istəyən insanlara qarşı .birləşməlidirlər, hətta öz övladları olmuş olsa belə

Heç bir mömin kafir şəxsin əvəzinə digər bir mömini öldürə və ya bir möminin vədinə hər hansı bir kafirə kömək etməməlidir. Allahın əhd və peymanı birdir. Kiçik bir müan da digər müanların adından əhd bağlaya bilər. Möminlərin hamısı bir-biri ilə dtdurlar və digəri ilə işləri yoxdur. Yəhudilərdən hər bir kəs bizə tabe olsa, bizim kömək və yoldaşlıyımızdan faydalanıb bizimlə bərabər olacaq. Nə ona zülm olacaq, nə də ki, .müanlar onun ziddinə kiməsə kömək edəcəklər

Möminlərin sülh və sazişi birdir. Heç bir mömin digər möminin razılığı olmadan sülh etməsin, ədalət və bərabərlik istisna olmaqla. Bizə kömək edən tayfanın bütün döyüşçüləri o

döyüşdə iştirak etməlidirlər (yəni, döyüşü tayfanın müəyyən bir qrupunun üzərinə .atmasınlar). Möminlərdən axıdılan qana digər möminlər zamindirlər

Ən yaxşı və möhkəm yol pərhizkar möminlərin getdikləri yoldur. Müşriklərin heç birinin Qureyşdən hər hansı bir mal və ya şəxsi pənahı altına almağa ixtiyarı yoxdur və heç bir möminin hər hansı bir möminin qureyşin malı və canına sahib olmasının qarşısını almamalıdır. Hər kim səbəbsiz yerə hər hansı bir mömini öldürərsə və onun öldürdüyü sabit olarsa öldürülən yaxınları razı (diyəni almağa) olmazsa, öldürənin özü də öldürülməlidir. Möminlərin hamısı onun əleyhinədirlər. Onun əleyhinə qiyamdan başqa .onlara hər hansı bir iş rəva deyil

Bu peymand qeyd edilənləri təsdiqləyən Allah və qiyamət gününə iman gətirmiş bir mömin, bidətqoyan və xilaf iş görən şəxsə kömək etməməli və ona pənah verməməlidir. Əgər ona kömək edib və ya pənah versə qiyamət günü ilahi qəzəb və .lənətə düçar olacaq, onun tövbə və fidyəsi qəbul olmayacaq

Hər vaxt bir məsələ ətrafında fikir ayrılığınız olarsa onun həlli üçün müraciət Allah və .onun rəsulu Məhəmməd olmalıdır

Hər vaxt yəhudilər möminlərin xeyrinə bir döyüşdə iştirak edərlərsə, gərək öz .səhmlərinə uyğun olaraq döyüş xərclərini ödəyələr

Bəni Of yəhudiləri möminlər ilə bir millət və ümmət kimidirlər. (Bir fərqlə ki) yəhudilər öz dininəmüanlar da öz dininə tabedirlər. Bu hökmdə özləri ilə qulları arasında bir fərq yoxdur. Yox əgər onlardan hər hansı bir şəxs zülm edib və ya bir günaha mürtəkib .olarsa bu halda özü və ailəsini təhlükəyə atacaq

Bəni Nəccar, bəni Haris, bəni Saidə, bəni Cəşm, bəni Ovs və bəni Söləbə yəhudilərinin hamısı bəni Of yəhudiləri kimi bir ümmət hökmündədirlər. Yox əgər onlardan hər hansı bir şəxs zülm edə və ya günaha mürtəkib olarsa bu halda özü və ailəsini təhlükəyə .atacaq. Söləbə qəbiləsindən olan Cəfənə tayfası da onlarla eyni hökmdədirlər

Bəni Şətibə qulları da onlarla eyni hökmdədirlər. Yəhud ailəsi və qohumları da onlarla eyni hökmdədirlər. Heç kəs onların dəstəsindən xaric olmayacaq. Məhəmmədin (s) izn

icazəsi olmadan heç kəsin qanı (səbəbsiz yerə) axıdılmayacaq. Hər kim xəlvətə salıb digərinin qanını tökərsə, vəbalı özü və ailəsini tutacaq. Əgər zülm edilən şəxs olarsa bu halda istisna ediləcək ki, Allah ona razılıq verəcək (əgər ona edilən zülmdən özünü .(müdafiə edərək kiminsə qanını tökmüşsəmütərcim

Yəhudi və müanların hər biri döyüşdə öz xərclərini ödəməlidirlər. Bu əhdnamədə adı çəkilənlərin əleyhinə kimlərsə döyüşə başlarsa yəhudi və müanların hər biri bu döyüşdə digərinə kömək etməlidirlər. Onların arasında nəsihət və xeyirxahlıq bərqərar olacaq. Pislik və günahın yerini yaxşılıq tutsun. Heç kəs öz həmpeymanına pislik .etməsin və hamı məzlumun köməyində olsun

Yəhudilər müanlara kömək məqsədi ilə döyüşdükləri zaman döyüş xərclərini birlikdə ödəsilər. Bu müqavilənin tabeçiliyində olanlar üçün Yəsrib (Mədinə) şəhəri əminamanlıq yeri olmalıdır. Hər kəsin qonşusu onun özü kimidir. Ona ziyan və pislik etməməlidir. Heç kəsə şəxslərin icazəsi olmadan pənah vermək olmaz. Əgər bu müqavilənin ardıcılları arasında anlaşmazlıq baş verərsə və bu fəsada çevrilməmiş, onun həlli üçün Allah və peyğəmbəri Məhəmmədə (s) müraciət ediniz. Allah bu .müqavilədə əks olunmuşlara razıdır

Qüreyş və dtlarına pənah vermək olmaz. Bumüqavilənin tabeçiliyində olanlar, Yəsrib şəhərinə hucum edilən vaxt bir- birinə kömək etməlidirlər. Əgər möminlər onları sülhə dəvət edərsə və onlar da qəbul edərlərsə müanlar da buna uyğun hərəkət etsinlər. Əgər onlar müanları sülhə dəvət edərlərsə və din barəsində döyüş getmirsə hər bir .mömin öz payına onu qəbul edə bilər

Ovs yəhudiləri və onların qulu da bu müqavilədə əksini tapanlardan faydalanacaqlar və onlarla yaxşı davranılacaq. Hər kimim etdiyi işin nəticəsi onun özünə aid ediləcək və .Allah ən doğru formada bu müqavilədə qeyd olunanlardan razıdır

Bu müqavilə günahkar və zülmkarı himayə etmir. Hər kəs (bu müqavilədə adları çəkilən) Mədinə şəhərini tərk edərsə və ya şəhərdə qalarsa amandadır. Zülmkar və cinayətkar istisna olmaqla. Allah və onun peyğəmbəri Məhəmməd yaxşı iş görənlər və .pəhrizkarların pənahıdır

müanlarının dairəvi şəklində əyləşərək, söhbət edən qrupuna rast gəldi. Cahiliyyət dövründə bir- birinin qanını tökən və düşmənçilik edən iki müxalif qrup arasında olan mehribançılıq onun və yanındakı iki nəfərin paxıl təbiətinə xoş gəlmədi. Öz- özünə dedi: And olsun Allaha əgər bunlar bir- biri ilə müttəfiq olsalar biz bu vilayətdə yaşaya bilmərik. Buna görə də yanında olan cavanlardan birinə göstəriş verdi ki, onların yanına gedərək, onların məclisində əyləşib Ovs və Xəzrəc arasında baş vermiş Buas(١) və digər döyüşlərdən söhbət açaraq, həmin günləri onların yadına salsın. Habelə həmin döyüşlər haqqında deyilən şerlər və qəhrəmanlıq dastanlarını onlar üçün .oxuyub, mümkün olan variantlardan istifadə edərək onları döyüşə sövq etsin

Həmin cavan Şas ibn Qeysin göstərişinə əməl etdi. O, elə etdi ki, Ovs və Xəzrəc tayfalarının üzvləri o günləri xatırlayıb, hər biri digərinin qarşısında öyünməyə başladılar. Bu arada Ovs tərəfindən Ovs ibn Qeyzi, Xəzrəc tərəfindən isə Cəbbar ibn Səxra təəssübkeşlik edib bir- birinin üstünə kobudluq etdilər. Onlardan biri dedi: Əgər !?istəsən o günlərə qayıda bilərik

Bu söz hər iki tərəfi təəssübkeliyə sürüklədi və dedilər: Biz hazırıq. Bizim ilə sizin görüş .yerimiz şəhər kənarı “Zahirə” adlanan yerə qalsın

Qeyd etdiyimiz şəxslər iki dəstəyə bölünüb, hər biri öz qəbiləsinə silah ardınca getdilər. .Bir az sonra dedikləri yerdə görüşdülər

İslam peyğəmbəri bu xəbəri eşitcək bir dəstə mühaciri götürüb, onların yanına :gələrək qarşılarında dayanıb buyurdu

Ey müanlar Allahı yadınıza salın! Yenidən cahiliyyət dövranımı yadınıza düşüb? Halbuki mən sizin aranızdayam. Allah sizi İslam dini ilə hidayət etdikdən sonra onunla sizi əziz və hörmətli etdi. Onun vasitəsi ilə cahiliyyət dövrünün adətlərini sizdən uzaqlaşdırdı. Sizə kafirlikdən nicat verdi. Sizin aranızda



---

١- [١] . Buas döyüşü İslam peyğəmbərinin Mədinəyə hicrətindən bir- iki il əvvəl baş vermişdi. Həmin döyüşdə Os tayfası Xəzrəcə qalib oldular. Bu döyüşdə Os tayfasına

sərkərdəliyi Huzeyr ibn Səman, Xəzrəc tayfasına sərkərdəliyi isə Əmr ibn Neman .Bəyazi rəhbərlik edirdi ki, hər ikisi bu döyüşdə öldürüldülər

birlik və ittifaq yaratdı (sizin ürəklərinizi bir- birinə mehriban etdi). Bu sözlər onların ürəklərinin dərinliklərinə nüfuz etdi. Özlərinə gəlib başa düşdülər ki, şeytanın vəsvəsi onları qarşı- qarşıya qoyub və düşmənlərin planı onları yenidən döyüş və qardaş qırğınına məcbur edir. Buna görə hamı ağlayıb bir- birini qucaqladılar və İslam peyğəmbəri ilə şəhərə geri döndülər. Bir tədbirlə düşmənin mənfur planını bir- birinə vurdular. Allahtaala bu barədə aşağıdakı ayələri nazil etdi: "De ey kitab əhli niyə Allahın ayələrinə kafir olubsunuz (pis əməllər ilə məşğul olduğunuz üçün qorxun) ki, Allah sizin .əməllərinizə şahiddir..." Ali İmran surəsinin ١٠۵- ci ayəsinin sonuna qədər

Yəhudilərin dil yarası və ortalığı qarışdırmağa davam etmələri

Yəhudilər fürsət düşdükcə müanlara qarşı düşmənçilik və ədavət göstərirdi və onlara .dil yarası vururdular

Məsələn bir zamanlar Əbdullah ibn Səlam, Söləbə ibn Səyə, Əsid ibn Səyə, Əsəd ibn Ubeyd və digər yəhudi başçıları müan oldular və dedilər: Bu Məhəmmədə iman gətirən bir neçə nəfər insan bizim içərimizdə hörməti olmayan rəzil insanlardır. Əgər şərafətli insanlar olsaydılar, heç vaxt öz atalarının dinindən əl çəkməzdilər və digər din qəbul :etməzdilər. Elə isə Allahtaala onların cavabında bu ayəni nazil etdi

Bütün kitab əhli eyni deyillər. Onlardan bir dəstə gecə vaxtı Allahın ayələri (oxumaqla)" (və namazla məşğuldurlar..." ayənin sonuna qədər.(١

Bu surənin ١٨۶- cı ayəsinin nazil olması barəsində deyirlər: Bu ayənin nazil olmasının səbəbi Əbubəkr ilə yəhudi Fənhas arasında baş verən mübahisə idi ki, Əbubəkrin Fənhasa bir şillə vurması ilə başa çatdı. Allahtaala bu ayədə səbrli və hövsələli olmağa (səsləyir (bu cür davranışların təkrarının qarşısını alır)(٢

Nisa surəsinin yəhudilər barəsində nazil olan ayələri

O cümlədən Kərdəm ibn Qeys, Usamə ibn Həbib, Nafe ibn Əbi Nafe, Bəhri ibn Əmr, Həyy ibn Əxtəb, Rufaə ibn Zeyd ara- sıra müanların yanlarına gələr, özlərini haqq cilvəsində göstərərək, nəsihət və mehribanlıqla onlara deyərdilər: Yersiz yerə pullarınızı

.Ali İmran surəsinin ۱۱۳- cü ayəsindən başlayaraq . [۱] -۱

.Daha çox izah üçün Sirənin ۵۵۸ ci səhifəsinə müraciət edə bilərsiniz . [۲] -۲

bu din yolunda xərcləməyin, çünki qorxuruq ki, müflis olasınız. Məxsusəndə bu işin sonunun nə olduğunu və nə ilə nəticələndiyini bilmirsiniz. Allahtaala bu barədə :aşağıdakı ayəni nazil etdi

O kəslər ki, özləri xəsislik etməklə bərabər başqalarını da xəsisliyə təhrik edir və“ Allahın öz lütfündən bəxş etdiyi nemətləri gizlədirlər. Biz kafirlər üçün alçaldıcı əzab .hazırlamışıq!” Nisa surəsinin ۴۴۶cı ayələrini onun barəsində nazil etdi

۳۷ci ayədə Əbdullah ibn Sorya və Kəb ibn Əsəd kimi yəhudi başçıları üçün nazil oldu. İslam peyğəmbəri onlara İslam dinini qəbul etməyi təklif etdi və buyurdu: And olsun Allaha ki, siz daha gözəl bilirsiniz ki, mənim gətirdiklərim haqdır. Onun sözünü rədd edib, inkar etdilər və öz küfrlərində sabit qaldılar. ۵۱ci ayədən ۵۴cü ayəyə kimi Həyy ibn Əxtəb, Səlam ibn Əbil Həqiq və digər bir qrup haqqında nazil oldu. Onlar qüreyş qruplarını müanlar əleyhinə təhrik edirdilər. Onlar Məkkəyə gedən zaman siz birinci əhli kitabsınız (yəni Tovratın ardıcıllarısınız) bizə deyin görüm bizim din üstündür yoxsa Məhəmmədin dini sualımın qarşılığında belə cavab verdilər. Sizin din daha üstündür. .Siz, o və ardıcılları ilə müqayisədə daha çox hidayət olmusunuz

۱۶۳cü ayədən ۱۶۵ci ayəyə qədər onlardan Səkin və Ədi ibn Zeyd barəsində nazil oldu. Onlar İslam peyğəmbərinə dedilər: Ey Məhəmməd biz görməmişik ki, Musadan sonra bəşər əhlinə göydən ayə nazil olsun. ۱۶۶cı ayə onlardan bir neçəsinin barəsində nazil oldu: Onlar İslam peyğəmbərinin yanına gələndə, peyğəmbər onlara buyurdu: Sizi and verirəm Allaha, siz bilmirsiniz ki, mən Allah tərəfindən sizə göndərilən peyğəmbərəm? .Onlar inkar edib dedilər: Biz belə bir şey bilmirik və heç vaxt da ona şəhadət vermirik

Maidə surəsinin Yəhudilər barəsində nazil olan ayələri

Müanlardan biri olan Əmr ibn Uməyyə Zəmri “Bere Mərunə” hadisəsində (ikinci cilddə bu barədə bəhs edəcəyik) İslam peyğəmbərinin pənahında olan Amir qəbiləsindən iki nəfəri öldürdü. Əlbəttə onun bu addımı Amir ibn Tufeylin dörd müana qarşı etdiyi hərəkət və onları qılıncdan keçirtməsi cinayətinin əvəzinə atılmışdı. Əmr ibn Uməyyənin xəbəri yox idi ki, peyğəmbər bu iki nəfərə pənah vermişdir. İslam peyğəmbərinin hadisədən xəbər tutduğunu biləndə məcbur olub o iki nəfərin

diyəsini ödəmək istədi. Pulu toplamaq üçün bəni Nəzir yəhudilərinin yanına gəldi ki, .onlardan kömək istəsin

Həzrət kürəyi onların qala divarına əyləşmişdi. Onlar qalada toplaşıb dedilər: Bizim üçün bir daha belə fürsət yaranmayacaq ki, asanlıqla Məhəmmədə əlimiz çatsın. Kim qalanın üstünə çıxıb, oradan onun başına bir daş ata bilər ki, bizim də fikrimiz rahat .olsun

Onlardan Əmr ibn Cəheş adlı bir nəfər bu işi öhdəsinə götürdü. Qülləyə çıxan kimi Cəbrail o həzrətin yanına gəlib onu onların pis niyyətindən xəbərdar etdi. İslam peyğəmbəri yerindən qalxıb Mədinəyə qayıtdı. Allahtaala bu barədə aşağıdakı ayəni :nazil etdi

Ey möminlər! Allahın sizə olan lütfünü xatırlayın ki, bir tayfa sizə əl qaldırmaq“ niyyətində olduğu zaman Allah onlara maneçilik törətmişdi...” (Maidə surəsinin ۱۱ci .(ayəsinin axırına qədər

ci ayə isə Neman ibn Əza, Bəhri ibn Əmru, Şəs ibn Ədi barəsində nazil oldu. Allahın -۱۸ rəsulu onları İslam dininə və Allaha iman gətirməyə dəvət etdikdə, İlahi əzabdan qorxutduqda dedilər: Biz Allahın övladı və dostlarıyıq (Allah bizə əzab verməz) bu .xristianların etdiyi iddiaya bənzəyirdi, onlar da belə söz danışırdılar

cu ayə Rafi ibn Hərmələ və Vəhəb ibn Yəhuza barəsində nazil oldu. İslam - ۱۹ .peyğəmbəri onları İslam dininə dəvət etdi. Amma onlar qəbul etmədilər

Bəs Məaz ibn Cəbəl, Səd ibn İbadə və digərləri onlara dedilər: Ey yəhudilər Allahdan qorxun (onun haqq sözünü qəbul edin) çünki and olsun Allaha ki, siz yaxşı bilirsiniz ki, o Allahın peyğəmbəridir. Siz deyildiniz ki, o gəlməmiş, peyğəmbərlik müjdəsini bizə xəbər verir və əlamətlərini bizim üçün sadalayırdınız. O iki nəfər inkar edib dedilər: Biz heç vaxt belə bir söz deməmişik. Allahtaala Musadan sonra nə bir kitab nə də ki, peyğəmbər göndərdi. Allahtaala bu ayəni nazil etdi. Sonra Musanın dastanını önə çəkir, o həzrət ilə etdiyləri müxalifətçilik və nəhayət onların “Tiyə” vadisində qırx il .sərgərdan qalmasına səbəb olan dastanı xatırlayır

Daşqalaq hökmü barəsində yəhudilərin peyğəmbərə müraciət etmələri

Əbi Hureyrədən rəvayət olunub ki, İslam peyğəmbərinin Mədinəyə daxil olmasından sonra, yəhudi bir qadın və kişi mühəssənə zina etdilər (yəni arvadı olan bir kişi ərli qadınla zina etdi). Yəhudilər özlərinə məxsus kitabxanaya toplaşıb dedilər: Bu qadınla kişini Məhəmmədin yanına göndərin və o iki nəfərin hökmünü Məhəmməddən .soruşun və baxın görün necə hökm edir

Bəs əgər sizin kimi hökm etsə ki, o iki nəfərin əllərini qırla batırılmış iplə bağlayın, üzlərini qaraldıb eşşəyə tərsi mindirin, onda xəbəriniz olsun ki, o səltənət iddiasında olan padşahdır və ona tabe olun. Amma əgər görsəniz ki, o iki nəfərin daşqalaq olmasına hökm etdi, onda bilin ki, o peyğəmbərdir və ondan ehtiyatlı olun ki, sizin .əzəmətinizi yox edəcək

Yəhudilər göstərişə əməl edib o kişini İslam peyğəmbərinin yanına gətirib dedilər: Ey Məhəmməd bu kişi bu ərli qadınla zina edib, biz onların hökmünü sənə həvalə etmişik ki, görək necə onlar haqqında hökm edəcəksən? İslam peyğəmbəri qalxıb onların kitabxanasına gəldi və buyurdu: Öz alimlərinizi mənim yanıma çağırın. Onlar gedib Əbdullah ibn Sorya, Əbu Yasir ibn Əxtəb və Vəhəb ibn Yəhuzanı gətirib dedilər: Bunlar bizim alimlərimizdirlər. İslam peyğəmbəri onların ən savadlısının kim olduğunu soruşdu: Hamılıqla dedilər: Yer üzərində Tovrat kitabını ən yaxşı bilicisi Əbdullah ibn .Soyadır

İslam peyğəmbəri – onların içərisində ən cavanı olan – Əbdullah ibn Soryaya buyurdu: Ey Soryanın oğlu səni and verirəm Allaha və Allahın günlərinə Tövratda ərli qadının zina etməsi barəsində ilahi hökm daşqalaq deyilmi? Dedi: Necə ki, ey Əbəlqasim and olsun Allaha ki, belədir. Bunlar bilirlər ki, sən Allah tərəfindən göndərilən .peyğəmbərsən. Amma onlarda olan həsəd bunu etiraf etməyə maneə olur

İslam peyğəmbəri oranı tərk edib və bəni Ğənəm ibn Malik ibn Nəccar məhəlləsindəki məsciddə o kişi ilə qadının daşqalaq edilməsinə göstəriş verdi. İbn Soryada bu hadisədən sonra küfr edib peyğəmbərin nübuvvətini inkar etdi. Bu zaman aşağıdakı :ayə nazil oldu

Ey peyğəmbər ürəklərində inanmadıqları halda, dildə: İnandıq deyənlərin küfrə doğru“ .tələsənlər səni qəmgin etməsin...”(۱) ayənin sonuna qədər

O zinakar kişi gördüki onları daşqalaq edirlər, qalxıb özünü qadına sipər verdi. Onlara o .qədər daş atdılar ki, nəticədə hər ikisi öldülər

Əbdullah ibn Ömərdən rəvayət olunub ki dedi: Qəzavəti İslam peyğəmbərinə həvalə etdikdə həzrət buyurdu: Tovratı da gətirin. Onların alimlərindən biri Tovratı gətirib oxumağa başladı. Elə ki, daşqalaq ayəsinə çatdı, əlini onun üzərinə qoyub onu oxumadı. Əbdullah ibn Səlam irəli gəlib onun əlini Tovrat səhifələrindən götürüb dedi: Ey Allahın elçisi bu daşqalaq ayəsidir ki, kişi onu oxumaqdan imtina etdi. İslam peyğəmbəri buyurdu: Vay olsun sizə ey yəhudi qövmü, niyə Allahın hökmünü kənara qoyub ona əməl etmirsiniz? Dedilər: And olsun Allaha ki, bu hökmə əməl olunurdu. Amma bir gün şahın əyanlarından bir kişi bir qadınla zina etdi və bu əmələ mürtəkib oldu. Padşah onu daşqalaq etmək istədikdə o kişi çığır- bağır salıb dedi: And olsun Allaha ki, məni daşqalaq etməmiş gərək filan kəsi (şahın yaxınlarından) daşqalağ edəsiniz. Onun sözünü şaha çatdıranda şah yəhudi böyüklərini hüzuruna çağırtdırdı. Onlarla məşvərətləşəndən sonra belə qərara gəldilər ki, zinakar daşqalağ olunmasın, (Necə ki, bu gün qanuni qüvvəddədir) üzünü qaraldıb, əllərini bağlayaraq eşşəyə .tərsinə mindirirlər

İslam peyğəmbəri buyurdu: Mən Allahın hökmünü dirildən və onun kitabına əməl edən ilk şəxs idim. Sonra göstəriş verdi ki, o iki nəfəri daşqalağ etsinlər. Əbdullah ibn Ömər deyir: Mən də onları daşqalağ edən şəxslərdən biriyəm. Amma ibn Əbbas deyir: Maidə surəsinin bu ayəsi (۴۲) yəhudilər, bəni Qərizə və bəni Nəzir arasında yayılmış qanbahası haqqında nazil oldu. Məsələ belə idi ki, çox qüdrətli olan və özlərini digərlərindən üstün hesab edən bəni Nəzir yəhudiləri öldürülənləri üçün kamil surətdə qanbahası alırdılar. Amma bəni Qərizədən öldürülənlər üçün qanpulunun yarısını ödəyirdilər. Yəhudilər bu barədə



---

.Maidə surəsinin ۴۱ ci ayəsindən başlayaraq . [۱] -۱

Allahın rəsulundan qəzavət etməsini istədilər. Peyğəmbər onları haqqa itaət etməyə və qanpulunu bərabər şəkildə öz aralarında ödəməyə məcbur etdi. Daha doğrusunu .Allah bilir

ci ayənin nazil olması barəsində deyirlər ki, bu ayənin nazil olma səbəbi bu idi ki, -۴۸ Kəb ibn Əsəd, ibn Səluba, Əbdullah ibn Sorya və Şas ibn Qeys bir-birinə dedilər: Yaxşı olar ki, biz Məhəmmədin yanına gedək, bəlkə onu öz din və ayininin vurğunu edib aldada bildik. Axı o da bir bəşərdir. Bəs o həzrətin yanına gəlib dedilər: Ey Məhəmməd sənə məlumdur ki, biz yəhudi alimlərindənik. Əgər biz sənə tabe olsaq bütün yəhudilər bizə baxaraq sənə tabe olacaq. İndi isə bizimlə ardıcıllarımız arasında fikir ayrılığı və mübahisə olduğu üçün sənin yanına onu həll etməyin üçün gəlmişik. Əgər sən bizim .xeyrimizə hökm versən biz sənə iman gətirəcəyik

.İslam peyğəmbəri onları yanından uzaqlaşdırdı və qeyd etdiyimiz ayə nazil oldu

Yəhudi böyükləri tərəfindən həzrəti İsanın peyğəmbər olmasının inkar edilməsi

Bir gün Əbu Yasir ibn Əxtəb, Nafe ibn Əbi Nafe, Azər ibn əbi Azər, Xalid, Zeyd, Əzar ibn Əbi Əzar və Əşii kimi bir neçə yəhudi Allahın rəsulunun yanına gəlib ondan soruşdular. ?Sən hansı peyğəmbərlərə iman gətirmisən

Həzrət cavabında buyurdu: Biz Allaha, bizə nazil olana, İbrahim, İsmail, İshaq, Yəqub və övladlarına, Musa, İsa və digər peyğəmbərlərə nazil olanların hamısına iman gətirmişik. Bütün peyğəmbərlər Allaha tabe olduğu üçün onların heç birinin arasında (fərq qoymuruq.(۱

Yəhudilər qulaq asırdılar peyğəmbər həzrəti İsanın adını çəkəndə onun peyğəmbərliyini inkar edib dedilər: Biz İsa ibn Məryəmə və ona inanan şəxslərə iman :gətirmirik. Elə isə Allahtaala bu barədə ayə nazil etdi

De: Ey kitab əhli! Bizdən xoşunuz gəlməməyiniz yalnız bizim Allaha, bizə nazil edilənə“ və bizdən daha əvvəl nazil edilənlərə inanmamağınıza və sizin əksəriyyətinizin fasiq (olmasınamı görədir?”(۲

١- [١] . Ali İmran surəsu ٨۴ cü ayə.

٢- [٢] . Maidə surəsi ۵٩ cu ayə.

Maidə surəsinin ۶۸- ci ayəsinin nazil olması barəsində İbn İshaq deyir: Bu ayənin nazil olması səbəbi bu idi ki, Rafe ibn Harisə, Səlam ibn Muşkəm, Malik ibn Seyf və Rafe ibn Hərimlə kimi bir neçə yəhudi peyğəmbərin yanına gəlib dedilər: Ey Məhəmməd məgər sən İbrahimin dinin ardıcılı və onun millətindən olduğunu, bizim əlimizdəki Tovrata imanın olduğunu və onun haqq olduğunu iddia etmirsənmi? Buyurdu: Niyə ki, amma siz Tovrata əməl etməyib, onda olanları və Allahın ona görə sizdən aldığı peymanı inkar etdiniz. Allahın insanlara çatdırması üçün göndərdiklərini gizlətdiniz. Mən buna .görə sizdən bezmişəm

Dedilər: Biz elə əlimizdə olan kitab və dinə vəfadarlıq edib sənə itaət etməyəcəyik. Çünki biz hidayət olunmuş və haqqın arxasınca gedirik və sənə iman gətirmirik. Elə isə Allahtaala onların cavabında qeyd etdiyimiz ayəni nazil etdi və Allahın elçisinə göstəriş :verdi

De ey əhli kitab Allah tərəfindən nazil olan Tovrat, İncil və Quranın göstərişlərinə" .əməl etməyincə sizin heç bir dəyəriniz yoxdur..." ayənin sonuna qədər

۵۷۶۱ci ayələr barəsində deyir: Yəhudi başçılarından olan Rufaə ibn Zeyd və Suveyd ibn Haris zahirdə müanların yanına gedərkən özlərini müan göstərir amma əslində öz dinlərində qalmış və münafiqlik edirdilər. Bundan xəbərdar olmayan bir sıra müanlar onlarla dostluq edib nəvaziş göstərirdilər. Buna görə də Allahtaala qeyd etdiyimiz :ayələri nazil etdi

Ey möminlər sizin dininizi oyuncaq hesab edən bir dəstə kitab əhli ilə dostluq" etməyin"... sonra buyurur: "Bunlar sizin yanınıza gəldikləri zaman: "biz iman gətirdik deyirlər!" halbuki onlar küfrlə daxil olmuş, küfrlə də çıxıb getmişlər Allah onların "!gizlətdiklərini daha yaxşı bilir

Yəhudilər barəsində nazil olmuş Quranın digər ayələri

Bir gün yəhudi rəhbərləri olan Nəham ibn Zeyd, Qərdam ibn Kəb və Bəhri ibn Əmr İslam peyğəmbərinin yanına gəlib dedilər: Ey Məhəmməd Allahla yanaşı digər bir Allahda mövcuddur? Peyğəmbər buyurdu: Allah şəriki olmayan bir məbuddur... Belə olduqda Allahtaala bu barədə aşağıdakı ayəni

nazil etdi: “De: Şahidlik baxımından nə daha böyükdür?... Sonra buyurur: Tək olan (Allahdan başqa bir Allah yoxdur...”(١)

Yəhudilərin qiyamət günü haqqında verdiyi suallar

Habelə bir gün yəhudi böyüklərindən olan Cəbəl ibn Əbi Qəşir və Şumeyl ibn Zeyd İslam peyğəmbərinin yanına gəlib dedilər: Ey Məhəmməd əgər sən doğurdanda Allah peyğəmbərisənsə de görək qiyamət nə vaxt olacaq? Allahtaala onlara cavab olaraq bu ayəni nazil etdi: “Ey bizim peyğəmbər səndən qiyamətin nə vaxt olacağı haqqında soruşanlara de bu mənim Allahıma məxsusdur. Qopacağı vaxtı Allahdan başqa heç kəs bilməz. Göylərdə və yerdə bir kimsənin onu bilməsi çətindir. O, sizə ancaq qəflətən (gələr”.(٢)

Səlam ibn Moşkem, Neman ibn Əbi Ofi, Məhmud ibn Dəhiyə, Şəs ibn Qeys və Malik ibn Seyf (bir neçə yəhudi din xadimi) bir gün İslam peyğəmbərinin yanına gəlib dedilər: Sən bizim qibləni dəyişdiyin (Beytülmüqəddəsdən Kəbəyə) halda, Üzeyrin Allahın oğlu ?olduğuna inanmadığın bir halda necə bizim sənə tabe olmağımız intizarındasan

:Allahtaala onlara cavab olaraq bu ayəni nazil etdi

Yəhudilər: Üzeyr Allahın oğludur, xaçpərəstlər də: Məsih Allahın oğludur dedilər.“ Onların ağzında gəzən bu sözlər daha öncə küfr edənlərin sözlərinə bənzəyir. Allah (onları öldürsün! Necə də döndərilirlər”.(٣)

## YƏHUDİLƏRİN İSLAM PEYĞƏMBƏRİNDƏN TƏLƏBİ

Habelə Məhmud ibn Subhan, Neman ibn Əza, Bəhri ibn Əmru, Uzeyr ibn Əbi Uzeyr kimi bir neçə yəhudi İslam peyğəmbərinin yanına gəlib dedilər: Ey Məhəmməd doğurdanda sənin gətirdiklərin Allah tərəfindəndir. Çünki bizim fikrimizcə onlar .Tövratın olduğu nəzm və tərtiblə eyni deyil

İslam peyğəmbəri buyurdu: And olsun Allaha bu kitabın Allah tərəfindən olduğunu və bu mətləbin Tövratda mövcud

۱- [۱] . Ənam surəsinin ۱۹- ۲۰ ci ayələri.

۲- [۲] . Əraf surəsinin ۱۸۷ ci ayəsi.

۳- [۳] . Tövbə surəsinin ۳۰ cu ayəsindən başlayaraq.

olduğunu siz yaxşı bilirsiniz. Quran elə bir kitabdır ki, əgər insanlar və cinlər birləşsələr belə onun kimisini gətirə bilməzlər. Bu vaxtı yuxarıda qeyd etdiyimiz və digər şəxslər olan Fənhas, Əbdullah ibn Surya və ibn Səluba və digərləri hamılıqla dilə gəlib dedilər: Ey Məhəmməd yəni bu Quranı insanlar və ya cinlərdən kimsə sənə verməyib və ya öyrətməyib? İslam peyğəmbəri buyurdu: And olsun Allaha siz yaxşı bilirsiniz ki, bu Quran Allah tərəfindəndir və mən də onun peyğəmbəriyəm. Bu barədə siz Tövratda oxumuş və görmüsünüz. Dedilər: Ey Məhəmməd Allah peyğəmbər göndərəndə ona istədiyini həyata keçirtmək üçün qüdrət verir. İndi sən də (əgər doğurdanda peyğəmbərsənsə? – mütərcim) səmadan kitab nazil et ki, biz onu oxuyaq və yaxşı tanıyaq. Əgər belə etməsən biz də sənin gətirdiyin bu Qurandan nazil edəcəyik. Belə :olduqda Allahtaala bu barədə aşağıdakı ayəni nazil etdi

De ey peyğəmbər! Əgər insanlar və cinlər yığışıb bir- birinə arxa olaraq Quran" (gətirmək istəsələr heç vaxt edə bilməzlər".(١

Əbdullah ibn Səlam müan olduqdan sonra Həyy ibn Əxtəb, Kəb ibn Əsəd və digər yəhudi rəhbərləri ona dedilər: Sənin dostun padşahlıq fikrindədir. Çünki ərəblər arasında peyğəmbər olmayacaq! Sonra peyğəmbərin yanına gəlib Zülqərneynin sərgüzəştini ondan soruşdular. O, həzrətdə Allahın Quranda buyurduğu kimi onun sərgüzəştini onlara danışdı. Bundan öncə də onlar Nəzr ibn Haris və Uqbə ibn Əbi Muiti vadar etmişdilər ki, bu dastan haqqında peyğəmbərdən soruşsunlar. Biz bu barədə .keçən bəhslərdə işarə etmişdik

### ...YƏHUDİLƏRİN ALLAHTAALANIN YARANIŞI HAQQINDA SUALI VƏ

YƏHUDİLƏRİN ALLAHTAALANIN YARANIŞI HAQQINDA SUALI VƏ İSLAM PEYĞƏMBƏRİNİ QƏZƏBLƏNMƏSİ

Səid ibn Cubeyr rəvayət edir: Bir qrup yəhudi İslam peyğəmbərinin yanına gəlib dedilər: Ey Məhəmməd bu məxluqatı Allah yaratdıysa bəs Allahı kim yaratdı? İslam



---

.Əsra surəsi ٨٨ ci ayə . [١]-١

peyğəmbəri bu sualdan elə qəzəbləndi ki, rəngi dəyişib onlara sərt şəkildə cavab verdi. Bu halda Cəbrail nazil olub ərz etdi: Ey Məhəmməd özünü ələ al sonra tohid surəsinin :ayələri əsnasında onların suallarına cavab verdi

De Allah birdir. O Allah ki, hamıdan ehtiyacsızdır və hamı ona ehtiyaclıdır. Nə övladı“ var və nə də kimsənin övladıdır. Və heç kəs də onun tayı-bərabəri deyil”.(۱) Allahın elçisi bu ayələri onlara oxuduqda dedilər: Elə isə Allahın yaranmasının necəliyini bizə izah elə görək Allahın əli- qolu necədir. Allahın elçisi bu dəfə əvvəlkindən daha bərk qəzəbləndi. Bu vaxt Cəbrail yenə nazil oldu və ona özünü ələ almağı tapşırıb, bu sualın :da cavabını dedi ki, Allahtaala buyurur

Və Allahı lazım olduğu kimi əzəmətli tanımadılar. Qiyamət günü yer onun qüdrətində“ və göylər isə onun səltənət əli ilə bükələcəkdir. Allah aid etdikləri sifətlərdən tamamilə (uzaq və ucadır”.(۲

Əbi Hureyrədən rəvayət olunan bir hədisdə belə deyilir: Allahın rəsulundan eşitdim ki, buyururdu: Mümkündür camaat öz- özlərinə fikirləşsinlər ki, bu məxluqatı Allah yaradıb, bəs Allahı kim yaradıb? Hər vaxt bu fikrə düşsələr desinlər “قل هو الله احد، الله الصمد، لم يلد و لم يولد و لم يكن له كفوا احد.” Sonra üç dəfə sol tərəfə tüpürsün və qovulmuş (Allahın dərgahından – mütərcim) şeytandan Allaha pənah aparsın (yəni desin “اعوذ بلله من االشيطان الرجيم”).

### MÜBAHİLƏ (NİFRİN MÜTƏRCİM) ƏHVALATI

Mədinəyə hicrətdən sonra əvvəlinci illərdə baş verən hadisələrdən biri də bundan ibarət idi ki, Allahın elçisinin gəlmə xəbəri ətrafa yayılan kimi, altmış nəfərlik Nəcran xristianlarından ibarət bir heyət İslam peyğəmbəri ilə görüşmək və onunla müzakirə etmək üçün Mədinəyə gəldilər. Onların içərisində on dörd nəfər və bu on dörd



---

۱- [۱] . Müfəssirlərin dediyinə görə bu surə Məkkədə nazil olub. Bu dastanın onların dedikləri ilə ziddiyət təşkil etməməsi üçün belə izah etməliyik ki, bu sualcavab .hicrətdən qabaq Məkkədə baş vermişdir

nəfərin də içərisində üç nəfər var idi ki, digərlərindən üstün hesab olunur və həmin dövürdə xristianların hörmətli şəxsiyyətlərindən hesab olunurdular. Onlardan birinin ləqəbi “Aqib” idi ki, mənası nəzər sahibi demək idi və onun nəzəri və rəyi olmadan bir iş görməzdilər və o zaman adı Əbdul- Məsih idi. Digərinin isə ləqəbi “Seyyid” idi onların məclisinin ağsaqqalı idi və adı isə “Əyhəm” idi. Üçüncüsü “Osqof” idi ki, keşiş və ruhani .ata mənasında idi, adı isə Əbu Harisə ibn Əlqəmə idi

Əbu Harisə Xristian dini və onların kitabları barəsində geniş məlumata malik idi. Kitabların əldə edilməsi və onların araşdırılması üçün çox əziyyət çəkmişdi. Buna görə də Roma imperatorları və xristian rəhbərlərinin hörmət etdiyi insan idi. Belə ki, ona böyük vəzifə tapşırmış və xristianların dini rəhbərliyini ona həvalə etmişdilər. Kilsələrin tikmək ixtiyarı və onların məxarici (maliyyə xərclərimütərcim) də ona həvalə edilmiş .idi

Əbu Harisə Mədinəyə tərəf gedəndə Kuz ibn Əlqəmə adlı qardaşını da özü ilə götürmüş və yolda onu da gəcavədə tərkinə mindirmişdi. Yolda qəflətən dəvə yıxıldı və kəcavə yerə çırpıldı. Kuz ibn Əlqəmə dedi: Haqq rəhmətindən uzaq olan kişi məhv olsun – nəzərində Allahın elçisini tutmuşdu ki, ona görə səfər edirdilər – Əbu Harisə (?onun üstünə qışqırıb dedi: Sən özün məhv ol! (niyə onun barəsində belə danışırsan

?Kuz ibn Əlqəmə dedi: Niyə əziz qardaşım

.Dedi: Çünki o peyğəmbərdir. And olsun Allaha o, bizim gözlədiyimiz peyğəmbərdir

?Soruşdu: Bəs niyə bunu etiraf edə- edə ona iman gətirməyirsən

Əbu Harisə dedi: Insanların bizə qarşı olan davranışı buna maneə olur. Çünki bunlar bizi özlərinə başçı seçib, rəhbər təyin ediblər. Əgər bu vəziyyətdə mən ona iman .gətirsəm bütün vəzifələri məndən alacaqlar

Kuz ibn Əlqəmə bu sözü yadında saxladı və Mədinəyə çatan kimi Allahın elçisinə iman .gətirib müan oldu

## XRİSTİAN RƏHBƏRLƏRİNDƏN BİRİNİN İSLAM DİNİNİ QƏBUL ETMƏSİ

Nəcran xristianlarının adət- ənənəsinə görə dini rəhbərlik kimə keçirdisə, bütün kitablarda ona verilirdi. Onların rəhbərlərindən biri dünyadan köçəndən sonra yeni rəhbər əvvəlki kitabları möhürləyir və onları açmırdı. İslam peyğəmbəri Mədinəyə gəldikdən sonra bir gün onların rəhbəri evdən çölə çıxdı və övladı da yanında idi. Yol gedən zaman qəflətən ayağı sürüşdü və yerə yıxıldı. Oğlu dedi: Haqq rəhmətindən uzaq olan kişi məhv olsun. Yəni İslam peyğəmbəri. Atası dillənib dedi: Onun haqqında belə danışma çünki o peyğəmbərdir və adı da bizim kitablarda mövcuddur. Oğlu bu sözü yadında saxladı. Atası öldükdən sonra onun bütün fikri atasının möhürlədiyi .kitabları açmaq və peyğəmbərin əlamətlərini orada oxumaq idi

Atasının dəfnindən sonra evə gəlib, möhürləri açıb, İslam peyğəmbərinin adı və əlamətlərini orada gördükdən sonra müan oldu və ondan sonra Həcc əməlini də .yerinə yetirdi

Nəcran xristianları peyğəmbər məscidində

Günorta sonra xristianlar Mədinəyə daxil olub birbaş məscidə getdilər və həmin vaxt .peyğəmbər müanlar ilə əsr namazını qılırdı

Bunlar özlərinə məxsus paltarlar ilə məscidə gəldilər. Onların görkəmi indiyə qədər .onların paltarlarını görməyən bir qrup müan üçün yenilik və maraqlı idi

Bir az əyləşdikdən sonra namaz vaxtları çatdı və qalxıb namaza hazırlaşdılar. İslam peyğəmbəri buyurdu: Onlarla işiniz olmasın və istədikləri kimi namazlarını qılsınlar. .Müanlar gördülər ki, bunlar üzü şərqə namaz qılırlar

Namazlarını qılıb qurtardıqdan sonra İslam peyğəmbərinin yanında əyləşdilər və həzrəti İsa (ə) haqqında olan müxtəlif əqidələrini söylədilər. Bəzilərinin əqidəsinə görə İsa Allahdır. Digər bir qrupun əqidəsinə görə İsa Allahın oğludur və üçüncü dəstə isə təslis əqidəsində idilər (yəni Allah üçün üç əsil qail idilər. Bunlar ata, oğul və .(ruhulqüdsdən ibarət idi

İsanın Allah olması haqqında deyirdilər: Onun Allah olmasına sübutunuz budur ki, o ölüləri dirildər, ağır xəstələrə şəfa verər, qeybdən xəbərlər verərdi. Palçıqdan quş heykəli düzəldər, ona üfürər və uçardı... Bütün bu işlər onun Allah olmasından xəbər .verirdi

Onun Allahın övladı olması haqqında isə deyirdilər: Onun atası olmamış və beşikdə də dil açıb danışdığı üçün demək olar ki, o Allahın övladı olmuşdur. Çünki bu cür hadisəyə .nə o vaxta qədər nə də ki, ondan sonra heç bir bəşər övladında rast gəlinmişdir

Onun üçdən biri olmasının dəlili isə Allahın öz işləri barəsində etdik, yaratdıq, dedik... kimi cəm sözləri işlətməsidir. Əgər Allah bir olsaydı təkdə işlədər və deyərdi: etdim, ...yaratdım, dedim

Onların başçılarından iki nəfər söhbətə başlayıb Allahın rəsulundan suallar soruşdular. Həzrət onlara buyurdu: İslamı qəbul edin. Dedilər: Biz bundan əvvəl İslamı qəbul etmişik. Həzrət buyurdu: Yalan danışırsınız. Çünki siz Allahın övladı olmasına inanır və xaça pərəstiş edirsiniz. Donuz əti yeyirsiniz! Beləcə siz necə İslam dinini qəbul ?etmisiniz

?Dedilər: Ey Məhəmməd əgər İsa Allahın oğlu deyilsə, elə isə atası kimdir

.İslam peyğəmbəri sükut edib onlara cavab vermədi

Bu vaxt Aliİmran surəsinin əvvəlindən başlayaraq səksəndən çox ayə o həzrətə nazil oldu ki, əksəriyyəti onların sözləri və danışıqlarına aid idi. Dastanda Məryəmin doğulması, Zəkəriyyənin ona qəyyumluğu, İsanın doğulması haqqında mələklərin onlara dedikləri sözləri bəyan etdikdən sonra deyir: Onun ölünü diriltməsi, ağır xəstələrə şəfa verməsi kimi gördüyü işlər Allahın izni ilə olmuşdur. Sonra İsanın necə atasız dünyaya gəlməsi barəsində buyurur: “Həqiqətən İsanın yaranması da bəşərin atası Adəmin yarandığı kimi Allah torpaqdan yaratdı. Sonra o torpağa dedi, kamil bir (بəşər ol və həmin anda oldu...”(۱

Sonra bu ayənin arxasınca Allahtaala öz peyğəmbərinə

mübahilə (nifrin) göstərişi verir: “Sənə göndərilən elmdən sonra buna dair səninlə mübahisə edənlərə de: Gəlin biz də oğlanlarımızı, siz də oğlanlarınızı, biz də qadınlarımızı, siz də qadınlarınızı, biz də özümüzü, siz də özünüzü çağıraq! Sonra dua (edib yalançılara Allahın lənət etməsini diləyək!”(١)

Bu vaxt sonda onlara ədalətli bir təklife dərək buyurur: De: Ey kitab əhli, sizinlə bizim aramızda eyni olan bir kəlməyə tərəf gəlin! Allahdan başqasına ibadət etməyək, ona şərik qoşmayaq və Allahı qoyub bir- birimizi rəbb qəbul etməyək!” Əgər onlar yenə də üz döndərərlərsə, o zaman deyin: “İndi şahid olun ki, biz həqiqətən, müanlarıq! (Allaha (təslim olanlarıq)!”(٢)

## XRİSTİANLARIN İSLAM PEYĞƏMBƏRİ İLƏ MÜBAHİLƏDƏN ÇƏKİNMƏLƏRİ

.Allahın rəsulu ona nazil olan ayələri onlar üçün oxuyaraq, onları mübahiləyə dəvət etdi

Dedilər: Ey Qasimin atası bizə möhlət ver ki, öz işimiz barəsində fikir edək. Həzrət onlara möhlət verdikdə qalxıb onların yanında dünyagörüşlü və savadlı olan Aqibin ?yanına gedib dedilər: Səncə nə etmək lazımdır

Aqib dedi: Ey xristianlar and olsun Allaha ki, siz yaxşı bilirsiniz ki, Məhəmməd göndərilən (mursəl) peyğəmbərdir və İsa haqında dedikləri də doğrudur. Digər bir tərəfdən də bilirsiniz ki, heç bir qövm və millət Allahın peyğəmbəri ilə mübahilə .etməyiblər. Edənlərdə birbaşa məhv olub, onlardan böyüklü-kiçikli kimsə qalmamışdır

İndi ki, əgər öz dininizdən əl çəkmək və Məsih haqqında olan əqidənizə göz yummaq istəyirsinizsə, Məhəmməd ilə digər bir vaxta vədələşib öz vətəninizə qayıdın və onunla .mübahilədən daşının

Nəcran xristianları peyğəmbərin yanına qayıdıb dedilər: Ey Qasimin atası biz mübahiləyə hazır deyilik və qərara aldıq ki, sən öz dinində, biz də öz dinimizdə qalaq. Amma hazırıq ki, öz



---

.Ali İmran surəsi, ۶١ ci ayə . [١]-١

aramızdan bir nəfəri seçib bizimlə göndərəsən ki, o bizim barəmizdə qəzavət etsin və onun dediklərinə boyun qoyaq.(۱) Allahın elçisi buyurdu: “əsr vaxtı gəlin mən sizin üçün .möhkəm və əmanətli bir şəxsi seçib, sizinlə göndərib



---

۱- [۱] . Qeyd etmək lazımdır ki, şiə və sünni alimlərinin və təfsirçilərinin sözlərinə uyğun olaraq mübahilə cərəyanı burada tamamlanmır. İbn Hişam burada bilərəkdən və ya bilməyərəkdən. Peyğəmbər əhli- beytinin böyük fəzilətlərinin birinin məxsusəndə sünnilərin qəbul etdiyi Əmirəlmöminin Əli (ə)- ın fəzilətlərinin birini söyləməkdən vaz keçib, bu həqiqəti ört- basdır etmək üçün dastanı qısaca qeyd etmişdir. Bizim boynumuzda olan vəzifəmizə görə dastanı geniş şəkildə qeyd edir və üstəlik bunu sünni məzhəb tarixçilər və təfsirçilərin təfsirləri arasından seçirik ki, əziz oxucular üçün heç bir şəkk- şübhə yeri qalmasın. İbn Betriq “Omdə” kitabının Təbriz çapının ۹۵- ci səhifəsində, Bohrani “Ğayətulməramın” ۳۰۰- cü səhifəsində sünnilərin böyük alim və müfəssirlərindən olan Söləbi, Məqatel və Kəlbidən hədis rəvayət edib ki, Allahın rəsulu bu ayəni Nəcran xristianlarına oxuduqdan sonra onları mübahiləyə dəvət etdi. O, həzrətin cavabında dedilər: Bizə möhlət ver ki, bu barədə götür qoy edək. Peyğəmbər onlara möhlət verdi və onlar Aqibin yanına gəlib məsələni danışdılar. Aqib (ibn Hişamın mətndə qeyd etdiyi kimi) onları mübahilədən çəkindirdi. Onlar növbəti gün Allahın rəsulunun yanına gələndə müşahidə etdilər ki, o həzrət evdən çıxıb, Həsəni qucağına almış, Hüseynin əlindən tutmuş, Fatimə onun arxasınca və Əli ibn Əbitalib də onların arxasınca gəlir. İslam peyğəmbəri onlara buyurdu: Mən nə zaman dua etsəm siz də amin deyərsiniz. Nəcran Osqofu (keşişlərin böyüyü) bu mənzərəni gördükdə üzünü Nəcran xristianlarına tutub dedi: Ey xristianlar mən elə simaları müşahidə edirəm ki, and olsun Allaha əgər dağın yerindən oynamasını Allahdan istəsələr bu baş verər. Məbada onunla mübahilə edəsiniz ki, hamınız məhv olarsınız və qiyamət gününə qədər yer üzərində bir xristian belə qalmayacaq. Qeyd etdiyimiz xristianlar osqofun sözünü eşitdikdən sonra Allahın rəsulunun yanına gəlib dedilər: Biz mübahiləyə hazır deyilik. Müzakirələrdən sonra razılaşdılar ki, ildə iki min geyim cizyə adı altında peyğəmbərə xərac versinlər. Peyğəmbər onu qəbul etdi və beləliklə aralarında sülh bağlandı. Sünni alimlərindən biri olan Vahedi “Əsbabin- nuzul” kitabının Misir çapının

dan məqsəd Həsən və –" ابنائنا" ٥٩cu səhifəsində Şöbidən hədis rəvayət edir ki, burada dan məqsəd isə Əli ibn Əbitalibdir. Digər" انفسنا" dan məqsəd Fatimə və – نساءنا" ,Hüseyn sünni alimləri də dediyimiz kimi bu ayənin təfsiri zamanı söhbət açıblar. Daha çox məlumat əldə etmək istəyirsinizsə "Əhqaqul- həqq" kitabının III cildinin ۴۶- ۷۶ cı səhifələrinə və ya "Ğayətul- məram" kitabının ۳۰۰- ۳۰۳ cü səhifələrinə müraciət edə bilərlər. Amma qeyd etmək lazımdır ki, burada deyilən Mübahilə hadisəsi şiə tarixçilərinin dediyinə görə hicrətin onuncu illərində baş verib, nə inki hicrətin birinci ili. .Ola bilsin ki, bu hadisə iki dəfə baş verib. Daha doğrusunu Allah bilər

Ömər ibn Xəttab deyir: Mən o günki kimi heç vaxt rəhbərliyi sevməmişdim. Arzu edirdim ki, bu iş üçün peyğəmbər məni seçsin. Buna görə də zöhr vaxtının istiliyində evdən çıxıb məscidə gəldim. İslam peyğəmbəri zöhr namazını qıldıqdan sonra öz sağ .və soluna baxdı. Hər dəfə boynumu uzadırdım ki, bəlkə məni gördü

Amma peyğəmbər o tərəf bu tərəfə baxmaqda davam edirdi ki, gözü Əbu Ubeydə Cərraha sataşdı. Onu yanına çağırıb dedi: Bunlara yola düş və onların arasında haqqa .uyğun hakimiyyət et. Beləliklə bu vəzifə Əbu Ubeydəyə qismət oldu

## MƏDİNƏ MÜNAFİQLƏRİNİN SƏRGÜZƏŞTLƏRİNİN BİR HİSSƏSİ

İslam peyğəmbəri Mədinəyə hicrət etdikdə oranın əhalisi özləri tərəfindən seçilən iki nəfər tərəfindən idarə olunurdu. Biri Əbdullah ibn Əbi ibn Səlul idi ki, Ovs və Xəzrəc qəbiləsinin hər ikisi onun rəhbərliyini qəbul edirdi. Digəri isə Əbu Amir Əbd Əmr ibn Seyfi idi ki, Ovs qəbiləsi onu özünə rəhbər seçmişdilər. O Uhud döyüşün də şəhid olan Hənzələ Ğəsilul- məlaikənin atası idi (bu barədə öz yerində bəhs edəcəyik). Əbu Amir cahiliyyət dövründə rahiblik etdiyi və əyninə yun paltar geydiyi üçün ona “Rahib” ləqəbi .vermişdilər

İslam peyğəmbəri Mədinəyə daxil olmazdan öncə Mədinə camaatı Əbdullah ibn Əbi üçün daşqaşla bəzədilmiş tac hazırlamışdılar ki, onun başına qoyub o, şəhər və ətrafına hakim təyin etdilər. Lakin İslam peyğəmbəri Mədinəyə daxil olduqdan sonra .bu fikirdən daşınıb onun ətrafından dağlışaraq o həzrətə tərəf axışdılar

Bu cərəyan Əbdullah ibn Əbini həsadətə təhrik etdi. O, İslama və bu müqəddəs dinin dəyərli rəhbərinə qarşı kin saxladı. O, başa düşdü ki, İslam peyğəmbərinin (s) Mədinəyə gəlməsi ilə onun hakimiyyəti ayaqlar altında qalıbdır. Mədinə əhalisinin İslam peyğəmbərinə qarşı axışdığını və o həzrətə qarşı, meyilli olduqlarını görüb, qərara aldı ki, zahirdə camaatdan fərqlənməyərək İslamı qəbul etsin, amma daxilən isə münafiq idi və günlər ötdükcə İslam peyğəmbərinə qarşı kin və düşmənçiliyi .artmağa başlayırdı

Ancaq Əbu Amir ibn Seyfi isə öz qəbiləsinin İslam dinini qəbul etdiklərini görüb, onlarla mübarizəyə qalxıb, həmin küfr halında qalmaqda davam edərək, öz yaxınlarından təqribən iyirmi nəfər ilə Məkkəyə getdi və beləliklə İslam dinini qəbul edib əziz İslam peyğəmbərinə tabe olmaqdan bəyan qaçırtdı. İslam peyğəmbəri onun barəsində .buyurardı. Ona "Rahib" Amir yox "Fasiq" Əbu Amir deyiniz

Məkkəyə getməzdən öncə Allahın rəsulunun yanına gəlib dedi: Bu nə dindir ki, sən gətirmisən? Buyurdu: İbrahimin pak dinidir. Əbu Amir dedi: İbrahimin dini mənim tabe .olduğum dindir

.İslam peyğəmbəri buyurdu: Sən o dində deyilsən

?Dedi: Niyə ki

Sonra sözünə davam edib dedi: Ey Məhəmməd sən bu dində olmayan şeyləri dinə !qoşursan

İslam peyğəmbəri buyurdu: Mən belə etməmişəm, bəlkə onu saflaşdıraraq, onun xalis .həqiqətini sizlər üçün gətirmişəm

!Əbi Amir dedi: Yalançını Allah qərib öldürsün, öz şəhər və diyarından sərgərdan etsin

İslam peyğəmbəri amin deyib buyurdu: Hər kəs yalan danışırsa Allah dediyin taleyə .düçar etsin

Bundan sonra Məkkəyə yollanıb orada yaşamağa başladı. Allahın elçisi Məkkəni fəth etdikdən sonra, Əbu Amir Məkkədə qala bilmədiyini görüb Taifə yollandı. Taif əhli də müan olduqdan sonra Şama getdi. Öz qarğış etdiyi kimi qərib yerdə kimsəsiz dünyasını dəyişdi. Dünyadan köçdükdən sonra onun yol- yoldaşlarından Əlqəmə ibn Əlasə və Kənanə ibn Əbd Yaleyl adlı iki nəfər onun mirasına görə mübahisə etdilər. Mübahisələrini həll etmək üçün Roma imperatoru Qeysərin yanına getdilər. O isə Əbu Amirin mirasını Kənanə ibn Əbd Yaleyliyə verərək Əlqəməni bu mirasdan məhrum .etdi

### İSLAM PEYĞƏMBƏRİNİN SƏD İBN İBADƏYƏ BAŞ ÇƏKMƏSİ VƏ ƏBDULLAH İBN ƏBİNİN SÖZÜ

Usamə ibn Zeyd deyir: Bir gün Allahın elçisi xəstələnmiş Səd ibn İbadəyə baş çəkmək üçün evdən çıxdı. Onun evinə

getmək üçün öz uzunqulağına minib məni də tərkinə aldı. Yolda öz qalasının kölgəsində bir dəstə Mədinəli ilə əyləşmiş Əbdullah ibn Əbi ilə rastlaşdıq. İslam .peyğəmbəri onları gördükdə onlara etinasızlıq etmək istəmədi

Buna görə də, eşşəkdən enərək Əbdullah ibn Əbinin yanına gəlib salam verdi, onların yanında əyləşərək (adəti belə idi) Qurandan ayələr oxumağa başladı və onlara behişt .və cəhənnəmi xatırlatdı

İslam peyğəmbəri danışan zaman Əbdullah ibn Əbi sakit qalmış və danışmırdı. O həzrət sözünü bitirdikdən sonra dilə gəlib dedi: Ey kişi! Əgər dediklərin doğrudursa daha yaxşı olar ki, evində əyləşəsən, yanına gələnlərə oxuyub, yanına gəlməyənlərə isə yersiz maneə olmayasan və çağrılmamış onun məclisinə gəlməyəsən və !xoşlamadığı şeyi onun üçün gətirməyəsən

O, məclisdə bir neçə müan ilə iştirak edən Əbdullah ibn Rəvahə onun sözünü kəsib :dedilər

Yox! Ey Allahın peyğəmbəri belə deyil (Əbdullah ibn Əbiyə fikir verməmütərcim) bəlkə sən özün bizim yanımıza gəl və bizim məclisimizə qədəm qoy. İstədiyini bizim üçün gətir ki, and olsun Allaha hər nə gətirsən biz ona meyl edəcəyik və onu sevəcəyik və o .elə bir şeydir ki, Allah bizi onunla izzətləndirib və hidayət edibdir

Bu sözü Əbdullah ibn Əbi ətrafdakılarından eşitdikdə üzünü çevirib, bu iki şeri :zümzümə etdi

متی ما یکن مولک خصمک لاتزل

تذل و یصرعک الذین تصارع

و هل ینهض البازی بغیر جناحه

وان جذ یوما ریشه فهو واقع

Yəni sənin dostun düşməninə çevrilirsə, ondan sonra həmişə xar olacaq və həmdə

səni yerə çırpacalar. Görəsən qızılquş (qırğı) qanadsız uça bilərmi? Şübhəsiz ki, bir gün qanadları vurularsa yerə düşəcək. Usamə deyir: İslam peyğəmbəri yerdən qalxıb, birlikdə Səd ibn İbadənin evinə getdik. Amma Əbdullah ibn Əbinin sözü o həzrəti pərişan etmişdi, çöhrəsində narahatçılıq və giriftarçılıq seçilirdi. Səd ibn İbadə bu mənanı anlayıb soruşdu: Ey Allahın rəsulu sizin çöhrənizdə narahatçılıq və qəm- qüssə

?müşahidə edirəm deyəsən xoşagəlməz söz eşitmisən

Buyurdu: Bəli. Sonra Əbdullah ibn Əbinin sözlərini Səd ibn İbadə üçün danışdı. Səd dedi: Ey Allahın elçisi narahat olmayın. Siz bu şəhərə gələn günü biz Əbdullah ibn Əbi üçün tac hazırlamış və istəyirdik ki, onun başına qoyub onu özümüzə rəhbər seçək. İndi camaatın sizin ətrafınıza yığışdığını görüb elə düşünür ki, siz hakimiyyəti onun .(əlindən almısınız (narahatçılığdan rahat ola bilmir

### MƏDİNƏDƏ BİR QRUP MÜHACİRLƏRİN XƏSTƏLƏNMƏSİ

İslam peyğəmbəri və digər Məkkə müanları Mədinəyə hicrət etdikdə o şəhərin su və havası (iqlimi) yaxşı deyildi və o şəhərə daxil olanlar üçün yararsız hesab olur və onları .möhkəm qızdırmaya düçar edirdi

Buna görə də Əbu Bəkr, Efiopiyalı Bilal və Amir ibn Fəhirə kimi bir sıra mühacirlər qızdırmaya düçar oldular. Ayişədən nəql edilən rəvayətə görə onların qızdırması o .həddə çatmışdı ki, sayıqlayırdılar

Allahtaala təkcə peyğəmbəri bu xəstəlikdən qorumuşdu. Buna görə də xəstəlik və sayıqlamalar barəsində Allahın peyğəmbərinə xəbər verib dedi: Bunlar qızdırma .ucbatından elə sözlər danışırlar ki, özləri nə danışdıqlarını bilmirlər

Allahın rəsulu onlar haqqında dua edib dedi: İlahi Mədinə şəhərinin su və havasını bizə uyğunlaşdır. Necə ki, Məkkə şəhərini bizə münasib etdin, onun yeməklərini bizə (mübarək et və bu şəhərin xəstəliyini “Məhiə” adlanan əraziyə ötür.(١

Deyilənlərə görə: Bunların xəstəliyi o qədər ağır idi ki, ayaq üstündə namaz qıla bilmir və naçar qalıb oturan yerdə namaz qılırdılar. Bir gün İslam peyğəmbəri onları oturan yerdə namaz qıldıqlarını görüb dedi: Oturan yerdə qılınan namazın fəziləti ayaq üstündə qılınan namazın fəzilətinin yarısına bərabərdir. Ondan sonra qeyd etdiyimiz şəxslər bərk xəstə olmalarına baxmayaraq fəziləti dərk etmək üçün namazlarını ayaq .üstündə qılardılar

. Tarixçilərin dediyinə görə Məhiə, Cəhfənin və ya ona yaxın vadinin adı olmuşdu . [۱] -۱

## CİHAD VƏ YA MÜŞRİKLƏRLƏ DÖYÜŞÜN BAŞLANMASI

Bundan öncə də qeyd etmişdik ki, İslam peyğəmbəri Məkkədə on üç il insanları İslam dininə və Allahtaalaya iman gətirməyə dəvət etdikdən sonra Mədinəyə hicrət etdi. Rəbiüləvvəl ayının on ikisi günorta (zöhr) vaxtı Mədinəyə daxil oldu. O gün .peyğəmbərin şərafətli ömründən əlli üç il ötürdü

İslam peyğəmbəri həmin il səfər ayına qədər yəni on bir ay müşriklərlə döyüşmədən Mədinə şəhərində qaldı. Düz səfər ayının əvvəllərində yəni Mədinəyə daxil olmasının on ikinci ayı Allah tərəfindən gələn göstərişə əsasən bir dəstə mühacir ilə birlikdə .müşriklərlə döyüşmək üçün Mədinə şəhərindən xaric oldu

## VƏDAN ĞƏZVƏSİ

İlk dəfə idi ki, İslam peyğəmbəri bir qrup müan ilə birgə döyüşmək üçün Mədinədən kənara çıxırdı. Bu səfərdə əziz islam peyğəmbəri camaatın işlərini həll etmək üçün Səd ibn İbadəni öz yerinə Mədinə şəhərinə təyin etdikdən sonra özü və ətrafındakılar Qüreyşin karvanını təqib etmək və bəni Zomrə ibn Bəkr qəbiləsi ilə döyüşmək üçün .“Vədan”(۱) adlanan yerə qədər getdi

Orada bəni Zomrə Məxşi ibn Əmrin rəhbərliyi altında o həzrətlə sülh bağladılar və dostluq və təcavüz etməmək arasında tərəflər arasında müqavilə bağlandı. Döyüş baş .vermədən İslam peyğəmbəri oradan Mədinəyə qayıtdı

## UBEYDƏ İBN HARİS SƏRYƏSİ

(UBEYDƏ İBN HARİS SƏRYƏSİ(۲

İslam peyğəmbəri Mədinəyə daxil olduqdan sonra Ubeydə ibn Haris ibn Əbdülmütəllib ibn Raba, altmış və ya ۸۰ nəfər mühacirlə birlikdə bir qrup Qüreyş başçılarının da olduğu Qüreyş karvanı ilə döyüşə göndərildi. Bunlar bu məqsədlə Mədinədən çıxıb su olan bir yerdə, Əkrəmə ibn Əbu Cəhl və ya



---

.Vədan” Cəhfə yaxınlığında bir yerin adıdır“ . [۱]-۱

TARİXÇİLƏRİN DEDİYİNƏ GÖRƏ: BURADA ĞƏZVƏDƏN MƏQSƏD O . [٢] -٢ DÖYÜŞLƏRDİR Kİ, İSLAM PEYĞƏMBƏRİNİN ÖZÜ DƏ O DÖYÜŞDƏ İŞTIRAK EDİRDİ. SƏRYƏ Və BESDəN MƏQSƏD O DÖYÜŞLƏRDİR Kİ, PEYƏMBƏR BİR QRUP INSANLARI SƏHABƏLƏRİNDƏN BİRİNİN RƏHBƏRLİYƏ DÖYÜŞƏ GÖNDƏRİR, AMMA .ÖZÜ İSƏ O DÖYÜŞDƏ İŞTİRAK ETMİRDİ

Məxrəz ibn Həfsin başçılığ etdiyi karvanla qarşılaşdılar. Amma onlar arasında döyüş baş vermədən birbirindən ayrıldılar. Yalnız Səd ibn Vəqqas düşmən tərəfə bir ox atdı .və deyilənlərə görə: Bu İslam tarixində müşriklərə tərəf atılan ilk ox idi

Bu səfərdə müanların xeyrinə olan hadisələrdən biri də karvandan iki nəfərin .müanlara qoşulmaları idi

Bu iki nəfərdən biri Miqdad ibn Əmr və digəri isə Utbə ibn Ğəzvan Mazəni idilər. Onlar bundan öncə müan olsalarda digər müanlar kimi Mədinəyə hicrət edə bilmirdilər. Həmin karvanla yola çıxmışdılar ki, bəlkə fürsət düşdü getdikləri səhradan Mədinəyə tərəf qaça bildilər. Bu rastlaşma isə onların məqsədlərinin reallaşması üçün yaxşı .fürsət idi və asanlıqla özlərini müanlara çatdıra bildilər

Bu səfər haqqında Əbubəkr və ya digər bir müan şerlər qoşdu ki, Əbdullah ibn Zuberi onlara cavab verdi (İbn Hişam həmin şerləri Sirənin I cildinin ۵۹۲-۵۹۴cü səhifələrində .(qeyd edibdir ki, maraqlanan müraciət edə bilərlər

Səd ibn Vəqqas da müşriklərə atdığı ox barəsində şerlər qoşdu (yuxarıdakı şerlərdən .(sonra qeyd olub

İslam peyğəmbərinin müanları döyüşə göndərmək üçün bayraq qaldırdığı ilk döyüş də .həmin səryədə olubdur

### HƏMZƏ İBN ƏBDÜLMÜTƏLLİB SƏRYƏSİ

Həmin ərəfədə İslam peyğəmbəri əmisi Həmzə ibn Əbdülmütəllibi otuz nəfər mühacir ilə birgə Qırmızı dənizin sahillərinə və "Eys" ətrafı "Seyfulbəhrə" tərəf yola saldı ki, Əbucəhlin başçılığı ilə üç yüz nəfərdən ibarət olan Qüreyş karvanı ilə döyüşsünlər. Onlar həmin əraziyə qədər gəlib orada həmin karvan ilə qarşılaşdılar. Amma hər iki tərəflə yaxşı münasibətdə olan "Məcdi ibn Əmr Cəhəni"nin araçılığı ilə sülh edib, aralarında döyüş baş vermədən bir- birindən ayrıldılar. Həmzə ibn Əbdülmütəllib bu səfər barəsində qəsidə qoşmuş və Əbucəhl də ona cavab vermişdir. Bəzi tarixçilərin dedyinə görə Həmzə ibn Əbdülmütəllib bu qəsidədə deyir: İlk bayrağı İslam peyğəmbəri bu səryədə bizim üçün bağladı. Amma bizim üçün bu qəsidənin Həmzə ibn Əbdülmütəllibə məxsus olması sübuta

.yetmədiyi üçün bu barədə düzgün qəzavət edə bilmərik, daha doğrusunu Allah bilər

### BƏVAT ĞƏZVƏSİ

O ilin rəbiuləvvəl ayında (yəni hicrətdən bir il sonra) İslam peyğəmbəri qüreyşlə döyüşmək üçün Mədinədən xaric oldu və Saib ibn Osman ibn Məzunu müanların işlərini həll etmək üçün Mədinədə canişin təyin etdi. Onlar Rizəvi dağının ətrafında “Bəvat” adlanan yerə qədər irəlilədilər. Ancaq Qüreyş ilə rastlaşmayıb oradan .Mədinəyə qayıtdılar

### ƏŞİRƏ ĞƏZVƏSİ

Cəmadiuləvvəl ayında o həzrət Əba ə ibn Əbduləsədi Mədinədə canişin təyin edib bir qrup mühacir ilə birgə qüreyşin digər bir karvanı ilə döyüşmək üçün Mədinədən çıxıb “Nəqəbe bəni Dinar” istiqamətində irəliləyib, oradan da “Feyfa Xebara” çatdı. Orada “Zatussaq” adlanan bir ağacın altında namaz qıldı. İndi orada o həzrətin adından bir məscid inşa ediblər. Orada həm də qoşun üçün yemək bişirdilər ki, indi də(١) qazanların qoyulduğu daşlar orada mövcuddur. “Muştərib” adlanan quyudan su çəkib qoşuna payladıqdan sonra yola düşüb “Xəlaiq” adlanan vadinin sağ tərəfindən keçib “Şöbə” yolu ilə “Yəleyl” və “Zəbrə”nin kəsişdiyi yerdə durdular və “Zəbuə” quyusundan su çəkib içdilər. Sonra “Fərəş Meləl” adlı yer ilə gəlib “Useyrə”də dayandı. Həmin yerə qədər düşmən ilə rastlaşmadığı üçün orada dayandı. Cəmadiuləvvəl ayının qalan günlərini və cəmadiulaxirdən bir neçə günü orada qaldı. Bu müddətdə onlarla bir olan .bəni Mədləc və bəni Zumrə ilə dostluq və sülh peymanı bağlayıb Mədinəyə qayıtdı

### ...HƏZRƏT ƏLİ İBN ƏBİTALİBİN ƏBU TURAB ADLANMASI VƏ

HƏZRƏT ƏLİ İBN ƏBİTALİBİN ƏBU TURABİ ADLANMASI VƏ O HƏZRƏT HAQQINDA BİR FƏZİLƏTİN QEYD EDİLMƏSİ

”Əmmar ibn Yasir deyir: Mən və Əli ibn Əbitalib “Əşirə



---

.Yəni kitab yazılan vaxtı nəzərdə tutur . [١] -١

.döyüşündə səfər yoldaşı və dost idik. Nəhayət qeyd etdiyimiz yerdə dayandıq

Bəni Mədləcdən bir qrup insan – orada yaşayanlar – gündüzlər sahib olduqları çeşmə və xurmalıqlarda işləyirdilər. Bir gün Əli ibn Əbitalib mənə dedi: Gəl onların yanına gedək və yaxından iş tərzlərinə tamaşa edək. Mən qəbul etdim və birlikdə onların .yanına getdik

Müəyyən müddət orada əyləşib işlərinə tamaşa etdik, yavaşyavaş bir çort vurmağa başladıq və bizi yuxu tutmağa başladı. Buna görə də qalxıb həmin xurmalığın arxasında orada olan kiçik xurma ağaclarının arasında hər ikimiz narın qumlar üstündə .yatdıq

Yuxudan ayılanda gördük ki, İslam peyğəmbəri başımızın üstündə durmuş və mübarək ayağı ilə bizi tərpədir. Biz üz- gözümüz torpağa bulaşmış halda yerdən qalxdıq və o həzrətin qarşısında durduq. Allahın rəsulu – Əli bin Əbitalibin baş ?gözündəki torpağı görüb – buyurdu: Ey Əbu Turab bu nə vəziyyətdir

O anda buyurdu: Sizə insanların ən bədbəxtlərinin kim olduğlarını söyləyimmi? Ərz .etdim əlbəttə ey Allahın peyğəmbəri

Buyurdu: Biri (Saleh peyğəmbərin) dəvəsini kəsəndir. (Sonra üzünü Əliyə tutub buyurdu:) digəri də sənin başına vuran (əlini həzrət Əlinin başının qabaq tərəfinə qoydu) və sənin bu saç- saqqalını yaş edəndir (yəqin ki, peyğəmbər başının qanının .(saqqalına axmasını nəzərdə tuturdu – mütərcim

İbn İshaq deyir: Bəzi rəvayətçilər onun Əbu Turab adlanması haqqında deyiblər: Hər vaxt Əli ibn Əbitalib həyat yoldaşı Fatimədən (ə) narahat olardı. Onunla danışmadan (evdən çölə çıxar) bir qədər torpağı başına tökərdi. Allahın rəsulu onu bu halda görəndə soruşardı: Ey Əbu Turab (torpaq atası) Sənə nə edib? Daha doğrusunu Allah .bilər

### SƏD İBN ƏBİ VƏQQAS SƏRYƏSİ

Həmin vaxtlarda islam peyğəmbəri Səd ibn Vəqqası səkkiz mühacir ilə döyüşə göndərdi. Onlar “Xərar” adlanan yerə qədər irəliləyib, düşmənlə qarşılaşmadıqları

## BİRİNCİ BƏDR ĞƏZVƏSİ VƏ YA SƏFVAN DÖYÜŞÜ

İslam peyğəmbərinin Əşirə döyüşündən qayıtmasından bir neçə gecə ötməmiş təzə bir hadisə baş verdi və peyğəmbərin yenidən Mədinədən kənara çıxmasına səbəb .oldu

Bu hadisə belə olmuşdu ki, Kərz ibn Caber Fəhri adlı birisi Mədinə əhalisinin sürülərinə basqın edib onları qarət etmişdi. İslam peyğəmbəri Zeyd ibn Harisi Mədinədə canişin təyin edib, Kərz ibn Cabiri təqib etmək üçün şəhərdən xaric olub Bədr ətrafındakı "Səfvan"a qədər irəliləsə də amma Kərzdən əsər- əlamət görməyib onu tapmaqdan əlini üzüb Mədinəyə qayıtdı və cəmadiulaxir ayənən qalanını, Rəcəb və Şəban aylarını .Mədinədə başa vurdu

## ƏBDULLAH İBN CƏHEŞ SƏRYƏSİ

"و يسئلونک عن الشهر الحرام"

ayəsinin nazil olması İslam peyğəmbəri birinci Bədr səfərindən qayıdandan sonra Rəcəb ayında Əbdullah ibn Cəheşi səkkiz nəfər mühaciri yeni tapşırıq ilə Məkkə istiqamətinə göndərdi. Bu səkkiz nəfərin hər biri Məkkənin bir qəbiləsindən idi. Belə ki, Bəni Əbdüşşəms və müttəfiqlərindən: Əbu Huzeyfə ibn Ütbə, Əkasə ibn Mohsün, .Əbdullah ibn Cəheş də həmin qəbilənin müttəfiqlərindən idi

.Bəni Nofəl ibn Əbdül Manaf və müttəfiqlərindən: Ütbə ibn Ğəzvan

.Bəni Zöhrədən: Səd ibn Əbi Vəqqas

Bəni Ədi ibn Kəb və müttəfiqlərindən: Amir ibn Rəbiə, Vaqed ibn Əbdullah, Xalid ibn .Bəkir

.Bəni Haris ibn Fəhrdən: Suheyl ibn Bəyza

İslam peyğəmbəri Əbdullah ibn Cəheşi onlara rəhbər təyin edib, əlinə bir məktub verərək buyurdu: İki gün getdikdən sonra məktubu açarsan və orada yazılanlara əməl .edərsən

Əbdullah o həzrətin tapşırdığı kimi iki gün Məkkə istiqamətində getdikdən sonra .məktubu açıb gördü. İslam peyğəmbəri o məktubda yazmış idi

Mənim məktubu oxuyan kimi yoluna davam et. Məkkə və

